**Nağdəli Zamanov**

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN NİTQ MƏDƏNİYYƏTİ

***MONOQRAFİYA AZƏRBAYCAN XALQININ ÜMUMMİLLİ LİDERİ HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 95-Cİ İLDÖNÜMÜNƏ İTHAF OLUNUR***

**"Elm və təhsil"**
**Bakı-2018**

Elmi redaktor: **Möhsün Nağısoylu**
*Akademik*

Rəyçilər: **İlham Məmmədzadə**
*Fəlsəfə elmləri doktoru, professor*
**Məsud Mahmudov**
*Filologiya elmləri doktoru, professor*
**Nadir Məmmədli**
*Filologiya elmləri doktoru, professor*

Ön sözün müəllifi: **Nizami Cəfərov**
*Akademik*

**Nağdəli Zamanov**
**Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (III kitab). Bakı, "Elm və təhsil", 2018, 520 səh.**

Monoqrafiyanın III hissəsində Umümmilli lider Heydər Əliyevin çıxışlarında nitqin ekspressivliyini yüksəltməyə xidmət edən etik və estetik mətnlər Azərbaycan dilinin imkanları hesabına araşdırma mövzusu olmuşdur. Müasir etikanın müxtəlif növləri, eləcə də estetik kateqoriyalar, incəsənətin ayrı-ayrı formaları böyük natiqin dilində tədqiqata cəlb olunmuşdur. Monoqrafiya dilçilik, fəlsəfə, diplomatiya, ədəbiyyat, tibb və digər sahələrdə fəaliyyət göstərənlər, nitq mədəniyyəti fənni tədris edən müəllimlər və filoloq tələbələr üçün dəyərli vəsaitdir.

**ISBN 978-9952-8176-6-9**

# ÖN SÖZ

Azərbaycan Tibb Universitetinin dosenti Nağdəli Zamanovun "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının III cildi oxucuların ixtiyarına verilmək üzrədir. Əvvəlki cildlərdə Heydər Əliyev nitqlərinin ekspressivliyini gücləndirən nitq ünsürləri (səmimiyyət, qətiyyət, nikbinlik, proqnozlar, fəlsəfi fikirlər, poetik duyğular), üslublar (elmi, publisistik, məişət, dini), əsas və köməkçi nitq hissələrinin üslubiyyat yaratması, frazeoloji birləşmələr, sinonimlər və s. ciddiyyətlə araşdırılmışdır. Bu cilddə isə müəllif Ulu Öndərin nitqlərini müşayiət edən etik və estetik mətnləri nitqin təsir gücünü artıran vasitələr kimi tədqiq etməyə müvəffəq olmuşdur. Müəllif haqlı olaraq etika və estetikanı dialektik qanunların şamil olduğu elm sahələri kimi ayırmış, Heydər Əliyev nitqlərinin təsir gücünü artıran etik və estetik elementləri şifahi, spontan söylənilən nitqlərdə aydınlaşdıra bilmişdir.

Azərbaycan xalqının əsrlərlə formalaşdırıb bu günə gətirib çıxartdığı etik dəyərlər Heydər Əliyevin dilində ciddi elmi-tədqiqata cəlb olunmuşdur. Zəngin siyasi natiqlik təcrübəsinə malik Heydər Əliyevin nitqində etik və estetik dəyərlərin araşdırılması bu yolda irəliyə doğru atılmış mühüm addımdır. Müəllifin qeyd etdiyi kimi şifahi, spontan söylənilən nitqlərdə etik və estetik mətnləri dinləyici şüuruna çatdıra bilmək Heydər Əliyev dühasına xasdır.

Tədqiqatçı bu dəyərlərin araşdırılmasında antik dövr filosoflarından üzü bəri təsəvvüf alimlərinin əsərlərinədək müraciət etmiş, siyasi natiqin nitqləri ilə maraqlı, monoqrafiyanı zənginləşdirən paralellər, müqayisələr aparmış, insani dəyərlərin ümumbəşəri olduğunu bir daha diqqətə çatdırmış, qlo-

ballaşan dünyada mili-dini ayrıseçkiliyin qəbuledilməzliyini ortaya qoymuşdur.

Dosent Zamanov etika və estetikanı siyasi lider nitqində haqlı olaraq ümumfəlsəfi qanunlara tabe olan ayrı-ayrı fənlər səviyyəsində təqdim edə bilib. Etik dəyərləri araşdırarkən müasir etikanın tələblərinə uyğun olaraq monoqrafiyada Heydər Əliyevin nitqləri dil etikası, dini etika, təhsil etikası, tibbi etika, ekoloji etika, etika və siyasət, hüquqi etika kimi fəsillərə ayırır. Maraqlısı odur ki, bütün bu "etikalar"ın sadə, anlaşıqlı bir dildə auditoriyalara çatdırılması müasir Azərbaycan dilinin imkanları hesabına araşdırılır.

Nağdəli müəllim haqlı olaraq təhsili etik kateqoriya hesab edir, təhsilə dövlət səviyyəsində önəm verən Ulu Öndərin təhsil işçiləri qarşısındakı çıxışlarında səslənən etik dəyərləri araşdırır. Təhsil-əxlaqımız, təhsil-mənəviyyatımız, təhsil-gələcəyimiz vəhdətini oxuculara etik mətnlərin köməyilə çatdırır.

Monoqrafiyada müasir etikanın başlıca istiqamətlərindən sayılan ekoloji etika, multikultural dəyərlər, tibbi etika fəsilləri də xüsusi maraq doğurur.

Dosent Zamanov ekoloji etika ilə bağlı Ulu Öndərin gah sadə cümlələrlə məişət üslublu, gah da publisistik üslubda ali kürsülərdəki çıxışlarını maraqlı müqayisələrlə oxuculara çatdıra bilib.

Monoqrafiyada tibbi etikaya xüsusi yer ayrılmışdır ki, bu müəllifin ixtisasca həkim olmasından, Azərbaycan Tibb Universitetindəki pedaqoji fəaliyyətindən irəli gəlir. Ulu Öndərin səhiyyə ocaqlarında, tibb ictimaiyyəti qarşısında olan çıxışları bu gün də həkim-xəstə münasibətlərində baş verən etik konfliktlərin həlli yolunda mühüm vasitədir. Müəllif bütün bunları elmi-publisistik bir dildə araşdıra bilmişdir.

Müəllifin istinad etdiyi ədəbiyyat siyahısına diqqət etdikdə Vətən və xarici ölkə alimlərinin bu sahələrdəki fikirlərinə

hörmətin, bu fikirlərə tənqidi yanaşmanın, məhz bu tənqidi yanaşma üsulu ilə Heydər Əliyev təfəkküründən süzülüb gələn nitqlərin araşdırılmasının şahidi oluruq.

Etika fəslində müəllif Aristotel və Kantın etik kredolarını təqdim edir, müqayisə edir, sonda isə Heydər Əliyevin XX əsr etik kredosunu oxuculara açıqlayır.

Bütün bu fəsillər şifahi söylənilən nitq prosesində dillə birgə araşdırılır. Bütün bu etik və estetik məqamlar nitq prosesinin tərkib hissəsi kimi oxuculara çatdırılır, etik və estetik mətnlər nitqin ekspressivliyini artıran nitq ünsürləri kimi araşdırılma obyektinə çevrilir.

Müəllif etika və estetikanı dialektik fəlsəfə qanunlarına tabe olan, ayrıca elm sahələri kimi oxuculara təqdim edə bilmişdir. Vətən və xarici alimlərə istinad olunan çoxsaylı ədəbiyyat siyahısı müəllifin monoqrafiyaya məsuliyyətlə yanaşmasından xəbər verir.

Dosent Zamanov böyük natiqin çıxışlarının söyləndiyi auditoriyaları sadalamaqla gələcək tədqiqatçılar üçün düzgün, optimal yol göstərmiş olur. Etik kateqoriyalardan (cəsarət, dostluq, sədaqət, ədalət) söhbət gedərsə Ulu Öndərin məişət üslublu nitqlərindən, əsasən də yubiley xarakterli çıxışlarından sitatlar gətirilir, mətnlər dilçilk baxımından şərh olunur. Belə ki, "dostluq" etik dəyəri müəllifə görə Heydər Əliyevin nitqlərində xüsusi çalarlar qazanır. Heydər Əliyev üçün dost milli təəssübkeşlik hissi zəngin olanlardır.

"Ədalət" etik və "ədalətsizlik" antietik dəyərlərə aid Ulu Öndərin nitqlərindəki mətnləri müəllif həm ümumetik dəyər kimi, həm də "hüquqi etika" prizmasından həll etməyə çalışmış və buna nail ola bilmişdir. Böyük natiqin bazar iqtisadiyyatı dövründə iqtisadi etika ilə bağlı islam dininin "halallıq" etik dəyərini işlətdiyi mətnlərdən ayıraraq, öz baxışlarını ortaya qoymuşdur.

Təhsil etikası fəslinə gəlincə bu zaman Heydər Əliyevin ali məktəblərə tələbə qəbulu ilə bağlı, orta məktəblərin açılışı, müəllimlər qurultaylarında söylənilən nitqləri mühüm yer tutur. Böyük natiqin nitqində dil etikası ilə əlaqədar mətnlər dilimizlə bağlı konstitusiya maddəsindəki dəyişikliklərə həsr olunmuş iclaslardan tutmuş xaricdə yaşayan soydaşlarımızla olan görüşlərədək öz əksini tapır. İqtisadi, bazar etikası məsələlərində yerli və xarici iş adamları ilə, sahibkarlarla baş tutan söhbətlərdə də bu cür mətnlərdən geniş istifadə olunur.

Etik, estetik mətnlərin nitqin auditoriyalara olan təsir gücünü artırmaqla, auditoriyaların natiqə olan sevgisini yüksəltmək məsələləri nitq mədəniyyəti sahəsində yenilikdir. Nitqdə ekspessivliyi yüksəltmək baxımından etik və estetik mətnlərdən ustalıqla istifadə etmək hər bir natiqə müyəssər olmur. Olmur ona görə ki, hər bir natiq bu fənlərə belə dərindən bələd deyil, bu sahədə öz üzərində işləmir.

Müəllif Ulu Öndərin nitqində müasir etikanın bir sıra növlərini tədqiq etməyə müvəffəq olmuşdur. Onun hər bir etika sahəsində müasir biliklərə istinad etdiyi məlum olur. Ekoloji etikadan bəhs edən müəllif ekologiya sahəsinə aid ədəbiyyatdan nümunələr gətirir, həmin nümunələri Heydər Əliyevin nitqləri ilə müqayisə edir, səlis, rəvan Heydər Əliyev dili ilə oxucularına ekoetikadan məlumat verir. Müxtəlif etik sahələrə aid Heydər Əliyev nitqlərini şərh edərək, Azərbaycan etik və estetik şüurunun formalaşmasında Heydər Əliyevin şəksiz rolunu seçmə nümunələrlərlə oxuculara çatdıra bilib.

Nağdəli müəllim estetik kateqoriyalar içərisində gözəlliyi əsasən qadın auditoriyasında, Beynəlxalq qadınlar günündə, faciəviliyi 20 Yanvar və Xocalı faciəsinə həsr olunan tədbirlərdə səslənən çıxışlar əsasında tədqiq etmiş, bu estetik dəyərləri dünya estetik fikri ilə uzlaşdıra bilmişdir. Müəllif incəsənətin çoxsaylı növlərini Ulu Öndərin çıxışlarında öyrən-

mişdir. Monoqrafiya ilə tanışlıq Heydər Əliyevin incəsənətin bütün növlərinə olan marağını, sevgisini üzə çıxarır. Böyük natiqin dilində incəsənətdə millilik, ümum-bəşərilik onun rəssamlıq, kino, teatr, eləcə də digər növlərində özünü göstərmişdir. Fəlsəfənin, sənətşünaslığın, etika və estetikanın tədqiqat obyekti olan, ilk baxışda kütlələrin anlamasında çətin görünən mətnlər Heydər Əliyevin çıxışlarında asan nitq üsulları ilə şüurlara çatdırılır. Bu üsullar içərisində dilçilik baxımından təkrarlar, sinonimlər, ritorik suallar, müqayisələr və ritorik fiqurlardan istifadənin önə çəkilməsi monoqrafiyada böyük natiqin nitq nümunələri əsasında araşdırılmışdır.

Tək-tək siyasi xadimlərin, ölkə başçılarının qismətinə yüksək səviyyədə bədii-estetik dünyagörüş əhatəliliyi, zənginliyi düşür. Heydər Əliyev belə dünyagörüşə malik olmaqla yanaşı, öz cazibədar nitqləri ilə bu dünyagörüşü formalaşdırırdı. Dosent Zamanovun qarşıya qoyduğu və mən deyərdim ki, ilkin mərhələdə nail olduğu budur. İnanırıq ki, sizlərə təqdim olunan "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının III hissəsinin hər bir yarımfəslində qarşıya qoyulan ciddi problemlər gələcəkdə tədqiqat obyekti olacaq, etika və estetika sahələrində fundamental elmi-tədqiqat işlərinin aparılmasına təkan verə biləcək.

**Nizami Cəfərov,**
***Akademik***

## MÜƏLLİFDƏN

***Hörmətli oxucu!***

Azərbaycan nitq mədəniyyətinin, xüsusilə siyasi natiqliyimizin inkişafında əvəzsiz rolu olan Heydər Əliyevin irsinin öyrənilməsi bu gün də, sabah da Azərbaycan dilçilik elminin qarşısında duran vacib məsələlərdəndir. Tərəfimizdən yazılıb işıq üzü görən ikicildlik "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasında Ulu Öndərin nitqlərinin müxtəlif tərəfləri 31 fəsildə araşdırılsa da, ekspressivlik yaratmaq baxımından bu nitqin etik və estetik tərəfləri tədqiqata cəlb olunmamışdır.

Monoqrafiyanın III hissəsi ilə bağlı ortaya maraqlı bir sual çıxa bilər. Etik və estetik kateqoriyalara böyük natiqin şəxsi münasibətinin Azərbaycan nitq mədəniyyətinə aidiyyatı nə dərəcədədir? Monoqrafiyanın I hissəsində nitqin gücünü artıran, ekspressivliyini yüksəldən nitq elementləri müəyyən bir çərçivədə öyrənilmişdir. Nitqin söylənildiyi auditoriyalar baxımından, ümumfəlsəfi qanunların da şamil olunduğu etik və estetik fikirlərin şifahi şəkildə söylənilməsi baxımından monoqrafiyanın bu hissəsi özünəməxsusluq qazanır. Elmi-texniki tərəqqinin yüksək vüsət tapdığı, qlobalizasiya adı ilə ziddiyyətli dünyamızda etik dəyərlərə, estetik kateqoriyalara müasir baxışın, Heydər Əliyev baxışının araşdırılması ciddi məsələlərdən sayıla bilər.

Monoqrafiyanın Sizlərə təqdim olunan III hissəsində Heydər Əliyevi böyük etik və ya böyük estet kimi təqdim etmək fikrindən uzağıq. Dediklərimiz öz əyani təsdiqini Ulu Öndərin 7 dekabr 2002-ci ildə Azərbaycan Akademik Milli Dram Teatrındakı çıxışında tapır: "Biz Azərbaycan teatrı ilə fəxr edirik. Mən bunu dəfələrlə demişəm. Siz bilirsiniz ki, Azərbaycan teatrının 100 illik yubileyində mən Respublika sarayında çıxış etmişəm. Sonra mənə dedilər ki, "Sən Res-

publkanın rəhbərisən, teatrşünas deyilsən, nə üçün məruzə edirsən?”. Dedim ki, məruzə etdim və hər halda, teatrşünaslardan pis etmədim. Bu, qəzetlərdə qalıbdır, arxivlərdən tapmaq olar”. Ulu öndərin nitqlərindəki etik və estetik mətn-fikirlər müstəqilliyimizin möhkəmlənməsinə, dövlətçiliyimizin qorunmasına yönələrək siyasi etika və siyasi estetikanın ölkədə inkişafını şərtləndirir.

Monoqrafiyada maraqlı məqamları Siz oxucularla bölüşmək qərarına gəldik.

“İkinci Dünya Müharibəsində – Böyük Vətən Müharibəsində Azərbaycandan gedən 300 min adam həlak oldu, geri qayıtmadı. ***Xatirimdədir***, bunu dəfələrlə deyiblər. Onların bəzilərinin öləndən sonra cibindən Səməd Vurğunun, Rəsul Rzanın şeirləri çıxmışdı. ***Demək***, şeir, şair sözü, yazıçı sözü hər şeydən ***təsirlidir***” [XIIIc.s.133]. “Demək” modalı ilə ədəbiyyatda sözün hansı cəsarətlərə gətirib çıxarması aydınlaşır. Bu məqamda ortaya haqlı bir sual çıxır: bəs lider sözü? Bəs Heydər Əliyev sözü? Bu sualların cavabı aşağıdakı mətndə aydınca verilmişdir: “Bu qiyamı qaldıran adamlar silahlanmışdılar, bunlar silahlı dəstələr idi, məndə isə ***heç nə*** yox idi. Mən televiziya ilə xalqa ***müraciət etdim*** və xalq məni müdafiə etdi. İki saatın içində Prezident Sarayının ətrafına ***yarım milyon*** adam toplaşdı. ***Düzdür***, onlar silahsız idilər, ***lakin*** onlara qarşı silah işlətmək mümkün deyildi” [XIIc.s.80]. Sözün kütlələrə olan təsirinin bundan bariz nümunəsini tapmaq çətindir. “Heç nəyi” olmayan liderin bir “müraciətinə” “yarım milyon” insanın toplanması xalqın öz liderinə inamın, etibarın nəticəsiydi. Və bu məqamda yenə də Aristotel “cəsarəti” yada düşür: “Cəsarət qoçaqlığa və qorxuya təsir edən şeylərlə də əlaqədardır, ancaq o, nə bu, nə də o biri ilə eyni dərəcədə əlaqədar deyil, lakin ən çox qorxu ilə bağlıdır. Doğrudan da, kim təhlükələr zamanı ***soyuqqanlı*** olub, özünün necə lazımdır elə aparırsa, ***o, daha cəsarətlidir, nəinki şəraitlə bağlı ürəklənib,***

***cəsarətli olan adam***. Deyildiyi kimi cəsarətli adamlara əzab-əziyyətə (mərdliklə) dözdüklərinə görə hörmət edirlər. Bax buna görə cəsarət əzab-əziyyətlə əlaqədardır və belə adam haqqına olaraq təriflənir; doğrudan da, əzab-zəiyyətə davam gətirmək, özünü həzdən saxlamaqdan daha çətindir" [10,s.88].

Bu gün Ulu Öndərin etika və estetika ilə bağlı dəyərli fikirləri həmin sahə alimlərinin stolüstü kitabı olmağa layiqdir. Hələ neçə-neçə nəsillər böyük natiqin nitqlərindəki milli dövlətçiliyin inkişafına yönələn dəyərli ideyaları mənimsəməlidirlər.

Monoqrafiyada bir daha siyasi xadim nitqində, diplomat nitqində etik və estetik dəyərlərdən istifadənin Heydər Əliyevin nitq üslubunda nə dərəcədə müvəffəqiyyət qazanmasını göstərməyə çalışmışıq.

Heydər Əliyev Müslüm Maqomayevin Azərbaycana həsr etdiyi mahnını himn adlandıraraq onun yaranma tarixindən danışır, "amma" qarşılaşma bağlayıcısı və "heç kim" inkar əvəzliyinin köməyi ilə bu mahnının Müslüm Maqomayevdə olduğu kimi ifa oluna bilməməsini prinsipial mövqedən açıqlayır. "Elə" ədatı ilə estetik təsiri dəfələrlə gücləndirir, mahnının ifasını auditoriyanın diqqətinə çatdırır. Maraqlı məqam kimi antietik dəyərə malik söz və ifadələrlə şeirdə, yazıda, nitqdə müsbət mənada estetiklik yaratmaq yolları müqayisə olunmuşdur. Azərbaycan dilinin zəngin imkanları hesabına ilk baxışda antietik görünən söz və söz birləşmələri yüksək bədii-estetik təsir gücü qazanır. Azərbaycan aşıq sənətinin XIX əsrdə görkəmli söz ustası Aşıq Ələsgərin dilində:

Dərdim çoxdur dindərməyin həzarat,
Məni bir alagöz ceyran ***öldürür***. [12]

Belə estetik zövqyaratmaya Səməd Vurğun poeziyasında da rast gəlirik:

Yenə ***qılıncını çəkdi üstümə***,
Qurbanı olduğum o ala gözlər.

Bədii ədəbiyyatda antietik dəyərlərin estetik zövq yaratması ən çox aşıq yaradıcılığında təsadüf olunur. "Nainsaf, bimürvət, zalım" anlayışlarını gözəllərə aid etmək, gözəllər tərəfindən də rəğbətlə qarşılana bilmək ziddiyyətini yaratmaq xalqın yüksək söz zənginliyini özündə daşıyan ustad sənətkarlara aiddir. Aşıq Şəmşir şeirində olduğu kimi:

***Nainsaf, bimürvət, zalım*** gözəlim,
Sənsən mənim sevgim, axır-əzəlim.
Qulluğunda bəs nə qədər nəzəlim,
Di bax, gör Şəmşirin bir tabı varmı?! [13]

Və siyasi xadim nitqində "Ancaq onun ən görkəmli mahnısı Azərbaycana həsr etdiyi mahnıdır. Bu mahnı Azərbaycanın himni kimi səslənir. O həmin mahnını, musiqini 1970-ci illərin ortalarında gözəl şairimiz Nəbi Xəzrinin sözlərinə bəstələmişdir. Amma ən başlıcası budur ki, Müslüm bu mahnını elə yaratmış, elə ifa etmişdir ki, onu ***heç kim*** belə ifa edə bilmir. Yaxşıdır ki, o bu mahnını belə ifa edir, ***amma pisdir*** ki, bunu heç kim onun kimi oxuya bilmir. Ona görə də heç kim onu oxumağa cürət etmir. Bu, müstəsna mahnıdır". Özündə antietik dəyər daşıyan ***"pis"*** ifadəsi ilə Müslüm Maqomayev sənətinin ecazkarlığı nümayiş etdirilir.

***Dəyərli oxucu!***

Araya-ərsəyə gələn bu üçcildlik monoqrafiyada anladıqlarım: Ali məktəblərdə, eləcə də kütləvi oxucu auditoriyası üçün çətin, anlaşılmaz görünən elm sahələri kimi etika, estetika fənləri, etik və estetik kateqoriyalar Ulu Öndərin nitqində nə qədər anlaşıqlı, nə qədər sadə xalq dilində şüurlara

yönəlmişdir. Onilliklər boyu elmi dilin çətinliyini, hər kəsin anlamaq iqtidarında olmamasını aşıladılar. Xalqı elmi-fəlsəfi cəhətdən düşünmək hissindən məhrum etməyə cəhd etdilər. Heydər Əliyev nitqlərində etik və estetik anlayışların araşdırılması aşağıdakı qənaətlərə gəlməyimə səbəb oldu: "Böyüklük elə özü qədər də sadəlik deməkdir", "Ən böyük elm, elə hamı tərəfindən ən tez başa düşülənidir".

Heydər Əliyev nitqlərinin bir mühüm xüsusiyyəti odur ki, böyük natiq çıxışlarını bir qrup üçün yox, ölkə əhalisi üçün ünvanladığını bildiyi üçün trubunadan maksimum yararlanmağa çalışır və buna da nail olur. Qohumlararası nikahın nə dərəcədə zərərli olduğunu başqa dinlərə mənsub olan xalqlar timsalında eyni bir fikri müxtəlif formalarda xalqın şüuruna yönəldə bilir. 1999-cu ildə "Naxçıvanda akademik Zərifə Əliyeva adına adına poliklinika"dakı nitqində biz bunun şahidi oluruq. Ruslarda, xristian dininə mənsub olanlarda "Bu adət yoxdur, qadağandır" və "Dini adət-ənənələri yol vermir" fikirləri bir neçə yerdə nitqin gözəlliyini pozmadan müxtəlif formada təkrarlanır. Ənənələrin əməli nəticələrini bir tibb mütəxəssisi kimi açıqlayır. Milyonlar auditoriyası üçün xəstəlikləri sadalayır, acı və ağır da olsa gələcək törəmələrdə bu xəstəliklərin üzə çıxacağını bircə-bircə açıqlayır: "Amma onu bilin ki, xristianlarda bu adət yoxdur, qadağandır. Məsələn, ruslarda bu adət *yoxdur*, ***qadağandır***. Ona görə də onlarda bu problem yoxdur. Amma bu problem onlar yaxşı bilirdilər. Mənim bu danışıqlarımdan onlar başa düşürdülər ki, mən rus xalqı üçün maraqlanmıram. Çünki rus xalqında belə adət ***yoxdur***. Orada qohum qohumla evlənə bilməz. Onların dini, adət-ənənələri buna ***yol vermir***. Kimsə evlənirsə, ola bilər, bu, sadəcə hadisədir. Amma dini adət-ənənə buna ***yol vermir***. Ancaq bizdə bu problem var idi və mən onların da fikirlərini öyrəndim. Sonra bildim ki, bir çox sahələrdə tədqiqatlar aparılıbdır. Bir çox xəstəliklərin, ***xüsusən***, yenə də deyirəm, əqli

xəstəliklərin, şüur xəstəliklərinin, göz xəstəliklərinin, başqa xəstəliklərin kökü qohumların nikah bağlamasından irəli gəlir. Yəni bundan onların özləri xəstələnmir, ***amma*** onlardan törəmiş uşaqlar xəstələnir. Bəlkə öz övladı xəstələnmir, ***amma*** nəvəsi xəstələnir, o biri törəməsi xəstələnir".

Dillə bağlı Heydər Əliyevin müxtəlif üslubların çulğalaşdığı nitqinin şahidi oluruq. "Azərbaycan dili!" xitabı, "Azərbaycan dilinin nə qədər şeirə bənzədiyini, xoş ahəngli olduğu" bədii ifadələri, "Dil hər bir millətin milliliyinin əsasıdır" publisistik cümləsi, dilçilikdə əsas elmi termin kimi "dil"dən istifadə olunması bu sıradandır. Təkcə "dil" terminini həcmcə kiçik, məzmunca çox zəngin bir mətndə 15 məqamda təkrar şəklində işlədərək dilə olan ilahi sevgisini izhar edir: "***Azərbaycan dili!*** Bu gün iftixar hissi ilə deyə bilərik ki, Sovet hakimiyyəti illərində biz Azərbaycan ***dilini*** qoruduq, saxladıq və inkişaf etdirdik. Azərbaycan ***dili*** indi çox yüksək səviyyədə, yəni onun qrammatik quruluşu, başqa sahələri yüksək səviyyədə olan bir ***dildir***. Sizə deyə bilərəm ki, başqa ölkələrdə müxtəlif ***dillərə*** mənsub olan insanlar Azərbaycan ***dilini*** sadəcə eşidərək, onun mənasını o qədər bilməyərək, ***Azərbaycan dilinin nə qədər şeirə bənzədiyini, xoş ahəngli olduğunu*** dəfələrlə qeyd ediblər. Biz dilimizlə fəxr etməliyik. ***Dil hər bir millətin milliliyinin əsasıdır.*** Ona görə də hər bir gənc öz ana ***dilini***, Azərbaycan ***dilini***, müasir Azərbaycan ***dilini*** gərək ən incəliklərinə qədər bilsin və bu ***dildən*** istifadə etsin. Biz müstəqil Azərbaycanda Azərbaycan ***dilini*** dövlət ***dili*** etdiyimiz kimi, cəmiyyətimizdə də, xalqımızın içində də Azərbaycan ***dilini*** mütləq hakim ***dil*** etməliyik" [XXVIIIc.s.247].

Elmi cəhətdən ilk baxışda çətin görünən etik dəyərlərin Heydər Əliyevin nitqində araşdırılması mühümdür. Ekoloji etikanın böyük natiqin auditoriyalara ünvanlanan şifahi, spontan nitqlərində dəyərləndirilmişdir. Azərbaycan dilinin zəngin imkanları hesabına ekoloji elementlərin düzgün, dəqiq

təsviri, bir sıra hallarda sadə məişət üslubunda ekoloji problemlərin həlli yolundakı elmi konfranslarda, sessiyalarda elmi publisistik üslubda söylənilən çıxışlar ekoloq-mütəxəs-sislər üçün, ekologiya sahəsində fəaliyyət göstərən əməkdaşlar üçün dəyərli nitq nümunələridir.

"Ədalət" etik kateqoriyasına olan münasibət Azərbaycan fikir tarixində yeni bir şey deyildir. Dövlətin idarə olunmasında, hüquqi dövlət quruculuğu yolunda ədalət etik kateqoriyasının dövlət başçısı nitqində yer alması təbii sayılmalıdır.

"1947-ci ildə Nizami Gəncəvinin 800 illik yubileyi keçirildi. ***Xatırlayın***, o vaxta qədər Azərbaycan xalqı Nizamini nə qədər tanıyırdı, yaxud dünya nə qədər ***tanıyırdı***? Tədqiqatçılardan, alimlərdən, yazıçılardan və mədəniyyətlə, ədəbiyyatla məşğul olan adamlardan başqa, ölkəmizdə Nizami bu qədər tanınırdımı, xalqımız, insanlar Nizaminin əsərlərini ***oxuyurdularmı***? Dünya tanıyırdımı ki, Azərbaycanın Nizami Gəncəvi kimi böyük bir şairi, yazıçısı, mütəfəkkiri, filosofu, alimi var? ***Yox***. Təsəvvür edin, əgər 1947-ci ildə bu yubiley keçirilməsəydi, Nizaminin əsərləri o vaxt Azərbaycan dilinə tərcümə olunmasaydı, kitabları nəşr edilməsəydi, portreti yaranmasaydı, heykəli qoyulmasaydı, Nizaminin adı əbədiləşdirilməsəydi və 1947-ci ildən sonra Nizaminin adı dünyaya geniş yayılmasaydı, Azərbaycan tarix, mədəniyyət, elm cəhətdən bu qədər zəngin olacaqdımı? Yox!" [XIXc.s.429-430].

İlk baxışda daş üzərində, mərmər üzərində insan xarakterini verə bilmək, öz yaratdığı əsərdə milli kaloriti əks etdirə bilmək kimi qabiliyyətə malik olmağı heykəltəraşlar qarşısında tələb qoyur. Sənətdə yüksəlişin yolu mənəviyyatca pak və təmiz olmaqdan keçir. "Elə" qüvvətlənirici ədatının köməyilə "daş"ı, "mərmər"i parçaya bənzədir.

Heykəltəraş işinin mühüm və müəyyən cəhətlərini bu sahə ilə əlaqəsi olmayan, bu işlərdə səriştəsi az olan auditoriya üçün rəvan bir dillə anladır. Auditoriya sanki qarşısında me-

marlıq fakültəsinin mühazirə oxuyan, bu fənnin sirlərini anladan mütəxəssisi görür – böyük rəssamlar, heykəltəraşlar əsərin ümumi konsepsiyasını, kompozisiyasını verirlər. "Heykəltəraş kimi, Ömərin bir xüsusiyyəti də ondan ibarətdir ki, özü həm yaradır, həm də fəhləlik işini görür. O, həm böyük *heykəltəraşdır*, həm də çox zəhmətkeş bir *fəhlədir*. Çox, həddindən artıq nadir bir insandır. Çünki bəzən böyük rəssamlar, heykəltəraşlar əsərin ümumi konsepsiyasını, kompozisiyasını verirlər, sonra onların köməkçiləri bu işi başa çatdırırlar. Amma bu adam bilavasitə özü işləyir. Bunların ha-mısını ***incəliklərinə*** qədər yonmaq nə qədər çətin işdir! Bu, daşdır, mərmərdir, amma elə bil ki, parçadır. Mərmərə, daşa bu qədər incəlik vermək böyük məharətdir, böyük ustalıqdır. Mənəviyyatca ***pak***, ***təmiz*** insanlar həmişə yüksək zirvələrə qalxıblar".

Monoqrafiyanın oxucularımızın ixtiyarına verilməsində çalışdığım ATU-nun rəhbərliyinə, elm məbədi sayılan kitabxanalarımızın – Axundov adına Milli Kitabxana, Prezident Kitabxanası, AMEA-nın Mərkəzi Elmi Kitabxanası, Azərbaycan Tibb Universitetinin Əsaslı Kitabxanasının əməkdaşlarına, Aşıq Şəmşir Mədəniyyət Ocağı İctimai Birliyinə, tədqiqatla bağlı məqalələrin çap olunduğu elmi jurnalların redaksiya heyətlərinə, monoqrafiyanın I və II hissələrinə rəy verən ziyalılarımıza, kitabın işıq üzü görməsində dəyərli məsləhətlərini verən Prezident Administrasiyası ictimai-siyasi şöbənin və AMEA-nın Dilçilik İnstitutunun əməkdaşlarına, elmi redaktora, rəyçilərə, ön söz müəllifinə, texniki heyətə, "Elm və təhsil" nəşriyyatının kollektivinə və nəhayət bu kitabların formalaşmasında mənəvi dəstəklərini əsirgəməyən doğma insanlara, eləcə də "Dizini bərkit, Heydər Əliyev adına layiq əsərlər yaz" deyən Kəlbəcər rayonu 58 saylı tam orta məktəbin müəllimi Famil Hacı Tapdıq oğlu Zamanova minnətdarlıq edir, həmin kollektiv və şəxslərə möhkəm cansağlığı, səadət arzulayıram.

Tədqiqat planımızda gələcəkdə Heydər Əliyev nitqlərinin psixoanalizi durur ki, bu analiz üçün öncə nitqin ekspressivliyini yüksəldən nitq elementlərinin öyrənilməsi vacibdir. Məhz bu nitq elementlərini – səmimiyyət, qətiyyət, nikbinlik, proqnoz, poetik duyğular, fəlsəfi fikirlər – öyrəndikdən sonda dahi şəxsiyyətin təfəkkür süzgəcindən süzülüb gələn, auditoriyaya yönələn nitqlərinin psixoanalizinə keçmək mümkün olar. Bu baxımdan Heydər Əliyevin müxtəlif çıxışlarında etik və estetik dünyagörüşlə bağlı mətnlər tədqiqata cəlb olunmuşdur.

Heydər Əliyev nitqlərinin araşdırılması gənc diplomatlar üçün dil baxımından, siyasi etika və dil etikası bölmələri xüsusi maraq doğurmalıdır. Monoqrafiya ekoloji xidmət sahəsinin əməkdaşları, tibb və sosial sahə əməkdaşları, dini qurumlarda, ilahiyyatla bağlı qurumlarda çalışanlar üçün dəyərli stolüstü kitab sayıla bilər.

***Dəyərli oxucu!***

Bircə məsələni sizlərin diqqətinə çatdırıram ki, Heydər Əliyevin nitqlərinin sehrinə düşmək çox asan, bu nitq cazibəsindən çıxmaqsa mümkünsüzdür. Bu gün dilimizi sevənlərin, ədəbiyyatımızı sevənlərin, nitqimizi sevənlərin bu nitq cazibəsindən heç çıxmaq niyyətləri də yox!

Allahın köməkliyi ilə Sizlərlə növbəti görüşlərimiz Ulu Öndərin nitqlərində frazeoloji birləşmələrin izahlı lüğəti, diskurs problemlərinin həlli yolları olacaqdır. Bu görüş – monoqrafiyalarda Azərbaycan dilinin varlığını özündə əks etdirən frazeoloji birləşmələrin hansı situasiyalarda, hansı ekspressivlikdə işlədilməsini müşahidə edəcək, bu ecazkar nitqlərin yenidən sehrinə düşəcəyik. ***İnşallah!***

**Nağdəli Zamanov**
***Azərbaycan Tibb Universitetinin dosenti,***
***tibb üzrə fəlsəfə doktoru***
***AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun dissertantı***

# I FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ ETİKA

## 1.1.Heydər Əliyevin nitqində etik anlayışlar

Azərbaycan nitq mədəniyyətinin, xüsusilə Azərbaycanın siyasi natiqliyinin inkişafında rolu əvəzsiz olan Heydər Əliyevin irsi bu gün də, sabah da öyrənilməyə layiqdir. Tərəfimizdən işıq üzü görən ikicildlik "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyalarında Ulu Öndərin nitqləri 31 fəsildə araşdırılsa da, bu nitqin etik və estetik tərəfləri əsasən öyrənilməmişdir [130, 131]. Yarımfəsildə mənəviyyatımızın inkişafına kömək edəcək etik-əxlaqi dəyərlərin müxtəlif auditoriyalarda böyük natiqin dilində necə səslənməsini oxucularımızla bölüşmək qərarına gəldik.

Etik dəyərlər tarixən dövlət, dövlətçilik, demokratiya anlayışları ilə dialektik vəhdətdə olub [65, 75, 90, 147, 194, 198]. Bu cür dəyərlər ulu öndərin çıxışlarında sadə cümlələrlə, publisistik üslubda xalqa çatdırılır: "Nə üçün indi hesab erliyək ki, bura kimin üçünsə vətəndir, kimin üçünsə vətən deyil? Azərbaycan bir respublika kimi, indi bir müstəqil dövlət kimi, öz ərazisində yaşayan hər bir şəxs üçün bərabər vətəndir. Hər bir şəxs bərabər hüquqlu vətəndaşdır. Burada şübhə olmasın və bu barədə olan əyintiləri, bu barədə olan qanunsuzluqları, ədalətsizlikləri biz aradan götürəcəyik, ancaq yenə də bir şey qanunsuz olursa, o biri qanunsuz işlə qanunsuzluğu aradan götürmək olmaz. Bir şey ədalətsizliklə olubsa, ***ədalətsizliklə*** ədaləti bərpa etmək olmaz. ***Ədaləti bərpa*** etmək lazımdır. Qanunsuzluğu aradan qaldırmaq lazımdır. Qanunsuzluğa qanunsuzluqla cavab vermək lazım deyil" [Ic.s.75].

Nitq prosesində Ulu Öndərin yerli-yerində işlətdiyi etik mətnlər dilçilik nöqteyi-nəzərindən araşdırılma mövzusu

olmamışdır. Bu yarımfəsildə mənəviyyatımızın inkişafına kömək edəcək etik-əxlaqi dəyərlərin müxtəlif auditoriyalarda böyük natiqin dilində necə səslənməsini oxucularımızla bölüşmək qərarına gəldik. Bu sahədə "Etikanın aktual problemləri" adı altında AMEA-nın Fəlsəfə İnstitutunun mütəmadi çap etdirdiyi konfrans materiallarından [29] istifadə olunmuşdur.

Böyük natiqin nitqlərində antidemokratik, antietik dəyərlərə – "hərc-mərclik", "öz-başınalıq", "xaos"a – qarşı "yüksək mədəniyyət", "nizam-intizam", "həmrəylik", "hörmət", "sayğı", "qayğı" kimi demokratik və etik dəyərlər qoyulur: "***Demokratiya*** hərc-mərclik deyildir, özbaşınalıq deyildir, xaos deyildir. ***Demokratiya*** yüksək mədəniyyət, yüksək nizam-intizam, vətəndaş həmrəyliyi, vətəndaşların bir-birinə hörməti, dövlət orqanlarına hörməti, dövlətin vətəndaşlarına hörməti, sayğısı və qayğısıdır. Bunların əsasında biz Azərbaycanda demokratik dövlət qurmaq yolu ilə gedirik və demokratik cəmiyyət təşkil olunmasını istəyirik" [Ic.s.146]. Ulu Öndərin nitqlərində tez-tez "ədalət", "ədalətsizlik", "qanun", "qanunçuluq" kateqoriyalarına təsadüf edirik. Bu bir daha etik dəyərlərlə dövlətçilik arasındakı dialektik vəhdətdən xəbər verir. Qədim yunan filosofu Aristotelin [11] bu kateqoriyalara verdiyi qiymətlər yada düşməyə bilmir: "Əgər, biz bildiyimiz kimi, qanunu pozan şəxs ***ədalətsiz*** adamdırsa, qanunun yolunu tutub gedən şəxs isə ***ədalətli*** admdırsa, aydındır ki, qanun çərçivəsi daxilində olan bütün işlər müəyyən mənada ədalətlidir. Doğrudan da, qanunvericilikdə nəzərdə tutulanların hamısı qanunauyğunluqdur, bu qərarların hər birini isə biz ədalətli, yəni haqq hesab edirik". Qətiyyətlilik böyük natiqin çıxışlarında bir tərəfdən nitq elementidirsə, digər tərəfdən etik anlayış kimi səslənir: "***Heç kim*** məni devirə bilməz. Mən bunu xalqın qarşısında deyirəm. Mən xalqın iradəsini yerinə yetirirəm. Azərbaycan Respublikasının dövlətçiliyini müdafiə edirəm, onun bütövlüyünü

müdafiə edirəm. Bu yolda məni ***heç kəs*** sındıra bilməz, çəkindirə bilməz, ***heç kəs*** qorxuda bilməz". "Heç kim", "heç kəs" inkar əvəzlikləri ilə əzmkarlıq və qətiyyət nümayiş etdirilir. "heç kəs ...bilməz" ifadələrinin təkrarı isə bu qətiyyəti yaddaqalan edir.

Heydər Əliyev dühasına xas olan millilik etik anlayışlarda da özünü göstərir. Belə ki, "milli qüdrət", "milli şərəf" kimi ifadələr tez-tez işlədilir: "Xalqımız yanvarın 20-də öz ***milli qüdrətini, milli şərəfini***, namusunu qoruyaraq şəhidlər verdi. Cəbhələrdə Azərbaycan xalqı öz torpaqlarını, öz ərazisini, öz müstəqilliyini qoruyaraq şəhidər verir".

Müasir etikada [156] filosoflar və teoloqlar yüksək inkişaf tapmış dini sistemlərin-iudaizm, xristianlıq və islam-mübahisə doğurmayan, təsiredici əxlaqi məzmuna malik olduğunu birmənalı qəbul edirlər. Bu məzmun antik etik konsepsiyaların üzərində yüksəlir. Dünya əhalisinin əksəryyəti Allaha inanır ki, İslamın elə bu əxalqi məzmunu böyük natiqin dilində auditoriyalara yön alır: "İslam dini həmişə insanları saflığa, təmizliyə, ülvi mənəviyyata dəvət etmişdir. Qurani-Kərim insanları düzlük, mənəvi paklıq ruhunda tərbiytə edir. Müstəqil Azəraycan Respublikasının bu ağır, çox çətin keşməkeşli dövründə bütün bunların bizdən ötrü böyük əhəmiyyət vardır" [IIc.s.144].

Heydər Əliyevin dini üslublu çıxışlarında auditoriyalar dini sistemlərin etik nüvəsi ilə tanış olur. Mühüm etik kateqoriya olan mənəviyyatın inkişafında İslam dininin xüsusi rolu sadə, anlaşıqlı bir dildə çatdırılır: "İslam dini əsrlər boyu bizim mənəviyyatımızın əsasını təşkil etmiş müsəlmanların dünyada layiqli yer tutmasını təmin etmişdir. Qurani-Kərimin bütün kəlamları bu gün Azərbaycanda Allahın yolu ilə getməyimiz üçün məşəldir. Biz bu yolla gedirik və gedəcəyik" [IIc.s.46].

Yunan filosofu Sokrat əxlaqlı olmağı və yaxşı bir həyat sürməyi bilik sahibi olmaqla eyni tutmuşdur. Onun fikrincə insanın qeyri-əxlaqi bir hərəkət etməsi bütövlükdə biliksizlikdən qaynaqlanır. "Əsrlər boyu inkişaf etmiş dünya sivilizasiyası möhkəm təhsil və elm üzərində qurulmuşdur, yüksək tərbiyə üzərində qurulmuşdur. Mən bizim gənclərimizi də bu yola dəvət edirəm. Güman edirəm ki, müstəqil Azərbaycan Respublikası gənclərinin yolu da bu yoldur, onlar bu yolla getməlidirlər. Biz də bu yolla getməkdə sizə kömək edəcək, şərait yaradacağıq" [IIc.s.147].

Mənəviyyat məsələləri Heydər Əliyev çıxışlarının ana xəttidirsə desək yanılmarıq: "Gənclərin tərbiyəsində milli, dini adət və ənənələrimizdən istifadə etmək lazımdır. Əsrlərin dərinliyindən bu günə gəlib çatan adət-ənənələrimiz həmişə adamları saflığa, təmizliyə dəvət etmişdir. Milli və dini adət-ənənələrimiz məhz bu prinsipə əsaslanır. Bu gün biz də gəncləri ***paklıq, saflıq, yüksək əxlaq, yüksək mənəviyyat*** ruhunda tərbiyə etməliyik. Bununla biz nəinki cəmiyyətimizi qoruyacağıq, həm də gələcək nəsli sağlam saxlayacaq və həmin nəsildə cəmiyyətimiz, xalqımız üçün zərərli halların kök salmasının qarşısını alacağıq. Bir də təkrar edirəm, cinayətkarlıqla mübarizə, gənclərin sağlam ruhda tərbiyə olunması üçün hər kəs öz sahəsində lazımi tədbirlər görməlidir". Buradan göründüyü kimi Heydər Əliyev əxlaqi dəyərləri kənarda yox, elə özümüzün milli, dini ənənələrimizdə axtarmağı tövsiyə edir. Və bu əxlaqi dəyərlər sinonim cərgələrin − "paklıq", "saflıq", "yüksək əxlaq", "yüksək mənəviyyat" − işığında özünə yer tapır. Elə bu dəyərlərin həyatda özünə yer almasında qətiyyətli ifadələr işə düşür. "Tərbiyə etməliyik", "tədbirlər görməlidir", "qarşısını alacağıq" kimi feilin lazım şəkli və feilin qəti gələcək zamanında işlənən ifadələrlə nitq yekunlaşır.

Etik dəyərlər böyük natiqin dilində vidalaşma mərasimlərində, məişət üslublu çıxışlarda da səslənir. Azərbaycan neft sənayesinin təşkilatçılarından biri, Dövlət Mükafatı Laureatı, Sosialist Əməyi Qəhrəmanı Qurban Abbasovla vidalaşma mərasimindəki çıxışda təvazökarlıq etik dəyərini "şöhrət dalınca getmək", "özünü qabağa salmaq", "özünü gözə soxmaq" antietik dəyərlərə qarşı qoyur: "...Dövlətin neft problemlərinin həllində Neftçi Qurban fəal iştirak edirdi. Mən bunların da şəxsən şahidiyəm. Bütün bunlarla yanaşı, bir daha deyirəm ki, o çox təvazökar bir adam idi. Şöhrət ***dalınca getmək***, yaxud özünü ***qabağa salmaq***, gördüyü işləri nəzərə çarpdırmaq, ***özünü gözə soxmaq*** − bunlar ona xas olan xüsusiyyətlər deyildi".

Mühüm bir etik kateqoriya hesab olunan cəsarət haqqında Aristotel deyirdi: "Belə ki, cəsarətli, sözün əsl mənasında, görünür, o adamdır ki, o, ən gözəl ölümü və insanı ölümlə hədələyən hər bir şeyi qorxu bilmədən qarşılayır. Daha sonra cəsarət müəyyən fəaliyyəti seçib, o şeyin qarşısında duruş gətirir ki, o, çox gözəl şeydir, yaxud ona görə ki, bunun əksinə hərəkət etmək rüsvayçılıqdır" [10,s.81]. Aşağıdakı mətndə bu kateqoriyanın bariz nümunəsinə böyük natiqin nitqində şahid oluruq: "Mən demişəm və bir də deyirəm, ömrümün bundan qalan hissəsini xalqıma bağışlamışam. Xalqım da bundan nə qədər istifadə edəcək, o qədər də istifadə edəcək. Ola bilər beş gün olsun, ola bilər bir ay olsun, ola bilər ondan çox olsun, ondan da artıq olsun. Ona görə Əlikram kimi adamların məni hədələməyi, bir onun yox, ümumiyyətlə, məni hədələyən adamların hamısına deyirəm, ***heç birisi*** güman etməsin ki, bu hədələr məni bir şeydən çəkindirə bilər. Xalqın yolunda mən özümü qurban verməyə hazıram, bu harada baş verəcək, mənim üçün fərqi yoxdur. ***Ancaq*** bu cür tərbiyəsizlik, bu cür ədəbsizlik şübhəsiz ki, məni narahat edir" [IIc.s.234].

Bu gün bazar mühitində etik problemlərin təhlili əsas problemlərdəndir. Etik problemlər çağdaş dövrümüzdə həm biznes, həm də əxlaq sahəsində mühüm əhəmiyyət kəsb edir. Burada da xüsusi etik fəlsəfi kitablarla yanaşı Ulu Öndərin nitqlərinə ciddi nəzər yetirmək kifayətdir. Gözəl bir üslubda, rəvan və səlis bir dillə sahibkarlar auditoriyasına yönələn nitq bu sıradandır: "Dünyada hər şey ***halallıq istəyir, təmizlik, düzlük*** istəyir. Keşmişdə bizim Azərbaycanda da böyük sahibkarlar, böyük mülk sahiblərinin əksəriyyəti, – deyə bilərəm hamısı – halal yolla, halal qazandığı pulla mülk sahibi olub, sahibkar olub".

Növbəti çıxış mərhələsində isə biz dövlətçiliklə iqtisadi etika arasındakı münasibətləri dövlət başçısının dilindən eşidirik: "Qanun nə cür pozulur? Qanunu pozan təkcə iş adamı deyil ki, qanunu pozan eyni zamanda o qanunun keşiyində durandır. Onlar əlaqəyə girəndə qanun pozulur. Əgər onlar əlaqəyə girməsələr qanun pozulmaz, sahibkar da düz yolla gedər. ***Amma*** sahibkar görəndə ki, bir dövlət orqanından istifadə etmək olar, onunla əlaqəyə girib gəlirin bir hissəsini ona verib, bir hissəsini özündə saxlamaq olar,-onda o yola gedir. Amma görəndə ki, gömrük orqanı, vergi orqanı, başqa dövlət orqanı, hüquq-mühafizə orqanları belə çirkin yollara getmirlər, onda sahibkar da düşünəcək ki, niyə mən əyri yollarla getməliyəm, elə düz yolla gedim, az qazanım, amma halal qazanım. Ona görə də mən sahibkara bu tövsiyəni verərkən, eyni zamanda dövlət orqanlarından tələb edirəm və ***qəti tələb edirəm*** ki, sahibkarlığın inkişaf etdirilməsi üçün indiyə qədər yaradılan və mövcud olan əngəllər aradan götürülsün, sahibkarlara onların normal fəaliyyət, qanuni fəaliyyət göstərməsi üçün şərait yaradılsın, kömək edilsin".

Heydər Əliyevin nitq və çıxışlarında səslənən etik anlayışların, kateqoriyaların qloballaşma dövründə dərindən öyrənilməsi zərurəti meydana çıxır. Böyük natiqin bu sahədəki

çıxışları etik dəyərlər, hüquq normaları və dövlətçilik dialektik vəhdətinin inkişafı baxımından çox vacibdir.

“Əgər bazar olmasa, həyat da olmaz” ifadəsi, “nə üçün”lə başalayan ritorik sualı, “yox” inkar ədatı ilə Heydər Əliyev bu gün formalaşan iqtisadi etikaya lakonik, məntiqə söykənən cavab verir: “Ticarət isə hər yerdə ticarətdir. Biri supermarketdə alver edir, digəri dükanda, üçüncüsü bazarda – hər yerdə alver edirlər. ***Əgər*** bazar olmasa, həyat da olmaz. Onlar məhz ən çalışqan insanlardır, Moskvada, – mən burada neçə illər yaşamışam, – qışda, iyirmi dərəcə şaxtada bazarda piştaxta arxasında bir neçə saat ayaq üstə dayanıb nə isə satmaq çox ağır zəhmətdir. ***Nə üçün*** hesab etməliyik ki, onlar bizi gözdən salan insanlardır? ***Yox***!” [XXVIIIc.s.258].

Regiona görə insanları təsnif etmək kimi antietik dəyərlərdən uzaq olmağı da biz Ulu Öndərin dilindən eşidirik: “Bir dəfə Yuri Lujkov Bakıya gəlmişdi. Mən ona dedim ki, xahiş edirəm, “Qafqaz millətindən olan şəxslər” ifadəsinə son qoyun. Əvvəla, bu, təhqiramizdir. Qafqaz millətindən olan şəxslər nə deməkdir? Qafqaz təkcə bizim ***regionun*** deyil, dünyanın gözəl bir güşəsidir. Qafqaz bir çox görkəmli insanların vətənidir. Qafqaz bir çox qəhrəmanların vətənidir. Siz nə istəyirsiniz?” [XXVIIIc.s.258-259].

“Bəli” təsdiq ədatı ilə azərbaycanlıların islam dininə mənsubluğunu bir daha geniş auditoriyalar üçün təsdiqləyir, “əlbəttə” qəti təsdiq modal sözü və “məhz” dəqiqləşdirici ədatı ilə dini tolerantlığı diqqətə çatdırır. Bu zaman tolerantlığın sinonimi kimi “dözümlülük” terminini işlədərək bir daha dil etikasına qayıdır: “Ümumiyyətlə, biz öz mənşəyimizi, öz milli mənşəyimizi və dini mənşəyimizi heç vaxt unutmamalıyıq. ***Bəli***, əcdadlarımız islamı hələ VII əsrdə qəbul etmişlər. İslam bir çox yüzilliklər ərzində xalqımızın həyatının mənəvi əsası olmuşdur. Biz başqa dinə tapına və ya onu qəbul edə bilmərik. ***Əlbəttə***, bizim Azərbaycanda üç konfessiya – müsəl-

man, islam, pravoslav xristian və yəhudi konfessiyaları var. Yeri gəlmişkən, çoxları təəccüblənir ki, Azərbaycanda üç konfessiya belə dostcasına fəaliyyət göstərir. Biz ***məhz*** belə xalqıq, təkrar edirəm, biz başqa dinlərə ***dözümlüyük***, lakin, bununla bərabər, milli adətlərimizin, milli mərasimlərimizin ən mühüm mənbələrindən biri olan öz dinimizi ***unutmamalıyıq***" [XXVIIIc.s.263].

İnsan, onun cəmiyyətdə yeri məsələsi fəlsəfi bir problem kimi filosofları həmişə düşündürür. İnsanın nələrə qadir olması, insanın hansı potensiala malik olması Heydər Əliyevin fəlsəfi düşüncələrində özünü qabarıq büruzə verir. Heydər Əliyevin fəaliyyət göstərdiyi illər ərzində işlətdiyi bir sıra ifadələr bu gün aforizmlər şəklində [7] xalqın dilində işlənir. "Xalqı həmişə mənəviyyat birləşdirmişdir. Çünki başqa əsaslara nisbətən mənəvi əsaslar daha üstündür", "Vətəndaşlıq milli mənsubiyyətlə müəyyən olunur", "Dövlət iki şeydən sarsıla bilər: günahkar cəzasız qalanda və günahsıza cəza veriləndə" və s. yüzlərlə ifadə bu qəbildəndir.

Heydər Əliyevin nitqlərində səslənən etik və estetik parçalar azərbaycançılıq ideyaları ilə, ümumazərbaycan ideyaları ilə çox zəngindir. Bu mətnlərdə müstəqillik və azərbaycançılıq dialektik vəhdətdədir. Etik, əxlaqi və estetik hisslər bir-biri ilə sıx bağlıdır, çünki yaxşılıq və gözəllik arasında dərin daxili vəhdət vardır [75].

Bütün çıxışlarında – həm etik, həm də estetik baxımdan seçilən çıxışlarında – Heydər Əliyev milliliyi, azərbaycançılığı öndə saxlayır: "Biz Bakı şəhəri – ölkəmizin paytaxtı ilə haqlı olaraq fəxr edirik. Onun bütün xüsusiyyətlərinə görə fəxr edirik. Eyni zamanda onun təbii gözəlliyinə, memarlıq gözəlliyinə görə fəxr edirik. Bakını quranlar, yaradanlar bu işi doğrudan da ürəklə, namusla görüblər. Şübhəsiz ki, burda pərakəndəlik də, səhvlər də olubdur. Sonrakı nəsillər bunları aradan qaldırır... Ancaq hər halda Bakı əsrlərdən-əsrlərə gözəl

qurulub, gözəl yaradılıbdır. Bakının yerləşdiyi təbii ərazinin də gözəlliyi var, eyni zamanda burada yaradılmış abidələr, binalar da Bakıya xüsusi gözəllik verir. Ona görə də Bakıdakı böyük memarlıq abidələri bizim milli iftixarımızdır” [IXc.s.396].

Bəzi müəlliflər [116] etik fəlsəfənin bir sıra kateqoriyalarını təsnif edirlər ki, bu kateqoriyalar − məqsəd ardıcıllığı və prinsipiallıq, təşəbbüskarlıq, müstəqillik, intizamlılıq və mütəşəkkillik, işgüzarlıq və təkidlilik, qətilik və cürətlilik, mətanət və mərdlik, inam hissi və iradəli hərəkət – böyük natiqin çıxışlarında yeri gəldikcə istifadə olunur.

Heydər Əliyevin dilində etik, əxlaqi dəyərlər ən ciddi dövlətçilik məqamlarında belə auditoriyaları səfərbər edir. Azərbaycan Respublikası Daxili İşlər Nazirliyində keçirilmiş müşavirədəki çıxış bu qəbildəndir: “Yenə də deyirik: biz polis orqanlarında, Daxili İşlər Nazirliyində xüsusi peşə hazırlığı olan ***bilikli, təcrübəli, təhsilli, eyni zamanda yüksək mənəvi keyfiyyətlərə malik*** adamlara güvənirik. Əgər kimsə bu keyfiyyətlər səviyyəsinə qalxa bilmirsə, bu tələblərə cavab verə bilmirsə, şübhəsiz ki, onlar kənara çəkilməlidir və rəhbərlik onları öz aralarından çıxarmalıdır. Daxili İşlər Nazirliyi, polis orqanları gərək həm güclü, həm ***mənəviyyatca sağlam***, həm də dəmir nizam-intizamlı bir təşkilat olsun. Belə bir təşkilat Azərbaycan Respublikasının müstəqilliyini, müstəqil dövlət kimi inkişafını təmin etməlidir” [Ic.s.146].

Etik fəlsəfə böyük natiqin dilində Azərbaycan iqtisadiy yatının inkişafı ilə bağlı çıxış məqamlarında auditoriyalara ünvanlanır: “Nazirlər Kabinetinin işində ***düzlük***, ***təmizlik, dürüstlük, paklıq*** yaratmaq lazimdir. Mən göstəriş vermişəm, hesab edirəm ki, Nazirlər Kabinetinin strukturu yaxın vaxtlarda təkmilləşdirilməlidir və bu cür işlərlə məşğul olan adamlar buradan kənarlaşdırılmalıdır. Nazirlər Kabinetinin aparatında ***sağlam, işi bilən, işə can yandıran və saf insanlar***

olmalıdır. Belə insanlar olmalıdır. Əgər belə olmasa, bu günkü mərhələdə iqtisadiyyatla bağlı böyük-böyük problemləri həll edə bilmərik" [VIIIc.s.79]. Heydər Əliyevin xarici ölkə rəhbərləri ilə görüşlərdə auditoriya Azərbaycan xalqının malik olduğu etik dəyərləri böyük natiqin öz dilindən eşidir. Azərbaycan xalqının sahib çıxdığı dəyərlər xarici ölkə rəhbərləri auditoriyasına bəyan edilir: "Xalqlarımız arasında dostluq həmişə ülvi olmuşdur, həmişə səmimi olmuşdur. Bu gün əmin ola bilərsiniz ki, Azərbaycan simasında tatar xalqı ***şərəfli, vəfalı və sadiq*** dosta malikdir. Təkrar edirəm, dostluğumuz istər tatar xalqı üçün, istərsə də Azərbaycan xalqı üçün eyni dərəcədə qiymətli olan dərin tarixi köklərə əsaslanır" [VIIIc.s.68].

Hüquqi dövlət, iqtisadi cəhətdən azad dövlət qurmaq yolunda böyük natiqin çıxışları etik fəlsəfə ilə zəngindir. 16 avqust 1996-cı ildə Azərbaycanda fəaliyyət göstərən sahibkarlarla görüşdəki çıxış "sahibkar hansı etik dəyərləri əks etdirməlidir" sualına cavab kimi səslənir. Sahibkar auditoriyası bu dəyərləri böyük natiqin dilindən bir öyüd kimi alır: "Sahibkar sözü çox hörmətli bir sözdür. Ancaq həqiqətən hörmətli bir sahibkar olmaq üçün birinci növbədə gərək yaxşı iş qurasan, ikinci növbədə gərək sahibkar kimi öz ***nüfüzunu, adını, hörmətini, imicini*** daim qoruyasan. Mən istəyirəm ki, bizim Azərbaycanın sahibkarları bax, belə sahibkarlar olsunlar. O xırda-xuruş sahibkarlar və əyri yollarla sahibkar olmaq istəyənlər, ya olanlar artıq aradan çıxmalıdırlar. Yenə də deyirəm indiyədək nə olub-olub, bundan sonra düz yolla getmək lazımdır" [VIIc.s.237]. Elə bu mətndə də "bax" qüvvətləndirici ədatının, "olsunlar" felin əmr şəklinin işləndiyi "bizim Azərbaycanın sahibkarları bax, belə sahibkar olsunlar" ifadəsi sahibkar əxlaqı haqqında düşünməyə əsas verir.

Təhsil sistemində əxlaqi, etik dəyərlərə − "saf mənəviyyat", "saf amal", "vicdan, namus" − əməl etməyənlərə Heydər

Əliyev dilində qətiyyətli cavab verilir: "Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz üzərimə götürərkən xalqa söz vermişəm, mən öz sözümün üstündə durmuşam və axıra qədər duracağam, son damla qanımadək, son nəfəsimədək sözümdən dönməyəcəm. Heç kəs də iradəmi qıra bilməyəcək. Ona görə də belə adamlar bilməlidirlər ki, çirkin əməllərindən çəkinməsələr onların haqqında ciddi cəza tədbirləri görüləcəkdir. Yenə də deyirəm bizim ali təhsil sahəsində, ali məktəblərimizdə ***saf mənəviyyatlı, saf amallı*** adamlar çalışmalıdırlar. Ona görə də təhsil nazirinin müavinlərinə, ali məktəblərimizin rektorlarına, ümumiyyətlə təhsil sahəsində işləyən ***vicdanlı, namuslu, saf mənəviyyatlı*** adamlara müraciət edirəm: hər bir kəs mənim bu sözlərimi nəzərə alaraq, öz işinin, öz vəzifəsinin əhəmiyyətini başa düşsün və bilsin ki, kimdən nə tələb olunur. Tələb isə o qədər də böyük tələb deyildir: Xalqımıza, Vətənimizə, müstəqil dövlətimizə, ***sədaqətlə, təmiz niyyətlə, saf mənəviyyatla*** xidmət etmək" [IIc.s.109].

Etik fəlsəfi baxışlar dini auditoriyalarda da özünə yer tapır: "Qurani-Şərifin bizə verdiyi tövsiyələr, dərs, göstərdiyi yollar, insanları ***paklığa, sədaqətə, qəhrəmanlığa, cəsarətə, cəsurluğa*** dəvət edən tələblərdir, tövsiyələrdir. Müsəlmanlar öz müqəddəs dininə sadiq olaraq əzab-əziyyətlər çəkmiş, ancaq böyük xoşbəxtliklərə də çıxmış və öz dininin, məsləkinin hər bir insan nə qədər böyük bir nemət olduğunu daim hiss etmişlər və bundan bəhrələnmişlər" [VIIIc.s.156]. Böyük natiq dini üslublu çıxışlarında həmişə olduğu kimi islam dininin söykəndiyi əxlaqı bəyan edir. Belə dini-fəlsəfi dünyagörüşün ortaya qoyulması islam adına qarşı çıxanlara tutarlı cavab kimi səslənir. Heydər Əliyevin nitqində etik fəlsəfə dialektikanın əksliklərin vəhdəti və ziddiyyəti qanunu ilə birgə səslənir: "Təəssüf ki, cəmiyyətdə ***qanunu pozanlar, əxlaqsızlıq, mənəviyyatsızlıq*** edənlər də var. Belələri insanı o qədər incidir

ki, həmin adam hər şeyi artıq qara rəngdə görür. Amma həyat tam qara deyil. Həyatın ***işıqlı tərəfi*** də, ***qaranlıq tərəfi*** də, ***gözəl tərəfi*** də, insanları ***incidən tərəfi*** də var" [XIIIc.s.171].

Əxlaqi və estetik hisslər bir-biri ilə sıx bağlıdır, çünki yaxşılıq və gözəllik arasında dərin daxili vəhdət vardır [Ic.s.39]. Filosoflar gözəlliyi tarix boyu müxtəlif şəkildə başa düşmüş və izah etmişlər. Gözəllik haqqında təsəvvürlərimizin əsasını təşkil edən fikir deyil, müəyyən daxili hissdir. Mühakiməyə əsaslanan bilik gözəlliyin dərk edilməsində hisslərin ifadəsini əvəz edə bilməz [75].

Heydər Əliyev üçün ***xəyanət*** antietik dəyəri aşağıdakı kimi dəyərləndirilir: "Azərbaycan Respublikasında hər bir vətəndaş eyni hüquqa malikdir. Heç kəs keçmiş xidmətlərinə, vəzifəsinə, doğulduğu yerə görə, yaxud başqa səbəblərə görə müstəsna hüquqa malik deyil, ola da bilməz. Biz demokratiya qururuq, hamı eyni hüquqa malikdir, hamı qanuna tabe olmalı, qanun çərçivəsində işləməlidir. Əgər kim isə hansısa bir vəzifəsindən, yaxud da ki, başqa bir mövqeyindən sui-istifadə edirsə, şübhəsiz ki, o, özü-özünə, valideynlərinə, xalqına, doğulduğu yerə xəyanət edir. Bunlara yol vermək olmaz" [VIIc.s.490].

Beləliklə, doğruluğa (to alethes) gəldikdə, onda orta mövqe tutan (ho mesos) qoy doğruçu (alethes), ortaya yiyələnmə isə doğruçuluq (aletheia), həqiqətin həddən artıq təhrif edilməsi – lovğalıq (aladzoneia) və belə adam isə – lovğa (aladzon), bunun az təhrif edilməsi – riyakarlıq, <belə adam> isə – riyakar (eiron) adlansın [6,s.56].

Axı ifrat halların birində xəta daha çoxdur, digərində isə az, buna görə də əgər ortaya yetmək olduqca çətindirsə, necə deyərlər, "ikinci gəmi səfəri zamanı daha yaxşı yol seçmək lazımdır", bu isə bizim göstərdiklərimizi həyata keçirmək üçün ən yaxşı üsuldur. Biz nəyə qarşı həssasıqsa, ona da diqqət yetirməliyik, zira insan nəyəsə anadangəlmə meyllidir,

bunu isə bizim özümüzün aldığımız həzlə və çəkdiyimiz əzabla öyrənmək olar, özümüz özümüzü əks tərəfə çəkib aparmalıyıq, çünki özümüzü qüsurdan uzaqlaşdırmaqla, biz ortaya gəlib çıxacağıq, bu isə, məsələn, ağacın əyriliyini düzəltmək kimi bir şeydir.

Bütün işlərdə hər şeydən çox həzdən və onu əmələ gətirən şeydən çəkinmək lazımdır. Troya xalqının ağsaqqalları Yelenadan bilavasitə nə görmüşdülərsə, biz də həzdən həmin şeyi görməliyik və bütün hallarda onların dediklərini təkrarlamalıyıq, zira əgər biz də onlar kimi həzdən uzaqlaşmağı bacarsaq, onda qüsurlu işlərimiz daha az olar [6,s.60].

İanə məsələsində həddi keçmək də tamamilə əliaçıq adama xas olan xüsusiyyətdir, belə ki, o, özünə lazım olduğundan da az saxlayır. İş ondadır ki, özünün nəzərə almamaq əliaçıq adama xas olan cəhətdir.

Əliaçıqlıq barədə danışdıqda var-dövləti nəzərə alırlar, zira əliaçıqlıq verilən şeyin miqdarının deyil, əl tutan adamın [qəlbinin] xüsusiyyətlərinin göstəricisidir, bu da var-dövlətlə uyğunlaşdırılır. Buna görə, əgər varidatı az olan adam daha az şey verirsə, onun daha əliaçıq adam olmasına heç nə mane olmur [10,s.98].

Əməldə böyüklük göstərmək, böyük dəyərlərə malik olan adamın adına layiq olan işdir, biz isə baxacağıq görək, o, bunu, [məhz] nədə göstərməlidir; [qəlbin özünün] xüsusiyyəti və bu xüsusiyyətə malik adam haqqında müzakirə açmağın isə əhəmiyyəti yoxdur [10,s.107].

Hər kim, buna layiq olmadan, özünün böyük dəyərlərə malik adam sayırsa, o, təkəbbürlü adamdır, amma özlərini (həqiqətdə) layiq olduqlarından daha (dəyərli sayan) adamların hamısı təkəbbürlü deyil.

Yazıq o adamdır ki, (o, özünə layiq olduğundan) az qiymət verir, o, istər böyük dəyərə malik adam olsun, istərsə də kiçik, özünün, hər halda, çox da dəyərli adam saymır, hər

kim böyük dəyərlərə malik ola-ola, özünü bunun əksi olan adam sayırsa, o, görünür, ən yazıq adamdır: əgər o, böyük dəyərlərə malik olmasaydı, özünün görəsən, necə adam sayardı.

Buna görə böyüklük – böyüklük nöqteyi-nəzərindən ifrat, lazımi qaydada olan (davranış) nöqteyi-nəzərindən ortadır, zira özünə layiq olduğu qiyməti vermək ona xas olan cəhətdir, digərləri isə artıq və ya əksik tərəfə meyl edir.

Beləliklə, böyük adam, deyildiyi kimi, özünün hər şeydən öncə sayğı və şərəflə əlaqədar göstərir; bununla bərabər həm var-dövlətə, həm taxt-taca, həm də, ümumiyyətlə, hər bir uğura və uğursuzluğa münasibətdə o, necə olur olsun, orta mövqe tutur, nə uğurlara həddən artıq sevinmir, nə də uğursuzluqlara görə həddən artıq kədərlənmir, axı o, hətta sayğı və şərəfə də nə isə böyük bir şey kimi yanaşmır; bununla belə, taxt-tacı da, var-dövləti də sayğı və şərəfə görə seçirlər, hər halda bunlara yiyələnməklə hörmət sahibi olmaq istəyirlər, amma hər kim üçün sayğı və şərəf böş şeydir, onun üçün heç nəyin dəyəri yoxdur. Bax buna görə də böyük dəyərlərə malik olan adamları təkəbbürlü (hyperoptai) sayırlar [10,s.110].

Bununla belə, əsl hörmətlə yalnız yaxşı adamlar layiqdir, amma kimdə bu və ya digəri varsa [yəni o, həm məziyyət sahibidirsə, həm də bütün işləri uğurla gedirsə], onlar hörmətə daha çox layiqdir. Lakin kim yaxşı olmadığı halda, sözü gedən yaxşı şeylərə malikdirsə, haqqı çatmadan özünün böyük dəyərələrə malik adam hesab edir və onun böyük adam kimi tanınması düzgün deyil, Sözü gedən yaxşı şeylərə malik adamlar da təkəbbürlü və həyasız (hybristai) olurlar, çünki məziyyətlərə malik olmadan uğurları layiqincə yaşamaq asan deyil. Uğurları layiqincə yaşamayan və özlərini hamıdan üstün tutan adamlar isə istədikləri hərəkətləri edirlər. Axı onlar böyük dəyərlərə malik adam olmadıqları halda, onu ancaq təqlid edirlər, bunu da hansı işdə bacarırlarsa, onda

edirlər, yəni onlar yaxşı hərəkətlərdə bulunmurlar, bununla belə başqalarına da xor baxırlar.

Böyük adama gəldikdə isə, o, heç kimə haqsız yerə xor baxmır, onun fikri bir qayda olaraq həqiqətlə səsləşir, halbuki adamların əksəriyyətinin üzə çıxardığı fikirlər, düşünülməmiş fikirlərdir.

Böyük adam boş şeylərə görə özünü təhlükə qarşısında qoymur və özlüyündə təhlükəni xoşlamır, çünki onun, ümumiyyətlə, yaxşı münasibət göstərdiyi şeylər olduqca azdır. Lakin böyük şeyə görə özünü təhlükəyə məruz qoyur və nəyin bahasına olursa-olsun sağ qalmağı şəninə sığışdırmayaraq lazımi anda ölümdən belə çəkinmir [10,s.110-111].

Böyük adam fəxrli şeylərin dalınca qaçmır, digərlərinin üstün olduğu şeylərə də iddia etmir, söhbət böyük saygı və şərəfdən, yaxud böyük bir şeydən getmədikdə, o, heç bir məqsəd güdmür və heç bir iş görməyə tələsmir; öz qətiyyətini isə az işlərdə, ancaq böyük və şərəfli işlərdə göstərir [10,s.112].

Onda kin-kidurət olmur: kiminsə yadına nəsəs salmaq, böyük dəyərlərə malik olan adama xas cəhət deyil,ələlxüsus söhbət ona edilən pislikdən getdikdə, belə şeyləri yadda saxlamamaq ona daha çox xas olan cəhətdir [10,s.113].

"Axı" qüvvətləndirici ədatının köməyilə mənəviyyat adamı ilə pul məsələsi arasındakı ziddiyyəti auditoriya üçün açıqlayır: "Hər şeyi pul həll etməməlidir. Mətbuat Nazirliyi bu məsələ ilə məşğul olmalıdır. ***Axı*** həmin nazirliyə şair, ***mənəviyyat***, mədəniyyət adamı başçılıq edir" [IIc.s.99].

"Bu müzakirələr, iki gün çəkən birgə işimiz bir də göstərdi ki, xalqla dövlət ahəngdar hərəkət edir və xalqla dövlət birdir. Bu birlik, vətəndaş həmrəyliyi bizim üçün bu gün də, sabah da, gələcək üçün də lazımdır. Biz sizinlə birlikdə müstəqil Azərbaycan kimi əzəmətli bir ***abidənin*** təməlini qoyuruq, onu qururuq, yaradırıq. Onu indiki nəsillər üçün yaradırıq, gələcək nəsillər üçün yaradırıq. Bizim üzərimizə

***şərəfli*** vəzifə düşübdür və bunu layiqincə yerinə yetirməliyik. Güman edirəm ki, hər bir vətəndaş bu vəzifənin yerinə yetirilməsində öz yerini tapacaqdır” [IVc.s.43].

“Xalqımız yanvarın 20-də öz milli qüdrətini, milli şərəfini, namusunu qoruyaraq şəhidlər verdi, cəbhələrdə Azərbaycan xalqı öz torpaqlarını, öz ərazisini, öz müsətqilliyini qoruyaraq şəhidlər verir” [Ic.s.107]

“Gənclər arasında son vaxtlar elə bir təbəqə yaranıb ki, təhsil onları o qədər də maraqlandırmır, mədəniyyət də maraqlandırmır. Nədənsə, çox əcaib adət-ənənələr meydana çıxıb ki, ***nə qədər*** mədəniyyətsiz olsan, ədəbsiz olsan, kobud danışsan, bəzən hətta ədəbsiz sözlər də işlətsən, ***o qədər*** də qəhrəman görünərsən, başqalarından seçilərsən. Bunlar dövrün bəlalarıdır, keçib gedən hallardır. Bu adətlər, belə hallar uzun sürə bilməz, yaşaya bilməz” [Ic.s.169].

“Halbuki özləri azadlıqdan, hürriyyətdən və haqq-ədalətdən dəm vurur, bunlardan ağzıdolusu danışırlar, axırı nə oldu – hamılıqla oğurluğa qurşandılar! Xalq bütün bunları görürdü və buna görə də çox məyus olmuşdu! İş-gücləri küçələrə düşüb “mersedes”lərlə ora-bura çapmaq və çoşçoğazlıq etmək idi. Elə hey danışır, dil boğaza qoymudular! Mənəviyyatsızlar, əxlaqsızlar, açız-aşkar oğrular çox idi, lap çox!” [Ic.s.58].

Etik dəyərlər – dövlətçiliklə sıx bağlı olan anlayışlardır ki, Ulu Öndərin nitqlərində siyasət və etika – dialektik vəhdətdədir. Eləcə də təhsil və elm bu sıradandır: “Əsrlər boyu inkişaf etmiş, dünya sivilizasiyası möhkəm təhsil və elm üzərində qurulmuşdur. Mən bizim gənclərimizi də bu yola dəvət edirəm. Güman edirəm ki, müstəqil Azərbaycan Respublikası gənclərinin yolu da bu yoldur, onlar bu yolla getməlidirlər. Biz də bu yolla getməkdə sizə kömək edəcək, şərait yaradacağıq” [Ic.s.169].

Mənəviyyatımızın inkişafı gənclərimizin yüksək mənəvi ruhda tərbiyəsi ilə şərtlənir ki, bunu böyük natiq öz nitqlərində,

xüsusilə müəllimlər auditoriyasında səsləndirir. "Mən bütün müəllimlərimizdən rica edirəm ki..." ifadəsi mənəvi tərbiyənin müəllimlərin vicdan işi olması həqiqətini xalqa çatdırsın. "Həm", "həm də" iştirak bağlayıcılarının köməyi ilə zəngin biliklə, yüksək mənəviyyatın vəhdətini göstərir" [IIc.s.221].

Etik fəlsəfə böyük natiqin dilində Azərbaycan iqtisadiyyatının inkişafı ilə bağlı çıxış məqamlarında auditoriyalara ünvanlanır: "Nazirlər Kabinetinin işində *düzlük, təmizlik, dürüstlük, paklıq* yaratmaq lazımdır. Mən göstəriş vermişəm, hesab edirəm ki, Nazirlər Kabinetinin strukturu yaxın vaxtlarda təkmilləşdirilməlidir və bu cür işlərdə məşğul olan adamlar buradan kənarlaşdırılmalıdır. Nazirlər Kabinetinin aparatında *sağlam*, işi bilən, işə can yandıran və saf insanlar olmalıdır. Belə insanlar olmalıdır. Əgər belə olmasa, bugünkü mərhələdə iqtisadiyyatla bağlı böyük-böyük problemləri həll edə bilmərik" [VIIIc.s.79].

"Azərbaycan etikasında "əxlaq" həyat tərzi və davranış, "mənəviyyat" isə mənəvi şüurla bağlıdır. Lakin etika təkcə əxlaq və mənəvi şüur, strukturunun təhlili ilə deyil, həm də əxlaqın tarixi növləri, onların müasir əxlaqda təzahürünün araşdırlması, həmçinin əxlaqi mədəniyyətin və əxlaqi fikirlərin təhlili ilə məşğul olur".

Böyük natiqin dilində həmişə "təəssüf ki", "təəssüflər olsun ki" modal sözlərlə birgə işlədilir [VIIIc.s.196]. "Rüşvətxorluq, dövlətin, xalqın, millətin malını dağıtmaq, qarət etmək, vəzifədən sui-istifadə etmək, korrupsiya, cəmiyyətimizi zəhərləyən cürbəcür belə hallar mövcuddur. *Təəssüflər olsun ki,* bunlar Silahlı Qüvvələrimizə də sirayət edibdir. Təəssüflər olsun ki, bunlar bizim sərhəd dəstələrinə də sirayət edibdir" [VIIIc.s.196].

Sinonimlərlə – "dövlətin, xalqın, millətin", "qarət etmək, dağıtmaq" – təkrarlarla (təəəssüflər olsun ki, bunlar) və digər

nitq ünsürləri ilə harmonik görülən Heydər Əliyev nitqi burada da özünü göstərir.

Biz mənəviyyatımızı qorumalıyıq. Bilirisniz ki, mən 1969-cu ildə Azərbaycana rəhbərliyə başlayan zamandan fəaliyyətimin əsas hissəsini mənəvi tərbiyə işinə yönəltmişəm, insanlarda olan mənfi cəhətlərin aradan götürülməsinə çalışmışam, o cümlədən, rüşvətxorluqla, korrupsiya ilə, vəzifəli şəxslərin vəzifəsindən sui-istifadə etməsi halları ilə və cürbəcür başqa çirkin hərəkətlərlə mübarizəyə sərf etmişəm. Mən gördüyüm işlərlə fəxr edirəm. Baxmayaraq ki, apardığım həmin mübarizə mən 1987-ci ildə bütün vəzifələrdən kənarlaşdırılandan sonra mənə qarşı yönəldildi. Məni günahlandırdılar ki, guya mən burada qanunsuz işlər görmüşəm. Ancaq tarix göstərdi ki, mən o vaxt da düzgün mövqedə olmuşam, düz hərəkət etmişəm, bu gün də bu mövqedəyəm. Yəni mən o vaxt da rüşvətxorluqla, korrupsiya ilə mübarizə aparmışam, bu gün də aparıram və gələcəkdə də ***aparacağam***. Belə hallarda günahkarlar bağışlana ***bilməz*** [XIVc.s.304].

## Aristotelin etik kredosu

– Yadda saxlayın ki, insanın təyinatı həyatda və öz hərəkətlərində ləyaqətli olmaqdır!;

– Düzgün hərəkət etmək üçün özünüzdə əxlaqi dəyərləri hazırlayın;

– Ehtirası nəzarətə alaraq onun nə çoxluğuna, nə də azlığına imkan verməyin;

– Həzz və əzablarda ölçünü gözləyin;

– Gənclik və yaşlı dövrdə öyrəndiklərinizə diqqətli olun. Əxlaq məsələlərində tərbiyə və təhsilin vacib rol oynadığını bilin;

– Etik qayda-qanunlar xeyirxah işlərə zəmin yaradır ki, xeyirxah işlər üçün özünüzdə vərdişlər yaradın;

– O şəxslərdən nümunə götürün ki, onları ləyaqətli adlandırırar;

– Xoşbəxtliyə, dolğun əxlaqi həyata can atın;

– Yadda saxlayın ki, əxlaqi təkmilləşdirmə yolunda insan üçün hədd yoxdur;

– Etikanı öyrənin, hərəkətlərinizdə onun müddəalarına əsaslanın;

## Kantın etik kredosu

– Əxlaqi varlıq olan insan öz hissi aləmi üzərində əxlaqla yüksəlir;

– Əxlaqi varlıq kimi insan təbiətdən ayrıdır, azadlıq qanunlarına uyğun yaşamalıdır;

– Azad olmaq dərkdə təcrübədən asılı olmayan mütləq əxlaq qanununa əməl etməkdir. Bu qanun dərki olan hər bir adama məlumdur. Belə ki, yalanın ləyaqətsiz olması hamıya məlumdur;

– Mütləq əxlaqi qanununa görə öz iradəsini məcbur edən xeyirxah iradə sahibi hesab olunur;

– İnsanlıq borcuna zidd olaraq nə özünə, nə də başqalarına məqsədə çatmaq vasitəsi kimi baxmayın. Əxlaq qanunlarına uyğun, insanlıq borcuna uyğun hərəkət edin;

– Elə yaşayın ki, sizin həzzləriniz, xoşbəxtlik və sevgiləriniz əxlaqi qanunlara əməl etməklə müşayiət olunsun;

– Özünə münasibətdə əxlaqi öhdəliklərə əməl edərək təmiz, vicdanlı, səmimi, ləyaqətli olun, yalana, acgözlüyə, xəsisliyə, yaltaqlığa qarşı çıxın;

– Başqalarına münasibətdə öhdəliklərinizi yerinə yetirərək insana nifrətə, lovğalığa, qeybətə, insanlıq borcuna və sevgiyə qarşı yönələn kinayəyə qarşı çıxın;

– Öz əxlaqi keyfiyyətlərinizi təkmilləşdirin, əxlaqi dəyərlərinizi inkişaf etdirin, düzgün davranışı öyrənin, mənəvi müəllimlərinizdən nümunə götürün;

– Yadınızdan çıxarmayın ki, insan həyatında əxlaqdan yüksək zirvə yoxdur. Əxlaqi həyat özünənəzarət tələb edir.

## Heydər Əliyevin etik kredosu

İnsanlığa münasibətdə Heydər Əliyevin etik kredosu sayıla biləcək aşağıdakı ifadələr xüsusi əhəmiyyət daşıyır

– Biz dünyəvi dəyərlərlə yaşamalıyıq. Amma eyni zamanda biz öz milli-mənəvi dəyərlərimizi itirməməliyik, onları yaddan çıxarmamalıyıq. Onları bizim millətimizə yad olan hansısa dəyərlərlə əvəz etməməliyik ;

– Həyatın mənası ondan ibarətdir ki, dünyaya gələn, böyüyən, ərsəyə çatan hər bir uşaq, həyat fəaliyyətinə başlayan insan cəmiyyətə, millətə, ölkəsinə, vətəninə layiqli xidmət etsin, fayda versin;

– "Vətəndaş" sözü böyük sözdür, müqəddəs sözdür. "Vətəndaş" sözü o deməkdir ki, hər bir vətəndaş öz vətəninə sadiq olmalıdır, onu göz bəbəyi kimi qorumalıdır və vətəninin uğrunda, torpağının uğrunda, anasının, atasının müdafiəsi yolunda şəhid olmağa hazır olmalıdır;

– İnsanlığa münasibətdə Heydər Əliyevin etik kredosu sayıla biləcək aşağıdakı sözlər xüsusi əhəmiyyət daşıyır;

– Əgər insan öz fikirlərinə sadiq olmasa, öz ideyasına inanmasa və öz ideyasının həyata keçməsi üçün vuruşmasa, savaşmasa, mübarizə aparmasa, o, qalib gələ bilməz;

– Bir şey ədalətsizliklə olubsa, ədalətsizliklə ədaləti bərpa etmək olmaz. Ədaləti bərpa etmək lazımdır.

Qanunsuzluğu aradan qaldırmaq lazımdır. Qanunsuzluğa qanunsuzluqla cavab vermək lazım deyil;

– Xalqdan heç kəs inciyə bilməz;

– Bilirsiniz, insan bir iş görürsə, onun qiymətini alırsa, həm o iş görmüş adam, həm də qiymət vermiş adam – ikisi də yüksək səviyyədə olanlardır. Amma insan bir iş görürsə, bu qiymətini alırsa, bundan sui-istifadə etməyə başlayırsa, əvəzinə 10–15–20 qat çox nəsə tələb edirsə, artıq bu onun keçmiş xidmətini ləkələyir və heçə endirir;

– Bəli, insan çox şeyə qadirdir. İnsan nikbin olmalıdır. İnsan nə qədər çətinliklərlə rastlaşsa da, öz istedadını, öz biliyini, öz bacarığını cəmiyyətə təqdim etməlidir, cəmiyyətə, ölkəsinə həsr etməlidir ;

Aristotelin etik kredosunda ümumetik dəyərlərə (ləyaqət, xeyirxahlıq, təhsil) xüsusi əhəmiyyət verilir. Əxlaqi təkmilləşmə yolunda insan üçün hədd olmadığını söyləyir. Kantda isə birbaşa antietik dəyərlərə (nifrət, lovğalıq, qeybət, kinayə) qarşı çıxışlar səslənir. Kantda da əxlaqdan yüksək zirvə olmadığı diqqətə çatdırılır.

Biz burada çalışdıq ki, XXI əsr insanının qarşısında duran mənəvi borcu Heydər Əliyev dilində təqdim edə bilək. Aristotel və Kantın etik kredolarından fərqli olaraq Heydər Əliyev dilində səslənən yuxarıdakı etik kredolar müasirlik baxımından seçilir, bugünkü dünya insanında etiraz yeri qoymur.

Heydər Əliyev ilk baxışdan çətin görünən etik fəlsəfəyə məxsus terminləri məişət üslublu nitqi ilə anlaşılan edir: "***Təbiidir ki,*** insanın həyatı heç vaxt hamar olmur, heç vaxt düz olmur. Həyatda hər bir insanın qarşısına müxtəlif ***çətinliklər***, ***maneələr*** çıxır. Bu da təbiidir. Əgər belə olmasa, onda həyatın ***dadı da, mənası da*** olmaz. Bir az sadə dildə desəm, həyat duzsuz olar. Amma əsas ondan ibarətdir ki, insan həyatda gərək elə yaşasın ki, o həmişə öz *mənəviyyatı* ilə fəxr etsin.

Hər bir şeyi itirmək olar. Amma uşaq da, böyük də, hər bir insan gərək ***mənəviyyatını, iradəsini*** itirməsin, bütün çətinliklərin qarşısını alsın, onların qarşısında ***əyilməsin***, ***sınmasın***. Öz iradəsi ilə yaşasın, böyüsün, cəmiyyətə fayda versin.

Həyatın mənası təkcə insanın bu həyatda yaşaması deyildir. Nə qədər çox, *firavan*, *zəngin* yaşasa da, əgər hər bir gənc, yaşlı insan həyatın mənasını bunda görürsə, təbiidir ki, o, zəngin deyil, mənəviyyatca kasıbdır. Həyatın mənası ondan ibarətdir ki, dünyaya gələn, böyüyən, ərsəyə çatan hər bir

uşaq, həyat fəaliyyətinə başlayan insan *cəmiyyətə, millətə, ölkəsinə, vətəninə* layiqli xidmət etsin, fayda versin" [XXXVIIc.s.118]. "Təbiidir ki" gerçəkliyə adi münasibət bildirən modal söz "hamar", "düz" və "çətinlik", "maneə" sinonimləri ilə auditoriyaya yön alır. Sonra həyatın xarakterizə olunmasına keçir. Auditoriya etikanın öyrəndiyi əsas dəyəri-mənəviyyatı və onun mahiyyətini, qorunmasını böyük natiqin dilindən eşidir. Bu mətndə feilin əmr şəklində mənəviyyatın çoxsaylı tələbləri sadalanır: itirməsin, qarşısını alsın, əyilməsin, sınmasın, yaşasın, böyüsün, fayda versin, xidmət etsin.

Etikanın əxlaqla yanaşı adət-ənənələri də özündə ehtiva etdiyinin fərqinə varsaq "ulu babalarımızın yaratdığı milli geyimlər", Ulu Öndərin dilində keçmişimizə hörmət (siz bu ənənəni yaşatmısınız…) bu mətndə öz yerini alır. "Bir tərəfdən", "ikinci tərəfdən" ardıcıllıq bildirən modallarla milli geyimlərin nələri bizlərə xatırlatdığını söyləyir. "Ancaq" ziddiyyət bağlayıcısı ilə auditoriyanı səfərbər edir, "öz" təyin əvəzliyinin köməyi ilə qloballaşan dünyanın zənginləşməsinə xidmət edən milli mədəniyyətlərin inkişafını önə çəkir: "Sizin mənə gətirdiyiniz bu milli paltar neçə əsrlərdir yaşayır. Onu bizim ulu babalarımız yaradıblar. Bizim ulu babalarımız bunu yaradarkən öz xalqının bir tərəfdən qəhrəmanlığını nümayiş etdiriblər, ikinci tərəfdən də onun nə qədər yüksək sənətə, mədəniyyətə mənsub olduğunu sübuta yetiriblər. Bu, bizim xalqımızın qədim mədəniyyət nümunəsidir. Sizin bu yağlı güləş ənənəniz xalqımızin gücünü, qəhrəmanlığını, qüdrətini, iradəsini nümayiş etdirən bir ənənədir. Siz bu ənənəni yaşatmısınız, yaşadırsınız və bütün dünyaya da nümayiş etdirirsiniz ki, biz dünyada gedən ictimai-siyasi, elmi, mədəni, dünyəvi proseslərdən geri qalmırıq, ***ancaq*** öz kökümüzü heç vaxt unutmuruq və öz kökümüzü heç bir şeyə dəyişmirik" [XIVc.s.217].

Dialektikanın əksliklərin mübarizəsi qanununu (Həyatda xeyirlə şər həmişə yan-yanadır. Müsbət ilə mənfinin mübarizəsi daimi dialektik bir prosesdir) etikaya da tətbiq edir.

"Əgər" şərt bağlayıcısı və ardıcıl olaraq feilin şərt şəklində ardıcıl ifadələrin köməyilə özünün etik kredosonu yaradır: "Mən həyatım boyu bunları görmüşəm. Bütün bu çətinliklərlə, maneələrlə, qarşıma çıxan bütün düşmənçilik hərəkətləri ilə mübarizə aparmağım, ən çətin zamanlarda iradəmi itirməməyim və qalib gəlməyim onu göstərir ki, mən də həmişə güləşmişəm. Mənim bu güləşim xalı üstündə olmayıbdır, yağlı güləş olmayıbdır. Mənim bu güləşim fikir güləşidir. Bunların hamısı özünəməxsus cəsurluq, qəhrəmanlıq tələb edir. Əgər insan öz fikirlərinə sadiq olmasa, öz ideyasına inanmasa və öz ideyasının həyata keçməsi üçün vuruşmasa, savaşmasa, mübarizə aparmasa, o, qalib gələ bilməz. ***Çünki*** həyat belədir. Həyatda ***xeyirlə şər həmişə yan-yanadır. Müsbət ilə mənfinin mübarizəsi*** daimi dialektik bir prosesdir" [XIVc.s.219].

Mənəviyyatımızın kökündə dayanan dəyərlərimizi böyük natiqin dilində eşidən auditoriya bu dəyərlərin əsil mənasını anlayır, "çünki" şərt bağlayıcısı ilə auditoriyaya ünvanladığı ifadələrin ardınca "amma" ziddiyyət bağlayıcısı ilə "bu adı almağıma haqqım var". Bu kişik mətndə "ədalət" və "böyüklük" etik dəyərlərini öz şəxsi nümunəsində dinləyicilərə çatdırır.

Aristotelə görə [10,s.108] böyüklüyün bir əlaməti də budur: "Ö şəxs görünür, böyük adamdır ki, o buna layiq olmaqla yanaşı özü-özünü də buna layiq bilir." Əgər insan özünü böyük dəyərə malik olan adam sayırsa, o, buna layiqdir, əlalxüsus da, o, çox böyük dəyərə malikdirsə, onda bu çox böyük nə isə yeganə bir şey olur. Dəyər anlayışı xarici amillərlə bağlı olan yaxşı şeylərə aiddir, bu yaxşı şeylər arasındakı böyük isə, bizim etiraf etdiyimiz kimi, görünür, Allah yolunda

verdiyimiz şey, yüksək vəzifəli adamların hər şeydən çox can atdığı şey, həm də ən gözəl əmələ görə verilən mükafatdır; bu isə ***şərəfin*** özüdür ki, var, zira, məhz bu, xarici amillərlə bağlı olan yaxşı şeylərdən ən böyüyüdür. Deməli, böyük adam şərəfə və şərəfsizliyə necə lazımdırsa, elə də münasibət göstərməlidir. Müzakirəsiz də aydındır ki, böyük adamlar sayğı və şərəfə can atır: axı onlar özlərini hər şeydən öncə sayğı və şərəfə layiq bilirlər, özü də dəyərli adam olduqlarına görə [6,s.108-109].

Çünki mən ***ədalətli*** insanam, heç vaxt istəmirəm ki, mənim haqqım olmadığı, yaxud layiq olmadığım, mənə münasib olmayan bir adı qəbul edim. Amma düşündüm ki, bu adı almağıma haqqım var və görünür ki, sizin bu qərarınız ədalətlidir. ***Ədalətli*** qərar vermisiniz. Ona görə də mən sizə bir daha təşəkkür edirəm.

Bir də onu deyə bilərəm ki, mən artıq sizin kırpınar təşkilatının üzvüyəm, sizin cərgənizdəyəm. Siz mənə "Baş Ağa" adı vermisiniz. Əmin ola bilərsiniz ki, bu fəxri adı mən ***şərəflə*** daşıyacağam və sizin bu etimadınızı, sizin inamınızı daim doğruldacağam [XIVc.s.220]. Bu vəziyyət Aristotelin şərəf haqqında dedikləri ilə eyni səslənir: "Şərəf (lime) və şərəfsizlik (atimia) xüsusunda ortaya yiyələnmə – böyüklükdür (megalopsykhia), artıq, ola bilsin, təkəbbür (khaunotes), əksik isə – alçalma (mikropysykhia) adlanır [10,s.54].

Ədalətsizliyi ifşa edərkən Heydər Əliyev cəsarətli, prinsipial nitq nümayiş etdirir. Bu nitq öncə səmimi bir dillə auditoriyaya yönəlir. Amerikanın dünyanın demokratik və ədalətli ölkə olması "ən" qüvvətləndirici ədatı ilə diqqətə çatdırılır. "Amerika Konqresində də bu qərarın ədalətsizliyini dərk edəcəklər" ifadəsi böyük bir cəsarətlə ədalətsizliyin ifşa olunmasından xəbər verir: "Biz Amerikaya dünyanın ***ən*** demokratik ölkəsi kimi baxırıq. Amerikanın Konqresində, dünyanın belə bir demokratiya mərkəzində, ədalət mərkəzində

bu qədər ədalətsizliyi təsəvvür etmək mümkün deyildir. Ancaq bu da reallıqdır. Biz çalışırıq, mən sizə təşəkkür edirəm ki, siz də bizimlə bərabər çalışırsınız ki, 907-ci maddə götürülsün. Bunun mənəvi tərəfi bizim üçün hər şeydən çətindir. Çünki Azərbaycan belə bir ədalətsizliyə layiq deyildir. Güman edirəm ki, nəhayət, Amerika Konqresində də ***bu qərarın ədalətsizliyini dərk edəcəklər*** və biz bu maddənin ləğv olunmasına sizinlə birlikdə nail olacağıq" [XXc.s.138-139].

Mənəviyyatımızın korlanmasına "təəssüf" edən böyük natiq, mənəviyyatın pozulma səbəblərini açıqlayır, bunun bir səbəbinin şəxsi mənafenin dövlət mənafeyindən üstün tutulması ilə əlaqələndirir. Pozulmuş mənəvi dəyərlərin bərpası yolunda "aradan qaldıracağıq" qəti gələcək zamanda işlənmiş ifadə ilə prinsipial mövqe nümayiş etdirir: "Bu da çoxdur. Çünki ***təəssüflər*** olsun ki, bizim adamların bəziləri mənəviyyatca çox korlanıbdır. Onlar Azərbaycanın mənafeyini güdmür, bəziləri öz mənafeyini güdür. Ona görə də xarici investor gələndə, onun qabağına öz mənafeyi üçün elə şərtlər qoyur ki, o da görür ki, şubhəsiz, bu şərtlə burada iş görə, gəlir götürə bilməz və çıxıb gedir. Belə hallar da var. Artıq bu da mənə gəlib çatıbdır. Mən bunlarla ciddi məşğul olacağam, məşğul olacağam. Biz bunları, nöqsanları da aradan qaldıracağıq" [XXIc.s.93].

Aristotelə görə [10,s.111] böyük adam böyük şeyə görə özünü təhlükəyə məruz qoyur və nəyin bahasına olursa-olsun sağ qalmağı şəninə sığışdırmayaraq lazımi anda ölümdən belə çəkinmir. Aşağıdakı mətndə Heydər Əliyevin Kaliforniyada olarkən Azərbaycan diasporu qarşısındakı çıxışının kiçik bir hissəsi "cəsarət" və "böyüklük" etik dəyərlərindən xəbər verir: "Necə yəni düşünə bilmirlər? Sadəcə, onlarda milli hiss çox, çox-çox-çox güclüdür. Milli hiss çox güclüdür. Mən Kaliforniyaya gələcəkdim, sadəcə, imkanım olmadı. Gəlib o ermənilərlə üz-üzə duracaqdım. Onlar orada mənim əleyhimə nə qə-

dər mitinq eləsəydilər, yaxud da mənə daş atsaydılar, mən onların qabağına çıxacaqdım. Çıxacaqdım və deyəcəkdim ki, siz ədalətsizsiniz, siz Amerika kimi inkişaf etmiş, demokratiya inkişaf etmiş bir dövlətdə yaşayırsınız, Amerikanın vətəndaşlarısınız, amma nə qədər ədalətsizsiniz! Mən bunları deyəcəkdim. Amma mənim proqramım imkan vermədi, ona görə də oraya gələ bilmədim. Ancaq inşallah, ***gələcəyəm, gələcəyəm, gələcəyəm***! Mən arzu edərdim ki, gəlib orada azərbaycanlılarla da yaxşı görüşə bilim" [XXIc.s.98].

Millətçiliyin, separatizmin əksinə olaraq milli hisslərin inkişaf tapması, özünəməxsus milli dəyərlərə söykənən milli dövlətlərin təşəkkül tapması Heydər Əliyev nitqlərinin əsasında durur. "Təkcə" ədatı ilə milliliyi qüvvətləndirməkdən xəbər verir. "Öz milli dövlətini qurub-yaradanlar dünyanı da özününkü biləcək" fəlsəfəsini ortaya qoyur: "Mənim arzum nədir? Arzum budur ki, azərbaycanlılar harada olurlarsa-olsunlar, onlarda milli hiss daha da çox oyansın. Sizin də, bizim hamımızın da borcu ondan ibarətdir ki, Azərbaycandan kənarda yaşayan azərbaycanlıların milli hissiyyatlarını oyadaq. Nəinki təkcə oyadaq ki, onlar yuxudan oyansınlar, həm də onlar güclənsinlər. Bu millilik bizi birliyə gətirir, yaxınlaşdırır. Bu millilik dövlətimizin əsasını yaradıbdır" [XXIc.s.99].

Feilin əmr şəklində işlətdiyi "bilin ki" ifadəsi ilə sədaqətin sinonimi kimi "sadiqliyi" təkrar edərək yaddaqalan nitq nümunəsi yaradır: "Bilin ki, mən sizə həmişə ***sadiq*** olmuşam, bundan sonra da ***sadiq*** olacağam. Mən Azərbaycan xalqına həyatım boyu ***sadiq*** olmuşam, ömrümün son dəqiqəsinə qədər də ***sadiq*** olacağam. Azərbaycanın dövlət müstəqilliyi yolunda bundan sonra da fədakarcasına çalışmaq mənim həyatımın mənasıdır" [VIIc.s.490].

"Şərəflə daşımaq" – ifadəsi nə deməkdir?! Bu frazeologizm Heydər Əliyevin dilində dövlətçilik ideyası ilə üzvi şəkildə sıx bağlıdır: "Ona görə mən istərdim ki, siz də, o

cümlədən Naxçıvandan kənarda yaşayan naxçıvanlılar da naxçıvanlı adını şərəflə daşıyasınız. Şərəflə daşımaq o deməkdir ki, gərək hər bir kəs qanun çərçivəsində hərəkət etsin, qanuna tabe olsun, qanunu möhkəmləndirsin, müstəqilliyimizi möhkəmləndirsin. ***Heç vaxt, heç bir*** vəchlə öz vəzifəsindən, imkanlarından sui-istifadə etməsin. Mən sizdən rica edirəım, bu halların qarşısını alasınız. Çünki bu siqnallar vaxtaşırı mənə gəlir" [VIIc.s.490].

Naxçıvanda "Kazım Qarabəkir Paşa məscidi"nin açilişi mərasimində nitqdə "dostluq", "qardaşlıq" dəyərləri türk dünyasına münasibətdə tez-tez səslənir. "Bəli" təsdiq ədatı bu dostluğun, bu qardaşlığın təsdiqi kimi auditoriyalara ünvanlanır. Bu dəyərlər zamanla uzlaşır: "Bəli, biz dəfələrlə deyirik: "Biz bir millət, iki dövlətik". Bu, bizim dostluğumuzun, qardaşlığımızın mənasını, məzmununu təşkil edir. Bu dostluq, qardaşlıq türk xalqı, Anadolu türkləri ilə Azərbaycan xalqı, Azərbaycan türkləri arasında əsrlərdən əsrlərə gələn dostluq, qardaşlıqdır" [XXIIc.s.241].

Təkrarlara ("tarixində", "ilk") və məntiqi ardıcıllığa söykənən nitq (azərbaycanlı→türk→müsəlman) "böyüklük" etik dəyərinin səslənməsinə gətirib çıxarır. Bu məqam üçün də Aristotel etikasında [10,s.108] hazır formula mövcuddur (Əməldə böyüklük göstərmək böyük dəyərlərə malik olan adamın adına layiq olan işdir. O şəxs görünür böyük adamdır ki, o, buna layiq olmaqla yanaşı özü-özünü də buna layiq bilir): "Xatirimdədir, mən Moskvada Sovetlər İttifaqı kimi superdövlətin başçılarından biri olduğum zaman istefaya getdim və məni Moskvada təqib etdilər. Orada məni çox incitdilər, hətta böyük təhlükələr qarşısında qalmışdım. Türk xalqı onu da bilməlidir ki, mən rus imperiyası ***tarixində***, sovet imperiyası ***tarixində***, sovet superdövlətinin ***tarixində*** Kremldə, o dövlətin başında duran ***ilk*** azərbaycanlı, ***ilk*** türk, ***ilk*** müsəlman olmuşam" [XXIIc.s.242].

Həyatının keşməkeşli anlarında ona qarşı çıxanları Azərbaycan dilinə məxsus antietik kateqoriyalar ilə – "namərdlər", "nadürüstlər" – qınağa çəkir, Naxçıvanda ona göstərilən münasibəti sinonim cərgə ilə dilə gətirir: "Moskvada üç il ağır bir şəraitdə yaşayandan sonra öz vətən torpağıma, Azərbaycana dönməyi qərara aldım. Gəldim Bakıya. Təəssüflər olsun ki, orada da ***namərdlər***, ***nadürüst*** insanlar mənim yaşamağıma imkan vermədilər. Buraya, Naxçıvana gəldim. Burada məni qucaqladılar, qoyunlarına aldılar, burada məni yaşatdılar" [XXIIc.s.242-243].

"Qoruya bilməyəcəmsə – hamımız bir yerdə şəhid olacağıq" – cümləsi "böyüklük" etik dəyəri kimi dövlət başçısının nitqində bəyan olunur: "Yəni 1990-cı ildə Lətif müəllim, Lətif Hüseynzadə 1918-ci ili yadına saldı və o illərin şahidi olaraq mənə bir ağsaqqal, müəllim kimi öz tövsiyələrini verdi. Mən ona dedim: Əziz müəllimim, mən böyük həyat yolu keçmişəm. Bu gün Naxçıvana məcburiyyətdən gəlmişəm, amma eyni zamanda gəlmişəm ki, sizinlə bir yerdə olum, bərabər olum, öz həmvətənlərimlə bir yerdə olum və vətənimi qoruyum. Əgər qoruya bilərəmsə – qoruyacagıq, ***qoruya bilməyəcəmsə – hamımız bir yerdə şəhid olacağıq***" [XXIIc.s.243].

Qeyri-etik dəyərlərin (eyş-işrət, bər-bəzək və s.) naxçıvanlılara xas olmaması "sınmamaq" kimi etik dəyərlərə malik olmasını deməklə bundan ibrət götürməyi tövsiyə edir: "Naxçıvanda gedən bu işgüzar quruculuq prosesi məni sevindirir. İnsanlar bu gün də çətin, ağır yaşayırlar. Bilirəm ki, ağır yaşayırlar. Amma naxçıvanlıların bir xüsusiyyəti vardır – nə qədər çətin yaşasa da, özünü hez vaxt sındırmaz. Özünü sındırmayıb deyəcək ki, mən yaxşı yaşayıram. Çünki eyş-işrət, bər-bəzək və sairə naxçıvanlılara heç vaxt xas olmayıbdır. Mən bunları heç vaxt görməmişəm" [XXIIc.s.247].

Hüseyn Cavidin Naxçıvanda dəfn olunması ilə əlaqədar söylədiyi nitq parçası mənəviyyatımızla bağlı diqqətçəkən bir

nitqdir. Cavidin xüsusi bir abidəyə layiq olması “həm”, “həm də” iştirak bağlayıcıları, “görə” qoşmasının təkrarı və “güman edirəm ki” modal sözün işlənməsi ilə auditoriyaya çatdırılır və əsaslandırılır. “Ona görə ki” səbəb bağlayıcısı Cavidin Naxçıvanda dəfnini şüurlara çatdırır. “Onda bəs Azərbaycanın başqa yerləri kasıb olacaq axı” cümləsi dərin dini-fəlsəfi bir ovqat yaradır: “Fəxri xiyabanda dahilərimiz yan-yanadır, hamısına böyük hörmət var. Amma Hüseyn Cavid ***həm*** əsərlərinə ***görə***, ***həm də*** əqidəsinə ***görə***, o qədər ağır cəzalandığına ***görə*** və bütün xidmətlərinə ***görə***, ***güman edirəm ki,*** xüsusi bir abidəyə layiqdir. Ona görə də ***qoy*** qədim Azərbaycan diyarı Naxçıvanda əcdadlarımız tərəfindən yaradılmış abidələrlə yanaşı, bizim yaratdığımız bir abidə də olsun. Əcəmi Naxçıvaninin Mömünə Xatun abidəsi ilə yanaşı, bizim dövrümüzün də bir abidəsi olsun. Bir də ***ona görə ki***, Cavid bu torpaqda doğulubdur. Azərbaycanın müxtəlif bölgələrində doğulmuş adamların hamısı Bakıda torpağa verilsə, onda ***bəs*** Azərbaycanın başqa yerləri kasıb olacaq ***axı***” [XXIIc.s.262-263].

Hələ sovetlər dönəmində antietik dəyərlərlə (korrupsiya, əxlaqa zidd hərəkətlər və sairə) o vaxtın çərçivəsində mübarizə aparan Heydər Əliyev bununla bağlı fikirlərini auditoriyaya səliscəsinə ünvanlaya bilir. Aparılan mübarizəni mahiyyətcə eyni olsa da formaca müxtəlif iki cümlənin köməyilə açıqlayır. Elə buradaca “sinonim cümlələrlə fikir aşılamaq hər natiqə müyəssər olmur” müddəasına gəlirik. Belə ki, “partiya dairələrində heç də hər yerdə yaxşı qarşılanmırdı” və “partiya rəhbərliyimizdə heç də həmişə bəyənilmirdi” cümlələri tərkib hissələri sinonim olan cümlələrdir: “Azərbaycanda MK-nın birinci katibi kimi mən də azadfikirliliyimlə müəyyən dərəcədə, o vaxtın çərçivəsi daxilində fərqlənirdim. O vaxtlar korrupsiyaya, əxlaqa zidd hallara, cəmiyyətdəki bütün mənfi hallara qarşı mübarizə barədə qaldırdığım məsələlər onda

***partiya dairələrində heç də hər yerdə yaxşı qarşılanmırdı.*** Çünki o vaxtlar belə bir müddəa mövcud idi: cəmiyyətimizdə mənfi nə varsa, hamısı keçmişin qalıqlarıdır və biz onları qabartmamalıyıq, çünki sosialist və kapitalist ideologiyaları arasında mübarizə gedir və aramızda qarşıdurma, "soyuq müharibə" olan ölkələrdəki düşmən qüvvələr bundan istifadə edirlər. Ona görə də mənim açıq çıxışlarım, məruzələrim, məqalələrim cəmiyyətdə çox böyük maraq doğururdu, ancaq eyni zamanda, bunlar ***partiya rəhbərliyimizdə heç də həmişə bəyənilmirdi***" [XXIVc.s.88].

Naxçivan Muxtar Respublikası Babək rayonunun Nehrəm kəndnin bir qrup sakini ilə görüşdəki söhbətdə Nehrəm kəndinin timsalında əxlaqi dəyərlərimizdən danışır, bu kəndin simasında üzünü bütünlüklə ölkə vətəndaşlarına tutur. "Bilirsiniz" modal sözün ardınca böyük natiqin düşündürücü, fəlsəfi fikirlərlə zəngin nitqi auditoriyalara ayaq açır. Üzünü Nehrəm kəndinin ağsaqqallarına tutub bu kəndin nümunə ola biləcək əxlaqi ənənələrini yada salır və bu ənənələrin qorunmasını (Nehrəmin gözəl ənənələrini, yüksək əxlaqi ənənələrini qoruyub saxlayasınız. İnsanların əxlaqının pozulmasına yol verməyəsiniz) ciddi-cəhdlə tələb edir: "***Bilirsiniz***", Nehrəm böyük kənddir. Tarixən nehrəmlilər heç vaxt Nehrəmə sığmayıblar. Azərbaycanın böyük-böyük ziyalıları Nehrəm kəndindən çıxmış adamlardılar. Naxçıvan Muxtar Respublikasının həm ziyalıları, həm dövlət işində işləyən adamlar Nehrəmdən olan adamlardır. Mən Nehrəm haqqında, Nehrəmin xüsusiyyəti haqqında, Nehrəmin ənənələri haqqında dəfələrlə demişəm və son dəfə Naxçıvana gələndə, xatirinizdədir, Cəlil Məmmədquluzadənin muzeyini açarkən orada bu barədə öz fikirlərimi, qəlbimdə olan hissiyyatları bildirdim.

Amma siz, Nehrəmin ağsaqqalları da ***gərək*** çalışasınız ki, Nehrəmin gözəl ənənələrini, yüksək əxlaqi ənənələrini qoru-

yub saxlayasınız. ***İnsanların əxlaqının pozulmasına yol verməyəsiniz***" [XXXIIc.s.416].

"Mənim yadımdadır" ifadəsi ilə auditoriyanın yaşlı təbəqəsini özüylə keçmişə aparan böyük natiq xüsusi bir canlanma yaradaraq, "əxlaqı qoruyun" ifadəsini iki yerdə təkrarlayır. Məcburiyyətdən uzaq olan (Mən indi demirəm ki, siz qadınların başına çarşab salın) lider əxlaqın qorunmasında israr edir. Yenə də "bilirsiniz" modal sözlə din haqqında özünün mülahizəsini auditoriyaya açıqlayır. Feilin vacib şəklində "itirməməliyik", "yaddan çıxarmamalıyıq", "hansısa dəyərlərlə əvəz etməməliyik" söz birləşmələri ilə əxlaqi dəyərlərimizin qorunması yolunda qətiyyət nümayiş etdirir: "Nehrəmi keçmişdə də, bu gün də dindar kənd hesab edirdilər. ***Mənim yadımdadır***, gənc vaxtlarımda Naxçıvanda yaşayanda eşidirdim ki, nehrəmlilər xüsusi bir millətdir, nehrəmlilər dindardır, nə bilim, qadının çarşabını atmağa qoymazlar. Naxçıvanın hər yerində qadınlar, demək olar ki, çarşabsız gəzirdilər. Amma Nehrəmdə elə şey yox idi. Üzləri örtülüdür, filandır, filandır. Mən indi demirəm ki, siz qadınların başına çarşab salın. Amma ***əxlaqı qoruyun. Əxlaqı qoruyun***, necə ki, o vaxtlar ***qoruyurdunuz***.

***Bilirsiniz***, din bir tərəfdən də mənəviyyatdır. Mən böyük dindarlığın tərəfdarı deyiləm. Çünki biz dünyəvi dəyərlərlə yaşamalıyıq. Amma eyni zamanda biz öz milli-mənəvi dəyərlərimizi ***itirməməliyik***, onları ***yaddan çıxarmamalıyıq***. Onları bizim millətimizə yad olan hansısa dəyərlərlə ***əvəz etməməliyik***" [XXXIIc.s.417].

Mən dəfələrlə demişəm, bizim gələcəyimiz milli-mənəvi dəyərlərimizin bəşəri dəyərlərlə, Avropa dəyərləri ilə sintezi vasitəsilə inkişaf edə bilər. Yəni biz nə qatı dindar olmalıyıq, nə bilim, qadını çarşab altında saxla, üzünü ört... Amma nə də bəzi yerlərdə olan – mən bunu açıqlamaq istəmirəm, bilirsiniz də – bəzi ölkələrdə olan insanların əxlaq normalarını qəbul

edə bilmərik. Təəssüflər olsun ki, indi Azərbaycanda bu istiqamətdə vəziyyət bir az xoşagəlməz haldadır. Bizim gənclərimiz – oğlanlar, qızlar, təəssüflər olsun ki, bəzən əxlaqsızlıq yoluna düşürlər [XXXIIc.s.430-431].

Daxili İşlər Nazirliyinin tərkibində, onun şəxsi heyətinin tərkibində birinci növbədə rəhbər işçilərin fəaliyyətində mənəvi dəyərləri möhkəmləndirməlisiniz, inkişaf etdirməlisiniz və beləliklə də, Daxili İşlər nazirliyinin bütün sistemlərində, yuxarıdan aşağıya qədər – nazirliyin rəhbərlərindən polis nəfərinə qədər sağlam əhval-ruhiyyə, sağlam mənəviyyat ***yaratmalısınız.***

Polis orqanlarının fəaliyyəti bir tərəfdən polis işçilərinin, DİN işçilərinin biliyindən, bacarığından, peşə səviyyəsindən asılıdırsa, digər tərəfdən bu orqanlarda möhkəm, dəmir nizam-intizamdan asılıdır. Bu nizam-intizam nə qədər möhkəm olsa, nə qədər qanunlara istinad etsə, eyni zamanda nə qədər ədalətli olsa, ***sizin*** işiniz də bir o qədər ***səmərəli olacaqdır.*** Bununla yanaşı polis orqanları işçilərinin hər biri ***yüksək mənəviyyat*** nümunəsi olmalıdır [Ic.s.143].

Qətiyyətli nitq – mənəviyyatın yüksəlməsini tələb edir, etik dəyərlərin inkişafını tələb edir: “Gənclərin tərbiyəsində milli, dini adət və ənənələri-mizdən istifadə etmək lazımdır. Əsrlərin dərinliyindən bu günə gəlib çatan adət-ənənələrimiz həmizə adamları saflığa, təmizliyə dəvət etmişdir. Milli və dini adət-ənələrimiz məhz bu prinsiplərə əsaslanır. Bu gün biz də gəncləri ***paklıq, saflıq, yüksək əxlaq, yüksək mənəviyyat*** ruhunda tərbiyə etməliyik. Bununla biz nəinki cəmiyyətimizi qoruyacağıq, həm də gələcək nəsli sağlam saxlayacaq və həmin nəsildə cəmiyyətimiz, xalqımız üçün zərərli halların kök salmasının qarşısını alacağıq. Bir də təkrar edirəm, cinayətkarlıqla mübarizə, gənclərin sağlam ruhda tərbiyə olunması üçün hər kəs öz sahəsində lazımi tədbirlər görməlidir” [IIc.s.180]. Heydər Əliyev əxlaqi dəyərləri kənarda yox, elə

özümüzün milli, dini ənənlərimizdə axtarmağı tövsiyə edir. Və bu əxlaqi dəyərlər sinonim cərgələrin – "paklıq", "saflıq", "yüksək əxlaq", "yüksək mənəviyyat" işığında özünə yer tapır. Elə bu mənfi halların kökünü kəsilməsi qəti gələcək zamanla açıqlanır.

"Öz" təyin əvəzliyinin təkrarı ilə hər xalqın milli-mənəvi dəyərlərinə hörmət etməyə səsləyir, "yüz", "min" miqdar sayları ilə ekspressivlik yaradır. "Çünki" səbəb bağlayıcısı ilə dini rəhbərlərə sayğıya çağırır: "Hər xalqın ***öz*** adət-ənənəsi var, ***öz*** milli-mənəvi və dini dəyərləri var. Biz ***öz*** milli-mənəvi dəyərlərimizlə, ***öz*** dini dəyərlərimizlə, adət-ənənələrimizlə fəxr edirik. Bizim xalqımız ***yüz*** illərlə, ***min*** illərlə adət-ənənələrimizi, milli-mənəvi dəyərlərimizi yaradıbdır və bunlar indi bizim xalqımızın mənəviyyatını təşkil edən amillərdir. Əgər insan mənsub olduğu millətin milli-mənəvi dəyərlərini anlaya bilmirsə, yaxud onları qəsdən təhrif edirsə, əgər vəziyyət o dərəcəyə çatırsa ki, hətta Azərbaycanın dini rəhbəri təhqir olunur, onda, təbiidir ki, bu bizi narahat etməlidir. Mən bunu nə üçün deyirəm? ***Çünki*** bu, indi Şeyxülislama yönəldilmiş bir təhqirdir. Amma, ümumiyyətlə, təhqir, yalan, böhtan bizim bir çox mətbuat orqanlarında adi hala çevrilibdir. Nə məqsəd daşıyırlar? Ölkədə, insanlarda müxtəlif fikir formalaşdırmaq. Buna nail ola bilməyəcəklər! [XXXVc.s.349]

Bu fürsətdən istifadə edərək, bir-iki məsələyə də toxunmaq istəyirəm. O da ondan ibarətdir ki, biz öz milli-mənəvi dəyərlərimizi, adət-ənənələrimizi, əxlaqi dəyərlərimizi bütün istiqamətlərdə ***qorumalıyıq, saxlamalıyıq*** və gənc nəsli əsrlər boyu böyük sınaqlardan keçmiş bu mənəvi, əxlaqi dəyərlər ruhunda ***tərbiyələndirməliyik*** [XXXVc.s.350-351].

"Heç vaxt" inkar ifadəsi ilə xalqların bir-birinə bənzəmədiyini, hər bir xalqın adət-ənənələrinə hörmət göstərməyi tövsiyə edir: "Hər xalqın öz mentaliteti var. Bizim Azərbaycan xalqının mentaliteti onun böyük sərvətidir. Heç vaxt iki xalq

bir-birinə bənzəməz. ***Heç vaxt*** iki xalq bir-birinə bənzər dəyərlərə malik ola bilməz. Yenə də deyirəm, hər xalqın ***özünə***, ***öz*** tarixi köklərinə, əcdadları tərəfindən yaradılmış milli-mənəvi dəyərlərinə bağlılığı böyük amildir. Biz də indi dünyanın mütərəqqi mənəvi dəyərlərindən istifadə edərək, xalqımızın mədəni səviyyəsini daha da inkişaf etdirərək, gənc nəsli daha da sağlam əhval-ruhiyyədə, saf əxlaqi əhvali-ruhiyyədə tərbiyələndirməliyik. Amma bunun əvəzinə, bizim cəmiyyətimizdə bəzi qüvvələr buraxdıqları ayrı-ayrı qəzetlərlə, jurnallarla xalqımızın içərisində, xüsusən gənclərin içərisində pozuculuq işləri ilə məşğuldurlar [XXXVc.s.350-351].

Bakıda fəaliyyət göstərən bəzi gecə klublarında səhərə qədər müxtəlif oyunlar, əyləncələr təşkil edilir və çox vaxt da bu əyləncələr ifrat dərəcəyə gəlib çatır. Bütün Azərbaycan xalqının əxlaqına, mənəviyyatına zidd forma alır və beləliklə də, bizim gənclərimizin bir hissəsinin əxlaqı pozulur. Bu, ***dəhşətli*** bir şeydir [XXXVc.s.351].

Sovetlər dönəmindən sonra milli dəyərlərimizdə baş verən qeyri-etik dəyərlər tənqidə məruz qalır. “Zənginləşmənin əleyhinə” olmayan, iqtisadi etikanı auditoriyaya bəyan edən Heydər Əliyev antietik “əxlaqsızlıq”, “mənəviyyatsızlıq” kimi hallara təəssüf edir. Elə bu təəssüfün ardınca inzibati dövlət orqanlarına göstərişlərini verir, feilin lazım şəklində olan “götürülməli”, “son qoyulmalıdır” ifadələri ilə məmurları səfərbər edir: “Amma bir qütbdə həddindən artıq zənginləşmiş, bəzi hallarda qanunsuz zənginləşmiş, öz vəzifələrindən sui-istifadə edərək zənginləşmiş, harınlaşmış insanlar və onların övladları eyş-işrət içərisindədir, o biri tərəfdən, çadırlarda yaşayan insanlar ***inildəyirlər***, nə qədər ***əziyyətlər*** çəkirlər. Hər bir vətənpərvər insan düşünməlidir ki, əgər mənim xalqımın bir hissəsi belə ağır vəziyyətdədirsə, mən bu qədər harınlaşmamalıyam. Amma harınlayanlar, bəzi zənginləşmiş adamlar var.

Biz insanların bəzilərinin bizneslə məşğul olaraq ***zənginləşməsinin əleyhinə deyilik***. Ancaq bizə o da məlumdur ki, Avropanın, Amerikanın ən zəngin insanları birinci növbədə mənəviyyatı qoruyurlar. Onlar nə qədər zəngin olsalar da, milyardlarla dolların, böyük işlərin sahibi olsalar da ***heç vaxt*** mənəviyyatsız yola getməzlər. İnsanlar varlandıqdan, zənginləşdikdən sonra, xalqına, dövlətinə daha yaxşı xidmət etmək barədə ***düşünməli***, daha çox iş görməlidir. Əldə etdiyi vəsaitlə yeni işlər görüb Azərbaycanın iqtisadiyyatını ***inkişaf etdirməlidir***. Amma ***təəssüf ki***, bəziləri özləri də, övladları da ***əxlaqsızlığa, mənəviyyatsızlığa*** yol verirlər. Bəziləri bizim gənc qızlarımızı yoldan çıxarırlar, onları əxlaqsızlığa sövq edirlər. Bunların hamısı bizim yeni bəlalarımızdır. Bu bəlalarla mübarizə aparmaq lazımdır. Mən bu gün şəhər icra hakimiyyətinin başçısı Abutalıbova və Daxili İşlər naziri Usubova bu barədə lazımi göstərişlər vermişəm. Lazım olan ölçülər ***götürülməli*** və bütün bunların hamısına ***son qoyulmalıdır***. Bizim məqsədimiz xalqımızın mənəviyyatını qorumaq və zənginləşdirməkdir” [XXXVc.s.352].

## 1.1.1.Heydər Əliyevin nitqində ədalət

Heydər Əliyevin nitqlərində ədalət etik kateqoriyasını araşdırmazdan öncə qədim yunan filosofu Aristotelin ədalət haqqında olan fikirlərinin müasirliklə əlaqə baxımından təqdimi vacibdir: "Əgər, biz bildiyimiz kimi, qanunu pozan şəxs ədalətsiz adamdırsa, qanunun yolunu tutub gedən şəxs isə ədalətli adamdırsa (dikaios), aydındır ki, qanun çərçivəsi daxilində olan bütün işlər müəyyən mənada ədalətlidir. Doğrudan da, qanunvericilikdə nəzərdə tutulanların hamısı qanunauyğunluqdur, bu qərarların hər birini isə biz ***ədalətli***, yəni ***haqq*** hesab edirik" [10,s.129].

"İndi bizim əsas vəzifəmiz gənclərdə vətənpərvərlik ruhunu, milli ruhu, döyüş ruhunu qaldırmaqdır. Vətəni, torpağı müdafiə etmək, hər bir gənc üçün müqəddəs vəzifə olmalıdır. Biz xalqımızı, gənclərimizi ***ədalətsiz müharibəyə*** dəvət etmirik, başqa ölkələrin torpaqlarına göz dikmirik. Ermənistan torpaqlarından heç nə ələ keçirmək istəmirik. ***Ancaq*** eyni zamanda torpaqlarımızın zəbt olunmasına dözməməliyik. Millətini, torpağını sevən hər bir namuslu adam buna razı olmamalıdır. Ona görə də gənclər ***gərək hərbi xidmətə getsinlər.*** Hərbi xidmət etməyən gənc gələcək həyatında sınaqlardan çıxa bilməz. Bu, tarixən belə olmuşdur: hərbi xidmət insanları daha da mətinləşdirir, daha ***cəsarətli***, dözümlü edir, çətinlikləru aradan qaldırmaq keyfiyyəti aşılayır" [Ic.s.176].

"Əlbəttə" qəti təsdiq modalı ilə müxalifləri ədalətli olmağa çağırır. "Yox" inkar ədatı ilə ədalətsizliyə yox deyir: "Əlbəttə, müxalifət iqtidara qarşı öz fikrini bildirməlidir. Amma bu, doğru-düzgün, ***ədalətli*** olmalıdır, böhtan yox! ***Böhtan*** yox, ***yalan*** yox, ***uydurma*** yox, ***saxtalaşdırma*** yox!" [XIIc.s.93].

Heydər Əliyev ədalətsizliyi "ittiham edir", auditoriyanı da bu ittihamın doğruluğuna inandırır: "O hadisədən sonra, yanvarın 21-də Moskvadakı Daimi nümayənədəliyimizə getdik.

Orada Moskvada yaşayan beş mindən artıq azərbaycanlı yığışmışdı. Biz matəm etdik, böyük mitinq oldu. Mən o vaxt Moskvada ağır bir vəziyyətdə yaşadığım zaman mitinqdə çıxış etdim, Azərbaycana qarşı bu cür ədalətsiz hərəkət etdiyinə görə kommunist rejimini ***ittiham etdim***" [XIIc.s.89].

"Ədalətli" etik və "ədalətsizlik" antietik dəyərlərə yunan filosofu Aristotelin şəxsi münasibətlərini oxucularla bölüşmək qərarına gəldik. İndi baxıb görək "ədalətsiz" (adikos) sözü necə mənada işlənir. Beləliklə, o adam ədalətsiz sayılır ki, o, qanunu (paranomos) pozur, öz mənfəətini güdür (pleonektes) və haqsızdır, buradan isə aydındır ki, ədalətli adam qanuna tabe olan (moninos) və haqlı (isos) şəxsidir. Deməli, ədalət və ya haqq qanuni və haqlı şeydir, ədalətsizlik və ya haqsızlıq isə qanuna zidd və haqsız şeydir.

Əgər ədalətsiz adam öz mənfəətini güdəndirsə, onun məqsədi faydalanmaq olacaq, özü də hər şeydən yox, o şeylər, hansılar ki, həyatda olan uğur və uğursuzluqlar bunlarla bağlıdır və hansılar ki, bunları şərtsiz olaraq götürürük, həmişə yaxşı şeylər olur ancaq bu və digər adama görə bu, həmişə belə deyil. Buna baxmayaraq insanlar o yaxşı şeyləri Allahdan diləyib, onları axtarırlar ki, bunu etməli olmasalar da, bu vacibdir, bir tərəfdən yalvarırlar ki, şərtsiz olan yaxşı şeylər onlar üçün də yaxşı şeylər olsun, digər tərəfdən isə – o şeyi seçirlər ki, bu, onlar üçün xeyirlidir [10,s.128-129].

Beləliklə, ədalət proporsionallıqdır, ədalətsizlik isə qeyri-proporsionallıq. Deməli axırıncı halda münasibətlərdə olan tarazlıq pozulur; işdə də, məhz bu baş verir. Doğrudan da, ədalətsiz hərəkət etdikdə lazım olduğundan çox xeyir götürürlər, ədalətsizliyə məruz qaldıqda isə az. Pis işdə isə əksinə: kiçik pislik böyük pislikdən yaxşı mənada fərqlənir, zira kiçik pislik böyük pislikdən daha yaxşıdır, hansı şey üstün tutulursa, o da yaxşı şeydir, bir şey nə qədər (üstün

tutulursa), o, bir o qədər yaxşı şeydir. Beləliklə, ədalətin bir forması budur [10,s.136].

Beləliklə, ədalətsizliyin və ədalətin nə olduğu barədə danışdıq. Əgər bu anlayışlara tərif verilibsə, aydındır ki, işdə (dikaiopragia) ədalət, ədalətsiz (toadikein) hərəkət etməklə ədalətsiz şeyə (to adikeisthai) məruz qalmağın – bir halda qədərindən çoxa, digər halda aza malik olurlar – arasında olan ortadır. Ədalət isə nə isə bir ortaya yiyələnmədən ibarətdir, amma digər məziyyətlər olan mənada yox, ona görə ki, o, ortaya məxsusdir, ədalətsizlik isə – ifrat hallara.

Deməli, ədalət o şeydir ki, hesab edildiyinə görə ədalətli adam bunun sayəsində öz xoşuyla ədalətli surətdə bulunmaq və xeyri özü ilə başqaları arasında bölüşdürmək iqtidarındadır, həmçinin o, elə edir ki, layiqli şeylərin bölgüsündə onun payı başqalarınınkından çox olmasın (ziyanlı şeylərin bölgüsündə də həmçinin), belə ki, hər iki tərəfin payı tən olsun; digər şəxslərin arasında da pay bölgüsü apardıqda, o, belə hərəkət edir.

Əksinə, ədalətsiz adam ədalətsiz şeyi, yəni haqsız şeyi nəzərdə tutur, deməli, xeyirdə və ziyanda müvafiq olaraq artıq və əksiyi nəzərdə tutur, bu isə proporsionallığı pozur. Bax buna görə ədalətsizlik – artıq və əskikdir, axı bu, artıq və əksiyi doğuran səbəbdir, həm də ədalətsiz adamın özü üçün şətsiz olan faydalı işlərdə artığı doğuran səbəbdir, ziyanlı işlərdə əskiyi doğuran səbəb, digərləri üçün isə hər şeyi, ümumiyyətlə, belədir, ancaq proporsionallıq istənilən tərəfə dəyişib, pozula bilər. Beləliklə, ədalətsiz işin (to adikema) iki tərəfi var: "aza" malik olmaq ədalətsizliyə məruz qalmaq, "çoxa" malik olmaq isə – ədalətsiz hərəkət etmək deməkdir.

Aristotelin "ədalət" haqqındakı fikirlərindən sonra Heydər Əliyevin dilində "ədalətli" olmağı insanlara anlatmağın şahidi oluruq: "Hüquqi dövlət qurmaq üçün müvafiq qanunlar qəbul

etmişik və bundan sonra da edəcəyik. Kim bunun qarşısını alacaqsa, biz onu yolumuzdan kənarlaşdıracağıq.

Bilirsiniz, mən bunları sizin üzünüzə deyirəm. Əvvəl də dedim, mən sizin işlərinizi qiymətləndirirəm. Ancaq mənim xüsusiyyətim bir də ondan ibarətdir ki, kimi çox qiymətləndirirəm, onun səhvini, günahını da üzünə deyirəm. Üzünə deyirəm, ona görə yox ki, onun üçün acı olsun. Ona görə ki, o anlasın. ***Anlasın ki***, düz işləmək lazımdır. ***Anlasın ki, ədalətli*** işləmək lazımdır. ***Anlasın ki***, qanunla işləmək lazımdır. ***Anlasın ki***, bizim bu demokratik, hüquqi dövlət quruculuğumuzun yolu ilə getmək lazımdır, şəxsi mənafeləri kənara qoymaq lazımdır [XXVIc.s.424-425].

Heç kəs gizlənə bilməz, bu göy qübbə altında,
Hər kəs öz mərdliyilə çatır şöhrətə, ada. [106,s.107]

Cahanın qəddarlığı onsuz da bəsdir bizə,
Yalnız ***haqqı*** qoruyan şahlar nəfəsdir bizə. [106,s.110]

Bilirsiniz ki, mənim həyatım xalqa, millətə, Azərbaycana həsr olunubdur. Bu, mənim həyatımın mənasıdır. Əgər insanlar bunu görürsə və qiymətləndirirsə, bu, mənim üçün ən yüksək mükafatdır. Ancaq kimsə qiymətləndirir, kimsə qiymətləndirmirsə, bu da mənim üçün heç bir narahatlıq hissi doğurmur. ***Cəmiyyətdə hamı üçün yaxşı olmaq mümkün deyildir***. ***Xüsusən*** də hakimiyyətdə olan insan üçün. Hakimiyyətdə olan insan kimisə təltif edir, amma onun hakimiyyəti dövründə kimsə cəzalanır. Bu təbiidir. Qanunu pozan, cinayət edən ***cəzalanmalıdır***. Amma ***təəssüf*** ki, cəzalanan həmin insan bəzən öz cinayətini unudaraq hakimiyyəti, onu cəzalandırmış orqanları günahlandırır. ***Bu*** da var. ***Bu*** da bizim reallığımızdır. ***Bu*** da məndə heç bir təəccüb doğurmur. Ancaq Azərbaycanda insanların tam əksəriyyəti dövlətimizin müstəqilliyi

yolunda son beş ildə görülmüş işləri qiymətləndirir və sizin burada dediyiniz kimi, yüksək qiymətləndirir. Bu da mənim üçün, mənim gələcək işlərim üçün böyük dəstəkdir. Bu, məni daha da ruhlandırır, mənə daha da çox güc verir [XVIIc.s.165-166].

Heydər Əliyev nitqində ədalət etik kateqoriyası ən çox Qarabağ münaqişəsi ilə bağlı çıxışlarda özünü göstərir. Bu ədalətsizlik auditoriyalara səmimi ifadələrlə (sözün düzü), "təəssüf" modal sözü ilə açıqlanır. "Niyə", "nə üçün" sual əvəzlikləri ilə ardıcıl səslənən ritorik suallar auditoriyanı bu ədalətsizliyə qarşı səfərbər edir: "Təkrar edirəm, mən istəyirəm ki, Yuqoslaviya münaqişəsi ***ədalətlə***, dincliklə və ona cəlb olunmuş bütün tərəflərin mənafeyinə uyğun həll edilsin. Bununla bərabər, ***sözün düzü***, həmişə peşmançılıqla, təəssüflə düşünürəm: ***nə üçün*** bizim regiona belə maraq yoxdur? ***Nə üçün*** Dünya Birliyi, böyük dövlətlər, o cümlədən Rusiya və digər Avropa dövlətləri, Amerika Birləşmiş Ştatları – hamı indi onunla məşğul olur, buna nə qədər vəsait sərf edirlər? ***Niyə*** buradakı münaqişəni aradan qaldırmaq, burada haqq-ədalətə nail olmaq üçün tədbirlər görmədilər? [XXc.s.38]

Xaricdə yaşayan həmvətənimiz, taninmiş müğənni Yaqub Zurufçu ilə görüşdəki söhbətində, Prezident sarayı 28 iyul 1999-cu ildə Heydər Əliyev beynəlxalq səviyyədə baş verən, Azərbaycanın suverenliyinə qarşı yönələn ədalətsizlikdən danışır. "Ədalətsizlik" terminini təkrarlayaraq, davamiyyət bildirən modallarla "ədalət" etik kateqoriyasını gündəmə gətirir: "Ancaq təəssüflər olsun ki, Dağlıq Qarabağ erməniləri və Ermənistan 1988-ci ildə bu məsələni qaldıranda bunun qarşısı alınmadı. Bu da hərbi münaqişəyə, qanlı müharibəyə gətirib çıxardı. Buna görə də Azərbaycan xalqında sovet hakimiyyətinə qarşı böyük bir etiraz, narazılıq var idi. Bu da əsaslı, ***ədalətli*** idi. Çünki Azərbaycana qarşı ***ədalətsizlik*** edilmişdi.

Birinci ***ədalətsizlik*** o vaxt, ikinci ***ədalətsizlik*** – həm xəyanət, həm cinayət 1990-cı ilin yanvarında edilmişdi [XXIc.s.85].

“Amma” qarşılaşma bağlayıcısı ilə ədalətin ən çox təhsil sahəsində olmasının vacibliyini gündəmə gətirir: “Ədalət ***hər yerdə*** lazımdır. ***Amma*** məktəbdə ədalət hamısından çox lazımdır, ali məktəbdə ədalət hamısından çox lazımdır. Siz müəllimsiniz, siz psixoloqsunuz, siz bu işləri bizdən yaxşı bilirsiniz” [XXIc.s.258].

Məşhur Norveç səyyahi Tur Heyerdal və onu müşayiət edən şəxslərlə görüşdə söhbət zamanı son bir əsrdə ölkəmizin məruz qaldığı ədalətsizliyi əcnəbi qonaqlara izah edir. Ədalətin bərpası üçün tarixi həqiqətlərin olduğu kimi çatdırılmasının vacibliyini diqqətə çatdırır: “Bu baxımdan Azərbaycan çox böyük ***ədalətsizliklərə*** – Sovet İttifaqı yaranan zaman da, ondan sonrakı dövrlərdə də və son on il müddətində də – məruz qalıbdır. ***Əlbəttə***, bütün bunlar barədə hamı düşünməlidir. Hamı bilməlidir ki, tarixi şəxsi məqsədlərə uyğun olaraq yaratmaq olmaz. Tarix ***həqiqəti*** əks etdirməlidir. Bunlar mənim ümumi mülahizələrimdir. Mənim dediyim bu sözlərin sizin apardığınız işlərlə heç bir əlaqəsi yoxdur. Burada həm sol tərəfdə, həm də sağ tərəfdə tarixçilər əyləşiblər. Mən fürsətdən istifadə edərək bu barədə öz fikirlərimi bildirirəm” [XXIXc.s.434].

Fransada təhsil alan soydaşlarımızla görüşdə Azərbaycan həqiqətlərini görməkdə dünya ictimaiyyətini doğru yolu çağırır: “Sağ olun. Bilirsiniz, bizə qarşı, ölkəmizə, xalqımıza qarşı **ədalətsizlik** olubdur. Amma təəssüflər olsun ki, dünya ictimaiyyətində, bir çox ölkələrdə, o cümlədən Fransada bu ədalətsizliyi bilmirlər, ya da bilmək istəmirlər. Nə üçün? Çünki Ermənistan tərəfinin dünyada diasporu çox böyükdür. Onların təbliğatı böyükdür. Amma Azərbaycanın keçmişdə bu barədə imkanları olmayıbdır. Heç olmasa indi siz, necə deyərlər, yavaş-yavaş meydana gəlirsiniz. Bu bizə çox lazımdır.

Çünki biz Azərbaycana qarşı edilən ***ədalətsizliyi***, təcavüzü sübut etməliyik. Əgər bunu sübut etməsək, biz məsələni həll edə bilmərik. Burada da gərək hərə öz səyini qoysun" [XXXIIIc.s.32].

Ulu Öndərin nitqlərinin əsas qayəsi islahatların sonda sosial ədalətin təntənəsinə gətirib çıxarmasıdır: "Səhiyyədə islahatlar aparılır. Bu da təbiidir. Apardığımız islahatların əsas məqsədləri, əsas mənası bundan ibarətdir ki, biz sosial ***ədalətli*** cəmiyyət qurmaq istəyirik. Bütün islahatlar sosial yönümlü olmalıdır, sosial ***ədaləti*** təmin etməlidir. Bu, asan məsələ deyildir. Amma bilin, bu, bizim qarşımızda olan strateji vəzifədir və biz özəlləşdirməni həyata keçirərək, torpaq islahatı keçirərək, başqa iqtisadi islahatları keçirərək, xarici ticarəti liberallaşdıraraq, ümumiyyətlə, iqtisadiyyatda liberallaşdırmanı daha da sürətlə yayaraq bir şeyi heç vaxt unutmamışıq və unutmayacağıq: sosial vəziyyət, sosial ***ədalət*** və bütün bu görülən işlərin sosial yönümü. Ona görə də biz bu işlərin hamısını birlikdə, kompleks şəklində apararaq, şübhəsiz ki, cəmiyyəti ilbəil, aybaay daha da yaxşı vəziyyətə gətirəcəyik" [XXc.s.379].

Sosial ədalətin bərpası böyük söz adamlarının, filosofların əsas fikri olmuşdur ki, bu məqamda da Nizami Gəncəvinin ideyaları özünü göstərir:

Bu dünyada kim tapar ən böyük səadəti?
O kəslər ki, qoruyar gözləyər **ədaləti**! (106,s.110]

**Adil** olsa şah əgər, hamı ona baş əyər,
Bəslər məhəbbətini bütün canlar, könüllər. (106,s.111]

Beləliklə, böyük natiqin dilində ədalət dahi Nizaminin ədaləti ilə üst-üstə düşür.

## 1.1.2.Heydər Əliyevin nitqində cəsarət

Azərbaycan siyasi natiqliyinin inkişafında əvəzsiz rol oynayan Heydər Əliyev nitqlərinin müxtəlif tərəflərinin araşdırılması bu gün də, qloballaşma dediyimiz dövrdə də aktuallığını saxlayır. Tərəfimizdən dəyərli oxucularımızın istifadəsinə verilmiş "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" ikicildlik monoqrafiyasında Ulu Öndərin nitqlərində poetik çalarlar, fəlsəfi fikirlər, əsas və köməkçi nitq hissələri, üslublar və s. tədqiqat obyekti olsa da, onun spontan, şifahi, ecazkar nitqlərində etik dəyərlərin, etik kateqoriyaların araşdırılmasına diqqət yetirilməmişdir. Etik kateqoriyaların dövlətçilik, diplomatiya sahəsində digər nitq ünsürləri ilə harmonik səsləndirilməsi tək-tək siyasi natiqlərə müyəssər olur.

Heydər Əliyev şəxsiyyətinə xas olan mühüm etik kateqoriyadan biri cəsarətdir. Biz bu kateqoriyanı Ulu Öndərin nitqlərində ana xətt kimi görürük ki, elə bu xalqın dövlət rəhbərindən tələb etdiyi, eləcə də xalqı lider ətrafında sıx birləşdirən ən mühüm etik kateqoriyalardan biridir.

Məhz mühüm bir etik kateqoriya hesab olunan cəsarət haqqında Aristotel deyirdi: "Belə ki, cəsarətli, sözün əsl mənasında, görünür, o adamdır ki, o, ən gözəl ölümü və insanı ölümlə hədələyən hər bir şeyi qorxu bilmədən qarşılayır. Daha sonra cəsarət müəyyən fəaliyyəti seçib, o şeyin qarşısında duruş gətirir ki, o, çox gözəl şeydir, yaxud ona görə ki, bunun əksinə hərəkət etmək rüsvayçılıqdır" [10,s.81] Aşağıdakı mətndə bu kateqoriyanın bariz nümunəsinə böyük natiqin nitqində şahid oluruq: "Mən demişəm və bir də deyirəm, ömrümün bundan qalan hissəsini xalqıma bağışlamışam. Xalqım da bundan nə qədər istifadə edəcək, o qədər də istifadə edəcək. Ola bilər beş gün olsun, ola bilər bir ay olsun, ola bilər ondan çox olsun, ondan da artıq olsun. ...Ümumiyyətlə, məni hədələyən adamların hamısına deyirəm, heç birisi

güman etməsin ki, bu hədələr məni bir şeydən çəkindirə bilər. Xalqın yolunda mən özümü qurban verməyə hazıram, bu harada baş verəcək, mənim üçün fərqi yoxdur" [IIc.s.358]. Qətiyyətlilik böyük natiqin çıxışlarında bir tərəfdən nitq elementidirsə, digər tərəfdən "cəsarət" etik anlayışı kimi səslənir: "Heç kim məni devirə bilməz. Mən bunu xalqın qarşısında deyirəm. Mən xalqın iradəsini yerinə yetirirəm. Azərbaycan Respublikasının dövlətçiliyini müdafiə edirəm, onun bütövlüyünü müdafiə edirəm. Bu yolda məni heç kəs sındıra bilməz, çəkindirə bilməz, ***heç kəs*** qorxuda bilməz". "Heç kim", "heç kəs" inkar əvəzlikləri ilə əzmkarlıq və qətiyyət nümayiş etdirilir. "heç kəs...bilməz" ifadələrinin təkrarı isə bu qətiyyəti yaddaqalan edir. "Cəsarət" etik kateqoriyası böyük natiqin dilində gah xalqdan tələb olunur, gah xalqa məxsus olduğu dilə gətirilir: "Mən Azərbaycanın gənclərinə müraciət edirəm. Azərbaycanın ağır anlarında gənclər həmişə özlərinin qəhrəmanlığını, ***cəsarətini*** göstərmişlər, bu gün də göstərməlidirlər" [IIc.s.360].

Aristotel vətəndaş cəsarətinin mənasını aydın şəkildə açıqlayır: "Hər şeydən öncə vətəndaş (politike) cəsarəti, axı bu, cəsarətə daha çox bənzəyir. Qanunla müəyyənləşdirilmiş müstəqillik dərəcələrinə görə, tənəyə görə, həm də şərəf və hörmət naminə müharibənin ağırlığını vətəndaşlar öz çiyinləri üstündə daşıyırlar, bunu belə hesab etmək qəbul olunmuşdur. Bax buna görə də o vətəndaşlar ən cəsarətli sayılır ki, onlarda qorxaqlar abırdan salınır, cəsarətlilər isə ***şərəf*** və ***hörmət*** sahibi olurlar. Homer də, məsələn, Diomed və Hektoru belə təsvir edir: Mər qorxudan qapı və divar dalında gizlənən zaman mənə ar olsun!" [10,s.84].

Elə Heydər Əliyev üçün də cəsarət vətəndaş şücaəti, mövqeyidir. Xalq şairi Qabilin 70 illiyinə həsr olunmuş yubiley gecəsindəki söhbətdə həm şair, yazıçı cəsarətindən, həm də şair, yazıçı siyasətindən bəhs edilir: "Yubiley gecəsində çıxış

edənlərdən biri dedi ki, Qabil siyasətlə məşğul olmayıbdır. Bu fikir doğru deyil. Qabilin həmin Yanvar faciəsinə həsr olunmuş şeirinin özü ***siyasətdir***. Yaxud, yadımdadır, mən Naxçıvanda olanda Qabil burada qəzetdə çıxış etmişdi və Mütəllibova 24 sual vermişdi ki, o bu suallara cavab versin. Mən o vaxt bu yazını oxudum, fikirləşdim ki, görəsən, Mütəllibov ***bu suallara cavab verəcək, yoxsa yox***? O, həmin suallara cavab verə bilmədi. Qabilin bu sualları verməsinin özü bir vətəndaş ***şücaəti***, mövqeyi idi. Ona görə də Qabil heç də siyasətdən kənarda qalmayıb, öz fikrini deyibdir" [VIIIc.s.236-237]. Keçmışdə baş verən hadisələrə münasibətdə natiqin işlətdiyi ritorik sual (fikirləşdim ki, görəsən, Mütəllibov bu suallara cavab verəcək, yoxsa yox?) və həmin ritorik suala cavab auditoriyanı yenidən səfərbər edir.

Aristotelə görə cəsarət məhdudiyyətlər daxilində olmaqla qorxu və qoçaqlıq arasındakı ortaya yiyələnmədir; daha sonra cəsarət müəyyən fəaliyyəti seçib, o şeyin qarşısında duruş gətirir ki, o, çox gözəl şeydir, yaxud ona görə ki, bunun əksinə hərəkət etmək rüsvayçılıqdır. Yoxsulluqdan, məhəbbətdən, yaxud başqa bir əzabdan azad olmaq üçün ölmək cəsarətli adama xas olan cəhət deyil, bu daha çox qorxağa xasdır, axı əzab-əziyyətdən yaxa qurtarmaq – zəiflik deməkdir, çətinlikdən qorxan adamsa ölümü ona görə qəbul etmir ki, bu yaxşı şeydir; ancaq ona görə qəbul edir ki, bu, adamı pis şeylərdən azad edir [10,s.83]. Dövlətçiliyin təhlükədə olduğu anlarda Heydər Əliyev nitqində məsuliyyəti təkbaşına boynuna götürdüyü məqamlar üçün "mən" şəxs əvəzliyinin təkrarlanması işə düşür, auditoriya lider cəsarətinin şahidi olur. Xalqdan mandat alan dövlət başçısı "heç kim", "heç kəs" inkar əvəzlikləri ilə prinsipial, cəsarətli mövqe nümayiş etdirir: "***Heç kim*** məni devirə bilməz. ***Mən*** bunu xalqın qarşısında deyirəm. ***Mən*** xalqın iradəsini yerinə yetirirəm. Azərbaycan Respublikasının dövlətçiliyini müdafiə edirəm, onun bütövlüyünü müdafiə

edirəm. Bu yolda məni ***heç kəs*** sındıra bilməz, çəkindirə bilməz, ***heç kəs də*** qorxuda bilməz" [Ic.s.99].

Xalqın yolunda "özünü qurban verən" lider böyük cəsarətlə "heç birisi güman etməsin ki" deyərək özlərini etikadan kənar apranları sərt qınağa çəkir: "Mən demişəm və bir də deyirəm, ömrümün bundan qalan hissəsini xalqıma bağışlamışam. Xalqım da bundan nə qədər istifadə edəcək, o qədər də istifadə edəcək. Ola bilər 5 gün ***olsun,*** ola bilər bir ay ***olsun,*** ola bilər ondan çox ***olsun,*** ondan da artıq ***olsun***. Ona görə Əlikram kimi adamların məni hədələməyi, bir onun yox, ümumiyyətlə, məni hədələyən adamların hamısına deyirəm, ***heç birisi*** güman etməsin ki, bu hədələr məni bir şeydən çəkindirə bilər, xalqın yolunda mən özümü qurban verməyə hazıram, bu harada baş verəcək, mənim üçün fərqi yoxdur. Ancaq bu cür ***tərbiyəsizlik***, bu cür ***ədəbsizlik şübhəsiz ki***, məni narahat edir" [Ic.s.71].

Cəsarət qoçaqlığa və qorxuya təsir edən şeylərlə də əlaqədardır, ancaq o, nə bu, nə də o biri ilə eyni dərəcədə əlaqədar deyil, lakin ən çox qorxu ilə bağlıdır. Doğrudan da, kim təhlükələr zamanı soyuqqanlı olub, özünün necə lazımdır elə aparırsa, o, daha cəsarətlidir, nəinki şəraitlə bağlı ürəklənib, cəsarətli olan adam. Deyildiyi kimi cəsarətli adamlara əzab-əziyyətə mərdliklə dözdüklərinə görə hörmət edirlər. Bax buna görə cəsarət əzab-əziyyətlə əlaqədardır və belə adam haqqına olaraq təriflənir; doğrudan da, əzab-zəiyyətə davam gətirmək, özünü həzdən saxlamaqdan daha çətindir [10,s.88].

Gəlin bu məziyyətdən sonra tədbirlilik haqqında danışaq, axı cəsarət və tədbirlilik – qəlbin şüurdan kənar hissəsinin məziyyətləridir. Biz artıq demişik ki, tədbirlilik həzlərlə bağlı ortaya yiyələnməkdir, çünki o, həzlərə nisbətən əzabla daha az bağlıdır [10].

"Cəsarət" etik kateqoriyası digər etik dəyərlərlə birgədir. Bu bir daha insan şəxsiyyətinin formalaşmasında etik dəyə-

lərin sıx şəkildə, üzvü şəkildə birliyini göstərir: “Bir sözlə, hamıya müraciət edirəm və bu ağır gündə hamıdan ***mətanət***, ***dəyanət***, ***cəsarət***, ***qəhrəmanlıq, namus, qeyrət*** gözləyirəm. Azərbaycan xalqı qeyrətli xalqdır, mətin xalqdır” [IIc.s.360].

Başqa bir məqamda böyük natiq səmimi ifadələrlə auditoriyanı cəsarətli insanların timsalında səfərbər edir: “Yenə də gəlin açıq danışaq, bir halda ki, mən bu mövzuya toxundum, bunu deməyə bilmərəm. Bizim xalqımız yenə də ardıcıl olmadı. Bir müddətdən sonra bizdə ehtiraslar soyudu. (yerdən səslər: gösləri qorxdu). ***Bəli***, amma gərək qorxmayaydı. ***Bəli***, Xəlil Rzanı da tutdular, başqalarını da tutdular. Nə olsun tutdular? Tutulmaq da olar, qurban da getmək olar. Amma gərək xalqın naminə iradəni itirməyəsən” [XIIIc.s.12]. İki yerdə “bəli” təsdiq ədatı ilə “həbs olunmaq”, “qurban getmək” cəsarət rəmzlərini “iradəni itirmək” antietik kateqoriya ilə üz-üzə qoyur.

Heydər Əliyevin auditoriyalar qarşısındakı cəsarətli fikirlərini səmimiyyət kimi də qəbul etmək olar ki, bu özlüyündə “yalan” antietik kateqoriyanın əks müsbət etik formasıdır. Səmimiyyətsə ən çox “açıq danışmaq” anlamındadır. 1997-ci il Azərbaycan yazıçılarının X qurultayında səmimiyyətin cəsarətlə üzvi bir sintezinin şahidi oluruq: “Bunu açıqca bilin. Mən çox açıq danışan adamam. Həmişə, söz xoş gəlməsə də, mən onu açıq deməliyəm. İndi bizim maliyyə sistemimiz elədir ki, biz bütün güzəştləri ləğv etdik və edirik. Sona qədər də ləğv edilməlidir, ***heç bir*** güzəşt qalmamalıdır. Bazar iqtisadiyyatı, sərbəst iqtisadiyyat sistemində güzəşt ola bilməz. İnsanlara başqa vasitələrlə kömək etməyə ***çalışacağıq***” [XIIIc.s.112]. Bu kiçik mətndə “bilin” feilin əmr şəkli, “deməliyəm” feilin lazım şəkli, “heç bir” inkar əvəzliyi ilə cəsarətli, prinsipial, qəti mövqe nümayiş etdirir. Və burada inkar əvəzliyi ilə feilin lazım şəkli birgə işlədilərkən qətiyyət birə on qat yüksəlir.

Şəxsiyyətin formalaşması prosesində cəsarət etik kateqoriyasının mühüm yer aldığını Heydər Əliyevin nitqində izləyirik. Şeyx Şamilin 200 illik yubileyinə həsr edilmiş təntənəli gecədəki nitq (4 noyabr 1997-ci il) buna misaldır: "Şeyx Şamil əsrinin, dövrünün mütəfəkkir insanlarından biri olubdur. Onun ***zəkası, ağlı, yüksək təhsili, elmi bilikləri***, siyasi dünyagörüşü və onun şəxsi qəhrəmanlığı, ***cəsurluğu***, ***şücaəti*** Şeyx Şamili böyük sərkərdə, alim, filosof, dövlət xadimi, xalq qəhrəmanı edibdir". Heydər Əliyevin dilində Şeyx Şamilin şəxsi şücaəti Aristotelin "şəxsiyyətin yaddaqalan olmasının bir mühüm səbəbi onun cəsarətidir" fikriylə eyni səslənir: "Bununla belə, cəsarətlə əldə olunan məqsəd zövq verir, amma idman yarışlarında olduğu kimi, o, ətrafda olan şeylərin arxasında qalıb, görünmür; yumruq döyüşlərinin məqsədi – çələng və sayğıdır, bunları qazanmaq zövq verir, amma can aldığı zərbələrdən inciyib, əziyyət çəkir, gərgin məqamlarda həmişə belə olur; madam ki, bu artıq şeydir, onda nəyə görə yarışırlar, onların bundan heç bir zövq almaması, görünür, xırda şeydir. Əgər cəsarətlə də belədirsə, deməli, cəsarətli adamın iradəsinin əksinə olaraq, əcəl və aldığı yaralar ona əzab verəcək, ***amma*** o, bunlara davam gətirəcək, çünki bu çox gözəldir, çünki buna davam gətirməmək ***rüsvayçılıqdır***. O, nə qədər çox məziyyətə malikdirsə, həm də nə qədər çox xoşbəxtdirsə, ölüm ayağında bir ***o qədər*** çox əzab çəkəcək, axı belə adam üçün həyat ən dəyərli şeydir, o isə özünü ən yaxşı şeylərdən məhrum edir, bu isə çox acınacaqlıdır (lyperon)" [10,s.88].

Heydər Əliyev "müxalifətdə idik" deməklə keçmişə qayıdır, "əleyhinə çıxış etdim və bunu əsaslandırdım" ifadələri ilə bu gün nail olunmuş müstəqillikdən Aristotel demiş "zövq" alır: "Onu da bildirmək istəyirəm ki, mən Naxçıvanda işləyərkən, Muxtar Respublika Ali Məslicinin sədri olarkən Naçıvan Muxtar Respublikasının Ali Məclisi kommunist haki-

miyyətinə ***müxalifətdə idik*. *Biz bunu açıq elan etmişdik.*** Təsadüfi deyildir ki, 1991-ci ilin mart ayında Sovetlər İttifaqının saxlanması ilə əlaqədar keçirilən referendumda Naxçıvan Muxtar Respublikası iştirak etmədi. Sizə məlumdur ki, mən Azərbaycan Respublikası Ali Sovetinin sessiyasında Azərbaycanın referenduma getməsinin ***əleyhinə çıxış etdim*** və bunu əsaslandırdım. Naxçıvan Muxtar Respublikası bu referendumda iştirak etmədi" [XIIIc.s.269].

"İkinci Dünya Müharibəsində – Böyük Vətən Müharibəsində Azərbaycandan gedən 300 min adam həlak oldu, geri qayıtmadı. ***Xatirimdədir***, bunu dəfələrlə deyiblər. Onların bəzilərinin öləndən sonra cibindən Səməd Vurğunun, Rəsul Rzanın şeirləri çıxmışdı. ***Demək***, şeir, şair sözü, yazıçı sözü hər şeydən ***təsirlidir***" [XIIIc.s.133]. "Demək" modalı ilə ədəbiyyatda sözün hansı cəsarətlərə gətirib çıxarması aydınlaşır. Bu məqamda ortaya haqlı bir sual çıxır: bəs lider sözü? Bəs Heydər Əliyev sözü? Bu sualların cavabı aşağıdakı mətndə aydınca verilmişdir: "Bu qiyamı qaldıran adamlar silahlanmışdılar, bunlar silahlı dəstələr idi, məndə isə ***heç nə*** yox idi. Mən televiziya ilə xalqa ***müraciət etdim*** və xalq məni müdafiə etdi. İki saatın içində Prezident Sarayının ətrafına ***yarım milyon*** adam toplaşdı. ***Düzdür***, onlar silahsız idilər, ***lakin*** onlara qarşı silah işlətmək mümkün deyildi" [XIIc.s.80]. Sözün kütlələrə olan təsirinin bundan bariz nümunəsini tapmaq çətindir. "Heç nəyi" olmayan liderin bir "müraciətinə" "yarım milyon" insanın toplanması xalqın öz liderinə inamın, etibarın nəticəsiydi. Və bu məqamda yenə də Aristotel "cəsarəti" yada düşür: "Cəsarət qoçaqlığa və qorxuya təsir edən şeylərlə də əlaqədardır, ancaq o, nə bu, nə də o biri ilə eyni dərəcədə əlaqədar deyil, lakin ən çox qorxu ilə bağlıdır. Doğrudan da, kim təhlükələr zamanı ***soyuqqanlı*** olub, özünün necə lazımdır elə aparırsa, ***o, daha cəsarətlidir, nəinki şəraitlə bağlı ürəklənib, cəsarətli olan adam***. Deyildiyi kimi cəsarətli

adamlara əzab-əziyyətə mərdliklə dözdüklərinə görə hörmət edirlər. Bax buna görə cəsarət əzab-əziyyətlə əlaqədardır və belə adam haqqına olaraq təriflənir; doğrudan da, əzab-əziyyətə davam gətirmək, özünü həzdən saxlamaqdan daha çətindir" [10,s.88].

Heydər Əliyevin müstəqilliyimizin qorunması yolunda xarici dövlətlərdə rəsmi müsahibələrdəki nitqi cəsarət və qətiyyətdən xəbər verir. "Məhz" dəqiqləşdirici ədatla, "heç kimə", "heç vaxt" ifadələri ilə prinsipial mövqe tutur ki, bu da cəsarət səviyyəsinə yüksəlir: "Dünən mən mətbuat konfransında bəyan etdim ki, dövlət müstəqilliyi, milli azadlıq bizim üçün tarixi nailiyyətdir. Odur ki, biz öz müstəqilliyimizi və azadlığımızı ***heç vaxt*** və ***heç kimə, heç bir ölkəyə, heç bir dövlətə*** güzəştə getməyəcəyik. Biz bütün ölkələrlə münasibətləri də ***məhz*** bu prinsipi əsas tutaraq qururuq" [XIIc.s.72].

"Cəsarət" etik kateqoriyası dünyanın ən mötəbər kürsülərində belə Heydər Əliyev nitqlərini tərk etmir. 29 sentyabr 1994-cü ildə BMT Baş Məclisinin 49-cu sessiyasındakı çıxış bu qəbildəndir: "Ermənistan Respublikasının silahlı qüvvələri tərəfindən Azərbaycan ərazilərinin işğal edilməsi ilə əlaqədar son iki il ərzində Təlükəsizlik Şürasının 4 qətnaməsi və onun sədrinin 6 bəyanatı qəbul edilmişdir.

Lakin bütün bu qərarlara Ermənistan Respublikası hələ də qətiyyən məhəl qoymir. Bundan əlavə o, Azərbaycanın işğal edilmiş, ərazilərində öz hərbi qüvvələrini artırmaqda davam edir. Digər tərəfdən, Təhlükəsizlik Şürası da qəbul edilmiş qətnamələrin yerinə yetirilməsi mexanizmini işə salmamışdır. Belə bir sual meydana çıxır: Təhlükəsizlik Şürası nə dərəcədə ardıcıl və qətiyyətlidir, hər bir konkret halda onun səlahiyyətlərinin tətbiq dərəcəsi nə ilə müəyyən edilir? Beynəlxalq hüquq normalarını kobud surətdə pozan dövlət barəsində təsirli tədbirlər görmək çox nüfuzlu beynəlxalq təşkilatın Dünya birliyi qarşısında borcudur" [IIc.s.310].

Ritorik sualla Heydər Əliyev Təhlükəsizlik Şürasını səfərbər edir, BMT-nin borcunu onun yadına salır, cəsarətli çıxışın sonluğu isə "xalqın səsini eşitmək", "ürəklərə yol tapmaq" frazeologizmləri ilə auditoriyanı düşündürməyə vadar edir: "Hörmətli xanımlar və cənablar! BMT Baş Məclisinin bu yüksək tribunasını belə bir ümidlə tərk edirəm ki, siz xalqımın ***səsini eşidəcəksiniz***, xalqımın səsi ***ürəklərinizə yol tapacaqdır***. Diqqətinizə görə minnətdaram" [IIc.s.314].

"Əliyev heç yerə getməyəcəkdir" ifadəsi qarşı tərəfə bir cəsarətli çağırış kimi səslənir, prinsipial mövqe nümayiş etdirir. Milli mənafelərə uyğun gəlməyənləri "qətiyyətlə rədd edən" siyasi lider növbəti cəsarət göstərir. Ən əsası odur ki, Heydər Əliyev cəsarəti "sağlam düşüncəyə malik" siyasətçi cəsarətidir: "***Əliyev heç yerə getməyəcəkdir***. Əliyev Azərbaycanın milli mənafelərini əsas tutaraq öz dövlətinin – vurğulayıram ki, müstəqil dövlətinin, – siyasətini həyata keçirir. Milli mənafelərimizə uyğun gələn hər şey bizim üçün məqbuldur. Bunlara zidd olanları isə ***qətiyyətlə rədd edirik***. Biz Müstəqil Dövlətlər Birliyinin mövcud olmasına və inkişaf etməsinə tərəfdarıq. Lakin MDB-ni hansısa fövqəlmilli struktura çevirmək cəhdləri ilə heç vaxt razılaşmayacağıq. Əgər belə meyllərdən imtina edilərsə, hesab edirəm ki, MDB səmərəli olacaq və o zaman kimin haraya gedəcəyi barədə suallar ortaya çıxmayacaqdır. İndi hər bir lider öz dövlətinin müstəqil yaşamasını təmin etmək və onun milli mənafelərini qorumaq istəyir. Öz xalqı üçün bu məqsədləri güdən hər bir ***sağlam düşüncəli siyasətçi*** bu başlıca amillə hesablaşmaya bilməz [XVc.s.162].

Heydər Əliyevin bir qisim çıxışlarında əgər biz cəsarətli fikirlərin şahidi oluruqsa, digər çıxışlarında Ulu Öndərin birbaşa "cəsarət" etik anlayışı haqqında fikirlərinin şahidi oluruq. Heydər Əliyev üçün vətəndaş olmağın bir mühüm əlaməti də onun cəsarətidir. Böyük natiqə görə "cəsarət"

“dostluq” etik kateqoriyası ilə birgədir. Elə buradaca yuxarıdakı dəyərlərin bir yerdə olmasını “səadət” hesab edir: “Sizin gözəl ailəniz, Qalina Pavlovna Vişnevskaya kimi qəşəng xanımınız var. Ərlə arvadın eyni bir sahədə çalışması, üstəlik, onların eyni baxışlara malik olması xoşbəxtlikdir. Görkəmli müğənni olan Qalina Pavlovna Vişnevskaya o çətin dövrdə, siz ***cəsarətli*** vətəndaş addımı atanda sizə ***vəfalı dost*** oldu. O, həmişə sizinlə birlikdə idi. Bu gün də sizinlədir. Bu, böyük ***səadətdir***. Möhkəm arxa olanda insan həmişə daha ***cəsarətlə*** hərəkət edir. Sizin yaxşı uşaqlarınız, nəvələriniz var. Şadam ki, Allah bu baxımdan səxavətini sizdən əsirgəməyib, sizə sərvət veribdir. İstəyirəm ki, sizin bu sərvətiniz daha da artsın [XVIc.s.48-49]. Sinonim (dəstəyi, köməyi, yardımı ilə) 1994-cü ilin oktyabr hadisələrində xalqın etimadını təvazökarlıqla xatırlayan siyasi lider öz göstərdiyi cəsarətdən danışmır. Və buradaca Aristotelin cəsarətlə bağlı təsvir etdiyi “ən gözəl vəziyyət”ə uyğunluq (Cəsarətlinin hansı qorxulu şeylərə aidiyyatı var? Bəlkə, ən böyük faciələrə? Axı cəsarətli faciələrə hamıdan daha yaxşı dözür. Ən dəhşətlisi isə – ölümdür, zira bu son həddir, adama elə gəlir ki, bunun arxasında ölən adamdan ötrü nə yaxşı bir şey var, nə də pis bir şey. Amma, hər halda, insanı ölümlə əlaqədar olan halların hamısında cəsarətli hesab etmirlər, məsələn, ölüm tufan və ya xəstəlik zamanı gəldikdə. Bəs onsa hansı hallarda? Bəlkə, ən gözəl vəziyyətlərdə? Döyüş vəziyyəti, məhz belələrindəndir, zira bu təhlükələrin ən böyüyü və ən gözəlidir. Vətəndaşların və hökmdarların (monarkhoi) döyüşçülərə göstərdiyi hörmət də elə bundan xəbər verir [10,s.80-81].) Azərbaycan vətəndaşlarının öz siyasi rəhbəri ilə apardığı mübarizədir: “1994-cü ilin oktyabr hadisələrini xatırlayın. Burada dövləti devirmək, məni öldürmək istədilər. Mən xalqa müraciət etdim, televiziya ilə sizə müraciət etdim. Özü də gec, axşam vaxtı. Mən həmin gecəni heç vaxt unuda bilmərəm, bu gün də

böyük minnətdarlıq hissi ilə xatırlayıram. Çünki mənim müraciətimdən sonra cəmi bir-iki saat ərzində Prezident sarayının ətrafı insanlarla doldu. Oraya yüz minlərlə insan gəldi və onların əksəriyyəti siz idiniz, qadınlar idi. O gecə çox faciəli bir gecə idi, Azərbaycanın müqəddəratı həll olunurdu, "***Olum*** ya ***ölüm"*** dəqiqəsi keçirirdik. Ancaq sizin, xalqın – Azərbaycan xalqının dəstəyi, köməyi, yardımı ilə biz o böhrandan çıxdıq" [XVIIc.s.320].

Ardıcıllıq bildirən modallarla (əvvəla, ikincisi) güclü dövlət sayılan Rusiyanın hərəkətləri cəsarətlə xatırlanır. "Yerləşdirməməlidir" feilin lazım şəkli təkrarlanaraq nitqin qətiyyətliliyini cəsarətə doğru yüksəldir. "Məncə" təfəkkür modal sözü, "heç kim" inkar əvəzliyi, "yox" inkar ədatı və "edə bilməz" qətiyyətlilik ifadəsiylə cəsarətli, prinsipial addım atır: "***Əvvəla***, bu Rusiya qoşunlarında xidmət edənlərin 50 faizi ermənidir. Bu, bizə məlumdur. ***İkincisi*** isə, mən prinsipcə hesab edirəm ki, əgər Rusiya Ermənistanla Azərbaycan arasında münaqişəni həll etmək istəyirsə, bu zaman, bu münaqişə aradan qaldırılana qədər öz qoşunlarını Ermənistan ərazisində ***yerləşdirməməlidir***. ***Yerləşdirməməlidir***. ***Məncə***, buna qarşı heç kim etiraz edə ***bilməz***. Amma Rusiya bununla hesablaşmır. Biz Ermənistanla hərbi münaqişədəyik. Rusiya vasitəçilik edir və bu münaqişəni həll etmək istəyir. Lakin bununla bərabər, Ermənistan ərazisindəki öz silahlı qüvvələrini durmadan artırır. ***Yox***, mən bununla razı deyiləm və bu barədə ***öz fikrimi bu gün bir daha*** söyləməyi lazım bilirəm" [XXc.s.48].

"Həqiqətən" modal sözü ilə auditoriyaya real gerçəkliyi bəyan edən Heydər Əliyev "fikir verin. Onlar həqiqətən qazırdılar" ifadəsiylə Siyasi Bürodakı yaramazlıqları ifşa edir, "mən bir neçə dəfə ***hiddətləndim***, öz fikrimi bildirdim", "bir neçə dəfə etiraz edib dedim", "belə olmaz"la Siyasi Bürodakı güclü qrupa qarşı təkbaşına mübarizəni auditoriyanın

diqqətinə çatdırır: “***Eləmi***? Bu, onun çox yaxın adamıdır. Amma, görünür, obyektiv yazır, o, öz gündəliyini yazır. Şahnazarovla birlikdə Qorbaçovun yanına necə getdiklərindən yazır. Qorbaçov Şahnazarovu bağrına basaraq, onu 64 illiyi münasibətilə təbrik etmiş və sonra demişdir – Əliyevin ayağının altını qazırıq və bu, Rəşidovun işindən də betər bir iş olacaqdır. Fikir verin. Onlar həqiqətən qazırdılar, özü də ***necə*** qazırdılar. Rəşidov vəfat etmişdi və onun ölümündən sonra qazmağa başlamışdılar. Ən dəhşətlisi isə bunu Siyasi Büroda müşahidə etmək idi. Mən bir neçə dəfə ***hiddətləndim***, öz fikrimi bildirdim, amma nə etmək olardı. İnsan ölüb gedib, di gəl ki, onun ölümündən sonra da ***qazırlar, qazırlar, qazırlar***. ***Elə*** dəhşətli işlər, əxlaqa, mənəviyyata zidd işlər görürdülər ki, bunlara dözmək sadəcə, mümkün deyildi. Onda mən Siyasi Büronun tərkibində idim və bir neçə dəfə etiraz edib dedim ki, ***belə olmaz***. ***Amma***, demə, onlar sonra... Qazmağı qərara alıblarmış...” [XXIIc.s.66-67]

“Demək, görürsünüz, burada milli azadlıq, milli istiqlaliyyət ruhu nə qədər güclü idi. Ona görə də Naxçıvanda belə müstəqil qərarlar qəbul edilirdi. Bu qərarların da qəbul edilməsində, ***şübhəsiz ki, mənim də xidmətim az olmamışdır***. Bu gün Naxçıvan ağır blokada şəraitində yaşayır. Onun ən ağır dövrünü mən naxçıvanlılarla bir yerdə yaşadım – 90-cı ildən 93-cü ilə qədər. Burada fəlakətli bir vəziyyət vardı. İndi çox hörmətli qonaqlar gəliblər. Amma o vaxt Naxçıvana gəlib-gedən yox idi. ***Yox idi Naxçıvana gəlib-gedən***! Bəzən çağırır, xahiş edirdik. Buraya kiçik bir konsert qrupu gələndə sevinirdik. ***Düzdür***, qışda bu salonda soyuqdan oturmaq olmurdu. Hamımız paltoda otururduq. Amma yenə də yığışırdıq. Bir-iki-üç nəfər, bəli, Niyaməddin Musayev o vaxt ***cəsarət*** göstərdi, ***qorxmadı***, Naxçıvana gəldi, burada konsert verdi və biz hamımız böyük sevgi, məhəbbətlə onun musiqisinə, mahnılarına qulaq asdıq” [XXIIc.s.206-207].

"Bəli, hörmətli Süleyman Dəmirəl öz iradəsi ilə, öz mərdliyi ilə, öz ***cəsarətliliyi*** ilə, öz ağlı ilə, zəkası ilə xalqına daim xidmət etmək istəmişdir. Onun məqsədi hardasa bir vəzifə tutmaq olmamışdır. Onun məqsədi xalqına xidmət etmək olmuşdur. Amma xalqına xidmət etmək üçün də lazımdır ki, onun elmi səviyyəsi, onun siyasi potensialı, onun təcrübəsi xalqına çatsın, onu xalqa verə bilsin, xalqa xidmət edə bilsin. Bu yolu hörmətli Süleyman Dəmirəl şərəflə keçmişdir. Ona görə də əziz dostum Süleyman Dəmirəl Türkiyədə böyük hörmət qazanmış və ona görə də dəfələrlə Türkiyənin baş naziri vəzifəsinə irəli çəkilmiş, seçilmiş və ona görə də 1993-cü ildə Türkiyə Cümhuriyyətinin 9-cu prezidenti, cümhurbaşqanı seçilmişdir. Bu, böyük ***şərəfdir*** [XXIIc.s.436]. Göründüyü kimi "cəsarət" kateqoriyası "iradə", "mərdlik", "ağıl", "zəka" ilə birgə mövcud olduqda öz qiymətini alır.

## 1.1.3.Heydər Əliyevin nitqində dostluq, sədaqət

Yarımfəslə keçməzdən öncə Aristotelin dostluq, sədaqət haqqındakı fikirlərinə səyahət etmək, sonra isə Ulu Öndərin bu etik dəyərlərlə bağlı kütlələrə yönələn fikirlərin araşdırılmasına keçək. Həqiqətən, varlılarında, yüksək vəzifəli adamların çarın da dostlara həddən artıq böyük ehtiyacı var. Əgər xoşbəxt yaşamaq (eyergeisa) imkanı yoxdursa, onda firavanlığın (eyeteria) nə xeyri var, çox vaxt da dostlara iltifat göstərirlər, bu isə xüsusilə tərifəlayiqdir. Bəs xoş güzəranı dostlarsiz necə qoruyub saxlamaq olar, zira güzəran daha yaxşı olduqca onu qoruyub saxlamaq çətin olur. Həm də yoxsulluq və digər bədbəxtçiliklər zamanı dostlar, elə bil, insan üçün bir hamidir. ***Dostlar*** cavan adamlara lazımdır ki, onlar səhvlərdən özlərini gözləyə bilsinlər, qocalara lazımdır ki, onlara qulluq göstərsinlər, onların arasında olan zəiflərə və xəstələrə kömək etsinlər; yaşlarının qaynar çağlarında isə onlar "birlikdə gedən iki nəfərin" çox gözəl hərəkətlərdə bulunması üçün lazımdır, zira insanlar birlikdə həm daha yaxşı anlaşır, həm də daha yaxşı fəaliyyət göstərirlər.

Görünür ki, valideyndə öz uşağına qarşı olan dostluq hissləri fitridir, eləcə də uşaq da valideynə qarşı, özü də nəzərə almaq lazımdır ki, bu ancaq insanlarda deyil, quşlarda da, heyvanların əksəriyyətində də belədir, eyni mənşədən olan varlıqlarda, ələlxüsus da adamlarda olan insanpərvərliyin (philanthropoi) biz əbəs yerə tərif etmirik. İnsana hər bir insanın necə yaxın və dost olmasını (bos oikeion kai philon) sərgərdan həyat keçirdikdə görmək olar. Dostluğu, görünür ki, dövlət də, qanunvericilər də möhkəmləndirir, onlar dostluğa daha canı-dildən qayğı göstərirlər, nəinki ədalətə, zira dostluq fikir birliyinə bənzər bir şey kimi görünür, fikir birliyinə isə ixtilafın olmamasına (stasis) görə hamıdan çox qanunvericilər səy edir, bu, (dövləti) düşmənlərdən qorumağa bənzəyir.

Vətəndaşlar dost olduqdan sonra onların qanuna ehtiyacı olmur, halbuki ədalətli olduqda, onların hər halda dostluğa da ehtiyacları olur, düzgün münasibətlərdən isə ən düzgünü səmimi (philikon) münasibət sayılır.

Dostluğun meydana çıxmasına səbəb olan bu əsaslar formasına görə bir-birindən fərqlənir, deməli, dostluq hissləri də, dostluğun özüdə növbənövdur.

Demək, məqsədinə görə dostluğun üç forması var. Hər bir halda qarşılıqlı dostluq münasibəti olur, bu gizlin saxlanılmır; adamlar bir-birinə qarşı, ümumiyyətlə, hansı dərəcədə fayda arzulayırsa, onların arasındakı dostluq münasibəti də o dərəcədə olur. Buna görə də bir-birilə faydadan ötrü dostluq edənlər, bunu özlüyündə dostlarına görə etmir, bu dostluğun ömrü bir-birindən müəyyən fayda əldə edənə qədərdir. Zövqə görə dostluq edənlər də belələrindəndir; məsələn, onlar ağıllı adamlara ona görə heyran olmurlar ki, bu şəxslər belədir, bu ancaq ondan ötrüdür ki, bununla dostlarına zövq verirlər.

Beləliklə, hər kim faydaya görə dostluq edirsə, bunu özündən ötrü edir, hər kim kefə görə dostluq edirsə, bunu da özündən ötrü edir, daha dostluq etdiyi adama görə yox, onunlasa ona görə dostluq edir ki, həmin adamdan o, xeyir və ya kef görür. Beləliklə, bu dostluq bekara dostluqdur, kiminlə dost olmaq istəyirlərsə, onunla da dostluq münasibəti qururlar, amma bu münasibət bir halda faydaya görə qurulur, digər halda isə həzzə görə.

Əlbəttə, belə dostluqlar asanlıqla pozulur, çünki tərəflərin (bir-birinə olan rəğbəti) daimi deyil. Doğrudanda, onlar bir-birinə qarşı olan münasibətdən zövq almadıqda, nə də bir-birindən faydalanmadiqda onların dostluğu pozulur. Bununla bərabər fayda daimi deyil, hər dəfə başqa şeydən ibarət olur. Beləliklə, əvvəlki dostluğun əsasının puça çıxması ilə, (həzz və fayda) üzərində qurulan dostluq da pozulur [10,s.225].

Mükəmməl dostluq isə yaxşı adamlar və məziyyətlərinə görə bir-birinə oxşar adamlar arasında olur, zira özlüyündə yaxşı olan bu adamlar nə qədər xeyirxahdirlarsa, bir-birinə sözün həqiqi mənasında bir o qədər də fayda arzulayırlar. Xeyri dostlarından ötrü istəyənlərsə, daha yaxşı dostlardir. Doğurdanda, bir-birinə belə münasibət göstərmələrinin səbəbi onların özləridir, daha bu kənar hallara görə deyil, buna görə də onların dostluğu daimi olur, çünki onlar yaxşı adamlardır, məziyyət isə daimi bir şeydir. Dostların hər biri isə həm sözün tam mənasında, həm də öz dostuna münasibətdə yaxşıdır, zira yaxşı adamlar sözün tam mənasında yaxşıdır, belə də dost dostun köməkçisidir. Onlar buna uyğun surətdə zövq verir, zira yaxşı adamlar həm sözün tam mənasında, həm də bir-birinə zövq verir, axı zövqdə hər kəsin etdiyi hərəkət, onun içərisindən gəlir və buna uyğun bir şey olur, yaxşı adamların isə hərəkətləri də eynicürdür, yaxud buna oxşardır. Tamamilə aydındır ki, belə dostluq daimidir, axı burada dostlara lazım olan şeylərin hamısı birləşib [10,s.226].

Görünür, əvvəl başda deyildiyi kimi, ədalət hansı şeylərə aiddirsə, dostluqda o şeylərə aiddir, hansı adamlar arasında ədalət varsa, dostluq da həmin adamlar arasında olur, zira bir növ ədalət və dostluq, ümumiyyətlə, bütün ictimai münasibətlərdə, (yəni cəmiyyətdə) öz yerini tapır [10,s.238].

Əxlaqi əsasda faydadan ötrü olan dostluğa gəldikdə isə, bu, (şərt əsasında olmur), belə ki, dostlara hədiyyə verdikdə, yaxud, başqa bir iltifat göstərdikdə, əvəzində onlardan bir bu qədər, yaxud daha çox şey gözləyirlər, elə bil, bağışladıqları şeyi borc veriblər. Əlaqələr kəsildikdən sonra, vəziyyət əvvəlki kimi (olmasa), gileylənməyə başlayacaqlar. Bu ona görə baş verir ki, hamı, yaxud əksəriyyət ən gözəl şeyi arzulara da, onların seçimi, hər halda, fayda üzərində olur. Buna baxmayaraq yaxşılıq etmək özlüyündə çox gözəldir, əvəzini almaq məqsədilə edilən yaxşılıq isə yox, göstərilən

köməkliyi qəbul etməyə gəldikdə isə bu, faydalıdır (ancaq çox gözəl şey deyil) [10,s.249].

"Əslində, bax, bu dostluq həm də onunla bağlıdır ki, mən Müslümün özümə yaxın olmasını istəyirdim və ona maksimum diqqət göstərirdim. Hesab edirəm ki, bütün bunlar Azərbaycan incəsənətinin, Azərbaycan mədəniyyətinin xeyrinə idi" [XLIc.s.54].

Mən Rəşid Behbudovun yaradıcılığı haqqında bəzi fikirlərimi bildirdim. Amma xatirələrim də çoxdur. Mənim onunla şəxsi ***dostluq*** münasibətim vardı. Hələ Azərbaycanın rəhbəri olmazdan xeyli əvvəl onunla şəxsi münasibətim, dostluğum vardı. Bu dostluqda məni ona bağlayan onun gözəl sənəti idi. O isə nədənsə, mənə də müəyyən qədər, hansı səbəblərə görəsə çox hörmət edən bir insan idi. Hələ o vaxt ki, mən respublikanın rəhbərliyində deyildim [XXXVIc.s.287]. Mən nümayəndə heyətinin tərkibinə onu salaraq, birincisi, ona öz dostluq münasibətimi göstərdim, ikincisi də, dedim ki, elə bu bizim nümayəndə heyətini daha da bəzəyəcəkdir. Çünki onu bizdən daha çox, yaxşı tanıyırlar [XXXVIc.s.289].

"Gürcü-Azərbaycan dostluğu böyük sınaqlardan, imtahanlardan keçibdir. Mən dünyanın bir çox yerlərində bunu dəfələrlə bəyan etmişəm. Bu gün bir daha bəyan edirəm ki, qonşu yaşayan iki xalq – gürcü və Azərbaycan xalqları qədim zamanlardan həmişə ***dost***, ***qardaş*** olmuşlar. Bütün tarixə nəzər salarkən qətiyyətlə deyə bilərik ki, bizim xalqlarımız arasında heç vaxt ***nifaq***, ***ziddiyyət***, ***düşmənçilik***, ***qarşıdurma*** olmamışdır. Biz həyatın bütün mərhələlərində dost, qardaş olmuşuq. Bu gün də müstəqil dövlətlər kimi, azad xalqlar kimi yenə də bu ***dostluğu, qardaşlığı*** davam etdiririk" [XVIIIc.s.5-6].

"Biz dəfələrlə demişik ki, – siz də burada dediniz – Azərbaycan xalqı rus xalqına ***dost* və *qardaş***, ölkə kimi, xalq kimi baxır. Azərbycan xalqı on illərlə, yüz illərlə rus xalqı ilə ***dostluq*** edibdir. Bu ***dostluq*** və qardaşlıq hissləri bu gündə davam

edir. Bu, azərbaycanlıların qəlbindədir. Bunu heç vaxt silmək olmaz. Eyni zamanda dost dosta gərək kömək əli uzatsın. Biz hamımız rus xalqından, Rusiyadan umuruq ki, onlar bizə kömək etsinlər. Güman edirəm ki, sizin səsləriniz Moskvada eşidiləcək, cənab Şumeykonun qəlbində öz izini salacaq, onun bu barədə fikirlərinin daha da formalaşmasına kömək edəcək və əminəm ki, Azərbaycan xalqının bu ağır vəziyyətdən çıxmasına yardım edəcək" [IVc.s.117].

"Biz açığıq. Azərbaycan xalqının ürəyi genişdir. Biz bütün dünyaya açığıq. Bizə dost olan ölkəyə – Rusiyaya açığıq.

Biz ***dostuq***, sülh istəyirik, ***ədalət*** istəyirik, ***səmimi dostluq münasibətləri*** istəyirik. Elə bu hisslərlə də Vladimir Flippoviçə, nümayəndə heyətinin bütün üzvlərinə müraciət edirəm. Bu hisslərlə də deyirik: "Sizə yaxşı yol, rus xalqına, Rusiyaya çoxlu salamlar, sizin ölkənizdəki çoxsaylı dostlarımıza çoxlu salamlar yollayırıq. Təşəkkür edirəm" [IVc.s.120].

Dostluq etik kateqoriyası Heydər Əliyevin dilində çıxışların sonluğunda auditoriyaya bir xitab kimi səslənir. Dostluğun qarşılıqlı olduğunu nəzərə çarpdırmaq məqsədilə böyük natiq əgər bir dəfə "Azərbaycan-Qazaxıstan" deyirsə, növbəti xitabda "Qazaxıstan-Azərbaycan" deyir. "Bu bayram münasibətilə sizi bir daha təbrik edir və Azərbaycan xalqının dostluq, qardaşlıq hisslərini sizə yetirirəm. Yaşasın ***Azərbaycan – Qazaxıstan dostluğu***! Yaşasın ***Qazaxıstan–Azərbaycan dostluğu***! Abaya eşq olsun! Qazax xalqına eşq olsun! Qazaxıstan torpağına eşq olsun!" [IVc.s.162].

Auditoriya Heydər Əliyevin xarici ölkə rəhbərləri ilə görüşlərdə Azərbaycan xalqının malik olduğu etik dəyərləri böyük natiqin öz dilindən eşidir. "Eyni dərəcədə" ifadəsilə "dostluqda nə artıqlığa, nə də əskikliyə yol verilməməlidir" müddəasını irəli sürür. Azərbaycan xalqının sahib çıxdığı dəyərlər xarici ölkə rəhbərlərinin auditoriyasına bəyan edilir: "Xalqlarımız arasında dostluq həmişə ülvi olmuşdur, həmişə

səmimi olmuşdur. Bu gün əmin ola bilərsiniz ki, Azərbaycan xalqının simasında tatar xalqı ***şərəfli, vəfalı və sadiq*** dosta malikdir. Təkrar edirəm, dostluğumuz istər tatar xalqı üçün, istərsə də Azərbaycan xalqı üçün ***eyni dərəcədə*** qiymətli olan dərin tarixi köklərə əsaslanır" [VIIIc.s.68].

Bəli, 1987-ci ildə Moskvada məndə ürək tutması oldu, infarkt keçirdim. Bundan sonra təqiblərə məruz qaldım. 1987-88-ci illərdə hər şeyə qara yaxmış bəzi jurnalistlər haqqında danışdım. Ancaq bu işdə hər şey məqsədyönlü idi – bəzilərini qaralayır, onların barəsində hər cür uydurmalar söyləyirdilər, digərləri isə bir növ kənarda qalırdı. Bunların hamısını Qorbaçov tənzimləyirdi. O illərdə mənə də çox iftiralar, özü də tamamilə əsassız iftiralar yağdırırdılar. Əgər bu yazıların, heç olmasa, bircə faizi həqiqətə uyğün olsaydı, onda deyərdim ki, bu, doğrudur, o birisi isə yalandır. Ömrüm boyu, – o illərdə də, bu gün də, – işləmişəm, özü də, ***sədaqətlə*** Mən gizlətmirəm, Sovet İttifaqına da, Kommunist Partiyasına da çox ***sədaqətlə*** xidmət etmişəm. Çox sədaqətlə. Bəziləri indi deyirlər ki, hələ o vaxt bu quruluşu sevmirdilər, onunla daxilən razı deyildilər. Belə adamlar var [XXIVc.s.94-95].

Ulu Öndər Azərbaycan prezidenti Heydər Əliyevə "Ruh" jurnalistləri müdafiə komitəsinin təsis etdiyi "Jurnalistlərin dostu" mükafatının təqdim olunmasına həsr edilmiş mərasimdəki nitqdə dosluğun şərtlərini yada salır, "dostluq", "dost olmaq", "dost" ifadələrini tez-tez təkrar etməklə bu müqəddəs etik dəyər haqqında fikirlərini auditoriyaya ünvanlayır. "Qədər" qoşması və "gəlin" əmr ədatı ilə dostluğu müvəqqəti hesab etməməyə çağırır: "Ancaq gəlin həqiqi ***dost*** olaq. Mən sizinlə, jurnalistlərlə dost olmaq istəyirəm. Amma ***dostluq*** ikitərəfli şeydir. Gərək iki tərəf də ***dost*** olmaq istəsin. İndi belə bir hadisə baş verib, iş belə gətirib ki, biz, iki tərəf də ***dost olmaq*** istəmişik. Amma ***gəlin*** danışaq ki, bu daha pozul-

masın, biz ***dost*** olaq, ***axıra qədər dost olaq***. Mən dost olmaq istəyirəm" [XXXVIIIc.s.53].

Gürcüstan prezidenti Eduard Şevarnadzenin 70 illiyi münasibətilə onun Azərbaycan prezidenti tərəfindən təbrik edilməsi mərasimindəki nitq dövlətlərarası dosluğa yönəlmiş bir nitq nümunəsidir: "Mənim bu gün Gürcüstana, Tbilisiyə gəlməyim müəyyən mənada, əgər buna protokol nöqteyi-nəzərindən yanaşsaq, qeyri-adi xarakter daşıyır. Ancaq biz bu məsələni insani nöqteyi-nəzərdən qiymətləndirsək, burada qeyri-adi heç bir şey yoxdur.

Səmimi münasibətlərimiz ildən-ilə ***bax***, belə yaranırdı. Münasibətlərimiz insani xarakter daşıyırdı, lakin bununla bərabər, bu münasibətlər heç də insani münasibətlərimizlə məhdudlaşmırdı, həm də xalqlarımızın – gürcü xalqının, Azərbaycan xalqının, Gürcüstan Respublikasının və Azərbaycan Respublikasının taleləri üçün son dərəcə böyük əhəmiyyətə malik idi. ***Yəni*** biz bir-birimizlə sadəcə olaraq dostluq etmək, görüşmək, bir-birimizə xoş sözlər demək, süfrə arxasında əyləşib gürcü şərabı və yaxud Azərbaycan konyakı içmək və ya Azərbaycan şərabı içmək, həm gürcü xalqına, həm də Azərbaycan xalqına məxsus olan kabab ***yemək naminə dostluq*** etmirdik. ***Xeyr***, bütün bunlar bir vasitə, ***ötəri hal*** idi. Dostluğumuzun əsasını təşkil edən başlıca səbəb isə həm Eduard Amvrosiyeviçin, həm də mənim öz xalqlarımıza bacardıqca ***daha çox fayda*** vermək arzumuz idi [XIVc.s.175]. Yuxarıdakı nitq parçası Aristotelin dostluq fikirləri ilə həmahəngdir: "Ancaq fayda nöqteyi-nəzərindən olan dostluq gileyə səbəb olur; bir-birindən kömək istəyən adamların həmişə çox şeydən ehtiyacı olur, onlar əmindirlər ki, qədərindən aza malikdirlər, həm də gileylənirlər ki, onlar buna layiq olsalar da, qədərindən azalırlar; amma yaxşılıq edənlər, köməkliyi qəbul edənlərə onların ehtiyacı nə qədərdirsə, bir o qədər kömək göstərə bilmirlər" [10,s.248].

Gürcüstanla Azərbaycan, gürcü və Azərbaycan xalqları arasında həmişə xoş dostluq münasibətləri, qardaşlıq münasibətləri olmuşdur. Yeri gəlmişkən, bu, xalqlarımızın böyük xoşbəxtliyidir ki, biz əsrlər boyu yanaşı yaşayaraq bir-birimizdən heç vaxt küsməmişik, aramızda heç vaxt heç bir münaqişə olmayıbdır. Biz bir-birimizə kömək etmişik, bir-birimizə ***böyük hörmətlə*** yanaşmışıq. Siz gözəl bilirisniz, dostum Eduard Şevarnadze də bilir ki, gürcü xalqına, Gürcüstana, gürcü torpağına, gürcü ədəbiyyatına, gürcü musiqisinə, gürcü incəsənətinə, gürcü rəqslərinə, Gürcüstanda olan hər şeyə, gürcü xarakterinə, hətta gürcü lətifələrinə Azərbaycanda necə böyük məhəbbətlə yanaşırlar. Bu faktdır [XIVc.s.183].

Mən Eduard Şevarnadzeni 30 ildir tanıyıram, biz onunla yaxın dostuq və bunu bir insan kimi mən özüm üçün böyük sevinc və ***böyük nailiyyət*** hesab edirəm. Bütün bunlar mənə Eduard Şevarnadzenin şəxsiyyətində nəyi həmişə müşahidə etdiyimi deməyə imkan verir. O, təbiət etibarilə görkəmli insandır, görkəmli dövlət xadimidir. O, öz xalqının görkəmli oğludur, çox işlər görmüşdür, öz əməlləri ilə özünü, adını əbədiləşdirmişdir. Bununla bərabər, bu insan yüksək mənəviyyata, yüksək mədəniyyətə, yüksək savada, yüksək nəzakətə malik insandır, sadə və səmimi bir insandır. Mən onunla dostluq etdiyim illərdə, əməkdaşlıq illərimizdə, birgə işlərimizdə bunların hamısını görmüşəm, bunların hamısını duymuşam. Eduard Şevarnadzenin məhz bu şəxsi keyfiyyətləri, insani keyfiyyətləri onun təbii istedadı ilə birlikdə, onun çox böyük əməksevərliyi və çox böyük iş qabiliyyəti ilə birlikdə, malik olduğu yüksək məsuliyyət hissi ilə birlikdə ona Gürcüstanın belə böyük bir vətəndaşı olmağa imkan vermişdir [XIVc.s.187].

Mən çıxışımın əvvəlində dedim və bir daha demək istəyirəm ki, bugünkü gün Dağıstan və Azərbaycan xalqları arasında dostluğun parlaq bir səhifəsidir. Xalqlarımız həmişə dostluq etmişlər və indi biz bu dostluğu, münasibətlərimizi

möhkəmləndiririk. Ötən ilin noyabrında biz Qafqazın böyük oğlu, bütün Qafqaz xalqlarının görkəmli qəhrəmanı Şeyx Şamilin 200 illiyini birlikdə qeyd etdik. Xalq Məclisinin sədri Muxu Əliyev başda olmaqla Dağıstandan Bakıya böyük bir nümayəndə heyəti gəlmişdi. Bizim nümayəndə heyəti Mahaçqalaya getmişdi. Biz bir yerdə olduq və Şeyx Şamil bizim ümumi qəhrəmanımızdır. Təsadüfi deyil ki, həmin gecədə Şeyx Şamilin indi Şəki rayonunda yaşayan nəticəsi Məryət Əsgərova da çıxış etdi [XVc.s.333].

Dostluq – bu təkcə zəruri şey deyil, həm də əxlaqi cəhətdən çox gözəl şeydir, axı biz dostluqda bulunanları təqdir edirik, çoxlu dosta malik olmaqsa, çox gözəl bir şey sayılır. Bununla bərabər bəziləri hesab edir ki, yaxşı kişilər və dostlar eyni bir şeydir [10,s.221-222].

Mən artıq dedim ki, Əziz Əliyev kimi görkəmli insanlar Dağıstan və Azərbaycan xalqları arasında dostluğun və qardaşlığın möhkəmlənməsinə çox böyük töhfə vermişlər. İndi bu işə biz də töhfəmizi verməliyik. Ona görə ki, heç nə bir yerdə donub qalmır, hər şey inkişafda, hərəkətdədir. Həyatımızın indiki dövrü keçmişdəkindən – biz bir dövlətin, bir ölkənin tərkibində olduğumuz dövrdəkindən fərqlidir. İndi Azərbaycan müstəqil dövlətdir. Respublika olan Dağıstan eyni zamanda Rusiya Federasiyasının bir hissəsidir. Bizim Dağıstanla olan münasibətlərimiz – Rusiya ilə ***dostluq*** münasibətləri deməkdir. Biz Rusiya, rus xalqı ilə həmişə dostluq və mehriban münasibətlər şəraitində yaşamışıq. İndi də bu cür münasibətlər şəraitində yaşayırıq. Biz Azərbaycan ilə Rusiya Federasiyasında dostluq və əməkdaşlığı gələcəkdə də möhkəmləndirəcəyik [XVc.s.334].

Bütün bunlar bizim ümumi, misilsiz sərvətimizdir. Bizim borcumuz, vəzifəmiz, gələcək nəsillərin borcu və vəzifəsi isə bu sərvəti, nə varsa hamısını qoruyub saxlamaq, möhkəmləndirmək və inkişaf etdirməkdir. Əminəm ki, Dağıstan və Azər-

baycan xalqları arasında dostluq və qardaşlıq əbədi olacaqdır. Əziz Əliyev bu dostluğun simvoludur. Onun davamçıları olan biz isə bu dostluğun əbədi olması üçün hər şeyi edirik [XVc.s.335].

Ümumiyyətlə, bu, bizim qədim dostluğumuzun rəmzidir. Mən bunu dəfələrlə demişəm və Gürcüstandan gələn xanım dostumuzun da dilindən eşitdik ki, gürcü xalqı ilə Azərbaycan xalqı arasında əsrlər boyu həqiqətən çox səmimi dostluq əlaqələri olmuşdur, bizim aramızda heç vaxt nifaq olmayıbdır. İndi də müstəqil dövlətlər kimi Gürcüstanla Azərbaycan arasında olan dostluq, qardaşlıq əlaqələri Qafqazda sülhün, əmin-amanlığın yaranmasının böyük bir amilidir [XVIIc.s.310].

Yenə mən dedim ki, bilirsiniz, mən çox sıxılıram, utanıram. Siz bu qədər əziyyət çəkirsiniz, bu qədər zəhmət çəkirsiniz. Mən bunu çox yüksək qiymətləndirirəm. Ancaq eyni zamanda, mən istəmirəm ki, siz bu qədər əziyyət çəkəsiniz. Dedi ki, heç bir əziyyəti yoxdur. Sənin sağlamlığın mənim üçün və təkcə Azərbaycan üçün yox, Türkiyə üçün də lazımdır. Ona görə də sənin sağlamlığın yolunda nə edirəmsə hamısını ürəkdən edirəm. Bu, onun sözləridir [XXc.s.339].

Bütün bu dediklərimin nəticəsində, – mən bunu demişəm, yazmışam, amma bir də deyirəm, – Türkiyə Cümhuriyyətinin prezidenti əziz Süleyman Dəmirəl mənə qardaşlıqdan da, dostluqdan da artıq qayğı göstəribdir. Mən bunu həyatımda heç kəsdən görməmişəm. Yəni mən ağır xəstə olmamışam. Düzdür, 1987-ci ildə Moskvada infarkt keçirdim. Bir neçə aya qədər xəstəxanada yatdım. Ancaq nə qədər acı olsa da bu keçmişdir, mən bunu heç vaxt deməzdim. Amma bu gün deməliyəm [XXc.s.341].

Bu gün bir daha qeyd etmək istəyirəm ki, mənim o vaxt partiya yaratmaq fikrim yox idi. Mənim həyatım sizə məlumdur. Bunun məni həmişə sevindirmiş parlaq illəri də, ancaq həyatım üçün çox ağır, çətin, təhlükəli illəri də olubdur. Mən

keçmiş zamanlarda xalqıma həmişə ***sədaqətlə*** xidmət etmişəm. Amma Moskvada yüksək vəzifələrdən kənarlaş-dırılandan, istefaya gedəndən sonra ətrafımda cərəyan edən ədalətsizliyi və on illər boyu sədaqətlə xidmət etdiyim hökumətin, partiyanın mənə qarşı təzyiqlərini, təqiblərini görərkən yenidən siyasətə qayıtmaq fikrində olmadım. Hesab etdim ki, mən həyatda öz missiyamı yerinə yetirmişəm, onun qiymətini isə gələcək, tarix verəcəkdir [XXIVc.s.43-44].

Mən 1950-ci illərdən Niyazi ilə yaxın dostluq əlaqəsində olmuşam. Bizim ailələrimiz çox yaxın olubdur. Ailəvi dost olmuşuq. Sonrakı dövrdə, Azərbaycana rəhbərlik etdiyim zaman da bu dostluğum davam edib və təkcə onunla dost olduğuma görə yox, o, həqiqətən nadir insan olduğuna görə, nadir ***musiqiçi, dirijor olduğuna görə*** həmişə mən ona böyük məhəbbətlə, sevgiylə yanaşmışam. Təbiidir ki, lazım olan qayğılarımı da ***göstərmişəm*** [XLIIIc.s.65].

## 1.2.Heydər Əliyevin nitqində müasir etika

### 1.2.1. Heydər Əliyevin nitqində siyasət və etika

Bu yarımfəsildə Ulu Öndərin müxtəlif auditoriyalardakı çıxışları araşdırma obyekti olmuşdur. Araşdırmada AMEA-nın Fəlsəfə İnstitutunun etika ilə bağlı mütəmadi çap olunan konfrans materiallarından [29], qədim yunan filosoflarının dövlətçilik ideyalarının öz əksini tapdığı əsərlərdən [28, 137], Azərbaycan klassik ədəbiyyat xadimləri və filosoflarının fikirlərindən yararlandıq.

Klassik siyasət fəlsəfısində əxlaq və siyasət bir-birindən ayrı olaraq görülmədiyi üçün məhz fərdi həyat kimi ictimai həyatın da məqsədi əxlaqla bağlı olaraq düşünülmüş və əxlaqlı insan ilə fəzilətli cəmiyyətin təbii olaraq bir-birləri ilə münasibətdə olduğu qəbul edilir. Buna görə də klassik filosoflar "ən yaxşı ictimai sistem nədir" sualını siyasət fəlsəfəsinin əsas problemi olaraq qəbul etmişlərdir. Modern dövrdə əxlaq ilə siyasət arasında əlaqə qopmuşdur. Siyasət əxlaq və xoşbəxtlik məfhumlarından daha çox güc məfhumuna əsaslanır. Belə ki, post-modernistlik tərəfindən də bu ciddi şəkildə tənqid olunur [57; 71].

Siyasət ümumi mənada iqtidarı, yəni, başqalarına əmretmə və onların davranışlarını öz istək və arzularına müvafiq müəyyənetmə cəhdi olaraq tərif oluna bilər. Məhz modern dövrdə siyasət sahəsi dəyərlər sistemindən ayrı müstəqil olaraq qəbul edilir [34; 156, s.30]

Veberin prinsipi ondan ibarətdir ki, siyasətçi məsləklər etikasına yox, məsuliyyət etikasına arxalanmalıdır. "Sən zor gücü ilə şərə qarşı durmalısan, yoxsa ki, şər qüvvələrin qalxmasına məsuliyyət daşıyırsan" [156,s.644].

Böyük natiqin dilində etik dəyərlər səmimi ifadələrlə auditoriyaya açıqlanır. Demokratik, hüquqi dövlət quruculu-

ğunu dilə gətirərək prezident olmaq üçün namizədlər arasında sağlam rəqabəti üstün tutur. Bu zaman xalq və namizəd arasındakı münasibətləri feilin şərt şəklində (etibar edərsə, göstərə bilərsə, tanıya bilərsə) açıqlayır: "Beləcə də siyasətçilərimiz olmalıdır ki, birinin yerini o birisi tuta bilsin, yer boş qalmasın, ***demokratik***, ***hüquqi*** dövlət ki qururuq, – o, daimi ***olsun***, ***yaşasın***, bizim müstəqilliyimizi yaşada bilsinlər. Ona görə bu baxımdan mən çox istəyirəm ki, Azərbaycanda prezident olmaq üçün bir yox, bir çox layiqli adamlar olsun və onların arasında ***sağlam rəqabət*** getsin. Xalq da kimə daha çox etibar ***edərsə***, kim xalqa daha çox sədaqət göstərə ***bilərsə*** və xalq onu daha çox tanıya ***bilərsə***, gələcəkdə ona səs versinlər. Bu barədə mənim siyasətim bundan ibarətdir və fikrim də belədir" [XVc.s.178-179].

Ancaq Heydər Əliyev üçün etik-əxlaqi dəyərlər siyasi fəaliyyətlə birgə olmalı, siyasətçi öz işini bu dəyərlərlə uzlaşdırmalıdır. Etika və siyasət anlayışlarının vəhdətini bariz şəkildə Heydər Əliyevin sahibkarlarla olan görüşlərində görə bilərik: "Qanun nə cür pozulur? Qanunu pozan təkcə iş adamı deyil ki, qanunu pozan eyni zamanda o qanunun keşiyində durandır. Onlar əlaqəyə girəndə qanun pozulur. Əgər onlar əlaqəyə girməsələr qanun pozulmaz, sahibkar da düz yolla gedər. Amma sahibkar görəndə ki, bir dövlət orqanından istifadə etmək olar, onunla əlaqəyə girib gəlirin bir hissəsini ona verib, bir hissəsini özündə saxlamaq olar, – onda o yola gedir. Amma görəndə ki, gömrük orqanı, vergi orqanı, başqa dövlət orqanı, hüquq-mühafizə orqanları belə çirkin yollara getmirlər, onda sahibkar da düşünəcək ki, niyə mən əyri yollarla getməliyəm, elə düz yolla gedim, az qazanım, amma halal qazanım. ***Ona görə də*** mən sahibkarlara bu tövsiyəni verərkən, eyni zamanda dövlət orqanlarından ***tələb edirəm və qəti tələb edirəm*** ki, sahibkarlığın inkişaf etdirilməsi üçün indiyə qədər yaradılan və mövcud olan əngəllər aradan

götürülsün, sahibkarlara onların normal fəaliyyət, qanuni fəaliyyət göstərməsi üçün ***şərait yaradılsın, kömək edilsin***" [VIIc.s.231].

Əgər, biz bildiyimiz kimi, qanunu pozan şəxs ədalətsiz adamdırsa, qanunun yolunu tutub gedən şəxs isə ədalətli adamdırsa (dikaios), aydındır ki, qanun çərçivəsi daxilində olan bütün işlər müəyyən mənada ədalətlidir. Doğrudan da, qanunvericilikdə nəzərdə tutulanların hamısı qanunauyğunluqdur, bu qərarların hər birini isə biz ədalətli, yəni haqq hesab edirik [10,s.129].

"Qanunları pozmaq – ədalətsizlikdir. Ədalətsizliyə dözmək etikaya ziddir. "Biz belə hallara dözə bilmərik, qətiyyən dözə bilmərik, qətiyyən dözə bilmərik. ***Heç kəs*** fikirləşməsin ki, indiyədək belə işlər bağışlanmışdır, yaxud da kim isə qoçuluq etmişdir və qoçuluq davam edəcəkdir. ***Hamı*** qanun çərçivəsində işləməlidir. Qanunu pozan adamlar barəsində vəzifələrindən, keçmiş xidmətindən asılı olmayaraq ***tədbir görüləcək***, qanunu pozan adamlar ***məsuliyyət daşıyacaqlar***" [IIc.s.35].

"İstər" bölüşdürmə bağlayıcısı ilə demokratik dövlət quruculuğu yolunda heç kimə güzəşt olmamasını bəyan edir: "Hamını xəbərdar etmək istəyirəm: *heç bir* vəzifəli şəxs qanundan kənara çıxa bilməz. ***İstər*** baş nazir olsun, ***istər*** nazir, ***istər*** icra hakimiyyətinin başçısı olsun, – fərqi yoxdur. Əgər biz demokratik dövlət qururuqsa, lemokratiya yolu ilə gediriksə, deməli, heç kimin qanunu pozmağa ixtiyarı yoxdur. Onu pozanlara qarşı isə, ***şübhəsiz ki,*** qanun ***tətbiq edilməlidir***. ***Güman edirəm ki***, bundan hər kəs özü üçün nəticə çıxaracaq, son vaxtlar cəmiyyətimizdə nizam-intizamın möhkəmləndirilməsinə, mənəvi saflığa doğru irəliləyiş bundan sonra da davam ***edəcək*** və biz cəmiyyətimizdəki mənfi halların aradan qaldırılmasına get-gedə nail ola biləcəyik" [IIc.s.35].

Bir sıra hallarda böyük natiqin nitqləri feilin lazım şəkli ilə başlayaraq həmin fellərlə də qurtarır: "***Bilməlisiniz ki, əgər*** kimsə bu tələblər səviyyəsində ***deyilsə***, o, şəxsiyyətindən, keçmiş xidmətindən asılı olmayaraq, kənara ***çəkilməlidir***. Yenə də deyirik: biz polis orqanlarında, Daxili İşlər Nazirliyində xüsusi peşə təhsilli, eyni zamanda yüksək mənəvi keyfiyyətlərə malik adamlara güvənirik. *Əgər* kimsə bu keyfiyyətlər səviyyəsinə qalxa ***bilmirsə***, bu tələblərə cavab verə ***bilmirsə***, ***şübhəsiz ki***, onlar kənara ***çəkilməlidir*** və rəhbərlik onları öz sıralarından ***çıxarmalıdır***" [Ic.s.146]. Yuxarıdakı üç cümlədən ibarət bu nitq parçası feilin lazım şəkli ("bilməlisiniz", "çəkilməlidir", "çıxarmalıdır"), şərt bağlayıcısı ("əgər"), feilin inkar şərt şəkli (bilmirsə) gerçəkliyə münasibətdə qəti təsdiq bildirən modal sözlə (şübhəsiz ki) çulğalaşaraq auditoriyanı qətiyyətə səsləyən dövlət başçısı nitqi yaradır.

Siyasi etikada "zor işlətməmək" kimi ümumi qəbul edilmiş tezislərdən çıxış etmək olmaz. Əks təqdirdə nüfuzdan düşən müharibə yox sülh olacaq. Veberin [156] politologiya və etika arasındakı düzgün ideyaları lazımi inkişafını tapa bilmədi: Heydər Əliyevin də dilində ictimai-siyasi sabitliyi pozanlara qarşı "onlar bilsinlər ki" feilin əmr şəklində hazır ifadələr mövcuddur. "Hər bir" təyin əvəzliyi ilə dövlətin öz vətəndaşlarını və ictimai-siyasi təsisatlarını qorumağa gücü olduğunu qeyd edir: [156] "İçimizdə bu gözəl əhval-ruhiyyəni, ictimai-siyasi sabitliyi pozub öz mənfur, çirkin şəxsi məqsədlərinə nail olmaq istəyənlər vardır. Ancaq onlar bilsinlər ki, artıq Azərbaycanda hüquqi demokratik dövlət vardır və bu dövlət Azərbaycan xalqının, ***hər bir*** vətəndaşın mənafeyini, hüquqlarını, müstəqil Azərbaycanın müstəqilliyini ***qorumağa qadirdir***. Siz bu günlər bunu öz həmrəyliyiniz, bayram əhval-ruhiyyənizlə nümayiş etdirirsiniz" [XVc.s.78].

Bir dövlət başçısı kimi Heydər Əliyev tarixi faktlara söykənərək sistemdən asılı olmayaraq vətəndaşların keçmiş

xidmətlərini sadalayır, məruz qaldıqlarını sinonim cərgəylə (tökülən qan, aldıqları yara, verilən qurbanlar) auditoriyanın diqqətinə çatdırır. Dövlət başçısı dilində ümumişlək söz (xalqa qarşı hörmətsizlik) və bədiiləşmiş ifadə (vəfasızlıq) nitqi yaddaqalan edir: "O insanlar ki, müvəqqəti olaraq Azərbaycanda hakimiyyətə gəlmişdilər və Azərbaycanın keçmiş tarixinin hamısını inkar etməyə çalışırdılar, o cümlədən yüz minlərlə Azərbaycan övladlarının Böyük Vətən müharibəsində, İkinci dünya müharibəsində, faşizmə qarşı müharibədə ***tökülən qanını, aldıqları yaraları, verilən qurbanları*** unutdurmağa çalışırdılar və onlara qarşı hörmətsizlik edirdilər, – artıq bunların hamısı aradan götürülübdür. Sadəcə olaraq, bunlar o dövrün ayrı-ayrı adamları tərəfindən ***xalqa qarşı hörmətsizlik*** və deyə bilərəm ki, ***vəfasızlıqdır***" [XVc.s.274].

"Beynəlxalq Təşkilatların qəbul etdiyi qanunlar, prinsiplər, hüquq normaları pozulmamalıdır" tezisi Heydər Əliyevin dilində inkarlıq kateqoriyalarının işlənməsi ilə prinsipial mövqe kimi öz əksini tapır. "Heç bir" inkar əvəzliyi ilə "yolverilməzdir" və "yol vermək olmaz" ifadələrini birgə işlədərək nitqin təsir gücünü artırır. "Nə" və "nə də" inkarlıq bağlayıcıları da prinsipial mövqe anlarında işə düşür. Qanunların pozulmasına əsaslanan antietik siyasətin perspektivsizliyinə işarə edir. "Heç vaxt", "nə.... nə də" inkarlıq bağlayıcıları ilə Dağlıq Qarabağ məsələsində sərt mövqe ortaya qoyur: "Bu, təkcə bizim prinsipimiz deyil, beynəlxalq hüquq normalarıdır, Birləşmiş Millətlər Təşkilatının, ATƏT-in prinsipidir. Heç bir ölkənin ərazi bütövlüyünün pozulmasına yol vermək olmaz. Hər hansı ölkənin sərhədlərinin güc yolu, silah yolu ilə dəyişdirilməsi yolverilməzdir. Ona görə də buna ***nə*** biz razı ola bilmərik, ***nə də*** beynəlxalq təşkilatlar, başqa ölkələr razı olmaz.

Ona görə Ermənistan bunu anlamalıdır və get-gedə anlayır ki, onların bu siyasəti perspektivsiz siyasətdir. Biz ***heç***

***vaxt*** buna yol verə bilmərik. ***Nə*** Dağlıq Qarabağı əlimizdən verməyəcəyik, ***nə də*** Azərbaycanın torpaqlarının bir qarışını. Ancaq məsələni sülh yolu ilə həll edirik [XVIc.s.407-408].

"Dövlət öz dövlətini və hər bir vətəndaşının hüququnu qorumalıdır" söyləyən böyük natiq cəzasızlıqla bağlı cinayətkarlığa qarşı mübarizəyə çağırır. Məhbusların siyasi cəhətdən xüsusiyyətlərinin hələ aydın olmadığı keçid dövrünü xarakterizə edir. "Mı", "mi" sual ədatları ilə yaranan ritorik cümlələrlə auditoriyaları səfərbər edir. Hüquqi etikanın nüvəsində duran "azadlıq – rahatlıq" ifadəsi isə Heydər Əliyevin nitqində əsas yer tutur. "Vətəndaş ***rahat*** yatsın, ***rahat*** dursun, ***rahat*** gəzsin, ***rahat*** istirahət etsin, ***rahat*** işləsin" cümləsində beş yerdə rahat sözü təkrarlanır: "İndi bəziləri, bizə müxalif olan qüvvələr deyirlər ki, Azərbaycanda siyasi məhbuslar var. Amma bir nəfər də siyasi məhbus yoxdur. Azərbaycanda məhbus var, hər ölkədə var. Burada yoxdur***mu***? Amerikada məhbus yoxdur***mu***? Var! Nə üçün? Cinayət etdiyinə görə! Cinayətkar cəzasını almalıdır. Cəzasızlıq şəraitində keçmişdə Azərbaycanda olan özbaşınalıq yaranır. Dövlət ***öz*** dövlətini və ***hər bir*** vətəndaşının hüququnu qorumalıdır. Vətəndaşın hüququnun qorunması ondan ibarətdir ki, vətəndaş rahat yatsın, rahat dursun, rahat gəzsin, rahat istirahət eləsin, rahat işləsin. Biz bunu təmin etmişik [XVIc.s.408].

Heydər Əliyevin nitqində siyasi etika iqtisadi və hüquqi etika ilə çulğalaşır. "Hesab edirəm ki" modalı ilə auditoriyanı iqtisadiyyatın gələcək inkişafına inandırır. İslahatların insanlara sərbəstlik verilməsinin dövlət tərəfindən həyata keçirilməsinin siyasət olduğu anlaşılır. Gümanları həmişə özünü doğruldan Heydər Əliyev nitqləri bu çıxışda da özünün göstərir: "Bizim həyata keçirdiyimiz islahatlar Azərbaycan iqtisadiyyatını çox canlandırıbdır. Biz keçid dövrünün çətinliklərinin öhdəsindən gəlirik. ***Hesab edirəm ki***, bu il və qarşıdan gələn ildə ölkəmizin iqtisadiyyatında inkişaf daha da

sürətlənəcəkdir. Apardığımız islahatlarla, insanlara sərbəstlik verməyimizlə bərabər, eyni zamanda, xarici sərmayələrin Azərbaycana gəlməsi respublikamızın iqtisadiyyatının inkişaf etdirilməsinin mühüm cəhətlərindən biridir. Azərbaycana xarici sərmayə təkcə neft sahəsinə yox, bir çox başqa sahələrə də qoyulur. Bu ilin ötən altı ayında Azərbaycana xarici sərmayə qoyuluşu keçən ilin müvafiq dövrünə nisbətən 70 faiz artmışdır. ***Güman edirəm ki,*** ilin ikinci yarısında bu artım daha da yüksək olacaqdır [XVIc.s.464].

“Bazar iqtisadiyyatı sistemi yaradırıq” deməklə siyasi etikanın iqtisadi inkişafa stimul verməsini, dövlətin qanunlar, proqramlar hazırlamasını önə çəkməklə siyasi etikanın aparıcı olduğunu dilə gətirir. Əxlaqın kökündə dayanan nitq ünsürü kimi səmimiyyət burada da özünü büruzə verir (burada nöqsanlarımız da meydana çıxır). Dövlət orqanlarında olan məmur səhvlərini cəsarətlə, səmimi bir dillə auditoriyalara çatdıra bilir. Sonda “bunlar keçicidir” deyərək nikbin bir ovqat yaradır: “Azərbaycan üçün demokratiya yeni bir şeydir. Biz bunları təmin etmək üçün ölkəmizdə demokratik Konstitusiya və qanunlar qəbul etmişik. Ancaq insanlar buna alışmalıdır və onların hamısının da eyni fikri olmalıdır. Biz bunu təmin edirik. Biz bazar iqtisadiyyatı sistemi yaradırıq. Qanunlarımız, proqramımız var, islahatlar, özəlləşdirmə aparırıq. ***Ancaq burada nöqsanlarımız da meydana çıxır.*** İnsanların bir qismi hələ buna alışa bilmir. Dövlət orqanlarında olan məmurlar da ***bəzən*** bunu bacarmırlar, yaxud da öz vəzifələrindən ***sui-istifadə*** edirlər. Belə və buna bənzər digər nöqsanlar az deyildir. Ancaq bunlar keçicidir. Daimi isə odur ki, Azərbaycan demokratiya, sərbəst iqtisadiyyat yolu ilə gedir, ölkəmizdə sahibkarlıq fəaliyyətinin yaranması və inkişaf etməsi üçün bütün imkanlar vardır və Azərbaycan öz iqtisadiyyatını dünya iqtisadiyyatı ilə sıx bağlamaq istəyir [XVIc.s.465].

Siyasi etikanın bir mühüm tərəfi inanmaq və inandırmaqdır. Bu zaman böyük natiq öz nitqində "inanıram ki" və "tam inanıram ki" deməklə auditoriyanı inamsızlıqdan çıxarır. Təkcə "həyata keçiriləcəkdir" ifadəsi qəti gələcək zamanda işlənərək kütlələrin siyasi liderin ardınca getməsini şərtləndirir: "***İnanıram ki***, Bakı Beynəlxalq Konfransında imzalanmış sənədlər, qəbul olunmuş qərarlar ardıcıl surətdə ***həyata keçiriləcəkdir***. Mən ***tam inanıram ki,*** Gürcüstan və Azərbaycan, Gürcüstan prezidenti və Azərbaycan prezidenti həmin qərarların həyata keçirilməsinin ən fəal iştirakçısı olacaqlar. Beləliklə, biz nəinki öz ölkələrimiz, Qafqaz üçün, bütün dünya üçün, Qərblə Şərqin, Avropa ilə Asiyanın birləşməsi üçün yeni bir nəqliyyat marşrutunun yaranmasına öz xidmətlərimizi göstərəcəyik [XVIIIc.s.9].

Vaşinqtonda, "Poçt" muzeyinin binasında, 26 aprel 1999-cu ildə Heydər Əliyevin Amerika-Azərbaycan Ticarət Palatasında rəsmi qəbuldakı nitqinin hərtərəfli araşdırılması siyasi etikanın aparıcı rolunu aşkarlamağa imkan verir. "Demokratik, hüquqi, dünyəvi" ifadəsi adı altında etikanın müxtəlif növlərinin bir arada olması faktı nəzərə çarpdırılır. Siyasi etikanın bir mühüm cəhəti də siyasi liderin verdiyi vədlərdə, gələcəyə tuşlanan proqnostik cümlələrində öz sözünün üstündə qətiyyətlə durmasıdır. İqtisadi terminləri (bazar iqtisadiyyatı, özəlləşdirmə, torpaq islahatı) sadalayan Heydər Əliyev iqtisadçı kimi auditoriya qarşısında çıxış edir, torpağın kəndlilərə verilməsini etik dəyər kimi nəzərə çatdırır: "Demokratiya yolu dönməz yoldur", "buna nail olacağıq" qətiyyətli fikirlər dediklərimizə əyani sübutdir: "Azərbaycanda ***demokratik, hüquqi, dünyəvi dövlət qurulur***. Azərbaycanda siyasi, iqtisadi islahatlar həyata keçirilir. Azərbaycan öz iqtisadiyyatını bazar iqtisadiyyatı prinsipləri əsasında qurur və inkişaf etdirir. Azərbaycan sülhsevər xarici siyasət aparır, dünyanın bütün ölkələri ilə qarşılıqlı surətdə faydalı əlaqələr

qurmağa və bunları inkişaf etdirməyə çalışır. Bütün bunlar Azərbaycan dövlətinin daxili və xarici siyasətinin əsaslarını təşkil edir. Mən bu gün burada Vaşinqtonda bir də bəyan edirəm ki, demokratiya yolu Azərbaycan üçün dönməz yoldur. Biz Azərbaycanı tam demokratik dövlət səviyyəsinə qaldıracağıq, buna qadirik və ***buna nail olacağıq.***

Azərbaycanda iqtisadiyyat ***bazar iqtisadiyyatı*** prinsipləri əsasında inkişaf edir. Biz özəlləşdirmə proqramını geniş surətdə həyata keçiririk. ***Torpaq islahatı*** proqramını həyata keçiririk, torpağı şəxsi mülkiyyətə, ***kəndlilərə vermişik***. ***Özəlləşdirmə*** Azərbaycanın iqtisadiyyatına yeni-yeni nailiyyətlər gətirir [XXc.s.133].

Cenevrə Demokratiya Quruculuğu İnstitutunun "media dəstəyi layihəsi" çərçivəsində Bakida keçirdiyi konfransda iştirak edən Gürcüstan və Ermənistan jurnalistləri ilə görüşdəki söhbətində "zənnimcə" modal sözü ilə millətlər arasında münasibətləri nizamlamaq üçün müxtəlif millətlərə məxsus jurnalistlərin bir araya gəlməsini müsbət hal kimi qəbul edir. Sinonim cərgələrlə Qafqaza xas olanları (xüsusiyyətləri, xarakterləri, adətləri, mərasimləri, ənənələri) Cenevrə Demokratiya Quruculuğu İnstitutunun əməkdaşlarına ünvanlayır. Cənubi Qafqazın təəssübünü çəkdiyini (dostluq etmək, bir-birini dəstəkləmək), baş verən neqativ halları (münaqişələr, qarışıqlıqlar) ziddiyyət halında media nümayəndələrinə təqdim edir: "Burada Gürcüstan və Ermənistan jurnalistləri iştirak edirlər. Cənubi Qafqaz həmişə bununla şöhrətlənmişdir ki, burada xalqlar ***dostluq*** etmiş, bir-birini dəstəkləmişlər, hərçənd münaqişələrin, qarışıqlıqların yarandığı vaxtlar da olmuşdur. Ümumiyyətlə, Qafqaz bütün dünyada öz səciyyəvi xüsusiyyətləri, xarakterləri, adətləri, mərasimləri, ənənələri olan bölgə kimi məşhurdur. Bunlar dünyanın digər bölgələrindəkindən müəyyən dərəcədə fərqlənir. Ona görə də bütün dövrlərdə səyyahlar, tarixçilər Qafqaza, xüsusən də onun

Cənubi Qafqaz adlanan hissəsinə – Gürcüstana, Ermənistan və Azərbaycana böyük maraq göstərmişlər [XXc.s.407].

"Əsrlərdən bəri yan-yana, qonşuluqda" yaşamaq, həm də münaqişədə olmaq "axı" qüvvətləndirici ədatı ilə əxlaqa sığmazlığa işarədir: "Cənubi Qafqaz ölkələri arasında əməkdaşlıq da vacibdir. Gürcüstanla Azərbaycan arasında mehriban münasibətlər, dostluq münasibətləri mövcuddur. ***Axı*** xalqlarımız əsrlərdən bəri ***yan-yana***, qonşuluqda yaşayırlar" [XXc.s.409].

"Bilirsiz" modal sözü ilə dövlət müstəqilliyi yolunda siyasi əxlaqı auditoriya üçün açıqlayan Heydər Əliyev "əlbəttə" qəti təsdiq modalı ilə Ermənistanın könüllü olaraq suverenliyini məhdudlaşdırmasını auditoriyanın diqqətinə çatdırılır. Növbəti nitq mərhələsində "XX əsrin sonunda ölkələri dinə görə bölmək, sadəcə olaraq, cinayətdir" ifadəsi ilə siyasətçiləri qınağa çəkir. Rusiya tərəfdən baş verən belə işlərə "təəssüf" edir. "Doğrudur" modal sözünü iki yerdə təkrar etməklə, "axı" qüvvətləndirici ədatı ilə bu gün xalqları dini azadlıqlarına görə təsnif etməyi siyasi əxlaq baxımından yolverilməz hesab edir: "***Bilirsiz***, siz çox kəskin ifadələr işlədirsiniz. Nə eşitmisiniz, eşitmisiniz. Mən burada nəsə deyə bilmərəm, bunu özümə rəva görmürəm. Ancaq fakt faktlığında qalır, Rusiyanın Ermənistanda silahlı qüvvələri, hərbi bazaları var. Ermənistanda sərhəd xidmətini əsasən Rusiya sərhədçiləri çəkirlər, amma təbii ki, Ermənistan sərhədçilərinin iştirakı ilə. Bu fakt özlüyündə onu göstərir ki, ölkənin suverenliyi müəyyən dərəcədə pozulmuşdur. ***Əlbəttə***, bu, ölkənin öz işidir, buna yol verə də bilər, verməyə də. Məsələn, Moskvada da bəziləri deyirlər ki, bilirsinizmi, Ermənistan Cənubi Qafqazda bizim yeganə dayağımız və müttəfiqimizdir. ***Əlbəttə***, bizə o da toxunur ki, məsələn, bəzən kimsə deyir ki, bu, xristian ölkəsidir. Başa düşürsünüzmü, XX əsrin sonunda ölkələri dinə görə bölmək, ***sadəcə olaraq, cinayətdir. Təəssüf***

ki, biz Rusiyada bu cür səslər eşidirik. Ermənistanın xristian ölkə olmasının məsələyə dəxli yoxdur. Amma nə olsun, belə bəyan edirlər, özü də yüksək vəzifəli adamlar bəyan edirlər. Xalq xristianlığa etiqad edir. ***Doğrudur***. Azərbaycanda xalq müsəlmanlığa etiqad edir. ***Doğrudur***. *Axı* bunu biz yaratmamışıq. Əcdadlarımız hələ çox-çox əsrlər əvvəl bu cür din qəbul etmişlər. İndi buna görə biz bir-birimizlə düşmənçilik etməli, inamsızlıq göstərməli, yaxud hesab etməliyik ki, görürsünüz, Moskva Ermənistanı xristian, Azərbaycanı isə müsəlman ölkəsi adlandırır? [XXc.s.415].

Demokratiyaya gedən yolda zaman anlayışına ciddi önəm verərək "bizə nə qədər vaxt, nə qədər məsafə" lazımdır deyən Ulu Öndər Avropa xalqları ilə Azərbaycan xalqının mentalitetləri arasındakı ciddi fərqləri nəzərə çarpdırır.

Dövlətin apardığı milli-dini siyasət auditoriyalara Azərbaycan xarakterini özündə əks etdirən zəngin, rəvan, yüksək mənəviyyata söykənən bir dillə çatdırılır. "Taleyin hökmü ilə" bədii ifadəsinin yaratdığı ovqatla başlanan nitq "bəs" sual ədatı ilə qurulan ritorik sual, "axı" qiymətləndirici ədatı ilə "qarışıq nikahdan doğulanların təqsirkar olmaması" müddəasını bəyan edir. İnsanları düşünməyə vadar edən ümumbəşəri bir nitq nümunəsi sonda dövlət başçısı dilində "mən qəti şəkildə xəbərdarlıq etmişəm" ifadəsi ilə bitir. "Heç bir problem yoxdur" böyük natiqin dilində tolerantlıq nümayiş etdirir: "Var. Belə siyasət var, o, mənim tərəfimdən – Azərbaycan prezidenti tərəfindən dəfələrlə bəyan edilmişdir. ***Taleyin hökmü ilə*** Azərbaycanda yaşayan ermənilər qarışıq nikahda olan ermənilərdir, yəni arvad erməni, ər isə azərbaycanlıdır. Belədir? Mən deyirəm: Yaxşı, ***bəs*** uşaqlar? ***Axı*** uşaqlarda da ***həm*** azərbaycanlı, ***həm də*** erməni qanı var. Onlardan heç kim – nə azərbaycanlıya ərə getdiyinə görə erməni, nə də erməniyə evləndiyinə görə azərbaycanlı təqsirkar

deyildir. Xüsusən də bu qarışıq nikahdan doğulmuş uşaqlar" [XXc.s.422].

Heydər Əliyevə görə siyasi etikanın bir qolu da haqları pozulmuş ölkələrin müdafiə olunmasıdır. İran İslam Respublikasının Şərqi Azərbaycan əyalətinin ostandarı Yəhya Məmmədzadənin başçılıq etdiyi nümayəndə heyəti ilə görüşdəki söhbətdə "kimi" bənzətmə mənasını verən qoşmanın bir neçə dəfə təkrarlanması (təcavüzkar kimi, təcavüz edən kimi) Ermənistanın İran tərəfindən necə tanıdılmasını diqqətə çatdırır. "Şübhəsiz ki" qəti təsdiq modal sözü ilə İran İslam Cümhuriyyətinin Azərbaycanın haqq işinin müdafiəsindəki rolunu göstərir: "Mən bu barədə danışanda qeyd etmək istəyirəm ki, beynəlxalq aləmdə çətin problem olan Ermənistan-Azərbaycan münaqişəsində İran həmişə Azərbaycanın haqq işini müdafiə edibdir. İran hökuməti daim Ermənistanı bir təcavüzkar ***kimi*** məhkum edibdir, ***təcavüzkar kimi*** tanıyıbdır. Azərbaycan torpaqlarına təcavüz edən ***kimi*** tanıyıbdır" [XXIc.s.124].

Aristotelə görə məhz insan layiqli bir cəmiyyət içərisində müsbət bir insan ola bilər və yaxşı bir insan olaraq hərəkət etdiyində də cəmiyyətə müsbət təsir edir [197]. Həmin layiqli cəmiyyətin formalaşması iqtisadiyyatın güclü inkişafı sayəsində mümkündür ki, postsovet məkanında Heydər Əliyev iqtisadi dəyərlərin həyata keçirilməsində dövlət siyasətini açıqlayır, "bilirsiniz" modal sözü ilə xarici iqtisadi əlaqələr haqqında düşüncələrini söyləyir. "Doğrudur" modalı ilə başlayaraq səmimi ifadə ilə "nöqsanları da deyir". Hələ də "öz şəxsi mənafeyini üstün tutan"ların – məmurların, bürokratların mövcudluğunu qeyd edir, "güman edirəm ki" modal sözü ilə qəti gələcək zamanda (tədbirlər görəcəyik) fikrini reallaşdırır. "Hamısı yüksək nəzarət altındadır" ifadəsi siyasətin müdaxiləsini müəyyən dövr üçün labüd edir: "***Bəli***, Təbriz ticarəti ilə dünyada çox məşhurdur. Mənə belə gəlir ki, elə İranda tacir-

lərin əksəriyyətini təbrizlilər təşkil edir. Ona görə də siz doğru buyurdunuz. Təbriz adı ilə, Təbriz tacirləri adı ilə tacirlər burada da fəaliyyət göstərməlidirlər.

***Bilirsiniz***, indi bizim xarici sərmayəyə çox ehtiyacımız vardır. Biz qapılarımızı açmışıq. Kim bizə xarici sərmayə gətirirsə, o, bizim üçün nəinki qəbuldur, biz bunu məmnuniyyətlə qəbul edirik. ***Doğrudur***, mən indi bəzi nöqsanları da deməliyəm. Bizim bu dövlət orqanlarında, bizim bu məmurlarda, bürokratlarda sərmayənin Azərbaycana gəlməsinə mane olanlar da vardır. Bəlkə bizim qanunlarda da bəzi çatışmazlıqlar vardır. Mən bunları son vaxtlar çox dərindən təhlil edirəm və güman edirəm ki, müəyyən tədbirlər görəcəyik. Ancaq mən bilirəm ki, bizim Azərbaycanda ayrı-ayrı məmurlar, bürokratlar, məsələn, xaricdən gələn bir iş adamının, o cümlədən İrandan gələn bir iş adamının iş görməsi üçün maneçilik törədirlər. Bunu da ***öz şəxsi mənafeyinə*** görə edirlər. Bu şəxsi mənafeyinə görə o hərəkətləri edərək Azərbaycanın ölkə kimi, dövlət kimi mənafeyinə zərbə vurur, zərər vururlar. Bunlar da bəzən xarici sərmayəçiləri soyudurlar. ***Düzdür***, çoxları gəlir, sərmayə qoyur, yollar tapırlar.

Məsələn, neft sahəsində bizim bütün müqavilələr elə təşkil olunubdur ki, heç bir bürokrat bunun içinə girə bilməz, heç bir məmur burada mane ola bilməz. Bunlar hamısı ***yüksək nəzarət*** altındadır. Onlar yaxşı gedir. Ancaq bizim başqa sahələrə də çox ehtiyacımız vardır [XXIc.s.127].

Mənəviyyatın yüksəlişində, inkişafında ədəbiyyatın, sənətin rolunu öz şəxsi təcrübəsində sınaqdan keçirən, qlobal əxlaqın formalaşmasında yüksək rolunu qiymətləndirən Heydər Əliyevin Şəhriyarla bağlı çıxışından bir parça diqqətəlayiqdir.

Öncə səmimi bir "mən hər şeyi açıq danışıram" ifadəsi auditoriyanı nitq cazibəsinə salır. "Hətta" ədatı ilə satirik bir məzmunda "bu, İran şairidir" ifadəsini yada salır. "O, eyni

zamanda Azərbaycan şairidir" deməklə qarşı tərəfi neytral vəziyyətə salır, sonda yenidən "bizim doğma şairimizdir" deməklə qətiyyətli nitq nümunəsi yaradır: "Şəhriyarın yubileyi haqqında mən böyük bir fərman verdim. Mən hər şeyi açıq danışıram, – ***hətta*** mənə dedilər ki, İranda kimsə inciyir, – bu, İran şairidir. Bu, ***həm*** İran şairidir, ***həm*** Azərbaycan şairidir. Bunu bir-birindən ayırmaq olmaz. Biz demirik ki, Şəhriyar İran şairi deyil, İran şairidir. Amma biz deyirik, o, eyni zamanda Azərbaycan şairidir. Bu, bizim doğma şairimizdir və Azərbaycan haqqında onun yazdığı şeirlər, onun yazdığı əsərlər insanlara ***nə qədər*** mənəvi qida veribdir, ***nə qədər*** böyük ruh veribdir" [XXIc.s.129].

Dövlətin apardığı dini siyasət böyük natiqin dilində bir sıra əxlaqi dəyərləri ünvanlayır. Aşağıdakı mətn dövlət başçısının dini əxlaqla siyasət arasındakı əlaqələr barədə fikirləridir. Öncə məişət üslublu nitq işə düşür. Auditoriya Sovetlər dönəmində Qafqazda şeyxülislam vəzifəsi olduğunu eşidir. İslam ölkələri arasında dini əlaqələrin olmasını, inkişafını "şübhəsiz ki" modal sözü ilə bəyan edir. Əxlaqi dəyər kimi "bir-birinin daxili işinə qarışmamağı" tövsiyə edir. Bu "qarışmamağı" heç vaxt prinsipiallıq bildirən ifadə ilə dilə gətirir. "Bir var dövlətin siyasəti, bir də var ki, müxalifətin" cümləsiylə məsuliyyət etikasına söykənir, "niyə çadra örtürlər?" ritorik sualla bir daha başqa qonşu ölkələrin daxili siyasətlərinə qarışmamağı tövsiyə edir, dini sahədə çalışan ilahiyyatçılar və diplomatlar üçün örnək ola biləcək nitq üslubu yaradır: "Sovet hakimiyyəti vaxtı din qadağan idi. Amma Qafqaz Müsəlmanlarının İdarəsi Bakıda yerləşirdi və şeyxülislam var idi. Bu şeyxülislamdan qabaq, sovet hakimiyyəti vaxtı da şeyxülislam var idi. Mən onu da tanıyırdım – Əlizadə, adı yadımdan çıxıbdır – şeyxülislam idi. Uzun müddət Azərbaycanda şeyxlik edib və bütün Qafqazın şeyxülislamı idi.

Ona görə dini əlaqələr, ***şübhəsiz ki,*** olmalıdır, inkişaf etməlidir. Bu təbiidir və biz bunu etməliyik. Ancaq bir-birinin daxili işinə qarışmaq, – mən hesab edirəm ki, bu olmamalıdır. Biz bir dövlət olaraq, dost, qardaş olaraq heç vaxt İran İslam Cümhuriyyətinin daxili işlərinin heç birinə qarışmırıq və qarışmarıq. Müxalifətdən kimsə burada qəzetdə nə yazırsa, onlara fikir verməyin. Mən səfirə bir-iki dəfə demişəm: ***bir var dövlətin siyasəti, bir də var ki***, – indi bizdə mətbuat azadlığıdır, – ***müxalifətin***, yaxud da ayrı-ayrı qəzetlərin fikri. Onlar dövlətin siyasətini ifadə etmir. Dövlətin siyasəti isə odur ki, İran İslam Cümhuriyyəti Azərbaycanın dostu, qardaşıdır və bu ölkə ilə bizim dostluğumuz, qardaşlığımız daimidir və bunu inkişaf etdirəcəyik. Biz İranın daxili işlərinə qarışmırıq ki, İranda, nə bilim, ***niyə çadra örtürlər?*** Biz buna qarışmırıq. Yaxud da ki, bu yaxınlarda orada, nə bilim, nəsə olmuşdu. Bu, daxili işdir, hər yerdə ola bilər. Bu, harada yoxdur ki! Burada da bizim bu müxalifət bir dəfə yürüş etdi, şəhərdə 4 kilometr ora-bura getdilər. Mənim əleyhimə sözlər deyirdilər, yazırdılar, edirdilər. Nə bilim, gah orada, gah burada bir mitinq etmək istəyirdilər [XXIc.s.133].

Heydər Əliyev şəxsiyyəti və onun apardığı siyasətin gücü şəxsiyyətin xarakteri ilə uzlaşmasındadır. Siyasətə başqa cür tərif verənlərin əksinə olaraq Heydər Əliyev şəxsiyyət və siyasət dialektik vəhdətinə aydınlıq gətirir. “Bilirsən, dostluqda gərək hər şey açıq olsun. Hər şey açıq olanda hər şey də düz olur ”. Təkcə bu ifadələr kifayət edər ki, “həyatda özünü doğruldan səmimiyyət elə əxlaqdır” müddəasına gələk. “Dost”, “qardaş” müraciətləri siyasi anlaşmalara aydınlıq gətirir. Siyasi münasibətlərdə “təmizlik”, “paklıq” ən yüksək əxlaqi dəyərlərdən xəbər verir: “***Bax***, mən bu sözləri bir dost kimi, qardaş kimi niyə deyirəm? ***Bilirsən, dostluqda gərək hər şey açıq olsun***. Hər şey açıq olanda hər şey də düz olur. Bunları deyirəm ona görə ki, xüsusən, bəzi hallarda bizi

narahat edən ayrı-ayrı din adamlarının gəlib burada dini öz istədiyi kimi təbliğ etməsidir. Buna ehtiyac yoxdur. Artıq bizdə Quran da Azərbaycan dilinə tərcümə olunubdur. İnsanların burada Qurana da etiqadı var, məscidlərə də etiqadı var, istədikləri qədər məscid də tikirlər.

O vaxt mən istəmişdim siz Naxçıvanda məscid tikəsiniz. Çünki bizim gücümüz yox idi. Amma indi istəmirəm, çünki Azərbaycanda indi o qədər məscid tikiblər ki, buna ehtiyac yoxdur. Hər dövrün bir hökmü var. O vaxt bu lazım idi, amma indi buna ehtiyac yoxdur, hər şey var. Mən bunları sizə bir ***qardaş*** kimi deyirəm. Xahiş edirəm, bu sözləri ***qardaş*** sözü kimi qəbul edəsiniz. Ona görə deyirəm ki, bizim münasibətlərimizdə həmişə ***təmizlik*** olsun, həmişə ***paklıq*** olsun" [XXIc.s.134].

"İnsanlarda böyük təmizlik əmələ gətirir" cümləsi Heydər Əliyevin nitqində ziyarətgahların əxlaqi təsirini auditoriyalara ünvanlamaqdır. "Vətəndaşın layiqli olub cəmiyyətə müsbət təsir etməsi Aristotel [11] tərəfindən irəli sürülürsə, dinin də belə rolu nə üçün də inkar olunsun. Dini ziyarətgahların insanı heyran qoyması elə müsbət təsirdən xəbər verir və Heydər Əliyevin nitqində öz ifadəsini tapır: "Bəli, Məşhəddə İmam Rza bizim hamımız üçün ən yüksək zirvədir. Mən sizə deyim ki, İmam Rzanın qəbrini, məbədini ziyarət edəndə heyran olmuşdum. Heyran olmuşdum ki, İran xalqı, milləti nə qədər əsrlər boyu bunu belə qoruyub saxlayıb, abadlaşdırıb, gözəlləşdirib. Doğrudan da, bu ziyarət insanlarda böyük təmizlik əmələ gətirir" [XXIc.s.135].

Heydər Əliyev Azərbaycan dövlətinin, hökumətinin qarşısında duran vəzifələri "üçün" qoşmasının köməyi ilə auditoriyaya açıqlayır. Dövlət qurmağın, cəmiyyət qurmağın canlı orqanizmdəki kimi daimi bir proses olduğunu sadə, məişət-publisistik üslubla çatdırır: "Bizim qarşımızda, yəni Azərbaycan dövlətinin, hökumətinin qarşısında bu yolla getmək ***üçün***

və tamamilə demokratik, hüquqi, dünyəvi dövlət, vətəndaş cəmiyyəti, demokratik cəmiyyət yaratmaq ***üçün*** hələ çox işlər görmək vəzifəsi durur. Bu proses heç vaxt qurtarmayacaqdır. Çünki insan cəmiyyəti canlı bir orqanizm olduğu kimi, bu proses də canlı bir prosesdir. Müəyyən mərhələyə çatandan sonra heç vaxt dayanmaz, hesab edilməz ki, bəli, artıq bir məsafəyə çatdıq və hər şeyi həll etmişik. Bu heç vaxt heç bir ölkədə olmayıb və bizim ölkədə də olmayacaqdır" [XXVIIc.s.70].

İqtidar partiyasının yeridəcəyi siyasətdə əxlaqi dəyərlərin hansı xarakterdə olacağını partiya üzvləri ilə görüşdə sadalayır. Mühüm əxlaqi dəyər kimi cəmiyyətin qabaqcıl hissəsini təşkil edən iqtidar partiyası üçün "iqtidarın, dövlətin" kölgəsində durmamaq tövsiyə və tələb olunur.

Partiyanın hansı əsas sahələrdə (hüquqi, demokratik dövlət qurmaq, demokratiyanın inkişaf etdirilməsi prosesində) və "qarşı" qoşmasının təkrarı ilə kimlərə münasibətdə daha fəal olması (demokratiyanı təhrif edənlərə, demokratiya anlayışından sui-istifadə edənlərə, ictimai-siyasi sabitliyi pozmaq istəyənlərə) diqqətə çatdırılır: "Təbiidir ki, dövlətin bir çox vəzifələri vardır. Bizim partiyanın üzvləri mənsub olduqları dövlət qurumlarında, yaxud da ki, təşkilatlarında öz fəallığı ilə bu dövlət işlərinin daha da uğurlu olmasını təmin edə bilərlər. Elə sahələr də var ki, burada onların imkanları yoxdur. Amma əsas sahədə, yəni bizim ***hüquqi, demokratik dövlət quruculuğu prosesində, ölkəmizdə demokratiyanın inkişaf etdirilməsi prosesində***, ölkəmizdə insanların demokratiyanı dərk etməsində və demokratiyanı təhrif edənlərə ***qarşı***, demokratiya anlayışından sui-istifadə edənlərə ***qarşı***, demokratiya adı ilə Azərbaycanda ictimai-siyasi sabitliyi pozmaq istəyənlərə ***qarşı*** və başqa bu cür qüvvələrə ***qarşı*** partiya çox fəal olmalıdır. Partiya burada artıq özünü qabağa verməlidir və iqtidarın, dövlətin kölgəsində durmamalıdır" [XXVIIc.s.73-74].

Demokratiyaya əxlaqi münasibəti bu gün Heydər Əliyev nitqləri əsasında düzgün təsəvvür etmək mümkündür. Etik lüğətə daxil olan terminlər böyük natiqin dilində siyasi-əxlaqi terminlərlə -"yüksək siyasi mənəviyyat, yüksək-siyasi əxlaq"- əvəzlənir. Demokratiya anlayışına aydınlıq gətirir. Bu aydınlıq auditoriyalara dilimizin zənginliyi ilə çatdırılır. Təkrar üslubi fiqurun (əxlaqsızlıq demək deyil, mənəviyyatsızlıq demək deyil, qanunları pozmaq deyil, heç də xaos demək deyil, özbaşınalıq demək deyil) köməyi ilə demokratiyanın tərifini yaddaqalan edir.

Siyasi-fəlsəfi rəhbərlik kitablarından fərqli olaraq auditoriya öz bilik səviyyəsindən, dünyagörüşü səviyyəsindən asılı olmayaraq demokratiya anlayışını asanlıqla mənimsəyə bilir. "Təmin etməkdir" ifadəsinin təkrarı isə (qanunun aliliyini təmin etməkdir, hüquq bərabərliyini təmin etməkdir, azadlığını təmin etməkdir) dövlətin siyasi etikasını sadalayır, sonra da vətəndaşın vəzifəsini bir-bir aydınladır. "Bax" əmr ədatı ilə dövlət və vətəndaş əxlaqı vəhdətini şüurlara yönəldir: "Demokratiya əxlaqsızlıq demək ***deyil***. Demokratiya mənəviyyatsızlıq demək ***deyil***. Demokratiya qanunları pozmaq ***deyil***. Demokratiya qanun çərçivəsində olmalıdır. Dövlətin vəzifəsi ölkədə qanunun aliliyini təmin etməkdir, insanların hüquq bərabərliyini təmin etməkdir, insanların azadlığını təmin etməkdir. Vətəndaşın da vəzifəsi bütün hərəkətləri, bütün fəaliyyəti, işləri qanunun çərçivəsində görməkdir. Bax, belə olan halda – bir tərəfdən, dövlət qanunun aliliyini təmin edirsə və ikinci tərəfdən, hər bir vətəndaş öz həyat tərzi ilə, davranışı ilə, fəaliyyəti ilə qanunun aliliyinin təmin olunmasına öz payını verirsə və qanunun aliliyindən istifadə edərək öz hüquqları çərçivəsində fəaliyyət göstərirsə, onda demokratiya həqiqi demokratiyadır.

Demokratiya heç də xaos demək ***deyil***, özbaşınalıq demək ***deyildir***. Əgər elə olsa, onda dövlət olmaz. Elə olsa, onda

qanun lazım deyil. Bunlar ümumiyyətlə, çox aydın məsələlərdir. Ancaq ola bilər ki, bizim ölkəmiz bütün bu prosesləri indi az bir zamanda həyata keçirdiyinə ***görə***, bu sahədə gənc olduğuna ***görə***, bəlkə də bu eybəcərliklər müəyyən qədər təbii qəbul edilə bilər. ***Ancaq*** eyni zamanda, bunlar get-gedə islah olunmalıdır. Yəni Azərbaycanda demokratik cəmiyyət eyni zamanda yüksək mənəviyyata, yüksək əxlaqa, yüksək siyasi mənəviyyata, yüksək siyasi əxlaqa layiq, malik olmalıdır" [XXVIIc.s.75].

Fəlsəfi düşüncələrin ortaya qoyulmasında tez-tez işlədilən "bilirsiniz" modal sözü siyasi etika haqqında da danışarkən istifadə olunur. "Demokratiyanın son həddi yoxdur" ifadəsi ilə əxlaqi dəyərlərin son həddinin təyin olunmaması, kamilliyə aparan yolun da sonsuzluğu dilə gətirilir. Məhz buna görə də Ulu Öndər partiya üzvlərini əxlaqi dəyərləri inkişaf etdirmək yolundan kənara çəkilməməyi, arxayınçılığa yol verməməyi "bax" əmr ədatı ilə sanki əmr edir.

Partiyaların, xüsusən müxalif partiyaların bir-birinə olan münasibətlərinin əxlaqi müstəvidə olmasını, "arqumentlə, konkret faktlarla" mübarizə aparılmasını tələb edir: "***Bilirsiniz, demokratiyanın son həddi yoxdur***. ***Bax***, bu prinsipi əsas tutaraq gərək bizim partiyamız arxayın olmasın ki, partiya böyük partiyadır, partiya hörmətli partiyadır, partiya iqtidardadır, Azərbaycan prezidenti bu partiyanın sədridir. ***Bax***, bu arxayınçılığı kənara qoymaq lazımdır və seçkilərdə işləyən bütün qüvvələrlə bərabər şəraitdə, bərabər hüquqda bizim partiya öz nümayəndələrinin Milli Məclisdə təmsil olunmaq üçün seçilməsinə çalışmalıdır. Bu, indiki mərhələdə qarşıda duran əsas vəzifədir və bu vəzifəni yerinə yetirmək üçün bizim partiyamız, partiyanın təşkilatları, partiyanın hər bir üzvü Azərbaycanın son illərdə əldə etdiyi nailiyyətləri təbliğ etməlidir, bu nailiyyətlərin əldə olunmasında dövlətin, partiyanın xidmətlərini göstərməlidir.

İndi müxalifətdə olan qəzetlər əksəriyyət təşkil edir, amma qüvvələr yox. Qüvvələr azlıq təşkil edir, amma qəzetlər əksəriyyətə malikdir. Onlar ağa qara deyirlər, qaraya da ağ deyirlər. Amma onlara cavab vermək lazımdır. Cavab da elə hay-küylə yox, hansısa bir sərt üsul ilə yox, ***arqumentlə, konkret faktlarla*** verilməlidir" [XXVIIc.s.78].

"Hakimiyyət formulu" verlişində siyasi xadimin məhşurlaşmasının səbəblərini açıqlayır. Bu səbəblər arasında ən mühüm olanı Heydər Əliyevə görə xalqı narahat edən antietik dəyərlərə qarşı mübarizədir: "Mən Azərbaycanda çox nöqsanların səbəbini bilirdim. Bilirdim ki, insanlar vəzifələrindən sui-istifadə edirlər, rüşvətxorluq var. Ona görə də bundan başladım. Demə, xalq məhz bunu gözləyirmiş. Ona görə də qısa bir vaxtda məşhurlaşdım" [XXXVIc.s.159].

Siyasətlə əxlaq arasındakı ziddiyyətləri qabaqcadan görən siyasi lider Konstitusiyanı əsas götürür. "Göz qoymalıyıq ki" frazeologizmindən yerindəcə yararlanaraq "vicdan azadlığı hüququnun" nələrə çevrilməməsi inkar bağlayıcıları "nə....nə də" ilə verilişdə öz əksini tapır: "Hesab edirəm ki, Azərbaycanın gələcəyə yolu dünyəvi həyat tərzindən keçir. ***Əlbəttə***, milli dəyərlərə, o cümlədən dini dəyərlərə hörmət edilməlidir, amma bununla belə, dünyəvi həyat tərzi olmalıdır. Biz ***Konstitusiyamızı*** əsas tutaraq, insanlarımıza vicdan azadlığı hüququ verərək, eyni zamanda***, göz qoymalıyıq ki***, bu hüquq ***nə*** fanatizmə, ***nə*** təməlçiliyə, ***nə*** ekstremizmə, ***nə də*** terrorizmə çevrilsin [XXXVIc.s.165].

Bir neçə cümlədən ibarət qısa müsahibədə Heydər Əliyevin siyasət adamının dinlə bağlı fikirləri açıqlanır. "Elə" qüvvətləndirici ədatı ilə o gənclik illərində "bütün dinləri, bütün millətləri" görmüşdü. "Yəni" aydınlaşdırma bağlayıcısı ilə dinə biganə olmadığını dilə gətirir. "Hər bir" təyin əvəzliyi ilə insanların dini dəyərlərə malik olmasını söyləyir. Auditoriya qarşısında milli-dini dəyərlərinə sadiq olan, bu sadiqliyi

ilə də milyonlara örnək ola biləcək siyasi lideri görür: "Mənim valideynlərim çox da dindar deyildilər. Mən gənclik illərində məhdud milli, məhdud dini mühitdə deyil, ***elə bir*** mühitdə, ***elə bir*** cəmiyyətdə olmuşam ki, orada hər şey vardı. Bütün dinlər vardı, bütün millətlər vardı. Məndə dinə elə bir bağlılıq yox idi. Amma bununla yanaşı, mən dinlə, ***albəttə***, maraqlanırdım. Quranı rus dilində oxumuşdum, hər şey, eləcə də dini ədəbiyyatda oxuduğum bir çox şeylər mənə maraqlı idi. İslamın tarixi, Məkkənin, Mədinənin tarixi haqqında oxuyurdum və sairə. ***Yəni***, mən dinə biganə deyildim. Hər bir insan hansısa dinə mənsubdur, dinsiz insan yoxdur. Mən öz köklərimlə islam dininə mənsubam, milliyyətcə azərbaycanlıyam. Bu anlayışları heç zaman ***heç nəyə*** dəyişmərəm. ***Heç nəyə!*** [XXXVIc.s.165-166].

Beləliklə, Heydər Əliyevin nitqində "siyasət və etika" yarımfəslini aşağıdakı kimi yekunlaşdırmaq olar:

– "Beynəlxalq Təşkilatların qəbul etdiyi qanunlar, prinsiplər, hüquq normaları pozulmamalıdır" tezisi Heydər Əliyevin dilində inkarlıq kateqoriyalarının işlənməsi ilə prinsipial mövqe kimi öz əksini tapır. "Heç bir" inkar əvəzliyi ilə "yolverilməzdir" və "yol vermək olmaz" ifadələrini birgə işlədərək nitqin təsir gücünü artırır. "Nə" və "nə də" inkarlıq bağlayıcıları da prinsipial mövqe anlarında işə düşür;

– Siyasətlə əxlaq arasındakı ziddiyyətləri qabaqcadan görən siyasi lider Konstitusiyanı əsas götürür. "Göz qoymalıyıq ki" frazeologizmindən yerindəcə yararlanaraq "vicdan azadlığı hüququnun" nələrə çevrilməməsi inkar bağlayıcıları "nə....nə də" ilə verilişdə öz əksini tapır

– Siyasi etikanın bir mühüm tərəfi inanmaq və inandırmaqdır. Bu zaman böyük natiq öz nitqində "inanıram ki" və "tam inanıram ki" deməklə auditoriyanı inamsızlıqdan çıxarır. Təkcə "həyata keçiriklənəcəkdir" ifadəsi qəti gələcək

zamanda işlənərək kütlələrin siyasi liderin ardınca getməsini şərtləndirir;

− Partiyaların, xüsusən müxalif partiyaların bir-birinə olan münasibətlərinin əxlaqi müstəvidə olmasını, "arqumentlə, konkret faktlarla" mübarizə aparılmasını tələb edir;

− Heydər Əliyevin dilində ictimai-siyasi sabitliyi pozanlara qarşı "onlar bilsinlər ki" feilin əmr şəklində hazır ifadələr mövcuddur;

− Heydər Əliyev Azərbaycan dövlətinin, hökumətinin qarşısında duran vəzifələri auditoriyalara açıqlayarkən köməkçi nitq hissəsi olan qoşmalardan da geniş istifadə edir. Dövlət qurmağın, cəmiyyət qurmağın canlı orqanizmdəki kimi daimi bir proses olduğunu sadə, məişət-publisistik üslubda çatdırır;

− Demokratiyaya əxlaqi münasibəti bu gün Heydər Əliyevin nitqləri əsasında düzgün təsəvvür etmək mümkündür. Etik lüğətə daxil olan terminlər böyük natiqin dilində siyasi-əxlaqi terminlərlə − "yüksək siyasi mənəviyyat, yüksək-siyasi əxlaq və s." − əvəzlənir.

## 1.2.2 Heydər Əliyevin nitqində hüquqi etika

"Bizim tələblərimiz isə qanundu, qanunun aliliyidir. Mənəviyyatın da hamısı qanunun içərisindədir" ifadəsi "Heydər Əliyevin nitqində hüquqi etika" yarımfəslinin başlığı olmağa layiq ifadədir.

Heydər Əliyevin hüquq-mühafizə sistemi əməkdaşları qarşısındakı çıxışları hüquqi etika ilə sıx bağlıdır. Hüquq-mühafizə orqanlarında çalışan əməkdaşların hüquqi etikanın həyata keçirilməsindəki rolları aydın bir dillə auditoriyalara yönəlir. Bu zaman "hər bir" təyin əvəzliyi ilə əməkdaşların öhdələrinə götürdüyü vəzifənin ağırlığı anladılır. "Şərəfli" peşə və "şərəfli" vəzifə ifadələri ilə şərəf etik kateqoriyasını açıqlayır. Məsdər tərkibli həmcins mübtədalı (keşiyində durmaq, insanların hüquqlarını qorumaq, cəmiyyətdə qanun-qaydanın saxlanmasını təmin etmək və insanların rahat yaşamasına xidmət etmək) zəngin cümlə ilə bu şərəfli vəzifə tərkib hissələrinə ayrılır. Azərbaycanda hüquqi etikanın təmin olunduğu real vəziyyət sonda bitkin bir cümlə ilə yekunlaşır: "Hüquq-mühafizə orqanlarının əməkdaşları çox ağır bir peşə sahibləridir. Bu sahədə işə başlayan ***hər bir*** adam dərk etməlidir ki, bütün başqa sahələrə nisbətən öz üzərinə ağır bir iş götürür. Amma eyni zamanda, bu peşə həm də ***şərəfli*** peşədir. Dövlətçiliyin ***keşiyində durmaq, insanların hüquqlarını qorumaq, cəmiyyətdə qanun-qaydanın saxlanmasını təmin etmək və insanların rahat yaşamasına xidmət etmək*** – bu, çox ***şərəfli*** vəzifədir. Mən bu gün məmnuniyyətlə qeyd edirəm ki, Azərbaycanın hüquq-mühafizə orqanları bu vəzifələrini uğurla yerinə yetirirlər. Son beş ildə Azərbaycanda gedən proseslər, əldə olunmuş ictimai-siyasi sabitlik, cinayətkarlığın qarşısının sürətlə alınması – bunlar hamısı bizim böyük nailiyyətlərimizdir və bu nailiyyətlərin əldə edilməsində də hüquq-mühafizə orqanlarının hamısının, o cümlədən Azər-

baycan prokurorluğunun xidmətləri böyükdür" [XVIIIc.s.286-287].

İnsan haqları anlayışı ilə üzvi bağlılıqda olan ləyaqət, azadlıq, bərabərlik, dövlət, ictimai münasibət kimi mühüm əhəmiyyət kəsb edən dəyərlər sosial varlıq olaraq insanın unikallığını şərtləndirir, onu toplum şəklində yaşayıb fəaliyyət göstərən digər canlılardan fərqləndirir [59, 89, 141, 143, 144, 146, 203].

Heydər Əliyevin nitqlərində işin icrasının əsasən gələcək zamanda vacib olduğunu göstərən feilin lazım şəkli işlənir. Feilin bu şəkli nitqdə təkrarlanaraq auditoriyanı gələcək günlərə hazırlayır, qətiyyətlilik ovqatı yaradır: "Ona görə də siz özünüz son illərdə sizin orqanlarda gedən prosesləri obyektiv, doğru-düzgün təhlil ***etməlisiniz***, sizi ləkələyən, işinizə maneçilik törədən, peşə sahənizə zərər vuran bütün hallardan xilas ***olmalısınız***, onları ***kənarlaşdırmalısınız***. Daxili İşlər Nazirliyinin tərkibində, onun şəxsi heyətinin tərkibində, birinci növbədə rəhbər işçilərin fəaliyyətində mənəvi dəyərləri ***möhkəmləndirməlisiniz***, inkişaf ***etdirməlisiniz*** və beləliklə də, Daxili İşlər Nazirliyinin bütün sistemlərində, yuxarıdan aşağıya qədər – nazirliyin rəhbərliyindən polis nəfərinə qədər sağlam əhval-ruhiyyə, sağlam mənəviyyat ***yaratmalısınız***" [Ic.s.143].

Münaqişələrin mövcudluğu, növündən asılı olmayaraq hüquqi pozğunluğa gətirib çıxarır. Bu isə özlüyündə hüquqi etika baxımından qəbuledilməzdir. Hüquqi etika qəbul olunmuş qərarlara, prinsiplərə ciddi riayət etməklə yanaşı sayğı tələb edir: "Müstəqillik dövründə respublikamızın qarşılaşdığı ən ağır problemlərdən biri – Ermənistan-Azərbaycan münaqişəsi hələ də qalmaqda davam edir. Qonşu respublikanın hərbi təcavüzü ölkəmizə çox böyük fəlakətlər gətirmiş, ərazimizin 20 faizi işğal olunmuşdur. Bununla belə, biz məsələnin sülh yolu ilə həllinə çalışırıq. Bu isə yalnız ATƏT-in Lissabon zirvə görüşündə qəbul edilmiş prinsiplər əsasında

olmalıdır. ***Təcavüzkar*** Ermənistan isə bu prinsipləri, habelə Minsk qrupu həmsədrlərinin son təkliflərini qəbul etməkdən ***boyun qaçırır*** *”* [XVIIc.s.127]. Bu kiçik mətndə beynəlxalq təşkilatların qəbul etdiyi və hər bir ölkənin həm hüquqi, həm də etik cəhətdən əməl etməli olduğu prinsiplərdən bəhs edilir. “Boyun qaçırır” frazeoloji birləşmədən yerindəcə yararlanaraq “təcavüzkar” ifadəsi ilə sərt mövqe nümayiş etdirir.

Hüquqi etikadan danışmazdan öncə Heydər Əliyev hüququn nə olduğunu auditoriyaya anladır. Qadın hüququna qarşı yönələn ədalətsizlikdən (qadın zülm, əziyyət çəkib, ana olub, övlad böyüdüb, kişisinə xidmət edib, ailəsini, elini-obasını saxlayıbdır, çox hüquqlardan məhrum olubdur) danışır. “Azad, sərbəst” olmağın elə hüquqa bərabər tutulduğu dilə gətirilir. Dövlət başçısının nitqində bu hüququn “seçmək və seçilmək” anlamında olduğu bəyan edilir: “Amma əslində isə belə olmayıbdır. Azərbaycan qadını ***zülm, əziyyət çəkib, ana olub övlad böyüdüb, kişisinə xidmət edib, ailəsini, elini-obasını saxlayıbdır***, çox hüquqlardan məhrum olubdur. 1918-1919-cu illərdə Azərbaycan Xalq Cümhuriyyəti dövründə Azərbaycan qadınına tarixdə ilk dəfə hüquqlar – ***seçmək və seçilmək hüququ*** verilibdir. Sonrakı dövrdə, 1920-ci ildən başlayaraq, Azərbaycan qadınının həyatında tarixi nöqteyi-nəzərdən qısa bir zamanda böyük hadisələr baş veribdir. Qadın çadranı atıb, ***azad, sərbəst*** olub, cəmiyyətdə bərabər hüquqlara malik olub, öz istedadını göstərə bilib və cəmiyyətdə özünəməxsus yer tutubdur, öz daxili və zahiri gözəlliyini dünyaya nümayiş etdiribdir [XVIIc.s.307-308].

Hüquqi etika ilə dostluq etik kateqoriyası arasındakı əlaqə aşağıdakı mətndə verilmişdir: “Gürcüstan-Azərbaycan dostluğunun ən gözəl xüsusiyyətlərindən biri də ***odur ki,*** Gürcüstanda yaşayan azərbaycanlılar öz doğma vətənlərində, torpaqlarında yaşayırlar və Gürcüstanın bərabər hüquqlu vətəndaşlarıdır, Azərbaycanda yaşayan gürcülər öz doğma vətən-

lərində, torpaqlarında yaşayırlar və Azərbaycanın bərabər hüquqlu vətəndaşlarıdır. ***Həm*** Gürcüstanda yaşayan azərbaycanlılar, ***həm də*** Azərbaycanda yaşayan gürcülər Gürcüstan-Azərbaycan dostluğunun möhkəmlənməsində böyük xidmətlər göstərirlər. Bu gün fürsətdən istifadə edərək mən onlara minnətdarlığımı və təşəkkürümü bildirirəm" [XVIIIc.s.6]. Göründüyü kimi xəbər budaq cümləsinin (odur ki) köməyi ilə vətəndaşın hüququnu açıqlayır, bu zaman vətəndaşın milli mənsubiyyətinin nəzərə alınması, onların bərabər hüquqlu vətəndaş olması fikrinə diqqət yetirir. "Həm", "həm də" iştirak bağlayıcılarının köməyilə Azərbaycan və Gürcüstan ərazisində yaşayan vətəndaşların hamısının bərabər hüququnu dilə gətirir.

Gerçəkliyə münasibətdə "şübhəsiz ki" qəti təsdiq modal sözü ilə hüquqi etikanın formalaşmasında rolu olan prokurorluq orqanlarının "yüksək intellekt" tələb edən işini incələyir. "Ancaq" ziddiyyət bağlayıcısı ilə bu sahənin hansı keyfiyyətlərə malik olmasını "yüksək" ifadəsinin təkrarı ilə həyata keçirir: "Prokuror olmaq, ***şübhəsiz*** *ki,* böyük intellekt tələb edir. Hüquq-mühafizə orqanlarının cürbəcür təşkilatları vardır, hər təşkilatın özünəməxsus xüsusiyyəti vardır. Ancaq prokurorluq işi ***yüksək*** intellekt tələb edən işdir, ***yüksək*** peşəkarlıq tələb edən işdir, ***yüksək*** hüquqi bilik, hüquqi təhsil tələb edən işdir. Biz bəzən özümüz-özümüzə lazımi qədər qiymət verə bilmirik. ***Ancaq*** deyə bilərəm ki, qısa bir dövrdə, son 30-40 il ərzində Azərbaycanda yüksək səviyyəli, peşəkar prokuror kadrları yetişibdir. Mən Azərbaycanda prokuror orqanlarını şəxsən 50 ildir ki, tanıyıram və müşahidə edirəm. Bəlkə ondan da bir az çox" [XVIIIc.s.286-287].

"Hesab edirəm ki" modal sözü ilə etik cəhətdən nümunə ola biləcək hüquq-mühafizə orqanları qarşısında feilin əmr şəkli ilə (gərək belə ünsürlərdən təmizlənsinlər) öhədlik qoyur. "Təsəvvür edin" ifadəsi ilə auditoriyanın diqqətini

prokurorluq orqanlarına verilən səlahiyyətə yönəldir. "Mənəviyyatca nə qədər saf olmalıdır" ifadəsi hüquq-mühafizə orqanlarının hüquqa, haqqa nə qədər sayğı göstərməli olduğunu anladır. Anlatmaq azdır! Dövlət rəhbərinin dilində bu bir tələb kimi səslənir: "Mən hesab edirəm ki, indi müstəqil Azərbaycanda hüquq-mühafizə orqanları gərək belə ünsürlərdən ***təmizlənsinlər***. Hüquq-mühafizə orqanlarına verilən səlahiyyət heç bir başqa dövlət orqanına verilmir. Hüquq-mühafizə orqanlarının içərisində isə prokurorların ən çox, ən yüksək səlahiyyəti vardır. ***Təsəvvür edin***, prokuror vətəndaşın həbs olunması üçün qərar qəbul edir. Bunu ancaq prokuror edə bilər. Ancaq, birincisi, prokuror həmişə çalışmalıdır ki, bu qərar əsaslı olsun, ədalətli və düzgün olsun. İkincisi, əgər prokuror belə bir yüksək səlahiyyətə malikdirsə, əgər prokurora bu qədər böyük etimad göstərilirsə, prokuror nə qədər məsuliyyətli olmalıdır və ***mənəviyyatca nə qədər saf olmalıdır*** [XVIIIc.s.289].

Prokurorluq işçiləri qarşısında söylənilən publisistik-məişət üslublu nitq hüquqi etikanın tərkib hissələrini auditoriyaya bəyan edir. İnsanların, vətəndaşların hüququnun qorunmasına məsul olan prokurorluq peşəsinin "hörmətli" və "şərəfli" olduğu diqqətə çatdırılır. Bu zaman xalqın qədim ənənələrindən – etik dünyagörüşündən istifadə olunur.

"Hər bir" işçi qarşısında feilin əmr şəklində səslənən "öz peşəsinin hörmətini yüksək saxlasın", "öz peşəsinin adını qorusun" ifadələri ilə həm arzu, həm də tələb olunur. "Arzu edirəm ki" ifadəsini təkrarlamaqla səmimiyyət dolu nitq nümunəsi yaradır. Belə səmimi nitqlər qarşı tərəfi əxlaqi dəyərlərə hörmətə səsləyir. Qüvvətləndirici "ən" ədatı ilə etik dəyərlərin sinonimi olan "hörmətli", "layiqli" ifadələri işə düşür. Sonda isə "Azərbaycanın dövlətçiliyinə sadiq olmalıdır" cümləsi etik dəyərlərin dövlət tərəfindən qorunmasını prinsipial şəkildə ortaya qoyur: "Prokurorluq peşəsi ***hörmətli***

peşədir. Hörmətli, ***şərəfli*** peşədir. Müstəqil dövlət kimi Azərbaycan keçmiş tarixindən, ənənələrindən istifadə edərək yeni dövlət quruculuğu prosesini həyata keçirir. O cümlədən, müstəqil Azərbaycanın prokurorluğu yaranır və inkişaf edir. Bu orqanın inkişaf etməsində xidmət göstərən hər bir Azərbaycan vətəndaşı şərəfli iş görür. Mən ***arzu edirəm ki***, ***hər bir*** prokurorluq işçisi öz peşəsinin hörmətini yüksək saxlasın, öz peşəsinin adını qorusun. O, öz peşəsinin adını qoruyaraq öz şəxsi adını qoruyacaqdır. ***Arzu edirəm ki***, müstəqil Azərbaycanın prokurorluğu və hər bir prokuroru cəmiyyətdə ***ən*** hörmətli, ***ən*** layiqli adam sayılsın. Bunun üçün böyük imkanlar var. Mən qeyd etdim, artıq Azərbaycanda güclü, yüksək səviyyəli prokuror kadrları korpusu yaranıbdır. Bu kadrlardan səmərəli istifadə etmək lazımdır. Hər bir prokurorluq işçisi də öz peşəsinə sadiq olmalıdır, müstəqil Azərbaycanın dövlətçiliyinə sadiq olmalıdır" [XVIIIc.s.293].

Hüquqi etikaya söykənməli olan hüquq mühafizə sistemi işçilərinin "iqtisadi sahəyə əsassız müdaxilələri" Ulu Öndər tərəfindən ciddi şəkildə tənqid olunur. Aşağıdakı mətndə rüşvətxorluğun hansı antietik dəyərə malik olması üzə çıxarılır: "Ayrı-ayrı dövlət orqanları tərəfindən ***iqtisadi sahəyə əsassız müdaxilələr*** narahatçılıq doğurur. Həmin dövlət orqanlarının bəzi işçiləri öz qanunsuz hərəkətləri ilə dövlətin nüfuzuna xələl gətirir və bir çox hallarda öz hüquqlarından şəxsi mənafeləri üçün istifadə edirlər.

Daxil olan məlumatlara əsasən yoxlamalar zamanı həmin orqanların işçiləri ayrı-ayrı hallarda vəzifədən sui-istifadə etmə və rüşvətxorluq hallarına yol verirlər.

Hüquqi şəxslərin qeydiyyatı və lisenziyalaşdırma sahəsində də süni maneələr mövcuddur. Sahibkarlıq fəaliyyəti ilə məşğul olan hüquqi şəxslərin qeydiyyatı və lisenziyalaşdırma sahəsində də süründürməçilik, qanunsuz imtinalara və sui-istifadəyə yol verilir" [XIXc.s.9-10].

İnsan haqları və azadlıq ideyası İslam dəyərlərində də öz əksini tapmışdır. Müqəddəs kitabımız Quranda və Məhəmməd peyğəmbərin kəlamlarında vicdan azadlığı (Dində məcburiyyət yoxdur. 2-ci ayə, 256-cı surə), şəxsi təhlükəsizlik ("Nəbadə özgənin evinə, sahibinə salamsız, icazəsiz girəsiniz". 24-cü ayə, 27-ci surə), sosial təminat və xalq hakimiyyətinin formalaşması haqqında fikirlər öz əksini tapmışdır [59]. "İnsan gərək sərbəst olsun, insan gərək öz fikri ilə azad olsun" şəxsi fikrin zorla dəyişməməsi elə yaradıcılıq imkanlarının genişliyinə işarədir. Professor V.A.Kanke [156] "Müasir etika"da yazırdı ki, azadlıq və ədalətə gəlincə onlar ciddi desək prinsip yox, dəyərlərdir. Cəmiyyətlərdə azadlıq nə qədər çox olduqca insanların yaradıcılıqlarını üzə çıxarmaq da bir o qədər çox olacaq. Məhz İslamda və müasir etiklərin fikirlərində əksini tapan ideyaları özünəməxsus Heydər Əliyev nitqində görürük: "***İnsan gərək sərbəst olsun, insan gərək öz fikri ilə azad olsun***. Biz bu azadlıqların, sərbəstliklərin hamısını Konstitusiyada elan etmişik. Prezident kimi, mən bunları təmin edirəm. Ona görə də insanın hüququnu, şəxsi fikrini zorla dəyişdirmək olmaz" [XXIc.s.316].

Siyasət və etika harmoniya təşkil edən anlayışlardır [135, 136]. Siyasət, Heydər Əliyevin dilində, əməlində öz yüksək əxlaqi dəyərini alır. "Hər bir siyasi liderin apardığı siyasət onun şəxsiyyəti ilə uzlaşır" prinsipi ortaya qoyulur. Heydər Əliyevin siyasi xətti bu gün səmimiyyətə söykənən və sabah həyatda özünü doğruldan siyasətdir. "Bax" qüvvətləndirici ədatı ilə "qəlbimdə olan bu sözləri sizə deyirəm" səmimi ifadə auditoriyanı natiqi dinləməyə ürəkdən sövq edir.

"Bəyan edirəm ki" ifadəsini eşidən auditoriya məsələnin ciddiliyini anlayır, "təəssüf ki" modal sözü ilə nitqini "hələ yumurtasından çıxmamış bir cücə kimi" frazeoloji birləşməsi ilə birləşdirir, "təəssüfün" sinonimi kimi "məni yandıran da budur" ifadəsini işlədir, feili sifətlərlə – "görməyən", "bil-

məyən", "böyük iddialarla yaşayan" – siyasətdə naşı olanlara cavab verir: "Güman edirəm ki, bəzən mənim şəxsi hissiyyatlarım haqqında sözlərimi də siz düzgün başa düşəcəksiniz. Çünki mən insanam. İnsan insana xas olan hər bir xüsusiyyətə malik olmalıdır. Bax, bu xüsusiyyətlərə görə də mən qəlbimdə olan bu sözləri sizə deyirəm.

Mən naxçıvanlıları, bütün Azərbaycan xalqını bu bayram münasibətilə bir daha təbrik edirəm. ***Bəyan edirəm ki***, Naxçıvan Muxtar Respublikasının muxtariyyət, dövlətçilik statusu daimidir, əbədidir.

***Təəssüf ki***, indi bəzi siyasətçilər meydana çıxıb, Azərbaycanda bir söz var – ***hələ yumurtasından çıxmamış bir cücə kimi*** bəyanatlar verirlər ki, "Azərbaycan unitar dövlətdir, burada muxtariyyət ola bilməz, bu muxtariyyəti ləğv etmək lazımdır". ***Məni yandıran da budur ki***, başa düşürsünüz, bunu edənlər naxçıvanlılardır. Mən həmin o cocuqlara – necə deyərlər, siyasətə qatılmış, amma siyasətin nə olduğunu görməyən, dövlətçiliyin nə olduğunu bilməyən, dövlət, idarə işində bir gün də işləməyərək böyük iddialarla yaşayan adamlara – hamısına cavab verirəm ki, Naxçıvanın muxtariyyəti tarixi hadisə olubdur. Bu, çətin bir dövrdə böyük bir mübarizənin nəticəsi olubdur" [XXIIc.s.248-249].

Azərbaycan respublikasının prokurorluq orqanlarının rəhbər işçiləri ilə görüşdə nitqdə sağlam mənəviyyatın hüquq-mühafizə sistemi əməkdaşları üçün "əsas meyar" olmasını böyük natiq auditoriyalara açıqlayır. Heydər Əliyevə görə partiya prinsipləri, partiya ideologiyası hüquqi etikanı təmin edə bilməzdi. İnsanların azadlığının təmini üçün Konstitusiyamızın mövcudluğunu ön plana çəkir: "Azərbaycan prokurorluğunda ciddi təmizləmə işi getməlidir. Azərbaycan prokurorluğunda sağlam mənəvi mühit yaratmaq lazımdır. ***Sağlam mənəviyyat*** hər bir prokurorluq işçisi üçün, qanun keşiyində duran bizim hər bir məmurumuz üçün ***əsas meyar***

olmalıdır. Əgər bu yoxdursa, o insan nə qədər yaxşı işləyirsə-işləsin, bizim tələblərimizə cavab verə bilməyəcəkdir. ***Bizim tələblərimiz isə qanundu, qanunun aliliyidir. Mənəviyyatın da hamısı qanunun içərisindədir***.

Keçmiş zamanlarda, sovet hakimiyyəti vaxtı biz sağlam mənəviyyat haqqında danışırdıq və bunu təmin etmək üçün çox işlər görürdük. ***Amma*** o vaxt bunu təmin etmək üçün qanuni əsaslar yox idi. Burada ancaq ***partiya prinsipləri, partiya ideologiyası*** var idi. İndi isə qanun, Azərbaycanın Konstitusiyası, müvafiq qanunları vardır. Bu qanunlar hər şeydən üstün olmalıdır" [XXVIc.s.414].

Hüquqi etikanın pozulmasına aid çıxışlarda böyük natiq loru leksikadan – "vəzifənin dadı", "qudurma", "çirkin üsullar" – istifadə edir. Məhz bu cür məişət üslublu nitq hüquqi etikanı pozanlara kəsərli cavabdır: "Lakin görünür ki, bizim bəzi yüksək vəzifəli şəxslərimiz vəzifə alandan, bu ***vəzifənin dadını*** bir az görəndən, bu vəzifəyə görə özünü bir balaca yüksək səviyyədə görəndən sonra onlarda başgicəllənmə xəstəliyi əmələ gəlir, bu çox kobud söz olsa da, mən bunu deyəcəyəm, – ***qudurma*** əmələ gəlir. Bu söz rus dilində daha incədir, ona "zaznaystvo" deyirlər, amma mən Azərbaycan dilində bu sözün "qudurma"dan savayı əvəzini tapa bilmirəm. İnsanlar qudururlar. O dərəcədə qudururlar ki, onlar artıq hesab edirlər ki, qanunu da poza bilərlər, müxtəlif ***çirkin üsullardan da*** istifadə edə bilərlər " [XXVIc.s.415].

"Azadlıq", "sərbəstlik" kimi hüquqi etik dəyərlər həyatımızın bütün sahələrindədir ki, mətbuata xüsusi fikir verilməlidir. Mətbuatda təsadüf edən antietik dəyərlərə – yalan, uydurma, böhtan – təəssüf edir, müxbirləri doğru-düzgün yola dəvət edir "Bunlar adi bir insana yaramayan şeydir. Bizdə indi mətbuat ***azadlığıdır***, qəzetlər tamamilə ***sərbəstdir***. Ancaq ***təəssüf*** ki, bəzi müxbirlər də bundan çox sui-istifadə edirlər, qəzetlər yalan, uydurma, böhtan xarakterli

məqalələr dərc edirlər. Qəzetlərin bu əhval-ruhiyyəsini görən dövlət adamları anlamalıdırlar ki, bu üsuldan istifadə etmək onlara xeyir gətirməz” [XXVIc.s.416].

Hüquqi etikanın qorunmalı olduğu hüquqi dövlətin təməl prinsiplərini elmi-publisistik üsulla auditoriyalara ünvanlayır. “Heç kəs daimi deyildir” ifadəsi auditoriyanı əxlaqi dəyərlərə qayıtmağa səsləyir. Əxlaqi dəyərləri nəzərə almaqla beynəlxalq hüququn mütərəqqi cəhətlərini qəbul etməyi mühüm hesab edir: “***Heç kəs daimi deyildir***. Amma hüquqi dövlət daimidir. Biz bu hüquqi dövləti, demokratik dövləti yaradırıq və onu pillə-pillə yüksəklərə qaldırırıq. Bunun da ən prinsipial bir hissəsi məhkəmə sistemində islahatların keçirilməsi, bütün məhkəmə sisteminin beynəlxalq hüquq normalarına uyğunlaşdırılmasıdır. Biz bir tərəfdən beynəlxalq hüquq normalarına uyğun olmaq, demokratik dövlət qurmaq, demokratik təşkilatlara, Avropa Şurasına daxil olmaq istəyirik. O biri tərəfdən də keçmiş Sovet İttifaqının prokurorluq sistemini özümüzdə saxlamaq istəyirik”.

Heydər Əliyevin çıxışlarında hüquqi və iqtisadi etik dəyərlər birgə səslənir. Etik dəyərlərlə şərtlənən azad, firavan həyatın əsasında iqtisadi cəhətdən güclü hüquqi dövlət dayanır. Hüquqi dövlətin qurulmasında dövlət və vətəndaş vəhdətini “hər bir” təyin əvəzliyi ilə ortaya qoyur. Feilin şərt şəklində nitqini quran böyük natiq sonda bu şərtləri aradan qaldıraraq əmr şəklinə keçir ki, bu bir daha qətiyyətli dövlət başçısının nitqindən xəbər verir: “Hər biriniz bilməlisiniz ki, əgər Azərbaycanda yaxşı yaşamalısınızsa, yaxşı yaşamaq ***istəyirsinizsə***, uşaqlarınızın, nəvələrinizin gələcəkdə firavan yaşamasını ***istəyirsinizsə***, ***arzulayırsınızsa***, ***gəlin***, bu dövləti, hüquqi dövləti birlikdə quraq. ***Gəlin***, iqtisadi siyasətimizi birlikdə həyata keçirək, özəl sektoru yaradaq. ***Gəlin***, bunları birlikdə edək [XXVIc.s.430-431].

Heydər Əliyevin Beynəlxalq Prokurorlar Assosiasiyası İctimai Komitəsindəki müraciəti sırf elmi üslubda hüquqi etikayla bağlı çıxışdır. "Müşahidələr onu deməyə əsas verir ki..." ifadəsi nitqin auditoriyalara olan çoxsaylı təsir güclərindən biri də natiqin müşahidəçiliyidir. Bu müşahidəçiliyin nəticəsi kimi böyük natiq son dövrlərdə cinayətlərin xarakterinin "ağırlaşmaslnı", törədilmə üsullarının "qəddarlaşmasını", cinayətkarların "amansızlaşmasını" qeyd edir. Hüquqi etika sahəsində dəyərlərin təhlükədə olmasından söhbət açır. Qloballaşma dövrünün etik dəyərləri ilə yanaşı antietik dəyərlərin də cəmiyyətə yol açdığını dilə gətirir: "Bəşər tarixi və müasir dünyada baş verən proseslər göstərir ki, cinayətkarlıq insan cəmiyyətinin mənəvi və əxlaqi dəyərlərinə böyük zərbə vuran, ictimai-siyasi sabitliyi pozan, dövlətin əsas dayaqlarını sarsıdan, cəmiyyətin tərəqqisinə təhlükə törədən sosial bəladır. İctimai-iqtisadi quruluşundan, inkişaf səviyyəsindən, mədəni və tarixi irsindən asılı olmayaraq, elə bir ölkə yoxdur ki, bu gün cinayətkarlıq problemləri ilə qarşılaşmasın. Müşahidələr onu deməyə əsas verir ki, törədilmiş cinayətlər getdikcə ağırlaşır, onların törədilmə üsulları ***qəddarlaşır***, cinayətkarların özləri isə ***amansızlaşırlar***.

Müasir inkişaf dövrü cinayətkarlığın qloballaşması ilə səciyyələnir. Belə ki, dünyada geniş vüsət almış inteqrasiya prosesləri transmilli mütəşəkkil cinayətkarlığın – terrorçuluq, korrupsiya, insan və silah alveri, narkobiznes, çirkli pulların yuyulması və digər bu kimi təhlükəli cinayətlərin yayılması ilə müşayiət olunur [XXXVIIIc.s.282-283].

Beləliklə, hüquqi etika ilə bağlı Heydər Əliyevin nitqlərində "qətiyyət" nitq ünsürü ilə yanaşı bütün üslubların çulğalaşdığı məlum olur.

## 1.2.3.Heydər Əliyevin nitqində iqtisadi etika

İqtisadi etika Heydər Əliyevin "Bakı Xəzər Bitkisel Yağ fabriki"nin açılışı mərasimindəki, İstanbulda Türkiyənin iş adamları ilə görüşdəki, Azərbaycan Sahibkarlar Assosiasiyası konfransında yerli sahibkarlarla görüşdəki, "Yoxslluğun azaldılması və iqtisadi inkişaf üzrə dövlət proqramı"nın təqdimatına həsr edilmiş ümummilli konfransdakı nitqləri əsasında araşdırılmışdır.

Bazar mühitində etik problemlərin təhlili əsas problemlərdəndir. Etik problemlər çağdaş dövrümüzdə həm biznes, həm də əxlaq sahəsində mühüm əhəmiyyət kəsb edir [67, 101, 157, 177, 196, 201, 204, 205]. Burada da xüsusi etik fəlsəfi kitablara yox, Ulu Öndərin nitqlərinə nəzər yetirmək kifayətdir. Gözəl bir üslubda, rəvan və səlis bir dillə sahibkarlar auditoriyasına yönələn nitqlər bu sıradandır.

Heydər Əliyevin nitqində iqtisadi məsələlər, bu məsələlərlə bağlı insan amilinin yeri və rolu, etik münasibətlər mübahisə doğurmayacaq dərəcədə zərgər dəqiqliyi ilə seçilməsilə fərqlənir. Bunun kökündə zənnimizcə, iqtisadi etikanı kitablardan oxuyan filosof alimlərdən, təsərrüfatla məşğul olmamış, "baş girləyən" siyasətçilərdən fərqli olaraq Heydər Əliyevin uzun illər partiya-təsərrüfat sistemindəki təcrübəsindən doğan ideyalar dayanır: "Torpağı paylamışıq. Torpağı paylamağımız çox gözəl nəticələr verir. Amma torpağı alan kəndlinin yüksək səviyyəli fermerə çevrilməsi üçün çox vaxt lazımdır. Onun gərək o qədər artıq vəsaiti, sərmayəsi toplansın ki... Ola bilər, bir il böyük xeyir götürsün, o biri il zərər çəksin. Bilirsiniz, bunlar hamısı mürəkkəb proseslərdir. Bunu da bilən yoxdur. Hətta kənddən çıxıb müxalifətdə olan adamlar da bilmirlər. Çünki onlar gedib pambıq tarlalarında işləməyiblər. Əgər pambıq tarlalarında işləsəydilər, o yolla

getməzdilər. O yola düşən adamlar ***baş girləyən*** adamlardır" [XXVIIc.s.88].

İqtisadiyyatın özünün inkişafında etikanin pozulması onun birtərəfliliyindədir [52, 161]. Məhz buna görə də Heydər Əliyev "qeyri-neft sektorunda çox böyük imkanlarımız vardır" deməklə hərtərəfli iqtisadi inkişafa nail olmaqdan danışır. Məntiqi ardıcıllıq iqtisadi sahədən bəhs edərkən də gözlənilir. Auditoriya "imkanlardan istifadə olunması" → "iqtisadiyyatın inkişafı" → "rifah halının yaxşılaşması" ardıcıllığını izləyir: "Ancaq eyni zamanda, Azərbaycanın ***qeyri-neft sektorunda çox böyük imkanlarımız vardır.*** Azad sektorda, iqtisadiyyatın neftə aid olmayan başqa sektorlarında böyük imkanlarımız vardır. Bu imkanların hamısından ***istifadə olunması*** və nəticədə ***iqtisadiyyatın inkişafının***, xalqın rifah halının yaxşılaşmasının təmin edilməsi bizim vəzifəmizdir. Sizə bildirmək istəyirəm ki, bunun üçün bizim real imkanlarımız da yaranıbdır. Biz indiyə qədər apardığımız işlər nəticəsində həm xeyli uğurlar əldə etmişik, həm də gələcək illər üçün çox tutarlı əsas yaratmışıq" [XLIIc.s.152-153].

Bakı şəhəri, Nizami rayonunda, 29 dekabr 1997-ci ildə "Bakı Xəzər Bitkisel Yağ" fabrikinin açılışı mərasimindəki nitqdə iqtisadi etikanın bir sıra məqamları açıqlanır. İqtisadiyyatdan danışan Heydər Əliyev "modernləşdirmək" neologizmini auditoriya üçün ümumişlək sözlərlə (yeniləşdirmək, dünya standartları səviyyəsinə qaldırmaq), eləcə də sinonimik cərgə ilə (xalq, cəmiyyət, bazar) izah edir. "Hesab edirəm ki" modal sözü ilə modernləşmənin mühüm əhəmiyyətini açılış mərasiminin iştirakçıları üçün açıqlayır: "Azərbaycanın iqtisadiyyatı yeni iqtisadi sistem yaradılması prosesindədir və bu proses çoxşaxəlidir. Həmin şaxələrdən biri də mövcud olan istehsal sahələrini ***modernləşdirməkdən***, ***yeniləşdirməkdən***, dünya standartları səviyyəsinə qaldırmaqdan və xalqın, cəmiyyətin, bazarın tələblərinə uyğun məhsul istehsal etməkdən

ibarətdir. Bu baxımdan 1960-cı illərdə yaranmış, Azərbaycanda sadəcə marqarin istehalı ilə məşğul olmuş zavodun yenidən qurulması və yüksək səviyyəli yağ məhsulları istehsalının təmin edilməsi təqdirəlayiq bir haldır. Mən bunu yüksək qiymətləndirirəm və bizim iqtisadi siyasətimizin həyata keçirilməsində bir hadisə hesab edirəm. ***Hesab edirəm ki***, bu, həyatın yeni tələblərinə uyğun istehsal sahələrinin yaranması və qurulması üçün gərəkli bir örnəkdir" [XIVc.s.29-30].

Postsovet məkanından ayrılmış müstəqil ölkənin − Azərbaycanın dövlət başçısı yeni sayılan iqtisadi terminlərlə (sərbəst iqtisadiyyat, təşəbbüskarlıq, bazar iqtisadiyyatı, sahibkarlıq) elmi üslubda auditoriya qarşısında iqtisad nəzəriyyəçisi kimi çıxış edir: "Bu onu göstərir ki, son illərdə bizim iqtisadiyyat sahəsində həyata keçirdiyimiz siyasət və tədbirlər öz nəticəsini verir. Bu onu göstərir ki, sərbəst iqtisadiyyat, təşəbbüskarlıq, bazar iqtisadiyyatı, sahibkarlıq sözləri sadəcə söz deyil, bunlar Azərbaycanın müasir həyatında artıq öz əməli yerini tapmış və bu yeni iqtisadiyyat prinsipləri respublikamızda bərqərar olmuşdur. Mən bunu yüksək qiymətləndirirəm. Hesab edirəm ki, "İntersun Holdinq" qrupunun fəaliyyəti bizim bu sahədə atdığımız addımların uğurlu nəticəsidir" [XIVc.s.30].

Yeni bazar iqtisadiyyatının bərqərar olduğu XX əsrin 90-cı illərində iqtisadi etikanın formalaşması [142, 163, 168, 170, 178, 183] baxımından Heydər Əliyevin nitqləri mühümdür. Müstəqilliyin ilk illərində qeyri-etik hərəkətlərin iqtisadiyyatda mövcudluğunu loru və yüksək kitab leksikası yolu ilə (qeyri-sağlam yollarla getmək vasitəsilə, qısa desək, fırıldaqçılıqla da işlər görülüb) auditoriyalara ünvanlayır. "Qanunsuz varlanıblar, para toplayıblar" ifadəsini türk iş adamlarına ünvanlayaraq az işlənən "para" sözünü yenidən dirçəldir, iş adamlarını öz dillərində düzgün yola dəvət edir.

Böyük natiq iqtisadi etikadan danışa-danışa hüquqi etikanı da, necə deyərlər, auditoriyanın yadına salır. "Biz artıq belə hallara yol verməyəcəyik" şəklində sərt bəyanat verir, iqtisadi etik dəyərlərin pozulduğu hər bir halda hüquqi dövlətin varlığından danışır. "Xəbərdarlıq edirəm ki", "əl çəkmək lazımdır" frazeologiyası ilə qətiyyətli nitq nümunəsi yaradır: "Respublikamızın və ölkəmizə bənzər respublikaların iqtisadiyyatında son illərdə gedən dəyişikliklərdə müsbət nəticələrlə yanaşı, ayrı-ayrı iş adamları, xarici şirklətlər, xarici iş adamları tərəfindən qanunları pozmaq və yaxud da qanunlardan kənar, ***qeyri-sağlam*** yollarla getmək vasitəsilə, qısa desək, ***fırıldaqçılıqla*** da işlər görülüb və belə işlər görmək cəhdi indi də vardır. Ola bilər, respublikamızda bu işlər yeni başlanan zaman Azərbaycanda bu cür niyyətlərlə, fikirlərlə iş görməyə başlayan insanlar, yaxud xaricdən ölkəmizə gəlmiş iş adamları müəyyən qədər buna müvəffəq olublar, ***qanunsuz varlanıblar, para toplayıblar***. Onlar belə işləri ilə həm iqtisadiyyatımıza, həm də cəmiyyətimizə çox zərər vurublar.

Bu hallar məlumdur. Ancaq indi hamı bilməlidir ki, ***biz artıq belə hallara yol verməyəcəyik.*** Bizim qanunlarımız, qərarlarımız, tələblərimiz belə halların aradan qaldırılmasını təmin edəcəkdir. Ona görə də mən "İntersun Holdinq" qrupunun işinin müvəffəqiyyətini, bunların birinci növbədə sağlam təməllər əsasında qurulduğunu qeyd edərək və gələcəkdə də belə davam edəcəyinə əmin olaraq, Azərbaycanda bütün başqa yollarla iş görmək istəyənlərə – həm respublikamızın vətəndaşlarına, həm də xarici ölkələrin vətəndaşlarına ***xəbərdarlıq edirəm ki***, o cür qanunsuz yollardan ***əl çəkmək lazımdır***" [XIVc.s.31-32].

"İnkişaf", "vicdan" etik kateqoriyalarının pul qazanmaq yolunda vacibliyini dilə gətirir. Feili bağlamaları məntiqi ardıcıllıqla düzərək (ticarət mərkəzinə baxarkən, malları

görərkən, söhbət edərkən, şahidi olarkən) dəyişilmiş iqtisadi mənzərəni auditoriyanın gözü qarşısında canlandırır. “Bax” əmr, “da” qüvvətləndirici ədatlarının köməyilə vətəndaşların rifahına yönələn iqtisadi islahatların xeyrini dilə gətirir: “Azərbaycanın indiki həyatı qanun çərçivəsində, insafla, vicdanla iş görüb pul qazanmaq, qazanc götürmək üçün çox əlverişli şərait yaradıblar. Bu şəraitdən istifadə etmək lazımdır. Əyri yollarla getmək lazım deyildir. Biz hamıya sərbəstlik vermişik. Biz bu gün “İntersun Holdinq” qrupunun Qələbə Meydanının yanında yaratdığı ticarət mərkəzinə ***baxarkən***, oradakı mağazaları, dükanları və onların içərisində dolu olan çoxçeşidli malları ***görərkən*** və o mağazaların sahibləri ilə ***söhbət edərkən***, onların əhval-ruhiyyəsinin şahidi olarkən bir daha hiss edirik ki, Azərbaycanın istimai, iqtisadi, ticarət həyatı nə qədər dəyişilibdir. ***Bax***, belə sağlam iş insanlara ***da***, yəni sahibkarlara ***da***, onların xidmətindən istifadə edən vətəndaşlara ***da*** xeyir gətirir” [XIVc.s.32].

Bir iqtisadi sistemdən digərinə keçid yeni etik dəyərlərlə yanaşı, təbii ki, antietik dəyərlər də yaradır. “...Vəziyyət necədir?” ritorik sualla sovet və postsovet iqtisadiyyatındakı etik dəyərləri müqayisə edir. Elə bu müqayisəni qarşı tərəfin dili ilə həyata keçirərək (deyir ki, yox müqayisə etmək mümkün deyil) auditoriyanı düşünməyə vadar edir. “Buna halal qazanc deyirlər” ifadəsi ilə halallığa aparan yolları açıqlayır. Elə bu çıxışında da Ulu Öndər texniki estetikanın imkanları ilə (iki yerdə “xarici görünüşü dəyişibdir) iqtisadi məsələləri çulğalaşdırır: “Bu gün mən gördüm ki, bu mağazanın sahibləri keçmişdə mağazada işləyənlərdən fərqlidirlər. Onların çoxu elə keçmişdə də mağazada işləyiblər. Mən onların birindən soruşdum ki, sən o vaxt da işləmisən, indi də işləyirsən, ***vəziyyət necədir***? ***Deyir ki, yox müqayisə etmək mümkün deyil***. Həmin insandır, o vaxt da ticarətdə işləyib, indi də işləyir. O vaxt dövlət ticarətində işləyərkən

bəzən məcburən oğurlayırmış, bəzən qiymətindən artıq, baha satırmış, ondan qazanırmış. Amma indi malın sərbəst, istədiyi kimi satır və ***halal qazanc*** götürür. ***Buna halal qazanc deyirlər***. Amma onun o vaxtkı qazancı o qədər də ***halal*** deyildi" [XIVc.s.38]. Gündəlik həyatımızda ümumişlək söz kimi "halallıq" geniş istifadə olunur. "Halallıq" sözü siyasi lider dilində bu gün iqtisadi etikanın əsas termininə çevrilir. Bu kateqoriya Heydər Əliyevin dilində: "Dünyada hər şey ***halallıq*** istəyir, ***təmizlik***, ***düzlük*** istəyir. Keçmişdə bizim Azərbaycanda da böyük sənətkarlar, böyük mülk sahiblərinin əksəriyyəti – deyə bilərəm hamısı – ***halal*** yolla, ***halal*** qazandığı pulla mülk sahibi olub, sahibkar olub" [VIIc.s.230] kimi səslənirsə, görkəmli Azərbaycan şairi Nizaminin də yaradıcılığında:

"Çörək qazanıram mən, götürmə babalımı,
Min harama dəyişməm birgünlük ***halalımı***" [107,s.118]

kimi qiymətini alır.

"Dəfələrlə" ifadəsi, "yalnız və yalnız" təkrarı ilə auditoriyanın diqqətini iqtisadi məsələlərin həlli yolunda Azərbaycan dövlətinin prinsipial mövqeyini əks etdirir. "Böyük kompleks" adlandırdığı bazar iqtisadiyyatını "həm", "həm də" iştirak baglayıcılarının köməyilə tərkib hissələrinə ayırır. Bu kompleksi təşkil edən prosesin hüquqi sənədlər əsasında həyata keçirilməsini anladır. "Üçün" qoşmasının təkrarlanması ilə iqtisadi sahədə dövlətin nə etməli olduğu diqqətə çatdırılır. Qabağa düşüb bazar iqtisadiyyatına kömək edənlərə "geniş meydan", "geniş yol açılmalıdır" frazeoloji birləşmələri ilə dəstək verilməsini gündəmə gətirir: "Biz bir neçə ildir ki, bazar iqtisadiyyatını təbliğ edirik, onu Azərbaycanda tətbiq edirik. ***Dəfələrlə*** demişik və bu gün, 1998-ci ilin ilk günlərində bir daha bildirmək istəyirəm ki, iqtisadiyyatımızın bütün sahələrində gələcək yolumuz yalnız və yalnız onu bazar iqtisadiyyatı yolu ilə aparmaqdan, bazar iqtisadiyyatının prinsiplərini Azərbaycanın həyatında tam bərqərar etməkdən

ibarətdir. Mən çox məmnunam ki, bazar iqtisadiyyatı böyük bir kompleksdir. Burada ***həm*** sahibkarlıq, ***həm*** təşəbbüskarlıq bu prosesdə ardıcıl surətdə həyata keçirilir, öz nəticələrini verir. Bazar iqtisadiyyatı ***həm də*** özəlləşdirmə, ***həm*** xarici sərmayənin gəlməsi, ***həm*** ayrı-ayrı vətəndaşların öz sərmayəsindən, imnkanlarından istifadə etməsi – hamısı ***böyük kompleks*** təşkil edən bir prosesdir. Azərbaycanda bu proses respublikamızın Konstitusiyası əsasında, qəbul etdiyimiz qanunlar əsasında, Azərbaycan prezidentinin bu sahədə verdiyi fərmanların, qərarların ***əsasında***, bir də bizim bu sahədə əməli fəaliyyətimiz nəticəsində həyata keçirilir. Azərbaycanda bazar iqtisadiyyatını tətbiq etmək ***üçün,*** yaratmaq ***üçün***, inkişaf etdirmək ***üçün*** çox iş görmək lazımdır. Biz bu işlərin hamısını görürük və indi bazar iqtisadiyyatı ***üçün geniş meydan, geniş yollar*** açılıbdır. Kim bu işdə bacarıqlıdırsa, kim bu işi bacarırsa, o, irəliyə düşüb, gedib və biz də onu alqışlayırıq. Buna heç vaxt mane olmağa qoy***ma***rıq. Əksinə, belə təşəbbüskarlara, belə sahibkarlara biz həmişə kömək etmişik və kömək edəcəyik" [XIVc.s.58].

İstanbulda, "Ceylan İnterkontinental" otelində, 14 fevral 1998-ci ildə Türkiyənin iş adamları ilə görüşdəki çıxışda iqtisadiyyatla bağlı Heydər Əliyev sahibkarlıq və sərbəstlik terminlərini heç də təsadüfi olaraq birgə işlətmir. İqtisadi etikanın, hüquqi etikanın mühüm tərəfi elə azadlıqdır, sərbəstlikdir müddəasını "investisiya", "sərmayə" sinonim terminlərini işlətməklə, "bir, iki, üç il" miqdar sayları ilə çulgalaşdıraraq izahedici nitq nümunəsi yaradır: "Azərbaycan dövlət müstəqillyini əldə edəndən sonra həyatının bütün sahələrində ciddi dəyişikliklər edir. Azərbaycanda demokratik, hüquqi, dünyəvi dövlət qurulur. Azərbaycan keçmiş iqtisadiyyatı pozaraq öz iqtisadiyyatını bazar iqtisadiyyatı prinsipləri üzərində qurur. Azərbaycanda ***sahibkarlığa***, ***sərbəstliyə*** böyük yer verilibdir. Azərbaycanda iqtisadi

islahatlar həyata keçirilir. Azərbaycanın xarici ticarəti tamamilə liberallaşdırılıbdır və ölkəmizə xaricdən ***investisiya***, ***sərmayə*** gəlməsi üçün böyük imkanlar yaranıbdır. Bunun üçün çox dəyərli qanunlar qəbul olunubdur və bundan sonra da qəbul ediləcəkdir. Bu işləri görmək üçün ***bir, iki, üç il*** yetərli deyildir. Türkiyənin tarixinə nəzər salsaq, o bugünkü gününə qədər ***70*** ildən artıq bir yol keçibdir. Əgər bu yolun birinci hissəsində o qədər də inkişaf olmayıbsa, son hissəsində inkişaf edibdir" [XIVc.s.267-268].

Reallığı təbii qəbul edən lider-natiq bunu əsrarəngiz nitqində tam səmimiyyətlə açıqlaya bilir. Ritorik sualla – Nə üçün sürətlə edə bilirik? –"Çünki" səbəb bağlayıcısı ilə, "birincisi" və "ikincisi" modallarla "inana bilmişik" və "inandıra bilmişik" ifadələri ilə sərbəst, "xalqın rifahına yönələn" bazar iqtisadiyyatını şüurlara çatdırır: "Əgər insan – hesab edin ki, bir ayaqqabı tikən, yaxud çarıq tikən 70 il bir istiqamətdə tikibsə, indi elə etmək lazımdır ki, əks istiqamətdə tiksin. Amma 70 il bu adamın əli belə öyrənibdir, bunu əks tərəfə öyrətmək asan deyildir. Amma biz bunu çox sürətlə edirik. ***Nə üçün sürətlə edə bilirik? Çünki, birincisi***, bizim buna istəyimiz var. Biz ***inanmışıq*** ki, bazar iqtisadiyyatını, yeni iqtisadi sistemi, yəni inkişaf etmiş dövlətlərin iqtisadiyyatında olan təcrübəni tətbiq etmək lazımdır. ***İkincisi***, biz bu müddətdə insanları ***inandıra*** bilmişik ki, keçmişdə nə qədər nailiyyətlər əldə etmiş olsaq da, bizim böyük imkanlarımız xalqın rifahına yönəldilməyibdir. İndi isə biz bazar iqtisadiyyatını, sərbəst iqtisadiyyatı tətbiq edəndən sonra onun nəticələrini görürük" [XIVc.s.269].

"Yeni iqtisadiyyatın qurulması asan bir şey deyildir" müddəasını, qarşıdakı çətinlikləri bədii bir dillə, nikbin notlarla ifadə edərək bu siyasəti həyata keçirəcək insanlara müraciət edir. "Əsas odur ki" xəbər budaq cümləli tabeli mürəkkəb cümlədə indiki və gələcək zamanları (gedirik və

gedəcəyik) uzlaşdırır: "Ancaq bilirsiniz, hesab edin ki, biz böyük bir cığır içərisindəyik. Biz bu ***cığırı***, ***yolu*** açа-açа gedirik. ***Əlbəttə***, bu cığırı açanda qarşısına ***daş da, kəsək də, qaya da*** çıxacaq – bunlar olacaqdır. Bunlardan qorxmaq lazım deyil. Əsas odur ki, biz irəliyə ***gedirik*** və ***gedəcəyik***. Bizim əsas tərəfdaşımız Türkiyədir, Türkiyənin iş adamlarıdır. Mən Türkiyənin iş adamlarını Azərbaycana dəvət edirəm" [XIVc.s.273].

İqtisadiyyatla bağlı etik dəyərlər – təmizlik, düzlük, dürüstlük, halallıq – "əziz qardaşlar" səmimi ifadəsi ilə auditoriyaya üz tutur. Sadalanan dəyərlərin üstünlük təşkil etdiyi yolun çətinliyini dilə gətirir, insan, onun təbiəti barədə öz fəlsəfi fikirlərini bəyan edir. Feilin arzu, istək şəklində olan "haram şeylərə yol verməyək, hər işi halallıqla görək" ifadəsi ilə insanları düşünməyə vadar edir: "***Əziz qardaşlar***, bilin, mən Azərbaycanda ömrüm boyu ***təmizlik***, ***düzlük***, ***dürüstlük***, ***halallıq*** tərəfdarı olmuşam. Bu gün də Azərbaycanı bu yol ilə aparmaq istəyirəm. Bu, çətin bir yoldur. İnsanlarda pis işlərə meyl daha çoxdur, nəinki təmiz, yaxşı işlərə. Bu da təbiidir. İnsanın təbiəti belədir. ***Mən insanın təbiətini bilirəm***. Əziz dostum Süleyman bəy də, mən də həyatımızda çox şeylər görmüşük. İnsan təbiətini də bilirik. Ancaq bizim borcumuzdur ki, bu pis şeylərə, haram şeylərə yol verməyək, hər işi ***halallıqla*** edək" [XIVc.s.274].

Bir dövlət rəhbəri kimi sahibkarlar arasındakı sağlam rəqabəti sinonim cərgə ilə (çəkinməyin, uzaqlaşmayın, yaxınlaşın) dəstəklədiyini bəyan edir: "Ona görə də mən sizi bir daha Azərbaycana dəvət edirəm. ***Çəkinməyin***, Azərbaycandan ***uzaqlaşmayın***, Azərbaycana ***yaxınlaşın***. Mən o qədər istəyirəm ki, Azərbaycana türk şirkətləri qoy çox gəlsin, bir-biri ilə ***sağlam rəqabət*** aparsınlar. Kim daha da yaxşı iş görə bilər – o, iş görmək hüququ alsın. Mən bunların hamısını dəstəkləyəcəyəm" [XIVc.s.275].

Həyatın hansı sahəsindən söhbət açırsa açsın, milli təəssübkeşlik hissi Heydər Əliyev nitqlərinin ana xəttini təşkil edir desək yanılmarıq. "Mən belə müqayisələri xoşlamıram" cavabı ilə Azərbaycan, onun malik olduğu dəyərlər sistemini dilə gətirir. Neft müqavilələrinin reallaşmasının "sosial sahəyə ciddi surətdə öz təsirini göstərəcəyini", "həyat səviyyəsinin yaxşılaşacağını" yeni etik və estetik dəyərlərin özünə daha da çox yer tapacağını nəzərdə tutur: "Mən ***belə müqayisələri xoşlamıram***. Bir də ki, Küveyt yeganə layiqli nümunə deyildir. Neft layihəsi mərhələ-mərhələ həyata keçiriləcək və 30 il müddətinə nəzərdə tutulmuşdur. Bu müddətdə Azərbaycanın neft hasilatından götürəcəyi pay 185 milyard dollar olmalıdır. Yəni bizim indi başladığımız işlərin hamısı tezliklə Azərbaycanın iqtisadiyyatına, sosial sahəyə ciddi surətdə öz təsirini göstərəcək və şübhəsiz ki, insanların ***həyat səviyyəsinin kəskin şəkildə yaxşılaşmasına gətirib çıxaracaqdır"*** [XVc.s.159].

"Xalqın daha da yaxşı günlərə çıxması"nın nələrdən keçməsi ardıcıl olaraq sadalanır. Populist şüarlara çıxışında yer verməyən Heydər Əliyev "bir neçə il keçəcək" deməklə, "tam ümidvaram ki" ifadəsini işlətməklə optimist ovqat yaradır. "Güman edirəm ki" və "əmin olun ki" modal sözlərlə firavan günlərə işarə edir: "Bilirsiniz ki, mənim həyatım gecə-gündüz işləməkdir, başqa bir şey yoxdur. İşləyirəm nə üçün – xalqımızı daha da yaxşı günlərə çıxarmaq üçün. ***Əmin olun ki***, ***xalqımız daha da yaxşı günlərə çıxacaqdır***. Bizim apardığımız iqtisadi siyasət, dünyanın böyük neft şirkətləri ilə imzaladığımız müqavilələr və ümumiyyətlə dünya iqtisadiyyatı ilə sıx inteqrasiya olmağımız, insanlara sərbəstlik verilməsi, sahibkarlığın, şəxsi mülkiyyətin yaranması respublikanın iqtisadi həyatını tamamilə dəyişdirir. Bunu özünüz görürsünüz. Ona görə də ***mən tam ümidvaram ki, bir neçə il keçəcək***, Azərbaycanın iqtisadi, sosial vəziyyəti çox

yaxşılaşacaqdır. Mənim də məqsədim ondan ibarətdir ki, birinci, buna nail olum, bunu təmin edim, ikinci də o günləri özümüz görək. ***Güman edirəm ki***, sizinlə birlikdə biz o günləri görəcəyik" [XVc.s.182].

Təsadüfi deyil ki, iqtisadi etika siyasi (açıq qapı siyasəti), hüquqi (qanunlar, fərmanlar) etika ilə birgə öyrənilir. Ölkə başçısı kimi Heydər Əliyevin qəbul etdiyi qanunlar, fərmanlar məhz iqtisadi yüksəlişə gətirib çıxarmalıdır: "Mən dedim ki, biz ***açıq qapı siyasəti*** aparırıq. İndi Azərbaycana çox investorlar gəlir və bunlar da təkcə neft və qaz sənayesinə yox, bir çox başqa sahələrə də gəlirlər. Biz onların gəlməsi və Azərbaycanda fəaliyyət göstərməsi üçün bütün imkanları yaratmışıq. Birinci növbədə bizim qəbul etdiyimiz ***qanunlar*** onlar üçün əlverişli şərait yaradıbdır. Bu qanunlardan əlavə, mən bir çox ***fərmanlar*** vermişəm. Bundan sonra da lazım olan şərait yaradılacaq ki, Azərbaycana xarici investisiya axını daha da güclənsin. Hər halda, bu gün mövcud olan vəziyyət, hesab edirəm ki, bizdə böyük məmnuniyyət hissi doğurmalıdır" [XVc.s.410].

"Sahibkarlara göstərilən yardım, diqqət" o deməkdir ki, sabahkı gün onlardan iqtisadi etik dəyərləri tələb etmək mümkün olsun. Heydər Əliyev məhz bu prizmadan çıxış edirdi. İqtisadi və demokratik proseslərin eyni vaxtda getməsi, inkişaf etmiş ölkələrin "necə ilə bugünkü səviyyəyə çatmaları" barəsində verilən ritorik suallar mahiyyəti açmağa kömək edir: "Mən bu gün bəyan edirəm ki, özəlləşdirmə, iqtisadi islahatların, torpaq islahatının həyata keçirilməsi, insanlara sərbəstlik verilməsi, sahibkarlara göstərilən yardım, diqqət, respublikamızda sahibkarlıq fəaliyyətinin günü-gündən inkişaf etməsi – bunlar hamısı Azərbaycanın iqtisadiyyatını daha da dirçəldəcək və yüksəklərə qaldıracaqdır" [XVc.s.411].

Heydər Əliyev üçün "ictimai-siyasi nöqteyi-nəzərdən", "iqtisadi nöqteyi-nəzərdən" yanaşaraq iqtisadi etikanı pozan-

lar qınaq, sonda isə qanun qarşısında cavab verməli olan subyektlər kimi tanıdılır. İqtisadi etikanın tələblərini yerinə yetirənlərə dövlət daim kömək edəcəkdir" müddəasını ortaya qoyur: "Keçmişdə belə idi ki, iş adamı bəzən gizli iqtisadiyyatla məşğul olurdu, onun öz çevrəsində bəzən hörməti olurdu, amma ictimaiyyətdə hörməti olmurdu. İndi dünya tamam başqa bir dünyadır, biz də başqa bir ölkədə yaşayırıq, yəni ***ictimai-siyasi nöqteyi-nəzərdən, iqtisadi nöqteyi-nəzərdən***. Sağlam iş görən hər bir iş adamı, sağlam iş görən hər bir özəl təşkilat, özəl şirkət hörmətə malikdir və biz onların fəaliyyət göstərməsi üçün, inkişaf etməsi üçün əlimizdən gələn köməyi etməliyik" [XVIIc.s.451].

"Şübhəsiz ki" qəti təsdiq modal sözü ilə "həll etməliyik" feilin lazım şəklini işə salaraq qətiyyətli nitq nümunəsi yaradır. İqtisadi situasiyanı dəqiq qiymətləndirən (orada yaşayış çətindir, torpaq azdır) böyük natiq satirik üslubu işə salır, kollektiv təsərrüfatın (kolxoz) hazır yeyənlərini sadalayır, kommunist sisteminin yaratdığı ierarxiyanin iç üzünü açır. "Özününkü olanda" ifadəsi ümumi mülkiyyət formasının yaşamağa qabil olmadığını "nə …nə" inkar bağlayıcıları ilə köhnə sistemdən bir şey qalmadığını bəyan edir: "Bununla yanaşı, şübhəsiz ki, biz iqtisadi məsələləri həll etməliyik. ***Şübhəsiz ki***, bu keçid dövründə insanların bir çoxunun vəziyyəti ağırdır, çətin bir dövr keçirirlər. Bu da təbiidir. Çünki Naxçıvan Muxtar Respublikasında dağ kəndləri var. Orada yaşayış çətindir, torpaq azdır. O vaxt məhsulun bir hissəsini ***kolxoz sədri***, bir hissəsini ***hesabdar***, bir hissəsini ***ferma müdiri*** yeyirdi, ***polis rəisi*** gəlirdi ki, mənim də payımı ver. Şübhəsiz ki, ***raykom katibinə*** də bir şey vermək lazım idi. Mən bunların hamısını bilirdim. Ona görə də dedim ki, həmin o xırda kəndlərdə torpaqları, mal-qaranı kəndliyə verin. ***Özününkü olanda*** o, torpağı yaxşı becərəcək, mal-qaranı bəsləyəcək, məhsul götürəcəkdir. Onun nə kolxoz

sədri, nə hesabdarı, nə ferma müdiri olacaqdır, polisin qarşısında da birtəhər dura bilər. İndi bunlar çox gözəl nəticələr veribdir [XXIIc.s.248].

Hadisələrə, ictimai-siyasi münasibətlərə fəlsəfi yanaşan Heydər Əliyev üçün dəyərlər mülkiyyət formasından asılı olmayaraq həmişə mövcuddur və olacaq: "***Mülkiyyət*** forması dəyişir. Əvvəl sosialist ***mülkiyyəti*** idi, hər şey dövlətin idi. Fabriklər, zavodlar işləyirdi, insanlar da hamısı işləyirdi, məvacib alırdılar və məvaciblə yaşayırdılar. Əksəriyyəti də yaxşı yaşayırdı. Kasıblar da vardı, amma əksəriyyəti də yaxşı yaşayırdı" [XXIc.s.88-89].

"Təbiidir ki" modal sözündən düşündürücü, fəlsəfi ideyaların auditoriyalara açıqlanması məqamlarında istifadə olunur ki, Heydər Əliyevin iqtisadi islahatların həyata keçirilməsi prosesindəki nitqində öz yerini tutur. Qəti gələcək zamanda işlətdiyi "irəliyə gedirik və gedəcəyik" ifadəsi ilə qətiyyət, "əmin ola bilərsiniz ki" ifadəsi ilə auditoriyada nikbinlik ruhu aşılayır. Aparılan bütün islahatların son nəticəsi isə "Azərbaycan xalqının rifah halının günü-gündən yaxşılaşdırılmasıdır" nəticəsinə gəlməsidir: "***Təbiidir ki***, iqtisadiyyatın bir qismi, xüsusən böyük istehsal müəssisələri, o cümlədən ağır sənayenin müəssisələri dövlət inhisarındadır. Ancaq o müəssisələr ki, dörd-beş il bundan öncə ağır vəziyyətdə idi, biz onların da daha güclü işləməsinə nail ola bilmişik.

Beləliklə, həm dövlət sektorunda olan sahələrin inkişaf etdirilməsi, yaxşı işləməsi üçün şərait yaradılması, həm də özəl sektorun güclənməsi, sahibkarlığa geniş imkanlar verilməsi, sahibkarlar təbəqəsinin yaranması, özəl sektora böyük imkanlar verilməsi, xarici ticarətin liberallaşdırılması – bütün bunlar hamısı həmin bu nəticələri verir" [XXIVc.s.58-59].

İqtisadiyyatda düzgün etik münasibətlərin təşəkkül tapması üçün sahibkarlığın inkişafı tələb kimi qarşıya qoyulur ki, bu sahədə Heydər Əliyevin xidmətləri onun nitqləri əsasında

araşdırılır. Sahibkarlığın inkişafının nəticələri məntiqi ardıcıllıqla auditoriyanın diqqətinə çatdırılır: yeni iş yerlərinin yaradılması → yeni məhsul növlərinin istehsalı→vergi ödəyicilərinin sayının artması→ əhalinin orta təbəqəsinin formalaşması→rifah halının yaxşılaşması: "Sahibkarlığın inkişafı ***yeni iş yerləri*** yaradır, istehlak bazarına ***yeni məhsul növü*** çıxarır, vergi ödəyicilərinin sayını artırır, iqtisadi islahatların sosial bazası kimi əhalinin orta təbəqəsi formalaşır. Digər tərəfdən sahibkarlığın inkişafı xarici investisiya axınını gücləndirir və ölkənin dünya iqtisadiyatına inteqrasiya olunmasını sürətləndirir. Azərbaycan dövləti sahibkarlığın sürətlə inkişaf etdirilməsini ölkədə iqtisadi və sosial problemlərin həllinin, cəmiyyətdə sabitliyin möhkəmləndirilməsinin mühüm amili hesab edir" [XXVc.s.239].

"Sahibkarların və iş adamlarının hüquq və mənafelərinin qorunması" ifadəsi ilə böyük natiq hüquqi etikanın iqtisadi etika ilə birgə inkişafına rəvac verir. Azərbaycan Sahibkarlar Assosiasiyasının çağırdığı konfransın işinə uğurlar arzulayaraq "inanıram ki" modal sözü ilə, "dəyərli fikirlər söylənləcək və sanballı təkliflər veriləcəkdir" ifadəsi ilə söz və məna zənginliyinə malik nitq nümunəsi yaradır: "Azərbaycan Sahibkarlar Assosiasiyası ictimai təşkilat kimi ölkədə sahibkarlığın inkişafına kömək sahəsində güclü dövlət siyasətinin gerçəkləşməsində, iqtisadi islahatların hüquqi bazasının təkmilləşdirilməsində, sahibkarların və iş adamlarının hüquq və qanuni mənafelərinin qorunmasında, ölkədə əhalinin hüquq mədəniyyətinin formalaşdırılmasında və işgüzar fəaliyyətinin gücləndirilməsində fəal rol oynamalıdır. ***İnanıram ki***, bu sahədə konfransda ***dəyərli fikirlər*** söylənləcək və ***sanballı təkliflər*** veriləcəkdir" [XXVc.s.240].

Ulu Öndər "həm də böyük siyasi üstünlüklər qazandırır" deməklə siyasi iradənin ortaya qoyulmasında, siyasi iradənin diktə olunmasında iqtisadi inkişafı əsas götürür. Heydər

Əliyev üçün xalqların zənginləşməsi, rifah hallarının yaxşılaşması etik və estetik dəyərlərin daha da güclənməsi anlamındadır: "Şübhə yoxdur ki, neft ehtiyatlarının işlənilməsi iqtisadi fayda ilə yanaşı, bizim xalqlarımıza ***həm də böyük siyasi üstünlüklər qazandırır***. Enerji resurslarının birgə hasilatı, dünya bazarlarına çıxmaq üçün neft və qaz kəmərlərinin çəkilməsi ölkələrimizin mənafeyini dünyanın çox inkişaf etmiş ölkələri ilə birləşdirəcək və regionun təhlükəsizliyinin, sabitliyinin və tərəqqisinin təminatçısına çevriləcəkdir" [XXVIc.s.152].

Yeni iqtisadi siyasətlə məşğul olan dövlət rəhbəri mütəmadi olaraq iş adamları ilə sahibkarlarla keçirdiyi görüşlərdə nisbi sinonim cərgələrlə (qanunlarımız, fərmanlarımız, sərəncamlarımız) sahibkarlığın inkişafına təkan verir: "Bu görüşün və bundan sonra keçiriləcək görüşün məqsədi ondan ibarətdir ki, biz bilavasitə iş adamlarından məlumat alaq ki, sahibkarlıq işi nə vəziyyətdədir, bizim ***qanunlarımız, fərmanlarımız, sərəncamlarımız*** Azərbaycanda sahibkarlığın inkişaf etdirilməsi üçün lazımi imkanlar yaradırmı, yoxsa yox. Əgər bu sahədə qanunvericilik nöqteyi-nəzərindən, yaxud da ki, icra orqanlarının qərarları ilə əlaqədar çətinliklər varsa, sizdən məlumat aldıqdan sonra biz müzakirə etməli və lazımi fərmanlar, sərəncamlar verməliyik" [XXXVIIIc.s.153].

"Bu bizi narahat edir" – cümləsi ilə fikrini yekunlaşdıran böyük natiq sahibkarlığa dəstək (sahibkarlara şərait yaratmaq, yardım etmək, onlara kömək etmək) və onlara olan maneçilik (müxtəlif maneələr törədirlər, yoxlamalar aparırlar, onların işlərinə müdaxilə edirlər) kimi antonimlərdən – ziddiyyətli fikirlərdən bacarıqla istifadə edir. "O qədər boğaza gəlirlər ki" frazeologizmi ilə onlara qarşı törədilən maneələrin şiddətini göstərir. Şərt budaq cümləli tabeli mürəkkəb cümlənin içində "əgər" şərt bağlayıcısı və nəticə bildirən "demək" modal sözü ilə situasiyanı aydınlaşdırır, "təəssuf ki" modal sözü ilə bu

hərəkətlərə münasibətini bildirir: "Ancaq son dövrün müşahidəsi onu göstərir ki, bizim həyata keçirdiyimiz tədbirlərə baxmayaraq, yenə də müxtəlif hökumət orqanları ***sahibkarlara şərait yaratmaq, yardım etmək, onlara kömək etmək*** əvəzinə, ***müxtəlif maneələr törədirlər, yoxlamalar aparırlar, onların işlərinə müdaxilə edirlər***, öz şəxsi mənafelərini təmin etmək istəyirlər. Bunlar da sahibkarlara mane olur. Hətta mənə deyirlər ki, bəzi sahibkarlar belə yoxlamalardan, müdaxilələrdən ***o qədər boğaza gəlirlər ki***, haqlı işlərini bağlayırlar. Sahibkar nə məqsədi daşıyır? O, iş görür ki, pul qazansın. Onun istəyi pul qazanmaqdır, işi isə cəmiyyətə fayda verməkdir. Sahibkar müəyyən məhsulun isteshalı ilə məşğul olur, demək, o məhsul cəmiyyətə lazımdır. Yaxud ticarətlə məşğul olur, cəmiyyətin yaxşı ticarətə ehtiyacı var. Başqa xidmət sahələri ilə məşğul olur. İnsanların buna da ehtiyacı var. ***Əgər*** sahibkar bu işlərlə məşğul olaraq qoyduğu sərmayəni çıxara və qazancı götürə bilmirsə, ***demək***, onun sahibkarlıqla məşğul olmasının mənası yoxdur. ***Təəssüf ki,*** bizə məlumatlar çatır ki, belə hallar var və az deyildir. Bu bizi narahat edir" [XXXVIIIc.s.154].

"Rica edirəm ki, ancaq bu barədə danışasınız" ifadəsinin müəllifi kimi Heydər Əliyev sahibkarlarla görüşdə səmimilik nümunəsi göstərərək, iştirakçıları da səmimiyyətə çağırır. "Amillər barədə açıq-aydin desin, heç kəs utanmasın, heç kəs çəkinməsin" deyimi doğru və düzgün danışmağa tələb kimi qarşıya qoyur. Doğruluq etik dəyərinin iqtisadi sahəylə əlaqəsini açıqlayır: "Beləliklə, mən istəyirəm ki, bizim bu görüşümüz açıq keçsin, sərbəst, rahat keçsin, heç kəs narahat olmasın. Azərbaycan prezidenti kimi, mənim məqsədim həmişə belə olubdur: biz Azərbaycanda iqtisadi siyasətimizin istiqamətini müəyyən edən kimi və bunun bazar iqtisadiyyatı istiqaməti olduğunu təyin etdiyimizə görə, Azərbaycanda

biznesin inkişafına daim fikir vermişəm və fikir verirəm" [XXXVIIIc.s.156].

Keçid dövrünün problemləri kimi hüquqi azadlıqların tam təşəkkül tapmaması, "ədalətsizlik" antietik dəyərin mövcudluğu, "birtəhər baş dolandırmaq" frazeoloji birləşmə ilə qeyri-normal iş şəraitini qiymətləndirir: "Bilirəm ki, bəzi *biznesmenlərin* şikayətləri var, öz aralarında deyirlər. Amma gəlib açıq demək istəmirlər. Bunun da səbəbi var. Çünki açıq deyəndə, hansı orqandan şikayət edibsə, o, təəssüflər olsun ki, ona qarşı daha da təzyiqlər edir, yaxud ***ədalətsiz*** hərəkətlər edir. Ona görə biznesmen fikirləşir ki, ***birtəhər başımı dolandırım***" [XXXVIIIc.s.159].

"Demək" yekunlaşdırıcı modal sözlə çıxılmaz vəziyyət yaradıldığını auditoriyanın diqqətinə çatdırır. "Təbiidir" modal sözünü iki yerdə işlədir. Birinci nitq məqamında "heç kəs işləməz" deməklə sahibkarlara haqq qazandırır. İkinci nitq məqamında isə "biz bu barədə lazımi ölçülər götürəcəyik" fikriylə dövlətin iqtisadi maraqlarının qorunmasına yönələn sərt mesajını göndərir: "Sahibkarların çoxları da mağazaları bağlayırlar, bu işlərindən imtina edirlər. Çünki məmurların bu cür müdaxiləsi, yoxlamalar mağazaları elə vəziyyətə salır ki, sahibkar nəinki qazanc əldə edə, hətta qoyduğu vəsaiti çıxara bilmir. ***Təbiidir***, belə halda ***heç kəs işləməz***. ***Demək***, son illərdə bizim böyük əzab-əziyyətlə yaratdığımız bu ticarət sistemi belə getsə dağılacaqdır. Bu çox narahatedici haldır. ***Təbiidir ki***, biz bu barədə ***lazımi ölçülər götürəcəyik"*** [XXXVIIIc.s.164].

"Qoy" əmr ədatı, feilin əmr şəklində işlənən "azad yaşasınlar", "azad işləsinlər", "ticarətlərini aparsınlar" ifadələri iqtisadi etikanın mühüm şərti olan "azadlığı" öndə saxlayır. Həmişə gümanları özünü doğruldan böyük natiq –"Guman edirəm, mən bu barədə lazımi konkret qərarı qəbul edəcəyəm" deməklə hüquqi etika ilə iqtisadi etika arasında dialektik

əlaqəni təsdiqləyir: “Biz ticarətə azadlıq vermişik. ***Qoy*** onlar ***azad yaşasınlar***, *azad işləsinlər, ticarətlərini aparsınlar*. Onlar böyük iş görürlər. Ancaq müxtəlif məmurlar, icra orqanları tərəfindən bunların qarşısı alınır. Ramiz Mehdiyev, mən sənə tapşırıq verirəm, sabah yoxla, Goranboy rayonunda həqiqətən belə bir vəziyyət varsa, mənə məruzə et. ***Güman edirəm, mən bu barədə lazımi konkret qərarı qəbul edəcəyəm***. Bunu ləngitmək lazım deyil” [XXXVIIIc.s.165].

İqtisadi etikanın ünsürlərini sadalayan Heydər Əliyev öncə “kim bacarıqlı çıxdı” deməklə etik dəyərlərin pozulması fikrini ortaya qoyur. Çünki hər bir etik dəyərlər daşıyıcısı bacarıqlı ola bilmir. Sonrakı mərhələdə uğurlardan, toplanan sərvətdən söhbət açılır. Sərvətin “dövriyyəyə buraxılması”, “zənginləşmə” mərhələlərindən sonra yenidən etik dəyərlərə qayıtmaq “millətinə, xalqına yaxşılıq etmək imkanı” şansının yaranması haqqında danışır: “İndi sərbəst iqtisadiyyatdır, bazar iqtisadiyyatıdır. ***Kim bacarıqlı çıxdı***, o, bazar iqtisadiyyatında uğur qazanacaqdır. Uğur qazanır, deməli, özünə sərvət toplayır. Sonra o sərvəti ***dövriyyəyə buraxır***, gəlir əldə edir, daha da ***zənginləşir***. Ondan sonra ***millətinə, xalqına yaxşılıq etmək imkanları*** yaranır. Ona görə də burada yaşayın. Bunun üçün mən sizə xeyir-dua verirəm. Azərbaycana qayıtmağa tələsməyin. Bilmirəm, Azərbaycandan xəbəriniz varmı?” [XLc.s.74]

“Cənab Heydər Əliyev, məsuliyyət tələb edin” ifadəsi böyük natiqin dilində məsuliyyət etikası anlayışına uyğun gəlir. Bazar iqtisadiyyatı, sərbəst iqtisadiyyat şəraitində məhdudlaşdırılması tələb olunan məsuliyyətə çağıran fikirlərin mövcudluğunda reallığı nəzərə alan Heydər Əliyev “nə edim, mən demokratiya, söz azadlığı elan etmişəm” ifadəsi ilə verilən sözü pozmağın etikadan kənar olduğuna işarədir: “Dünyada ***elə*** bir adam yoxdur ki, böyük siyasətdən, Kremldən, onun ən yüksək zirvəsindən ***uzaqlaşdırsınlar*** və sonra ***əzsinlər***, sonra isə yenidən gəlib Azərbaycan xalqının – buna

ehtiyac olduğuna görə – ***rəhbəri seçilsin***, prezidenti olsun. Mən həm sovet hakimiyyəti dövründə Azərbaycanın başçısı olmuşam, həm də müstəqil Azərbaycanın prezidentiyəm. Mənə hər yerdə hörmət edirlər. Mənə bəziləri deyirlər ki, ***"Cənab Heydər Əliyev, məsuliyyət tələb edin".*** Onlara deyirəm ki, nə edim, mən demokratiya, söz azadlığı elan etmişəm. Söz azadlığını kim necə başa düşürsə, o cür hərəkət edir. Mən onlara artıq düzəliş verə bilmərəm. İndi mənim aqibətim elədir ki, gördüyüm bu işlərin naminə, xalqa xidmətimi davam etdirmək naminə bütün böhtanlara dözürəm. Ancaq hər gün öz işimlə, əxlaqımla, öz mənəviyyatımla sübut edirəm ki, bu yalanların, uydurmaların heç biri mənə yapışmaz. Xalq heç vaxt bunlara inanmayıb və inanmır" [XLc.s.75].

"Yoxsulluğun azaldılması və iqtisadi inkişaf üzrə dövlət proqramı"nın təqdimatina həsr edilmiş ümummilli konfransda yoxsulluğun azaldılması yollarından danışarkən Ulu Öndər onu yaradan səbəbləri bir iqtisadçı kimi analiz etməklə yanaşı, yoxsulluğa siyasi-etik cəhətdən yanaşır. İqtisadiyyatın geridə qalması yoxsulluğun başlıca səbəblərindən biri kimi dəyərləndirilir. "Yoxsulluq, işlə təmin olunmamaq sonda rifah halının pisləşməsinə yeni etik dəyərlərin çatışmazlığına səbəb olur" müddəasını irəli sürən böyük natiq bazar iqtisadiyyatına keçmənin labüdlüyünü elmi-publisistik bir dillə auditoriyalara yönəldir: "Yoxsulluğun səbəbləri məlumdur. Dünyanın ayrı-ayrı ölkələrində bunun müxtəlif səbəbləri var. Bəzi qitələrdə elə ölkələr var ki, yoxsulluq, ola bilər, on illərlə mövcuddur. Bir çox ölkələrdə yoxsulluq son dövrdə, yəni İkinci dünya müharibəsindən sonra və xüsusən axırıncı onilliklərdə dünyada gedən proseslərlə əlaqədardır. Əgər bizim bölgəmizi, yəni Şərqi Avropa ölkələrini, keçmişdə Sovetlər İttifaqına daxil olmuş indiki müstəqil respublikaları, ölkələri götürsək, burada yoxsulluğun səbəbləri digər yerlərdən bir az fərqlidir, ancaq eyni zamanda tam aydındır. Bu, iqtisadiyyatın geridə

qalması və bunun nəticəsində ***insanların işlə təmin olunmaması və beləliklə, onların rifahının yaxşılaşdırılması üçün imkanlar yaradıla bilməməsi*** nəticəsində olmuşdur" [XLIIc.s.145].

"Bəli" təsdiq ədatı ilə bazar iqtisadiyyatı, sərbəst iqtisadiyyat yolunun "anlaşılmaz", "mürəkkəb" yol olduğunu göstərir. "İnsanların çoxu bu iqtisadi sistem şəraitində işləməyə öyrənməmişlər" ifadəsinin fəlsəfi izahı sahibkarlar auditoriyasına yönəlir: "Sizə məlumdur ki, bizim iqtisadiyyatımız, nəhayət, 1995-1996-cı illərdə tənəzzülə son qoymuşdur və ilbəil, ardıcıl surətdə inkişaf edir. İnkişafımızın da əsasları məlumdur. Birinci növbədə, bu, Azərbaycanın bazar iqtisadiyyatı yolu ilə getməsidir. ***Bəli***, bu yol bizim üçün yeni yoldur və çoxları üçün olduqca anlaşılmaz, mürəkkəb bir yoldur**.** ***İnsanların çoxu bu iqtisadi sistem şəraitində işləməyə öyrənməmişlər***. Ona görə də biz bir çox çətinliklərlə rastlaşdıq. Ancaq bazar iqtisadiyyatını tətbiq etmək üçün iqtisadi islahatların həyata keçirilməsi əsas şərt idi. Biz bunları başladıq, uğurla həyata keçirdik və indi də davam etdiririk" [XLIIc.s.147].

İqtisadi etika digər etikalarla – siyasi, hüquqi, ekoloji – semiotik əlaqədədir. Aşağıdakı mətndə qaçqınların sosial vəziyyətini yaxşılaşdırmaq üçün "76 milyon dollar ayırmışam" təsdiq cümləsində iqtisadi islahatların aparılması, bu işlərə dövlətin bilavasitə kömək və qayğısı nəticəsində pulların qazanılma mənbələri aydınlaşır. Təbii ki, yeni bazar iqtisadiyyatı prosesində iqtisadi etik dəyərlər pozulsa da, sonda toplanmış pullar siyasi etika baxımından öz düzgün, etik təyinatını tapır. "Ancaq" ziddiyyət bağlayıcısı ilə bizləri arxayınçılıq etməməyə çağırır: "Bildiyiniz kimi, Neft Fondundan indiyə kimi, ilk dəfə olaraq, mən qaçqınların sosial vəziyyətini yaxşılaşdırmaq, onlara yaşayış evləri tikmək üçün ***76 milyon dollar ayırmışam***. Dövlət büdcəmizə indi Milli

Məclisdə baxılır. Müəyyən miqdar vəsait də büdcəmizin kəsirini örtmək üçün ayrılacaqdır. ***Ancaq*** bizim Neft Fondunun gəlirləri artacaq, qarşıdakı bir neçə ildə orada milyardlarla dollar vəsait olacaqdır. Amma bu bizi heç vəchlə arxayın etməməlidir. Bu, Azərbaycanın iqtisadi vəziyyətinin təminatıdır" [XLIIc.s.152].

İqtisadi etika ilə bağlı Heydər Əliyevin fikirlərini aşağıdakı kimi qruplaşdırmaq olar:

– Bir sıra ifadələr: "iqtisadiyyatın inkişafı, xalqın rifah halının yaxşılaşması", "qanunsuz varlanma, para toplama", "halallıq, təmizlik, düzlük", "açıq qapı siyasəti", "həyat səviyyəsinin yaxşılaşması" – iqtisadi etikanı anlamaq baxımından tez-tez işlədilir;

– İqtisadiyyatın inkişafına əngəl yarandığı hallarda "xəbərdarlıq edirəm ki", "əl çəkmək lazımdır" kimi hüquqi etik terminlər nitqdə öz yerini alır.

Ulu Öndərin iqtisadi məsələlərlə bağlı keçirdiyi tədbirlər əsasında araşdırılmış iqtisadi etika məsələləri ümid edirik ki, gələcəkdə təfəkkür-dil vəhdəti əsasında daha da dərindən öyrəniləcək, Azərbaycan iqtisadiyyatının inkişafına xidmət göstərən iqtisadçılar üçün mühüm rəhbərliklərin hazırlanmasında ciddi addım olacaq.

## 1.2.4.Heydər Əliyevin nitqində təhsil etikası

Bu yarımfəsildə məqsəd müstəqillik yoluna qədəm qoymuş gənc respublikanın gələcək inkişafında təhsilin rolu haqqında Ulu Öndərin nitqlərini araşdırmaq, bu nitqlərin auditoriyaya olan təsir gücünü Azərbaycan dilinin imkanları hesabına oxuculara ünvanlamaqdır.

Müstəqillik qazanmış Azərbaycan xalqının gələcək tərəqqisində, dünya sivilizasiyasına qovuşmasında hansı etik dəyərlər daşımasını müxtəlif auditoriyalarda Azərbaycan dilinin zəngin imkanlarından istifadə edərək kütlələrin süuruna çatdırılmasında Ulu Öndərin nitqlərinin rolu mühümdür. Təhsillə bağlı bu araşdırmalarda aşağıdakı görüşlər əsas götürülmüşdür: Bakının Suraxanı rayonundakı 275 nömrəli məktəbdə Bilik Gününə və Yeni dərs ilinin başlanmasına həsr olunmuş mərasimdə, Prezident sarayında 31 avqust 1999-cu ildə Azərbaycanın təhsil işçiləri və bu il ali məktəblərə daxil olmuş tələbələrlə görüşdə, Kocaeli Universitetində yeni dərs ilinin başlanmasına həsr olunmuş mərasimdə, Bakı Dövlət Universitetinin 80 illiyi münasibətilə BDU-nun və bir sira xarici ölkə universitetlərinin rəhbərləri ilə görüşdə, Bakı, Nərimanov rayonu, 82 saylı pilot orta məktəbində Yeni dərs ilinin başlanması və Bilik Günü münasibətilə keçirilən təntənəli toplantıda, Bilik Günü və Yeni dərs ilinin başlanması münasibətilə Bakının Səbail rayonundakı Tofiq İsmayılov adına riyaziyyat və informatika təmayüllü 6 saylı məktəb–liseydə keçirilən mərasimdə, 1 sentyabr 2001-ci ildə Bakının Nəsimi rayonu ərazisində (*Səməd Vurğun küçəsində*) – paytaxtda ilk özəl ümumtəhsil məktəb kompleksinin istifadəyə verilməsi mərasimində, 1 sentyabr 2001-ci ildə Qars şəhərində Qafqaz Universitetinin fəxri doktoru diplomunun təqdim edilməsi mərasimində, 28 iyun 2002-ci il Bakının Suraxanı rayonundakı 275 nömrəli məktəbdə Bilik gününə və

Yeni dərs ilinin başlanmasına həsr olunmuş mərasimdəki nitqlər 1970-1987-ci illərdə azərbaycandan kənarda ali təhsil almış mütəxəssislərin ümumrespublika toplantısında.

Hələ bizim eradan əvvəl qədim yunan filosofu Aristotelin etik kredosunda deyilir: "Gənclikdə və sonrakı dövrlərdə öyrəndiklərinizə diqqətlə yanaşın. Əxlaq məsələlərində tərbiyə və təhsilin vacib rol oynadığını bilin" [156]. Təsadüfi deyildir ki, Aristotel dolğun etik dəyərlərlə zəngin həyatı xoşbəxtlik kimi səciyyələndirirdi [156]. Sokrat əxlaqlı olmağı və yaxşı bir həyat sürməyi bilik sahibi olmaqla eyni tutmuşdur. Ona görə insanın qeyri-əxlaqi bir hərəkət etməsi bütövlükdə biliksizlikdən qaynaqlanır [126]. Təhsilin "ideal insan", "alicənab şəxs yetişdirməsi ideyası" hələ qədim Çin filosofu Konfutsi (e.ə. 551–479) tərəfindən də irəli sürülmüşdür [1].

Son dövrlər cəmiyyətin və dövlətin inkişafı üçün bilik və təhsilin rolunu hamı anlayır. Bu gün təhsilə istehsalat üçün baş meydança kimi baxılır ki, təhsil biliklərin, innovasiyaların və texnologiyaların yayılması və ötürülməsində mühüm rol oynayır. [99, 172, 173, 174].

Dövlətin qayğısı altında inkişaf tapan təhsil həmişə Heydər Əliyevin diqqət mərkəzində olub. "Mən" şəxs əvəzliyini bir neçə dəfə təkrarlamaqla təhsilə olan münasibətini açıqlayır. "Mən" əgər bir tərəfdən məsuliyyəti təkbaşına boynuna götürməkdisə, digər tərəfdən Aristotel etikasına görə böyüklük əlaməti hesab olunur. İki yerdə "birinci növbədə" ifadəsini işlətməklə təhsilə olan qayğısını dilə gətirir: "Mən 1969-cu il iyulun 14-də Azərbaycana rəhbər seçiləndən sonra dərhal, birinci növbədə təhsil məsələləri ilə məşğul olmağa başladım. Bilirsiniz ki, mən o vaxta qədər də dövlət işində işləmişdim. Azərbaycanda təhsilin, xüsusilə ali təhsilin vəziyyəti məni daim maraqlandırmışdı və mən bu barədə xeyli məlumata malik idim. Ona görə də bizim təhsilin nailiyyətlərini

də, qüsurlarını, nöqsanlarını da bilirdim. Şübhəsiz ki, respublikanın başçısı kimi məsuliyyətimi də dərk edirdim. Ona görə də mən birinci növbədə təhsil məsələlərinə ciddi fikir verdim" [XVIIc.s.210].

"Ümumiyyətlə" yekunlaşdırıcı modal sözü ilə Azərbaycan xalqının bəşər mədəniyyətinə verdiyi töhfələr auditoriyaya ünvanlanır: "Bilirsiniz ki, ümumiyyətlə, Azərbaycan xalqı həmişə biliyə, elmə böyük maraq göstərmiş xalqdır. Çoxəsrlik tariximizdə xalqımız bəşər mədəniyyətinə, elminə böyük, yazıçılar dünya mədəniyyətini, elmini öz əsərləri ilə zənginləşdirmişlər" [XVIIc.s.212].

1969-cu ildə Azərbaycanın hakimiyyət sükanının arxasına keçən Heydər Əliyev ölkədə töhfələr vermiş, xalqımızın içərisində böyümüş görkəmli alimlər, ixtiraçılar, şairlər təhsilə nə üçün güclü qayğı göstərilməsini ardıcıl olaraq "nə üçün" sual əvəzliyi ilə başlayan ardıcıl ritorik suallarla, "birincisi" və "ikincisi" ardıcıllıq bildirən modal sözlərlə azərbaycanlı gənclərin "dünyaya daha geniş baxış etmək yoluna" qədəm basmalarını istəməsini söyləyir: "Beləliklə, biz 1969-cu ildə azərbaycanlı gənclərin respublikadan kənarda təhsil alması işləri ilə ciddi məşğul olarkən ölkəmizdə ali məktəblər də var idi, kadrlar da hazırlayırdıq. Ancaq ***nə üçün*** bu sahəyə belə ciddi fikir verdik və bunu böyük bir iş etdik? ***Nə üçün*** bununla çox ciddi məşğul olduq və nə üçün onunla bilavasitə Azərbaycanın birinci rəhbəri məşğul olurdu? Yenə də deyirəm, ***birincisi***, ona görə ki, bizə bir çox ixtisaslar üzrə mütəxəssislər lazım idi, onlar Azərbaycanın ali məktəblərində hazırlana bilmirdi. ***İkincisi***, şəxsən mən bu təşəbbüsü göstərərkən Azərbaycan gənclərini öz çərçivəsindən çıxıb dünyaya daha geniş baxış etmək yoluna salmaq istəyirdim [XVIIc.s.213-214].

Ulu Öndərin ideyaları bu gün ölkə prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirilir: "Təhsilə xüsusi

diqqət yetirilir. Son onillikdə üç minə qədər yeni məktəb binası inşa edilmişdir. Təhsilin keyfiyyəti ilə bağlı islahatlar aparılır. Hesab edirəm ki, yaxın gələcəkdə bu islahatların nəticəsini görəcəyik. Eyni zamanda dövlət vəsaiti hesabına gənclər dünyanın ali məktəblərinə oxumağa göndərilir ki, bu da ölkənin gələcək inkişafında öz sözünü deyəcək" **[ 35].**

Təhsilin Azərbaycandakı təkamülünü, keçdiyi yolu "keçmiş dövrlərdə", "orta əsrlərdə" ifadələri ilə dilə gətirərək tarixə ekskurs edir, "amma", "ancaq" ziddiyyət bağlayıcıları ilə o dövrlərdə ümumi savadsızlığın aradan qaldırılmamasını açıb göstərir: "***Keçmiş dövrlərdə*** də Azərbaycanda istedadlı gənclərin başqa ölkələrdə təhsil almaq ənənəsi olmuşdur. ***Orta əsrlərdə*** Azərbaycanda zəkalı, istedadlı gənclər adətən İranda, İraqda, Türkiyədə, Misirdə və başqa Şərq ölkələrində təhsil alırdılar. ***Amma*** onlar çox az idilər və şübhəsiz ki, onlar ali təhsil alıb, böyük biliyə malik olub öz istedadları, zəkaları ilə Azərbaycan xalqının tarixində əks olunmuş dəyərli əsərlər yaratmışdılar. ***Ancaq*** onlar xalqımızın ***savadsızlığının*** aradan götürülməsinə, ***maariflənməsinə*** böyük təsir etməmişlər" [XVIIc.s.213-214].

Növbəti nitq mərhələsində "təhsil" və "ədalət" etik kateqoriyalarının harmoniyasından söhbət açır. Ədalətin təntənəsi üçün sərt qərarlar qəbul olunmasına analitik təfəkkür hesabına aydınlıq gətirir, "hər bir" gəncin təhsil hüququnun bərpası üçün görülən işləri bəyan edir: "Yaxud, bir xüsusiyyəti də deyim. Hər şey göz qabağındadır, açıq demək lazımdır. 1969-cu ildən sonra mən təkcə bu iş üçün yox, Azərbaycanın ali təhsil sistemində ***ədalətin*** təmin olunması üçün də çoxlu tədbirlər gördüm. Düzdür, sonralar bunların bəziləri pozuldu. Hətta bəzilərinə görə sonralar mənə irad tutdular ki, nə üçün Heydər Əliyev bu cür ***sərt qərarlar*** qəbul etmişdir. Ancaq bunlar o dövr üçün lazım idi. Mən istəyirdim ki, ***hər bir*** azərbaycanlı gənc atasının, anasının kimliyindən,

ailəsinin maddi vəziyyətinin səviyyəsindən asılı olmayaraq, əgər istedadı varsa və ali təhsil almaq istəyirsə, buna nail ola bilsin" [XVIIc.s.220-221].

"Xatirimdədir" modal sözü ilə o dövr təhsilə olan dövlət qayğısını yada salır, "nəhayət" modal sözü ilə "ədalətsizlik" etik kateqoriyasının "ədalət"lə əvəz olunması yolunda apardığı mübarizədən danışır. Müvəffəqiyyətlə apardığı mübarizəni təvazökarlıqla "deyə bilmərəm tamamilə" ifadəsilə yekunlaşdırır: "Ancaq mən nə ilə rastlaşdım? Vəzifəli, yaxud imkanlı şəxslərin hamısının övladları ali məktəblərə daxil olurdu, amma kasıb insanların, vəzifəsi olmayan çoxlu valideynin uşaqları ali məktəbə daxil ola bilmirdi. ***Xatirinizdədir***, biz bu məsələlərlə o illər çox məşğul olurduq. ***Nəhayət***, bir neçə ildən sonra mən buna nail oldum ki, Azərbaycanda ali məktəblərə – ***deyə bilmərəm tamamilə***, əksərən, çünki o vaxt bəzən ***ədalətsizliklər*** baş verirdi – gənclərin əksəriyyəti ədalətli qəbul edilsin" [XVIIc.s.220-221].

Heydər Əliyevin Respublika Sarayında, 25 sentyabr 1998-ci ildə Azərbaycan Müəllimlərinin qurultayındakı nitqində təhsil, təhsilə dövlət qayğısı, təhsildə müəllimin yeri məsələləri kifayət qədər işıqlandırılmışdır. Azərbaycanda müəllimin, təhsilin rolunu qiymətləndirən Ulu Öndər "böyük", "geniş", "yüksək" sinonimlərlə təhsilin xarakterini açır: "Azərbaycanda təhsilin qədim və zəngin tarixi vardır. Bu gün bu barədə məlumatlar verildi. Siz, təhsil adamları, müəllimlər bizim təhsilin tarixini yaxşı bilirsiniz. Biz tarixin bütün mərhələlərində Azərbaycanda müəllimin, təhsilin rolunu qiymətləndiririk. Ancaq bu gün burada bildirildi, bu fikirlə mən də tamamilə şərikəm ki, Azərbaycanda təhsil, xalqımızın maariflənməsi XX əsrin əvvəlindən böyük sürətlə inkişaf edibdir və XX əsrin sonunda müstəqil Azərbaycan Respublikası ***böyük*** müəllim ordusuna, ***geniş*** təhsil şəbəkəsinə və ***yüksək*** təhsilə malikdir" [XVIIc.s.346-347].

**"**İftixar hissi keçirmək**"** böyüklük etik kateqoriyası kimi böyük adamlara xasdır. "Bunların hamısında mənim xidmələrim olubdur" ifadəsi Aristotelin "böyüklük" etik dəyəri ilə bağlı fikirləri ilə üst-üstə düşür. Filosofa görə böyüklük elə bir dəyər ki, bu böyük adamlar tərəfindən etdikləri xidməti dilə gətirməkdir [10]: "Bu gün ***iftixar hissi keçirə*** bilərəm ki, o illər mən Azərbaycana rəhbərlik etdiyim zaman saysız-hesabsız məktəblər yaranıbdır, ali məktəblərin sayı, onların fakültələri, kafedraları artıbdır, yüksək səviyyəli müəllim kadrları, universitetlərdə dərs deyən alim kadrları hazırlanıbdır və bunların hamısında mənim xidmətlərim olubdur [XVIIc.s.351].

"Həqiqətən" modalı ilə həyatını müəllimliyə həsr edən insanların hansı etik dəyərlərə (fədakar, sədaqətli, qəhrəman) malik olduğunu sadalayır. "Ləyaqət" etik kateqoriyasına uyğun olaraq "layiqli" sinonimini işlədir. "Əgər" şərt bağlayıcısını ritorik sualla birgə işlədərək müəllimin rolunu aydınlaşdırır: "Həyatını müəllimliyə həsr edən insanlar ***həqiqətən fədakar***, xalqına, millətinə ***sədaqətli*** və eyni zamanda ***qəhrəmanlıq*** göstərən insanlardır. Müəllimlik peşəsi asan peşə deyil. Bəziləri hesab edirlər ki, hər adam müəllim ola bilər. Bəzən olur ki, müəllimliyə ***layiq*** olmayan adam da müəllimlik edir. Belə hallar bu gün də var, gələcəkdə də ola bilər. Ancaq Azərbaycan müəllimlərinin tam əksəriyyəti layiqli müəllimdir. Əgər bunlar belə olmasaydı, Azərbaycanın bugünkü elmi, iqtisadiyyatı, mədəniyyəti, yüksəlişi ola bilərdi***mi***? Biz bunların hamısını məktəblərdən, universitetlərdən, müəllimlərdən, sizdən almışıq" [XVIIc.s.354-355].

Təhsilə məsul şəxs sayılan müəllim Heydər Əliyev üçün "ən ali simadır", "ən çox yadda qalan", "əziz olan" şəxsdir. "Hesab edirəm ki" modal sözü ilə dahi şəxsiyyət həyatının uğurlu olmasında əsas yolun müəllimlərin öyrətdiyi yol olduğu fikrini auditoriya ilə bölüşür: "Mən müəllimlərimi həmişə böyük hörmət və ehtiramla xatırlamışam. Bunu bu gün

bir daha bildirmək istəyirəm. Arzu edərdim ki, müəllim elə müəllim olsun ki, bax, mənim hafizəmdə orta məktəbdən indiyədək yaşayan duyğular hər bir gəncin hafizəsində qalsın. ***Xatirimdədir***, biz müəllimi görəndə həmişə özümüzü yığışdırırdıq. Müəllimdən həm qorxurduq, həm də ona hörmət edirdik. Biz müəllimin hər sözünü qanun kimi qəbul edirdik, şəxsən mənim həyatımda müəllim ***ən ali sima*** olmuşdur. Mən tək deyiləm, hesab edirəm, Azərbaycan vətəndaşlarının əksəriyyəti mənim kimi belə düşünür. Hər kəs öz həyatında müəllimlə özünün əlaqəsi haqqında fikirlər söyləyə bilər. Ancaq mənim çoxillik həyatımda, dünyanın çox mərhələlərini keçib gəldiyim həyatımda ən çox ***yadımda qalan***, mənim üçün ***əziz olan*** müəllimlərdir. Mən onları bu gün də böyük minnətdarlıqla xatırlayıram. ***Hesab edirəm ki***, mənim öz daxili istedadımla yanaşı, müəllimlərimin mənə verdikləri bilik, tərbiyə, müəllimlərimin mənə göstərdiyi ***yol*** bütün həyatımı həmişə ***uğurlu*** edibdir və bu gün də ***uğurlu*** edir" [XVIIc.s.354-355].

Növbəti mərhələdə müəllimliyin mənəvi tərəfi ilə vəhdətdə olan maddi tərəfinin təsvirinə keçir. "Əsl müəllim pul, sərvət üçün xidmət etməməlidir" müddəasını ortaya qoyur. "Xatirimdədir" modalı ilə müəllimlərin maddi durumunun əvvəlki illərdən fərqli olmadığını dilə gətirir, "amma" ziddiyyət bağlayıcısı ilə onların nə qədər "həvəslə ürəklə, sədaqətlə" çalışdıqlarını auditoriyaya xatırladır: "Amma bunlara baxmayaraq, hesab edirəm ki, başqa təbəqələrə nisbətən müəllimlər elə o vaxt da aztəminatlı adamlar olublar və bu gün də aztəminatlıdırlar. Bu, müəllimliyin xüsusiyyətidir. Çünki ***əsl müəllim pul, sərvət üçün yox, həmişə mənəviyyat üçün xidmət edibdir***. ***Xatirimdədir***, orta məktəbdə, pedaqoji texnikumda oxuyanda mənim maddi vəziyyətim, yəni ailəmin vəziyyəti çox zəif idi. Ancaq görürdüm ki, mənə dərs verən müəllimlərin maddi vəziyyəti bizim maddi

vəziyyətimizdən o qədər də artıq deyildir. ***Amma*** nə qədər ***həvəslə***, ***sədaqətlə*** və nə qədər ***ürəklə*** bizə tərbiyə, dərs verirdilər. Ona görə də müəllimlik peşəsi həmişə fədakarlıq tələb edir. Bu, belə olubdur [XVIIc.s.355].

Təhsillə bağlı Heydər Əliyevin aşağıdakı fikirləri etik kredo ola bilər: "Mən hesab edirəm ki, insan cəmiyyətində ən yüksək yerdə mənəviyyat durur. Maddi vəziyyət, sərvət, bu və ya başqa şeylər xeyli aşağıda durur". "Yox" inkar ədatıyla müəllimlərin öz peşələrinə prinsipiallığını dilə gətirən böyük natiq sonda müəllimlərə "afərin" söyləyərək, "baş əyirəm" frazeologizmi ilə kövrək hissiyyat yaradır: "***Mən hesab edirəm ki, insan cəmiyyətində ən yüksək yerdə mənəviyyat durur***. ***Maddi vəziyyət, sərvət, bu və ya başqa şeylər xeyli aşağıda durur.*** Bununla onu demək istəmirəm ki, müəllimlər həmişə maddi çətinlik içərisində yaşamalıdırlar. ***Yox***, sadəcə, bu sözlərimlə mən özünü müəllimlik peşəsinə həsr edən insanın həmin peşəyə sadiqliyini sübut etmək istəyirəm. Ola bilər, o müəllimlər gedib başqa bir işlə məşğul olsaydılar, bir neçə qat artıq fayda götürə bilərdilər və maddi vəziyyətləri də yaxşı olardı. Ancaq onlar müəllimlik peşəsini seçiblər, siz müəllimlik peşəsini seçmisiniz. Buna görə də mən sizə "***afərin***!" deyirəm, sizin qarşınızda, müəllimin qarşısında ***baş əyirəm***" [XVIIc.s.356].

Azərbaycanın təhsil işçiləri və ali məktəblərə daxil olmuş tələbələrlə görüşdəki nitqində Ulu Öndər təhsil-dövlətçilik, təhsil-estetika, təhsil-diplomatiya vəhdətini özünəməxsus rəvan bir dillə auditoriyalara ünvanlayır.

İncəsənətin növləri kimi musiqi də, rəssamlıq da Heydər Əliyevin dövlət başçısı kimi dilindədir. Himnimiz və bayrağımız haqqında öz düşüncələrini gənc tələbələrlə bölüşür, təhsil etik kateqoriyası ilə estetik (musiqi, rəssamlıq) kateqoriyaları çulğalaşdırır: "Bizim ölkəmizin vətəndaşlarının bəlkə də hamısı bunu istənilən səviyyədə dərk edə bilməyibdir.

Ancaq mən xarici ölkələrdə ziyarətlərdə olarkən, Azərbaycanın və həmin dövlətin himni çalınarkən çox böyük qürur hissi keçirirəm. Həmin ziyarətlərimdə məndə bəlkə də yüksək əhval-ruhiyyə yaradan Azərbaycanın bayrağı altında Azərbaycanın himninin çalınmasıdır. Onu da deyə bilərəm ki, bəzi dövlət başçıları sonrakı söhbətlərdə etiraf ediblər ki, sizin himninizin ***musiqisi*** çox gözəldir, ***bayrağınız*** da gözəldir. Bu, həqiqətən belədir" [XXIc.s.244].

Dil, təhsil, iqtisadiyyat və həyatın digər sahələri ardıcıllığını ortaya qoyan böyük natiq "əgər" şərt bağlayıcısının təkrarı ilə bugünkü səviyyəmizə gəlib çatan əsas yolu auditoriyanın gözü qarşısında canlandırır. "Potensial" sözünü bir neçə dəfə işlətməklə ölkəmizin potensialı, "potensial" sözünü "nə ...nə də" bağlayıcıları ilə sürəkli işlətməklə ölkəmizin nəyə malik olduğunu xatırladır: "Beləliklə, XX əsrdə sözün geniş mənasında ölkəmizdə Azərbaycan məktəbi yaranıbdır. Azərbaycan dilində, xalqımızın öz ana dilində uşaqlara, gənclərə təhsil verən və millətimizi təhsilləndirən məktəb yaranıbdır. Bu, ən böyük nailiyyətlərimizdən biridir. İqtisadiyyat da, həyatın başqa sahələri də bunun üzərindədir. ***Əgər*** bizim yüksək səviyyəli məktəbimiz olmasaydı, ***əgər*** bütün gənclər, uşaqlar icbari təhsilə cəlb edilməsəydi, ***əgər*** ilbəil yüksək səviyyəli müəllim, professor kadrları hazırlanmasaydı, ***əgər*** elmimiz inkişaf etməsəydi, biz indi ***nə*** bu iqtisadi ***potensiala***, ***nə*** elmi ***potensiala***, ***nə*** sosial ***potensiala***, ***nə*** də təhsil ***potensialına*** malik ola bilməzdik. Ona görə də bunları unutmaq olmaz və onları qiymətləndirmək, onlarla fəxr etmək lazımdır" [XXIc.s.246].

Prioritet sahə sayılan təhsilin normal məcrada inkişafı ictimai-siyasi sabitlikdən keçir ki, bu sabitliyi pozan antietik dəyərlər sinonim cərgə ilə – hərc-mərclik, dərəbəylik, özbaşınalıq, hakimiyyətsizlik – sadalanır və onların aradan qaldırılması diqqətə çatdırılır: "Son illərdə bizim əldə etdiyimiz ən

böyük nailiyyət Azərbaycanda ictimai-siyasi sabitliyin təmin olunması, ölkəmizin daxilində ***hərc-mərcliyə, dərəbəyliyə, özbaşınalığa, hakimiyyətsizliyə*** son qoyulması idi. Bu, Azərbaycanın həyatının bütün sahələrində canlanmaya, inkişafa təminat yaratdı. Bu, ***ümumiyyətlə***, respublikamızın inkişafını təmin etdi. ***Məhz*** bu baxımdan, ona görə də təhsil sistemi öz inkişafını yenə də ardıcıl surətdə təmin edə bildi" [XXIc.s.247].

"Milli ənənələrin üstündən keçməyəsiniz" fikrini təhsil islahatı aparanların diqqətinə çatdırmaqla "qoy" əmr ədatı ilə daha yaxşı ənənələrə malik olanın qurulmasını tələb kimi qarşıya qoyur: "Təhsilin özündə aparılan islahatlar çox vacibdir. Siz onları aparırsınız. Bugünkü çıxışlarda bu barədə məlumatlar verildi. Mənim sizə tövsiyəm ondan ibarət olar ki, islahatları düşünülmüş qaydada aparasınız, formalizmə, ***konyunkturaya*** yol verməyəsiniz, Azərbaycanın ***milli ənənələrinin üstündən keçməyəsiniz***. Bunlar həqiqətən həm Azərbaycan təhsilini dünyanın inkişaf etmiş ölkələrinin təhsili səviyyəsinə ardıcıl surətdə çatdırsın, həm də burada səhvlər buraxılmasın, mövcud yaxşı işlər pozulmasın.

Nəsə qurub-yaradan adam gərək düşünsün ki, o, mövcud olandan daha yaxşısını yaradır. Əgər onu yarada bilirsə, mövcud səviyyədən imtina edib onu yaratsın. Amma yarada bilmirsə, ***qoy*** mövcud olandan əl çəkməsin, həmin onunla yaşasın [XXIc.s.249].

"Təhsil" etik kateqoriya kimi Heydər Əliyevin daim diqqət mərkəzindədir. Ona görə də cəmiyyətin həssas yeri olan təhsili "biznesə çevirənlərə qarşı mübarizəyə səsləyir", fikrini "əl çəkmək" frazeologizmi ilə yekunlaşdırır: "Əgər kimsə həmin universitetdə təhsilin səviyyəsini dövlət ali məktəblərindən yüksək, keyfiyyətli etmək istəyirsə, çox sağ olsun – onlar bunu etsinlər və biz bunu müdafiə edirik, edəcəyik, dəstəkləyəcəyik. Ancaq kimsə bu dövrdə bunu ***biznes*** naminə

edirsə, bu yaramaz. Ondan ***əl çəkmək*** lazımdır [XXIc.s.250-251].

Təhsili biznesə çevirənlərə qarşı mübarizə ilə yanaşı ölkənin xarici siyasətinin aparılmasına məsul olan diplomatik korpusun hazırlanmasını, bu sahədəki təhsilə xüsusi diqqət yetirilməsini günün vacib məsələsi sayır. Ritorik sualla diplomatiyanın dinləyicilər üçün izahını verir, "axı" qüvvətləndirici ədatı ilə diplomatiya məsələlərinin, diplomatiya təhsilinin dövlətin işi olduğunu ciddiyyətlə qarşıya qoyur. "Hansısa bir kəsin" ifadəsi ilə diplomatik təhsilin qiymətini verir: "Məsələn, nə bilim, ***hansısa*** diplomatik bir universitet yaranıbdır, filan-olubdur. Diplomatiya, ümumiyyətlə, dövlətin inhisarıdır. ***Nədir diplomatiya?*** Diplomatiya hər bir dövlətin xarici siyasətini həyata keçirən təşkilatdır və onun kadrlarıdır. Buna diplomatiya deyirlər və o kadra da diplomat deyirlər. Bunu özəl bir yerdə hazırlayırlar. ***Axı*** bu, dövlətin işidir. Özəl bir qurum, yaxud da dövlətlə bağlı olmayan bir qurum həqiqətən müstəqil Azərbaycan dövləti üçün diplomatlar hazırlaya bilərmi? İnanıram ki, lazımi səviyyədə yox. Onlar oxuyacaqlar, təhsil alacaqlar, diplom da alacaqlar. Amma ola bilər, qeyri bir özəl sektorda işləsinlər. Buna heç kəs mane ola bilməz. Amma dövlət sisteminin diplomatiyasında yer tutmaq üçün, əlbəttə ki, onlar dövlət diplomatiyası ilə tanış olmalıdırlar, dövlət diplomatiyası təhsili almalıdırlar. ***Hansısa bir kəsin*** özəl diplomatik təhsilini almamalıdırlar" [XXIc.s.252-253].

Bakı Dövlət Universitetinin 80 illiyi münasibətilə BDU-nun və bir sıra xarici ölkə universitetlərinin rəhbərləri ilə görüsdəki nitqin (Prezident sarayı 11 fevral 2000-ci il) girişində öncə alimləri salamlayan böyük natiq Bakı Dövlət Universitetinin keçdiyi şərəfli yolu işıqlandıraraq, böyük natiq "ədalətsizlik" antietik kateqoriyasının hələ XX əsrin 30-cü illərində təhsillə əlaqəsini açır, təhsilimizin zəiflədilməsi ilə nəticlənən

o dövrü dinləyicilərə nişan verir: "Hörmətli alimlər! Hörmətli qonaqlar, xanımlar və cənablar! Azərbaycan Dövlət Universiteti tariximizdə çox böyük yer tutur. Məlumdur ki, o, 1919-cu ildə Azərbaycanda xalq cümhuriyyəti hakimiyyətdə olduğu zaman təşkil edilmiş və xalqımızın tarixində ilk universitetdir. Bu universitet təkcə bizim xalqımızın yox, ümumiyyətlə, Şərq aləminin ilk dünyəvi universitetidir. O, 80 illik fəaliyyəti dövründə Azərbaycana xidmət edibdir və Azərbaycanda təhsilin, elmin inkişafında böyük nailiyyətlər əldə edibdir.

Bütün bunlara görə də Bakı Dövlət Universiteti Azərbaycanda çox böyük hörmətə malikdir. Təbiidir ki, onun tarixi həmişə bizim arzu etdiyimiz, istədiyimiz kimi olmayıbdır. Yaranandan sonra onun həyatında böyük nailiyyət nümayiş etdirən dövrlər də olubdur. Ancaq totalitar rejim dövründə, xüsusən 1930-cu illərdə Azərbaycanda ziyalılara və bir çox elm, təhsil adamlarına ***ədalətsiz*** münasibət göstərilən zaman, onlar repressiya edilən zaman universitetin də görkəmli şəxsiyyətləri repressiya qurbanları olublar [XXVc.s.36].

Keçmişinə kəm baxanlardan fərqli olaraq təhsilimizlə bağlı keçmişdə baş verən mütərəqqi addımları səmimi ifadələrlə dilə gətirən böyük natiq özünə və müasirlərinə xitabən "həmin təhsil sisteminin bəhrələriyik" deyir. Keçmişin müsbət cəhətlərinin tənqid olunduğunu satirik bir dillə (belələri dünən bir söz, bu gün bir söz deyirlər, sabah başqa bir söz deyəcəklər) auditoriyaya ünvanlayır: "Mən qeyd etmək istəyirəm ki, o dövrün təhsil sistemi çox yaxşı təhsil sistemi olubdur. Əgər o olmasaydı, Azərbaycanda qısa bir zamanda təhsil, xalqın savadlanması, elmin inkişafı sahəsində belə müsbət dəyişikliklər olmazdı. Biz, indi yaşayan adamlar və bizdən gənc olan insanların hamısı ***həmin təhsil sisteminin bəhrələriyik***. Biz, burada oturanların hamısı, Azərbaycanın bütün alimləri o təhsil sistemində – həm orta, həm də ali məktəbdə təhsil almışıq. Ona görə də mən sovet hakimiyyəti

dövründəki təhsil sistemini yüksək qiymətləndirirəm. İndi konyunkturaya uyan bəzi adamlar vardır. Belələri dünən bir söz, bu gün bir söz deyirlər, sabah başqa bir söz deyəcəklər. Ola bilər ki, belə adamlar cəmiyyətdə müvəqqəti uğur qazana bilsinlər. Ancaq cəmiyyət onları heç vaxt ciddi qəbul etmir" [XXVc.s.37].

Nəzərə alsaq ki, obyektivliyə əsaslanan etiraf, səmimiyyət etik kateqoriyalar hesab olunur, o zaman aşağıdakı mətndə təhsillə bağlı Sovet dövründə qazandığımız uğurların özünə-məxsus Heydər Əliyev nitqi ilə auditoriyalara çatdırılmasının şahidi olarıq. Tarixi təhrif edənlərə "təəssüf edir". Həmin dövrdə baş verən ədalətsizliklərlə, repressiyalarla yanaşı, "xalqımızın təhsillənməsi, yüksək təhsilə, elmə malik olması" inandırıcı faktlarla diqqətə çatdırılır. Hələ Aristotelin etik kredosunda yalan və təhrif ləyaqətli iş hesab olunmurdu [156]. "Mən öz mövqeyimi bildirirəm" ifadəsinin arxasında demokratik dövlət başçısının xarakteri aydınca sezilir: "Bizdə tarixi təhrif edənlər olubdur. Sovet hakimiyyəti qurulandan sonra keçmiş tariximiz təhrif edilibdir. ***Təəssüflər olsun ki***, indi, sovet hakimiyyəti dağılandan sonra yenə də keçmişi təhrif edirlər. Bilirsiniz, o vaxtkı dövrdən ibrət götürmürlər. Siz alimlərsiniz, bunu bilirsiniz. Hesab edirəm ki, bu sözləri sizə deməyimin elə bir əhəmiyyəti yoxdur. Ancaq bu sözləri sizə deyərkən ***mən öz mövqeyimi bildirirəm.*** Mənim də mövqeyim ondan ibarətdir ki, Azərbaycan xalqı, təhsili 70 illik sovet hakimiyyəti dövründə böyük inkişaf yolu keçibdir. ***Xalqımız təhsillənib, yüksək təhsilə, elmə malik olubdur***. Xalqımızın mədəniyyəti yüksəlib və respublikamız o vaxt da, indi də dünyəvi dövlət, ölkə kimi bütün başqa dövlətlərlə bir yerdədir. Ola bilər, bir çox ölkələr daha da çox inkişaf edibdir. Məsələn, bəziləri az inkişaf edibdir. Bu da təbiidir: dünya da müxtəlifdir" [XXVc.s.37-38].

Qloballaşma və təhsil kateqoriyaları böyük natiqin dilində dialektik vəhdət halındadır. “Ona görə də indi biz bu islahatları həyata keçiririk” fikri ilə inteqrasiya proseslərinə işarə edir: “Təhsil sahəsində islahatların keçirilməsi məhz bu məqsədi daşıyır. Bizim təhsilin məzmunu yüksəkdir. Amma onun forması və təhsilin bəzi ayrı-ayrı mərhələlərdə müddəti, yaxud onların nəticəsi indi dünyada, xüsusən Qərb ölkələrində, inkişaf etmiş ölkələrdə olan sistemlərdən bir az fərqlidir. *Ona görə də indi biz bu islahatları həyata keçiririk* ki, bizim təhsil sistemi də həmin o ümumdünya təhsil sisteminə uyğun olsun [XXV c, 38-39].

Hələ Aristotelin etik kredosunda səslənirdi: “Əxlaq məsələlərində tərbiyə və təhsil vacib rol oynayır” [156,s.102]. Kant isə öz kredosunda “Mənəvi müəllimlərimizdən nümunə götürün” [156,s.115] ifadəsini işlədirdi. “Amma, Azərbaycanın rəhbəri kimi, şəxsən mən, bunu yetərli hesab etmirdim” – ifadəsi təhsilin inkişafında özünün şəxsi təşəbbüsünü irəli sürdüyünü auditoriyaya açıqlayır. O zaman Almaniyaya, İngiltərəyə, Fransaya, Amerikaya təhsil almağa getmək” imkanının olmadığını dilə gətirir. Bu məqamda Həzrəti Məhəmməd Peyğəmbərin “Elm Çində olsa belə onun dalınca getmək lazımdır” müddəası ilə uyğunluq tapılır. Xaricə tələbə göndərmək imkanı olmadığını “təbiidir ki” modal sözü ilə bildirən lider mövcud Sovet dövlətinin tanınmış ali məktəblərinə gəncləri göndərməklə Azərbaycanda təhsilə olan hörməti, sevgini həyata keçirə bilmişdir: “Moskva Dövlət Universiteti Azərbaycanda böyük hörmətə malik olubdur. 1970-ci illərdə – mən burada işləyərkən biz Azərbaycanda yüksək səviyyəli kadrların hazırlanması ilə çox ciddi məşğul olurduq. Təbiidir ki, bu kadrların hazırlanması işinin böyük bir hissəsi Azərbaycanın universitetləri, ali məktəbləri, institutları vasitəsilə aparılırdı. ***Amma Azərbaycanın rəhbəri kimi, şəxsən mən bunu yetərli hesab etmirdim.*** İstəyirdim ki, bizim gənclər

təkcə öz respublikasında – Azərbaycanda yox, kənarda da təhsil alsınlar. ***Təbiidir ki***, o vaxt bizim imkanımız yox idi ki, gənclərimizi ***Almaniyaya, İngiltərəyə, Fransaya, Amerikaya təhsil almağa*** göndərək – bu imkan bizdə yox idi. Amma Sovetlər İttifaqının müxtəlif universitetlərində gənclərimizin təhsil alması üçün imkan əldə etmişdik. O vaxt mənim təşəbbüsümlə, sovet hökumətinin qərarı ilə Azərbaycandan ildə 800–850 gənc, demək olar ki, güzəştli imtahanlarla Sovetlər İttifaqının təxminən 40–45 şəhərindəki universitetlərə göndərilirdi [XXVc.s.43].

Vətənin, torpaqların müdafiəsi və xalqın təhsili Heydər Əliyev üçün eynigüclü etik dəyərlərdir desək yanılmarıq. "Doğrudur" gerçəkliyə münasibətdə qəti təsdiq bildirən modal sözlər gənclərin şücaətinin fərmanlarla qiymətləndirilməsini dilə gətirir. Bakı Dövlət Universitetinin müəllimlərinin Azərbaycanın fəxri adları ilə mükafatlandırılması dövlətin təhsilə olan qayğısının bariz nümunəsidir: "Mən bu gün Bakı Dövlət Universitetinin fəaliyyətinə yüksək qiymət verərək, universitetin alimlərinin, müəllimlərinin Azərbaycanın fəxri adlarını alması, orden və medallarla təltif edilməsi haqqında fərmanlar imzalamışam. Yəqin ki, o fərmanlar bu gün sizə çatacaqdır.

Deyə bilərəm ki, mən yeddi ildir Azərbaycana müstəqillik dövründə rəhbərlik edirəm, ilk dəfədir ki, belə bir geniş təltif fərmanı imzalayıram. ***Doğrudur***, bizim ordumuzda, döyüşlərdə fəal iştirak etmiş və canlarını qurban vermiş, şəhid olmuş gənclərimizin qəhrəmanlığını, şücaətini qiymətləndirən fərmanlarım olubdur. Ancaq həyatımızın başqa sahəsinə aid bu gün imzaladığım kimi fərmanlarım indiyə qədər olmamışdır. Bu da mənim – Azərbaycan prezidentinin Bakı Dövlət Universitetinə verdiyim yüksək qiymətdir" [XXVc.s.45].

Yeni dərs ilinin başlanması və bilik günü münasibətilə keçirilən təntənəli toplantıdakı (Bakı, Nərimanov rayonu, 82 saylı pilot orta məktəbi, 1 sentyabr 2000-ci il) nitqdə

müəllimlərə olan şəxsi münasibətini açıqlamaqla nümunə göstərir.

“Təhsil” etik kateqoriya kimi Heydər Əliyev üçün həm daxili mənəviyyatdır, həm keçmişdən qalma ənənədir, həm də “biliklənmək” istəyidir: “Bu həqiqətlər Azərbaycan xalqının daxili mənəviyyatını, elm, ***təhsil*** sahəsində keçmiş ənənələrini inkişaf etdirməsini və xalqımızın biliyə nə qədər maraqlı olmasını, ***biliklənmək*** istəklərini həyata keçirməsini və biliyin yüksəkliklərinə qalxmasını nümayiş etdirir” [XXIXc.s.411].

Ulu Öndər təhsil dedikdə, onu özünəməxsus sinonimlərlə, “demək” yekunlaşdırıcı modal sözlə tərkib hissələrinə – biliklənmək, elmi mənimsəmək, dünyada gedən tərəqqiyə qoşulmaq – ayırır: “Bizim ilk dünyəvi məktəblərimiz də elə bu əsrin əvvəlindən yaranmışdır. Ancaq onlar da çox məhdud bir miqdarda gənclərin, uşaqların oxuması imkanına malik idi. Geniş kütlələr isə ***təhsildən***, ***demək***, ***biliklənmək***, elmi mənimsəmək, dünyada gedən tərəqqiyə qoşulmaq imkanlarından məhrum idi” [XXIXc.s.411].

“Dərin hörmətim, sevgim, məhəbbətim” ifadəsini ikinci dəfə “böyük hörmətim, sevgim, məhəbbətim”lə əvəz edir. “Təhsil” etik dəyərinin inkişafının müəllimlər əlində olduğunu gözəl anlayan böyük natiq Bilik Günü münasibəti ilə müəllimlərin və valideynlərin xatırlamalı olduğu yaddaqalan bir nitq söyləmişdir. Müəllimlik peşəsinin “ən” qüvvətləndirici ədatı ilə yerini anladır. Müqəddəs müəllim adına özünün münasibətini sinonim cərgə ilə – “hörmət, ehtiram, sevgi, məhəbbət” – bildirir. “Gündən-günə” tərzi-hərəkət zərfliyi ilə dövlətin müəllimə qayğısını açıqlayır. Qəti gələcək zamanda gələcəyə tuşlanan proqnozlarını bəyan edir, elə çıxışın gedişində “borc” adlı etik dəyəri feilin indiki zamanında bütün şəxslər üzrə – borcluyuq, borcluyam, borclusan, borcludurlar, borcludur – sadalayaraq ecazkar bir nitq yaradır: “Mən burada gənc müəllimləri, eyni zamanda yaşlı nəslin nümayəndələrini

– qocaman müəllimləri görürəm. Müəllimlik sənəti, peşəsi cəmiyyətdə ən yüksək qiymətə layiq olan bir peşədir. Müəllim olmaq kimi ***şərəfli*** bir iş yoxdur. Çünki müəllimlər xalqın biliklənməsinin, təhsilin inkişaf etməsinin və nəhayət, xalqın elminin inkişaf etməsinin əsasını qoyanlardır. Ona görə də bu bayram günü mən ilk növbədə müstəqil Azərbaycanın bütün ***müəllimlərini*** ürəkdən təbrik edirəm, müəllimə, bu müqəddəs ada öz ***dərin hörmət və ehtiramımı, sevgi, məhəbbətimi*** bildirirəm. Bəyan edirəm ki, müəllim bundan sonra da müstəqil Azərbaycanın həyatında görkəmli yer tutacaq, müəllimə qayğı gündən-günə artacaq və müəllimin şanı – şöhrəti daha da yüksələcəkdir.

Biz hamımız həyatımızda əldə etdiyimiz nailiyyətlərə, bütün varlığımıza görə müəllimə borcluyuq. Mən də müəllimə borcluyam, sən də müəllimə borclusan, bu nazirlər də müəllimə borcludurlar. Müəllimə borclu olmayan adam yoxdur, – hamı müəllimə borcludur. Ona görə də, mən dəfələrlə demişəm, – bir insan, adi vətəndaş kimi məktəbə qədəm qoyduğum ilk vaxtdan indiyədək mənim müəllimə ***böyük hörmətim, sevgim, məhəbbətim*** olubdur. Mən həyatımda çox yollardan keçmişəm. Həyatımın bəzi hissələrini bəlkə də indi xatırlaya bilmirəm, amma müəllimlərimi heç vaxt unutmamışam, hər bir müəllimim bu dəqiqə də gözümün qarşısındadır [XXIXc.s.412-413].

Millətin etik və estetik dünyagörüşünün formalaşması yolunda hansı fənlərin – Azərbaycan tarixi, Azərbaycan ədəbiyyatı, Azərbaycan dili – gələcəkdə tədrisi üçün direktiv tapşırıq verir: “Mən inanıram ki, biz indi müstəqil dövlət kimi heç kəsdən asılı olmayaraq, özümüz öz həyatımızın sahibi olaraq bundan sonra məktəbimizi daha da inkişaf etdirəcəyik. Amma məktəbimiz həm dəqiq elmlərin mənimsənilməsində daha da inkişaf etməlidir, eyni zamanda ictimai elmlər –

Azərbaycan tarixi, Azərbaycan ədəbiyyatı, Azərbaycan dili – bunların hamısı təhsilin çox vacib sahələridir" [XXIXc.s.414].

Azərbaycan ədəbiyyatının "demək" yekunlaşdırıcı modalla "Bu həm bizim tariximizdir, həm mənəviyyatımızdır, həm də mənliyimizdir" ifadəsi ilə öncül yer tutmasını tələb kimi qarşıya qoyur. Müəllimin nə etməli olduğunu, əsasən də "öz həyatlarını yüksək əxlaqi dəyərlərlə qursun" ifadəsi ilə gənclərə aşılanan ümummilli fikirləri yada salır: "Ancaq təkcə tarix deyil, bizim zəngin ədəbiyyatımız var. Azərbaycan ədəbiyyatı qədim dövrlərdən indiyədək öz zənginliyi ilə bütün dünya xalqları içərisində öncül yerlərdə olubdur. Demək, bu ***həm bizim tariximizdir, həm mənəviyyatımız, həm də milli mənliyimizdir***.

Mən müəllimlərin vəzifələri haqqında dedim. Ancaq bizim gənclərimizin, uşaqlarımızın vəzifəsi bunlardan heç də az deyildir. Müəllim öyrətməlidir, bilik verməlidir, tərbiyə verməlidir. Müəllim çalışmalıdır ki, uşaq nəinki bilik alsın, həm də cəmiyyətdə bütün əxlaq normalarını, prinsiplərini mənimsəsin və onlara riayət etsin, öz həyatını yüksək əxlaqi dəyərlər əsasında qursun. Ancaq tələbə, şagird, gənc isə gərək çalışsın ki, müəllimin bu səyləri ona fayda versin. Ona görə də bu gün birinci sinfə gedən uşaq da, onuncu sinfə gedən gənc də bilməlidir ki, bu 10-11 ildə keçən dövr hər bir insanın həyatında ən dəyərli dövrdür. Çünki bu illərdə kim nəyi itiribsə, onu sonra bərpa edə, qazana bilməyəcəkdir" [XXIXc.s.416-417].

"Bu nəyi göstərir" ritorik sualla "çadır şəhərciklərində" yaradılmış məktəblərin uşaqların yüksək balla ali məktəblərə daxil olmasını Azərbaycan xalqının fitri istedadı ilə əlaqədar olmasını auditoriyanın diqqətinə çatdırır: "İndi insanlar hər yerdə oxuyurlar. Mən uşaqları, gəncləri deyirəm. Sizin məktəbiniz böyük tarixə malikdir, böyük ənənələrə malikdir. İndi yenidən təmir olunubdur. Ancaq siz yəqin bilirsiniz ki, o çadırlarda yaşayan soydaşlarımızın uşaqları ***çadır şəhərciklərin-***

***də*** yaratdığımız məktəblərdə oxuyurlar. Mənə dedilər ki, bu il ali məktəblərə imtahan verənlərin içərisində çadır şəhərciklərində təhsil alan məktəblilərin bir qismi çox yüksək ballar toplamışlar***. Bu nəyi göstərir?*** Bu, Azərbaycan xalqının, Azərbaycan gəncinin fitri istedadını göstərir. Hər şeylə təchiz olunmuş çox gözəl məktəbdə də, çadır şəhərciyində də uşaq, gənc istəyir ki, inkişaf etsin, təhsil alsın. Buna görə də xalqımızın elmi potensialı, təhsil potensialı, bütün sahələrdə yüksək mütəxəssislərlə təmin olunmaq potensialı get-gedə artır. Bu da bizim müstəqillik dövründə əldə etdiyimiz əsas nailiyyətlərdən biridir" [XXXVIc.s.8].

"Azərbaycanda təhsil sistemi dövlət qayğısı altındadır" fikrini sonrakı nitq mərhələsində Heydər Əliyev dövlətin bu sahədə apardığı işlərin timsalında ardıcıl şəkildə aydınlaşdırır. "Amma, təhsildə yox" ziddiyyət (amma) və inkar (yox) bağlayıcılarının iştirak etdiyi üçsözlü cümlədə Prezident və təhsil dialektik vəhdətini nümayiş etdirir: "Azərbaycanda təhsil sistemi dövlət qayğısı altındadır. Yəni Azərbaycanın məktəbləri, təhsil müəssisələri, universitetləri – az hissəsini nəzərə almasaq – demək olar ki, hamısı dövlətə məxsusdur. Dövlət təhsilin maliyyələşdirilməsini, yüksək təhsil almaq üçün müasir maddi-texniki bazanın yaradılmasını, məktəblərin şəraitinin yaxşılaşdırılmasını özünün əsas vəzifələrindən biri hesab edir. ***Bilməlisiniz ki***, bizim büdcədə ən çox payı olan təhsil sistemidir. Bu da təsadüfi deyildir. Başqa sahədə ola bilər, kəsirlər də olsun, amma təhsildə yox.

Çünki təhsildə olan ***kəsir***, ***çatışmazlıq*** bizim gələcəyimizə xətalar yaradacaqdır. Buna görə də təhsil dövlət tərəfindən maliyyələşdirilir – az miqdarda özəl təhsil ocaqları var – bundan sonra da biz Azərbaycanda təhsilin inkişafını özümüzün siyasətimizin ***öncül*** sahəsi hesab edəcəyik, bundan sonra da səylərimizi davam etdirəcəyik" [XXXVIc.s.7-9].

Şəhid uşaqları və kimsəsiz uşaqlar üçün təşkil olunmuş Novruz şənliyində çıxış. "Gülüstan" Sarayı 20 mart 1996-cı il. Heydər Əliyevin nitqində bir sıra etik dəyərlər eyni vaxtda auditoriyaya ünvanlanır. "Vətəndaşlıq borcu", "təhsil", "şərəf" kimi dəyərlər gələcəyimiz olan uşaqların sağlamlığı baxımından "yaxşı böyütsün" tibbi etikanı da ora əlavə edir: "Ancaq bu çətinliklərə baxmayaraq, biz sizin qayğınıza qalmışıq, qalırıq və bundan sonra da qalacağıq. Hər birimizin, Azərbaycanın hər bir vətəndaşının borcu ***uşaqlara qayğı***, ***diqqət göstərməkdir***. Mən bu gün hər bir valideynə, hər bir ataya, anaya müraciət edirəm ki, uşağına yaxşı ***baxsın***, yaxşı tərbiyə versin, uşağın yaxşı ***böyütsün***. ***Çünki*** bu günkü uşaqlar müstəqil Azərbaycanın gələcəyidir. Bu gün hər bir müəllimə, məktəb işçisinə müraciət edirəm ki, uşaqlarımıza yaxşı ***təhsil*** versinlər, onları gələcəyə hazırlasınlar. Bilirəm, məktəblərin vəziyyəti çətindir, ağırdır, bir çox problemlər var. Amma bunlara baxmayaraq müəllimlik bizim üçün həmişə ***müqəddəs, şərəfli*** vəzifə olubdur və ümidvaram ki, müəllimlər öz ***şərəfli*** vəzifələrini bundan sonra da layiqincə yerinə yetirəcəklər" [VIc.s.6].

Təhsillə bağlı fikirlərində Heydər Əliyev "müəllim peşəsini ən gərəkli, ən lazımlı hesab edir". İqtisadi potensial yüksəldikcə müəllimə olan qayğının artırılmasını ön plana çəkir. "Şərəf" etik kateqoriyası öz təcəssümünü müəllimdə tapır. Müəllimlərin müəllim adının "şərəfini", "uca" tutmaları, çadır şəhərciyində belə, çətin şəraitdə belə öz fəaliyyətlərini davam etdirmələri "təkcə" ədatı, "nə....nə" inkarlıq bağlayıcıları ilə diqətə çatdırılır: "Ali məktəblərimizdə yüksək elmə malik olan professor-müəllim heyəti var. Ancaq orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə

fəaliyyət göstərən insanların hamısının işindən ***ən gərəklisidir, ən lazımlısıdır*** [XXXVIc.s.9].

Azərbaycanın iqtisadi potensialı yüksəldikcə, Azərbaycan büdcəsinin imkanları genişləndikcə, məktəbə, təhsilə, müəllimə ayrılan vəsaitin miqdarı artacaq və onların böyük hissəsi də ***müəllimlərin, təhsil işçilərinin*** maaşlarının artırılmasına yönəldiləcəkdir.

Bilirəm ki, indi həyatın bu dövründə müəllimlərin aldıqları maaş onların yaşayışını biz istədiyimiz qədər təmin etmir. Amma siz də bilməlisiniz ki, biz nə mümkündür, onu edirik, bundan sonra da ***edəcəyik***. Ancaq müəllim elə bir şəxsiyyətdir ki, o hansı şəraitdə olur-olsun birinci növbədə ***şərəfli müəllim adını yüksəkdə saxlamalıdır.***

Çadır şəhərciyində bizim müəllim müəllimliyini edir – aydındır, orada ***nə*** ev var, ***nə*** yatmağa yer var, təkcə çadırdır – bunu kim görübsə bilir, görməyən də gedib görə bilər. Orada müəllim o cür çətin şəraitdə yaşayaraq uşaqlara qayğı göstərir, müəllimlik edir və elə savad verir ki, o uşaqlar gəlib burada yüksək ballarla ali məktəbə qəbul olunurlar. ***Deməktir***, həmin müəllimlər müəllim adının ***şərəfini*** anlayırlar və bu adı ***uca*** tuturlar” [XXXVIc.s.].

“Uca”, “yüksək” sinonimləri ilə Azərbaycan xalqının mənəvi dəyərlərinin yüksəkliyini dilə gətirir. “Üçün” qoşması ilə və “hər bir” təyin əvəzliyinin köməyilə yüksək mənəviyyatı ünvanlayır: “Mən inanıram ki, müəllimlərin əksəriyyəti bu yüksək mənəvi dəyərlərlə yaşayırlar. Kimsə əgər hələ bu səviyyəyə çatmayıbsa, arzu edərdim ki, onlar da öz vəzifələrini yerinə yetirərək bilsinlər ki, Azərbaycan xalqının yüksək mənəviyyatı hər şeydən ***ucadır***, hər şeydən ***yüksəkdir***. Bu həm xalq ***üçün***, millət ***üçün***, hər bir azərbaycanlı ***üçün***, hər bir vətəndaş ***üçündür***” [XXXVIc.s.9-10].

Təhsilin uğurlu inkişafı bir tərəfdən təhsil işçiləri ilə bağlıdırsa, digər tərəfdən valideynlərə bağlıdır. “Valideyn

borcu"nu böyük natiq etik dəyər səviyyəsinə yüksəldir. Feilin əmr şəklində (gəlsinlər, görsünlər, əlaqə saxlasınlar) valideynlərin hansı vəzifələri yerinə yetirməli olduqlarını açıqlayır: "Keçmişi yada salaraq demək istəyirəm ki, İlhamın, Sevilin anası, mənim mərhum həyat yoldaşım Zərifə xanım valideynlərin bütün iclaslarına gedirdi və iştirak edirdi. Bu da hər bir valideynin borcudur. Valideynlər gərək məktəblə həmişə sıx əlaqə saxlasınlar. Gəlsinlər, uşağın dediyi ilə yox, müəllimlə haradasa görüşməklə yox, məktəbdə uşağının necə oxumasını, məktəbdə olan şəraiti görsünlər. Beləliklə, onlar öz uşaqlarının yaxşı oxuması üçün yaxşı fəaliyyət göstərə bilərlər, eyni zamanda, məktəblə əlaqə insanı daha da cavan saxlayır. Bunun da böyük əhəmiyyəti var" [XXXVIc.s.11].

Heydər Əliyevin nitqində müxtəlif etik dəyərlik adətən bir yerdə işlədilir. Bu cür nitqlər auditoriyanı düşündürə və nitqi yaddaqalan edə bilir. Belə ki, Latın qrafikasına keçməklə bağlı verilən fərmanlara hətta etiraz edənlər də tapılır. "Nə üçün mümkün deyil" ritorik sualına verilən "mümkün oldu" qətiyyətli cavab siyasət və etika vəhdətindən xəbər verir: "Latın qrafikasının tətbiq olunması da əsas məsələlərdən biridir. İndi mən burada XI sinfin şagirdləri ilə tanış olarkən məktəb direktoru mənə bildirdi ki, bunlar artıq II sinifdən latın qrafikası ilə oxuyurlar. Demək, bunlar artıq bizim cəmiyyətdə hər şeyə hazırdırlar. Amma mən bu yaxınlarda fərman verəndə ki, avqust ayının 1-dən bütün nəşriyyat, qəzetlər, kitablar latın qrafikasına keçməlidir, bəziləri narazı oldular, etiraz etdilər ki, bu mümkün deyil. ***Nə üçün mümkün deyil? Mümkün oldu***. İndi hər şey mümkündür. Bu da məktəbin əsas vəzifələrindən biridir.

Məktəbin müəllimlərinə, bütün kollektivə, Azərbaycanın bütün təhsil işçilərinə, bütün müəllimlərinə, Azərbaycanın təhsil alan uşaqlarına, ali məktəblərdə təhsil alan gənclərə,

hamıya bu yolda uğurlar arzulayıram. Sizin hamınıza can-sağlığı, səadət arzulayıram. Sağ olun" [XXXVIc.s.15].

Bakının Nəsimi rayonu ərazisində (*Səməd Vurğun küçəsində*) – paytaxtda ilk özəl ümumtəhsil məktəb kompleksinin istifadəyə verilməsi mərasimindəki nitqdə "Cəmiyyət təhsilsiz inkişaf edə bilməz" müddəasını irəli sürən Heydər Əliyev bu əxlaqi dəyərin uşaqlıq və gənclik illərinə təsadüf etməsini göstərir: "Bu hər bir xalqın, hər bir millətin həyatında əlamətdar hadisədir. Çünki ***cəmiyyət təhsilsiz inkişaf edə bilməz.*** Təhsilsiz xalq müasir şəraitdə öz imkanlarını həyatına sərf etmək üçün çox problemlərlə rastlaşar. Ona görə də təhsil hər bir insana lazımdır və bu təhsili də, təbiidir ki, hər bir insan gəncliyindən, uşaqlıq vaxtından almalıdır.

Böyük iftixar hissi ilə deyə bilərəm ki, Azərbaycanda təhsil XX əsrdə çox sürətlə inkişaf edibdir və təhsilə cəlb olunmayan uşaq, gənc, insan yoxdur. Bu bizim böyük nailiyyətimizdir ki, xalqımız tam savadlıdır, tam təhsillidir. Ancaq bilməlisiniz ki, dünyada heç də bütün ölkələrdə, hətta coğrafi nöqteyi-nəzərdən bizə yaxın ölkələrdə insanların, gənclərin hamısının təhsilli olduğunu demək olmaz" [XXXVIc.s.16].

Artıq vəsait əldə etməklə ədalətsizliyə yol verilən özəl təhsil müəssisələri barədə böyük natiq narahatlığını bildirir: "Təhsil biznesə çevrilməməlidir" deməklə təhsil kimi əxlaqi dəyərin qorunmasını təhsil sahəsindəki məmurlara yönəldir: "Ancaq bir şeyi qeyd etmək istəyirəm ki, ümumiyyətlə, ***təhsil*** biznesə çevrilməməlidir. Bunu hamı bilməlidir. Təəssüflər olsun ki, ötən illərdə ölkəmizdə bu məsələlər hələ tam nizamlanmadığına görə bəzi yerlərdə özəl universitetlər, yaxud özəl məktəblər yaranıbdır. Ancaq araşdıranda görürsən ki, bu onu yaradanların artıq vəsait əldə etməsi məqsədi ***daşıyır***. Başqa universitetlərə, məktəblərə nisbətən daha da yüksək təhsil vermək məqsədi ***daşımır***. Bu bizi ***narahat*** edir" [XXXVIc.s.20].

Sonrakı nitq mərhələsində təhsilin "müqəddəs" sahə olduğu şüurlara çatdırılır. "Əsl vətəndaş" Heydər Əliyev dilində təhsilli olmaqla yanaşı, "yüksək səviyyəli mütəxəssis"dir. Feilin şərt şəklində bəzi özəl məktəblərin fəaliyyəti sadalanır, (başqa məqsəd daşıyırsa, üstünlük verirlərsə, keyfiyyət aşağıdırsa) aşağı keyfiyyətli təhsilin "həm", "həm də" bölüşdürmə bağlayıcıları ilə millətə xəyanət olduğunu açıqlanır. Xəyanətə qarşı "buna qətiyyən yol vermək olmaz" qətiyyətli ifadə işə düşür: "İndi biznes, yəni özəl sektor bizim iqtisadiyyatımızda aparıcı yer tutur. Amma təhsil sahəsi ***müqəddəs*** sahədir. Çünki təhsil sahəsi uşaqları, gəncləri hazırlayıb gələcəyə əsl vətəndaş, yüksək səviyyəli mütəxəssis etmək üçün mövcuddur. Əgər özəl universitetlər, özəl məktəblər yaradan şəxslər başqa məqsəd daşıyırlarsa, yəni onlar bundan özləri üçün mənfəət götürmək məsələsinə üstünlük verirlərsə, bəzən də çox hallarda təhsilin keyfiyyəti bizim dövlət universitetlərindən, dövlət məktəblərindən aşağıdırsa, bu ***həm*** xalqa, ***həm*** uşaqlara, ***həm də*** millətimizə xəyanətdir. Buna qətiyyən yol vermək olmaz!" [XXXVIc.s.20].

Gələcəyin gəncliyə məxsusluğu "hər bir" təyin əvəzliyi ilə açıqlanır. "Yüksək", "həqiqi təhsil", "insanların rifah halının yaxşılaşmasına gətirib çıxaracaq" müddəası auditoriyaya yönəlir: "Təhsil sistemi Azərbaycanın gələcəyini təmin edən bir sistemdir. ***Hər bir*** millətin, hər bir ölkənin gələcəyi gənclərdir. Biz gənclərimizi ***nə qədər*** yüksək təhsilli etsək, ***həqiqi*** yüksək təhsilli ***etsək***, onların müəyyən ixtisaslara mükəmməl yiyələnməsinə şərait yarada ***bilsək***, müstəqil Azərbaycanın gələcəyi və ***demək***, müstəqil Azərbaycanın iqtisadiyyatının inkişafı, elminin inkişafı, təhsilinin inkişafı, ***insanların rifah halı o qədər də*** yaxşı olacaqdır [XXXVIc.s.20-21].

Dövlət siyasəti etikanın digər (ekoloji, dil, tibbi və s.) sahələrində olduğu kimi təhsil sahəsinə də şamil olunur. "Bütün dövlət orqanlarında", "hər yerdə" Azərbaycan dilinin,

ana dilinin, dövlət dilinin hakimliyinə çağırış edir: "Bizim məktəblərimiz millidir. Bilirsiniz ki, mən son vaxtlar Azərbaycanın dövlət dili, ana dili, Azərbaycan dili haqqında bir çox fərmanlar vermişəm. Azərbaycanın latın əlifbasına, latın qrafikasına keçməsi haqqında fərman vermişəm. Bu, artıq avqust ayının 1-dən tətbiq olunubdur. Çox məmnunam ki, mən buna nail oldum. Çünki bəziləri etiraz edirdilər ki, qısa müddətdə buna nail olmaq olmaz. Amma oldu. ***Bütün dövlət orqanlarında***, hakimiyyət orqanlarında, təkcə dövlət, hakimiyyət orqanlarında yox, təhsildə, səhiyyədə, biznes sahəsində, ***hər yerdə*** Azərbaycanın dövlət dili, ana dili, Azərbaycan dili hakim olmalıdır" [XXXVIc.s.21].

Ona görə mən çox sevindim ki, bu gün mənə verilən məlumatlar bizim dövlətin siyasətinin həyata keçməsi istiqamətində məktəbin qurulmasını nümayiş etdirir. Burada bütün təhsil Azərbaycan dilində, dövlət dilində keçiriləcəkdir. Ancaq mənə məlumat verdilər ki, burada eyni zamanda uşaqların hansı dilə daha çox həvəsli olmasından asılı olaraq, başqa dillər – ingilis dili də, rus dili də, fransız dili də, ərəb dili də, başqa dillər də tədris olunacaqdır. ***Bəli***, təhsildə uşaqların, gənclərin gələcəyini təmin etmək üçün bizim siyasətimiz bundan ibarətdir.

Təhsildən, təhsilə sevgidən, təhsilə dövlət qayğısından söhbət getdiyi hər bir çıxış anında dil, dilə sevgi, dili qorumaq məsələləri Ulu Öndərin diqqət mərkəzindədir. "Məhz" dəqiqləşdirici ədatı ilə Azərbaycan xalqının zəngin irsini öyrənməyin Azərbaycan dili ilə həyata keçirilməsindən danışır: "Hər bir Azərbaycan gənci – bəlkə indi yaşlı adamlar üçün bu vəzifəni qoymaq mənim üçün düzgün olmaz – birinci növbədə, gərək öz dilini, ana dilini bilsin. Çünki bu, anasının dilidir. Bu, ölkənin dövlət dilidir və gənc bu dildə təhsil alsın, bu dildə yazsın, bu dildə oxusun. Məhz bu dildə Azərbaycan

xalqının zəngin tarixini, zəngin mədəniyyətini, əsrlər boyu yaranmış böyük irsini öyrənə bilsin" [XXXVIc.s.21].

Azərbaycan dilinə olan sevgini izah edən böyük natiq "əlbəttə" qəti təsdiq modalı ilə dildə problemləri olanların Azərbaycan üçün yararlı ola bilmədiyini dilə gətirir: "Ancaq biz xalqımızı, millətimizi, gəncləri bununla məhdudlaşdırmamalıyıq. Çünki bir halda ki, biz müstəqil dövlət kimi, Dünya Birliyində bərabərhüquqlu yer tutmuşuq, müasir dünya tələb edir ki, hər bir azərbaycanlı öz Azərbaycan dilini, dövlət dilini yaxşı bilərək, onu işlək dil hesab edərək, eyni zamanda başqa dili də – ingilis dilini də, rus dilini də, fransız dilini də, digər dilləri də bilsin. Əgər insan müstəqil Azərbaycanda öz ana dilini, Azərbaycan dilini bilmirsə, başqa dillərdə təhsil alırsa, əlbəttə, o, Azərbaycan üçün yararlı ola bilməz. Başqa dilləri öyrənmək, mənimsəmək lazımdır. Ancaq o şərtlə ki, təhsil Azərbaycan dilində keçirilsin. Azərbaycan dilində təhsillə yanaşı, başqa dillərin də çox mükəmməl öyrənilməsi təmin olunsun" [XXXVIc.s.21-22].

"Çox gözəl cihazlarla təchiz olunub", "çox gözəl şərait yaradılmışdır" ifadələri özlüyündə texniki estetikanı əks etdirir. Elə bu iki cümlədə təhsil etikası və texniki estetikanın dialektik vəhdətindən söhbət açılır: "Mən inanıram ki, bu yeni məktəb ***çox gözəl cihazlarla***, ləvazimatlarla təchiz olunub və burada ***çox gözəl şərait yaranmışdır.*** Belə bir məktəb mənim bu gün verdiyim tövsiyələri yerinə yetirəcəkdir və beləliklə də, daha da yüksək bilik almış, gələcək üçün hərtərəfli hazırlıqlı gənclər buraxacaqdır" [XXXVIc.s.22-23].

Prezident sarayında 3 sentyabr 2001-ci ildə ən yüksək bal toplayaraq ali məktəblərə qəbul olunmuş gənclərlə görüşdə təhsil etikası ilə yanaşı Ulu Öndər tibbi etik dəyərləri də təhsillə bağlı məsələlərə qoşa bilir: "Öz köklərinə görə Azərbaycan xalqı zehni inkişaf etmiş xalqdır" fikrini "bir daha", "bir daha" qüvvətləndirici ədatla təsdiqləyir: "Bu, eyni

zamanda onu göstərir ki, Azərbaycan xalqı inkişaf etmiş xalqdır. ***Azərbaycan xalqı öz köklərinə görə zehni inkişaf etmiş xalqdır***. Biliyə, inkişafa həmişə diqqət vermiş və bu yol ilə getmiş xalqdır. Bizim çoxəsrlik keçmiş tariximiz də bunu sübut edir. XX əsrdə Azərbaycan xalqının keçdiyi yol, o cümlədən, son on ildə Azərbaycan xalqının müstəqil dövlət çərçivəsində yaşadığı dövr də bunu ***bir daha, bir daha*** sübut edir [XXXVIc.s.28].

Təhsil etikasının təhsil işçiləri qolunda məsələnin "təkcə" ədatı ilə rektorlardan asılı olmadığını, "hər bir" təyin əvəzliyi digərlərindən də asılı olduğunu dilə gətirir: "Mən bunu etiraf etməliyəm" deyimi ilə Azərbaycan əxlaq kodeksinin formalaşmasında şəxsi izini qoyur! "Yox" inkar ədatı və söz-cümlə ilə təhsildəki "qüsur" və "nöqsan"ları səmimiyyətlə dilə gətirir. "Namus", "sədaqət" etik dəyərlərin daşıyıcıları olan müəllimləri auditoriyalara tanıdır. Ziddiyyət qanuna söykənən "vəziyyət müxtəlifliyi, eləcə də heç vaxt inkarı ilə etməməliyik ifadəsi nitqin ekspressivliyini yüksəldir: "Rektorlar burada iştirak edirlər. Bu, təkcə rektorlardan asılı deyil, hər bir müəllimdən, universitetdə fəaliyyət göstərən hər bir şəxsdən asılıdır. Bizdə bu sahədə də nöqsanlar var və çoxdur. Mən bunu etiraf etməliyəm. Mən indi nailiyyətlər haqqında geniş danışanda heç kəs elə düşünməsin ki, guya hesab edirəm ki, bizim bütün təhsil sistemi, o cümlədən orta təhsil sistemi ***qüsursuzdur, nöqsansızdır***. ***Yox***. Çox nümunəvi məktəblər də var. Ancaq ***təəssüflər*** olsun ki, geridə qalanlar da var. Yaxud bəzi məktəblərdə çox ***namuslu, sədaqətli,*** tələbəyə yaxşı ***bilik verən*** müəllim də var. Amma onunla yanaşı, vaxtını keçirənlər, tələbənin biliyi haqqında o qədər də çalışmayanlar da var. Vəziyyət müxtəlifdir və bu həqiqəti biz heç vaxt inkar etməməliyik. Bu sözlər, bu fikirlər universitetlərə də aiddir" [XXXVIc.s.30].

Təhsilin etik tərəflərini auditoriyalara aşılayan Heydər Əliyev "səmimiyyət" etik dəyərini də dilə gətirməkdən çəkinmir. "Müəllimlərin maaşları istənilən səviyyədə deyildir" ifadəsi ilə səmimi etiraf edir: "Məlumdur ki, məsələn, ***universitetlərdə müəllimlərin maaşları istənilən səviyyədə deyildir***. Biz bu məsələni də həll etməyə çalışırıq. Ancaq imkanlarımız artdıqca bunları edəcəyik. İndi biz imkanlarımız çərçivəsində nə mümkündür etmişik. Ancaq iş onda deyil ki, maaşın çoxdur, ya azdır, yaxud da sənin avtomobilin var, yoxsa yox, yaxud da ki, təmtəraqlı bağın var, yoxsa yox. İş onda deyildir. Qaçqın vəziyyətində yaşayan uşaq nə qədər böyük məhrumiyyətə düçar olubdur. Ancaq o oxuyub və ona təhsil verən müəllim də yəqin ki, müəllim adını ***şərəflə*** daşıyıbdır. Ona görə də gəlib ali məktəbə qəbul olunmuş 25 min tələbənin içərisində ***ən yüksək bal*** toplayıbdır" [XXXVIc.s.31].

Gənclər üçün ünvanlanmış, xüsusilə təhsil alan gənclər üçün xitabən deyilmiş fikirlər həm təhsil etikası baxımından, həm də ümumiyyətlə gəncliyin etik-əxlaqi kodeksi üçün yarayan bir kodeks olmaq baxımından əvəzsiz nitq nümunəsi sayılır. "Bax" əmr ədatı ilə təhsil alınan gənclik illərinin uğurla keçməsini arzu edir. Əsas tələb kimi "dərk etməni götürür. Nəyi dərk etməni? Təbii ki "Lazımi mənəvi dəyərləri, milli dəyərləri müasir dünyanı dərk etməni. "Bu illəri boş keçirməyin bu illəri itirməyin" ifadələri ilə insan və zaman fəlsəfəsinə toxunur. "Zamana hörmət etməyən, elə zamanın da qisasına tuş gələcək" müddəasını gənclərə anladır. Sonluq "yüksək mənəvi dəyərlər əsasında yaşayın"la bitir: "Universitetlərdə insan gənclik həyatını yaşayır. Mən sizə deyə bilərəm ki, bu, insanın həyatının ən gözəl bir hissəsidir. Mən arzu edərdim ki, bizim hər bir gənc, hər bir tələbə, ***bax***, bu dövrü uğurla keçsin. Çünki bu dövrdə gəncin formalaşması, onun lazımi bilik alması, lazımi mənəvi dəyərləri ***dərk etməsi***, milli

dəyərləri ***dərk etməsi***, müasir dünyanı ***dərk etməsi*** onun gələcəyinin əsasıdır, təməlidir. Əgər bu təməl gənclik dövründə, xüsusən ali məktəblərdə qoyulmasa, birincisi, gələcəkdə bizim gənclər böyük çətinliklərlə rastlaşacaqlar və ikincisi, gələcək nəsillərin istədiyimiz səviyyəyə qalxması çətin olacaqdır. Ona görə də, əziz övladlarımız, siz bilin, mən həyatın bütün mərhələlərini keçmiş bir adam kimi, arxaya baxaraq, hər dövrü təhlil edərək, həyat təcrübəsi olan adam kimi, sizə deyirəm: ***Bu illəri boş keçirməyin, bu illəri itirməyin***. Öz fiziki sağlamlığınıza fikir verin. Onun üçün də gərək siz sağlam həyat tərzində yaşayasınız. Çalışın, maksimum bilik alın. Siz təkcə müəllimlərin verdiyi biliklə kifayətlənməyin, başqa bütün ədəbiyyatla da tanış olun və ***yüksək mənəvi dəyərlər əsasında yaşayın"*** [XXXVIc.s.32-33].

"Düzgün yol", "düzgün tərbiyə" əxlaq anlayışları valideynlərə tuşlanır. "Sağlam fiziki və mənəvi həyat tərzini" gənclərə tövsiyə edir. Bu şərtlərə əməl olunduğu təqdirdə "daha da" qüvvətləndirici ədatı ilə Azərbaycanın gələcək həqiqi qurucuları ola bilmək şansını itirməməyə çağırır: "Təbiidir ki, o gecə barlarında vaxt keçirən gənclər hansısa imkanlı ailələrin adamlarıdır. Kasıb adam, kasıb ailənin uşağı oraya gedə bilməz. Ancaq o adamlar da bilməlidirlər ki, nə qədər imkanlı olursan ol, nə qədər zəngin olursan ol, gərək sən övladına ***düzgün yol*** göstərəsən, ***düzgün tərbiyə*** verəsən. Onun gecə barlarında müxtəlif əyləncələri üçün şərait yaratmayasan. Mən bunu valideynlərə müraciət edərək deyirəm. Ancaq gənclərə tövsiyəm odur ki, onlar sağlam fiziki və mənəvi həyat tərzi keçirsinlər. Belə olan halda siz həm ***daha da*** sağlam vətəndaş olacaqsınız, həm ***daha da*** yaxşı bilik alacaqsınız, belə olanda həm də Azərbaycanın gələcəyinin həqiqi qurucuları olacaqsınız" [XXXVIc.s.33].

Qars şəhərində (28 iyun 2002-ci il) Qafqaz Universitetinin fəxri doktoru diplomunun təqdim edilməsi mərasimində

müəllimə olan münasibətini bildirir. Təhsilə sevgini əsrarəngiz bir dillə auditoriyaya çatdırmaq Heydər Əliyev nitqinə xas ola bilər. Təkcə "tarix boyu" ifadəsinin anlamını verərək yaddaqalan nitq nümunəsi yaradır. Belə olub, indi də belədir və gələcəkdə də belə olacaqdır feilin bütün zamanları ilə tarix boyu ifadəsinin izahını verir. "Savadlandırmaq" sözünün sinonimi kimi alimlər auditoriyasında "təhsilləndirmək" ifadəsi ilə müəllimə olan sevgisini bəyan edir. Bu sevginin təsirinə düşən müəllim ordusu öz qiymətini sanki yenidən dərk edir: "Əziz dostlar, insan cəmiyyətində hər bir iş, hər bir sənət qiymətlidir. Ancaq ***tarix boyu*** belə olub, indi də belədir və gələcəkdə də belə olacaqdır ki, ***müəllimlik*** sənətindən, yəni insanları təhsilləndirmək, sizin sözünüzlə desək, eyniləşdirmək sənətindən uca sənət yoxdur. Bizim Azərbaycanda artıq on illərə belə bir adət var – insanlar insanlara müraciət edəndə, hörmət əlaməti olaraq, müəllim deyirlər. Çünki müəllim, həqiqətən də böyük hörmətə layiqdir" [XXXIXc.s.306].

Auditoriya öncə sadə vətəndaşın yüksək ad daşıdığının fərqinə varır. "Ancaq" ziddiyyət bağlayıcısının, "da" qüvvətləndirici ədatının istifadəsi ilə müəllimin cəmiyyətdəki rolunu təhsil işçilərinin qarşısında göylərə qaldırır. "Bilirsiniz" modal sözü ilə auditoriyada düşündürücü bir ovqat yaratmaqla müəllimdən alınan mükafatın qiymətini bəyan edir: "Mən ***bəy*** olmamışam, ***bəy*** deyiləm və ***bəy də*** olmayacağam. Mən Azərbaycanın sadə vətəndaşıyam. Bu addan yüksək ad yoxdur. ***Ancaq*** bundan ***da*** yüksəyi ***müəllimdir***. Ona görə Azərbaycanda biz bunu həmişə belə düşünmüşük. Mən də uzun illər, sovet dönəmində də Azərbaycanın başçısı olduğuma, indi 9 il də müstəqil Azərbaycanın prezidenti olduğuma görə, cəmiyyətimizin hansı təbəqəsinin nə qədər hörmətə malik olduğunu şəxsən belə düşünürəm. Bu gün müəllimlərin,

tələbələrin iştirakı ilə sizdən aldığım bu fəxri ad da müəllimlərin mənə verdiyi mükafatdır.

***Bilirsiniz***, mən dövlətlərdən çox mükafatlar almışam. ***Həm*** sovet dövlətindən, ***həm*** digər dövlətlərdən mənim çox ordenlərim var. Əgər onların hamısını taxsam, döşümə yerləşməyəcək. ***Amma*** müəllimdən alınan mükafat, müəllimdən alınan qiymət hamısından ***üstündür"*** [XXXIXc.s.308].

Bakının Suraxanı rayonundakı 275 nömrəli məktəbdə Bilik gününə və yeni dərs ilinin başlanmasına həsr olunmuş mərasimdəki çıxış nitq mədəniyyəti baxımından öyrənilməyə layiqdir. Nitqin girişində uşaqlar və məktəblilərə "əziz", müəllimlərə isə "hörmətli" deyə müraciət edir. Təhsili canlılaşdıraraq ona uğurlar arzulayır. Təhsil Heydər Əliyev üçün abstrakt, cansız, mücərrəd bir anlayış yox, məhz canlı anlayış kimi təqdim edilir. Və gələcək üçün "Çalışmağı", "əziyyət çəkməyi" təhsillə eyni tutur: "Əziz uşaqlar! Əziz məktəblilər! Hörmətli müəllimlər!

...Bu, eyni zamanda, sizə dərs verən, sizi tərbiyələndirən ***müəllimlərdən*** asılıdır. Ona görə mən bu gün həm sizin məktəbin müəllimlərinə, həm də Azərbaycanın bütün müəllimlərinə tövsiyə edirəm ki, onlar öz vəzifələrini daim şərəflə yerinə yetirsinlər, Azərbaycanın təhsilinə yeni-yeni uğurlar arzulayıram. Çünki Azərbaycanın bu günü və gələcəyi üçün çalışmaq, əziyyət çəkmək və birinci növbədə təhsil almaq lazımdır" [XLc.s.427].

Siyasi etikanın tələblərinə uyğun olaraq dövlət rəhbəri təhsili yerinə yetirməyə məsul olan müəllimlərə öz vəzifələrini "şərəflə yerinə yetirməyi" tövsiyə edir. "Mən öz müəllimlərimə daim minnətdar olmuşam, bu gün də minnətdaram və ümid edirəm ki, siz də müəllimlərinizi sevəcəksiniz" deməklə təhsildə müəllimlərin də boynuna düşən məsuliyyət yükünü onların yadına salır: "Bizim həyatımızda ***müəllimlik*** ən hörmətli peşədir. ***Müəllim*** cəmiyyətimizdə görkəmli yer

tutur. Müəllimə hamı hörmət edir və hörmət etməlidir. Çünki sizi də və keçmişdə bizi də həyata hazırlayan, böyüdən və bu günlərə çıxaran müəllimlər olubdur. ***Mən öz müəllimlərimə daim minnətdar olmuşam, bu gün də minnətdaram və ümid edirəm ki, siz də müəllimlərinizi sevəcəksiniz***, müəllimlərinizə hörmət edəcəksiniz. Müəllimlərinizdən maksimum bilik almağa çalışacaqsınız. Ancaq müəllimlər də sizə ***böyük qayğı*** ilə yanaşacaqlar. Sizə yaxşı təhsil verəcəklər, dərs saatlarını səmərəli kecirəcəklər. Beləliklə, məktəb öz nəticəsini verəcəkdir" [XLc.s.427].

Təhsilin elmin inkişafı üçün maddi-texniki bazanın inkişafı ilə yanaşı, texniki estetikanın da rolunun inkaredilməzliyini vurğulayan Heydər Əliyev burada da dövlətin qayğısını önə çəkir: "Mən burada demək istəyirəm – bəlkə də bu, uşaqlara o qədər də aid deyildir – biz Azərbaycanda məktəblərin inkişafı üçün ciddi tədbirlər görməliyik. Mən bu gün bəyan edirəm ki, bu yaxın zamanlarda Azərbaycan məktəb tikintisi, məktəblərin müasir avadanlıqla təmin olunması, təmir edilməsi ilə əlaqədar ciddi tədbirlər haqqında öz təkliflərimi irəli sürəcəyəm. Düşünürəm ki, biz bu sahəyə daha çox qayğı göstərməliyik" [XLc.s.428].

Etik dəyərlərə söykənmədən hüquqi dövlət qurmağın mümkünsüzlüyü auditoriyalara aydın və səlis bir dillə çatdırılır. Təhsilin "ayrı-ayrı adamlara dəxli olan iş" olmadığını, bu işin "millət və dövlətlə" bağlılığını qeyd edir: "Biz bu gün də Azərbaycanda, cəmiyyətimizdə ***pak*** və ***ülvi mənəviyyatı*** bərqərar etmək üçün tələbə qəbulu kompaniyasına xüsusi fikir verməliyik. Çünki bu, sadə, yəni ayrı-ayrı adamlara dəxli olan iş deyildir. Bu, dövlətin, millətin gələcəyi ilə bağlı bir işdir" [IIc.s.105].

"Bilik-savad", "əsər-əlamət" kimi xəlqiliklə zəngin ifadələrin və "amma" bağlayıcısının köməyi ilə təhsilimizə əngəl olanları da qınağa çəkir: "Biz keçmişdə diplomlu savadsızları

da çox görmüşük. Bəzilərinin uç diplomu var idi. ***Amma*** başında ***bilik-savaddan əsər-əlamət*** yox idi. Diplomları başqa yollarla alanlar da vardı. Onlar indi də yaşayırlar, bəziləri hətta yaxşı, çox firavan yaşayırlar" [IIc.s.106].

Etik anlayışların əsasında duran "cavabdehliyi" təkrar nitq elementi ilə bir neçə dəfə təkrarlayır. Xalqın bu günü və gələcəyi üçün cavabdehliyi "məhz" dəqiqləşdirici ədatının köməyi ilə bir daha yaddaqalan edir. Məsuliyyətdən özünü kənara çəkməyərək səmimi bir dillə "bəli" təsdiq ədatı ilə cavabdehlik anlayışını şüurlarda təzələyir: "İndi biz müstəqil dövlətik, öz respublikamızın, öz taleyimizin sahibiyik. Xalqımızın bu günü və gələcəyi üçün ***cavabdehik***. ***Məhz*** biz cavabdehik. Biz deyəndə, mən birinci növbədə ziyalıları nəzərdə tuturam. Alimlərimizi, ali məktəblərimizdə çalışan yüksək ***səviyyəli, bilikli və zəngin təcrübəli*** şəxsləri nəzərədə tuturam. ***Bəli***, biz hamımız Azərbaycanın gələcəyi üçün cavabdehik, gənc nəslin yetişməsi üçün cavabdehik" [IIc.s.166].

Ulu Öndərin müxtəlif üslublu, çeşidli auditoriyalardakı çıxış, nitq, bəyanatlarına azərbaycançılıq hopmuşdur ki, biz bunu etik anlayışların çatdırılmasında da görürük. Azərbaycan, azərbaycanlı, azərbaycançılıq məfhumları burada da tez-tez təkrarlanır. Heydər Əliyev "Yüksək təhsil görmüş azərbaycanlılar Azərbaycanın milli sərvətidir" ifadəsini təhsil səhnəmizə gətirir: "Lakin biz bu günümüz, müstəqil Azərbaycanın gələcəyi haqqında düşünsək, gənc nəslin tərbiyəsinə ciddi fikir versək, ən əvvəl ali təhsil almağa qadir, yəni buna öz biliyi, zəkası, fitri istedadı ilə layiq olan gənclərin ali məktəblərə qəbul olunmasını təmin etsək, onda gələcəyimiz üçün böyük işlər görmüş olarıq. Yadınızda olar, 1970-ci ildən başlayaraq, hər il ali məktəblərə qəbul məsələləri ilə ciddi məşğul olur, tədbirlər görürdük. O illərdə biz başqa respublikalarda, Moskvanın və digər şəhərlərin ali məktəblərində təhsil almaq üçün hər il 600–900 gənc göndərirdik. İndi onla-

rın bir çoxu Azərbaycanda müxtəlif sahələrdə çalışır. Neçə-neçə adam başqa respublikalarda, xarici ölkələrdə yaşayır. Onların hamısı Azərbaycanın sərvətidir. Onlar burada olmasalar da, yenə də azərbaycanlıdır, Azərbaycanın milli sərvətidir"[ IIc.s.170].

Təhsilimizin inkişafına əngəl olan antietik hallara qarşı mübarizənin həmişə önündə duran Ulu Öndər deyirdi: "Ona görə də təhsil nazirliyinin müavinlərinə, ali məktəblərin rektorlarına, ***ümumiyyətlə***, təhsil sahəsində işləyən ***vicdanlı, namuslu, saf mənəviyyatlı*** adamlara müraciət edirəm: hər bir kəs mənim bu sözlərimi nəzərə alaraq, öz işinin, öz vəzifəsinin əhəmiyyətini başa düşsün və bilsin ki, kimdən nə tələb olunur. Tələb isə o qədər də böyük deyildir: xalqımıza, Vətənimizə, müstəqil dövlətimizə ***sadəqətlə, təmiz niyyətlə, saf mənəviyyatla*** xidmət etmək. Kim bunu bacarmırsa, ***qoy*** başqa sahələrə getsin. İndi o qədər sahə var ki, oralarda bu tələblər çox da vacib deyildir. Ancaq bizim bu müqəddəs sahələrimizi bundan sonra da ***ləkələmək, rüsvay etmək*** olmaz. İndiyədək olanlar bəsdir. Çirkin əməllərə son qoymaq lazımdır" [IIc.s.109]. Yuxarıdakı bu kiçik mətn dilçilikdə işlədilən "cümlədə sözlərin yeri dar, mənalar geniş olmalıdır" anlamına gəlir. Öncə təhsilimizin gələcəyi naminə "vicdanlı, namuslu, saf mənəviyyatlı" sinonim cərgənin və "ümumiyyətlə" modal sözünün köməyi ilə təhsil işçilərinə müraciət olunur. Müraciətdə "başa düşsün", "bilsin" kimi feilin əmr şəkilləri ilə auditoriya səfərbər olunur. Təhsil işçilərindən tələb olunan xidmət də sinonim cərgə ilə "sədaqət, təmiz niyyət, saf mənəviyyat" verilir. Təhsili "müqəddəs sahə" elan edən ümumilli lider sinonimlərlə verilən antietik "ləkə, rüsvay" ifadələri vasitəsi ilə mənfi halları qamçılayaraq fikrini ayıldıcı zərbə təkin səslənən "son qoymaq lazımdır" ifadəsi ilə yekunlaşdırır.

Təhsilin etik kateqoriya olması Heydər Əliyevin nitqində aydın bir dillə ifadə olunur. Təhsilin olmadığı dövrləri Ulu Öndər "qaranlıq keçmiş" adlandırır. "Savadsızlıq, gerilik, ətalət" sinonim cərgəsi ilə təhsil problemlərini önə çəkir: "Əsrin əvvəlindən indiyə qədər Azərbaycanın ərazisində, xalqımızın həyatında, təhsil, elm, mədəniyyət, şüurun inkişafı sahəsində çox böyük işlər görülüb, böyük nailiyyətlər əldə olunub. O qaranlıq keçmişdən sonra indi respublikamızda xalqın bütün təbəqələrini əhatə edən yüksək mədəniyyət, təhsil, elm mövcuddur" [IIc.s.170].

Etikanın müxtəlif tərəflərə – texnoloji, ekoloji, sosial, fəlsəfi tərəflərə malik olduğu başa düşülən çağımızda təhsil bu etik tərəflərin zirvəsindədir. Təkcə təhsilin etik kateqoriya kimi rolunun kütlələrə aşılanması, auditoriyalarda səslənməsi, bir daha dövlətçiliklə, milli ideologiya ilə etikanın üzvi surətdə bağlılığını göstərir.

Gənclik və gənclər böyük natiqin dilində bilik, təhsil, elmlə birgədir. Ömrün gənclik illərinin estetik bir dillə auditoriyalara çatdırılması, eləcə də gənclik qarşısında qoyulan əxlaq prinsipləri açıqlanır: "Siz gəncsiniz. Bu gün sizin qarşınızda böyük vəzifələr durur. Amma sonra gələn nəsillər sizin təcrübənizdən, yaratdığınız işlərdən istifadə edəcəklər. Siz də Azərbaycanın həyatında öz xidmətlərinizi göstərərək, ölkəmizi inkişaf etdirərək, sonra gələn nəsillərə böyük irs qoyacaqsınız. Ona görə də gənclik xoşbəxtlikdir. Bunu bilin, insanın həyatında gənclik dövründən gözəl dövr yoxdur. Hər bir gənc isə bu gənclik dövründən gərək maksimum səmərəli istifadə etsin. Gənclik dövründə boş, mənasız keçirilən bir gün sonra böyük itkilərə gətirib çıxarır. Hər gündən, dəqiqədən səmərəli istifadə olunmalıdır ki, gənc nəslimiz yaxşı bilik, təhsil alsın, elmin, həyatın bütün sahələrində olan təcrübəni mənimsəsin, həyatda, cəmiyyətdə həm özü, həm də ölkə, xalq üçün faydalı olsun" [VIIIc.s.387].

Bu kiçik mətndə təhsil etik kateqoriya ilə yanaşı "vaxt", "zaman" etikasına təsadüf edirik. "Gənclik dövrü", "boş və mənasız keçirilən bir gün", "hər gündən, dəqiqədən səmərəli istifadə" anlayışları "gənc nəslimiz yaxşı bilik, təhsil alsın" fikirləri ilə harmoniya yaradır.

"Təhsil" etik kateqoriyası Heydər Əliyevin dilində elmi-publisistik üslubun üstünlük təşkil etdiyi auditoriyalarda, xüsusilə ali və orta məktəb kollektivləri qarşısındakı çıxışlarda səslənir. Təhsil, gənclik, millətin gələcəyi dialektik vəhdətindən söz açan Ulu Öndər gənclərin ali təhsil almasını təkmilləşdirməyi əsas məqsəd hesab edir: "Gənclər xalqımızın, millətimizin, ölkəmizin gələcəyidirlər. Mən Azərbaycan dövlətinin başçısı, prezidenti kimi hazırki işlərlə, problemlərlə yanaşı, daim respublikamızın gələcəyi haqqında düşünürəm, ona qayğı göstərirəm və bunun üçün bu gün imkanım daxilində olan bütün tədbirləri həyata keçirirəm. Bu tələblərin biri də Azərbaycan gənclərinin ali təhsil almasının təkmilləşdirilməsidir" [XIIc.s.113].

Bu gün də Heydər Əliyev ideyaları filosoflar tərəfindən həyata keçirilir: "Azərbaycan da öz təhsil sistemini modernləşdirmək niyyətindədir. Bu gün təhsildəki islahatları heç kəs inkar etmir. Sadəcə dünyada və bizdə baş verən dəyişiklikləri öyrənməli, tətbiq etməliyik" [3].

29 avqust 1997-ci ildə Azərbaycanın və xarici ölkələrin ali məktəblərinə qəbul olunmuş tələbələrin bir qrupu və onların valideynləri ilə görüşdə giriş nitqi etik anlayışlarla zənginliyi ilə seçilir. "Ləyaqət", "dəyər", "sədaqət" kimi anlayışlar təhsil anlayışı ilə sıx əlaqədə verilir. "Mən bunu belə qəbul edirəm ki, siz hamınız söz verirsiniz ki, yaxşı oxuyacaqsınız, yaxşı təhsil alacaqsınız, respublikamızın ***dəyərli, layiqli*** vətəndaşları olacaqsınız və ölkəmizə, millətimizə, xalqımıza ***sədaqətlə*** xidmət edəcəksiniz. Əminəm ki,

belə də olacaqdır. Mən sizin sözlərinizi bir and kimi qəbul edirəm" [XIIc.s.121].

Bu gün də etikanı dövlətçilikdən uzaqda, ayrıca tədqiq etməyə çalışan filosoflara Heydər Əliyevin nitqində elmi üslubda hazır cavablar mövcuddur. Bu cavab milli dövlət quruculuğunun əsasını təşkil edən milli ideologiyanın söykəndiyi elm və təhsilin rolunun auditoriyalara açıqlanmasıdır: "Dediyim kimi, bizim milli ideologiyamızın konsepsiyası olmalıdır. Şübhəsiz ki, bu konsepsiya tarixi keçmişimiz, milli, mədəni, dini ənənələrimiz üzərində qurulmalıdır. Biz XX əsrdə cürbəcür mərhələlərdən keçdik, ayrı-ayrı ideologiyaların təsiri altında qaldıq. İndi xalqımız hər cəhətdən azaddır. Ona görə də lazımdır ki, ***ümumiyyətlə,*** düşünən beyinlərimiz, alimlərimiz və o cümlədən təhsil sahəsində çalışan müəllim ordusu milli ideologiyamızın formalaşması üçün öz fəaliyyətini göstərsin" [IIc.s.173].

Təkcə bu mətndə XX əsrdə milli ideologiyamızın yad təsirlərə məruz qalması, bu gün qloballaşma dediyimiz dünyanın yeni düzənində öz milli ideologiyamıza, öz milli etik dəyərələrimizə sahib çıxmaq ön plana çəkilir. Bu ideologiyanın həyata keçirilməsində rolu olan şəxsləri "***ümumiyyətlə***" modal sözü ilə sıralayır (düşünən beyinlər, alimlər, müəllim ordusunu təşkil edən müəllimlər), qüvvətləndirici "ən" ədatının köməyi ilə müəllimin əsas vəzifəsini auditoriyaya çatdıran böyük natiq bu vəzifənin "şərəfli" olduğunu bəyan edir. Və bu vəzifənin şərəfliliyini növbəti sinonim cərgə ilə açıqlayır. "Dəyərli, bilikli, zəkalı, tərbiyəli, vətənpərvər" vətəndaş anlamı ilə ilk baxışda mütləq sinonim oxşarlığı tapılsa da, sonda bu cərgənin hər bir üzvünün dərin mənalara malik etik kateqoriyalar olması anlaşılır.

"Şübhəsiz ki" qəti təsdiq modal sözü və "öz" təyin əvəzliyini üç yerdə işlədərək müəllimin cəmiyyətdə tutduğu yeri bir daha yada salır.

"Ona görə" səbəb bağlayıcısı ilə müəllimlər ordusu fəth olunur. Sonda məktəbin bir proses kimi, bir orqanizm kimi inkişafda olduğunu fəlsəfi bir dillə nümayiş etdirir: "Ancaq məktəbin, müəllimlərin ***ən*** əsas vəzifəsi bizim cəmiyyətimizə, xalqımıza, ölkəmizə dəyərli vətəndaşlar hazırlamaqdır. Müəllim vəzifəsi ona görə şərəflidir ki, o, cəmiyyət üçün ***ən dəyərli, bilikli, zəkalı, tərbiyəli, vətənpərvər*** vətəndaşlar hazırlayır. Şübhəsiz ki, birinci növbədə müəllim ***özü*** bu xüsusiyyətlərə malik olmalıdır, daim ***özünü*** də təkmilləşdirməlidir, ***öz*** üzərində işləməlidir. Öz üzərində işləməyən müəllim yaxşı müəllim ola bilməz. Bizim müəllimlərin əksəriyyəti ***ona görə*** yaxşıdırlar ki, onlar daim öz üzərində işləyir, tədris etdiyi fənni dərindən öyrənirlər, ictimai-siyasi sahədə biliklərini artırır və günü-gündən özlərini təkmilləşdiririrlər. Məktəb elə bir prosesdir, orqanizmdir ki, burada hamı – şagird də, tələbə də, müəllim də, bütün kollektiv də inkişafdadır" [XIIc.s.141].

Yarımfəsli ölkə prezidenti İlham Əliyevin təhsilimizin gələcəyi ilə bağlı nikbinliklə səslənən çıxışı ilə yekunlaşdırırıq: "Təhsilə xüsusi diqqət yetirilir. Son onillikdə üç minə qədər yeni məktəb binası inşa edilmişdir. Təhsilin keyfiyyəti ilə bağlı islahatlar aparılır. Hesab edirəm ki, yaxın gələcəkdə bu islahatların nəticəsini görəcəyik. Eyni zamanda dövlət vəsaiti hesabına gənclər dünyanın ali məktəblərinə oxumağa göndərilir ki, ölkənin gələcək inkişafında öz sözünü deyəcək".

Dilçi alimlərimizin, filosoflarımızın, təhsil sistemində fəaliyyət göstərən ziyalılarımızın Ulu Öndərin etik kateqoriya kimi təhsil barədəki fikir və düşüncələrinin birgə araşdırmalarının vaxtı çatmışdır.

Beləliklə, Heydər Əliyevin təhsillə bağlı etik müddəalarını aşağıdakı kimi vermək olar:

– “Ləyaqət”, “dəyər”, “sədaqət” kimi anlayışlar təhsil anlayışı ilə sıx əlaqədə verilir;

– “Təhsil” etik kateqoriyası Heydər Əliyevin dilində elmi-publisistik üslubun üstünlük təşkil etdiyi auditoriyalarda, xüsusilə ali və orta məktəb kollektivləri qarşısındakı çıxışlarda səslənir;

– Azərbaycanın təhsil işçiləri və ali məktəblərə daxil olmuş tələbələrlə görüşdəki nitqində Ulu Öndər təhsil-dövlətçilik, təhsil-estetika, təhsil-diplomatiya vəhdətini özünəməxsus rəvan bir dillə auditoriyalara ünvanlayır.

## 1.2.5. Heydər Əliyevin nitqində ekoloji etika

Ekoloji etika – ən yeni etik və davranış konsepsiyası kimi müasir elmi biliklərə əsaslanaraq, insanla təbiət arasındakı əxlaqi münasibətlər haqqında təlim olmaqla təbiətin əxlaqi tərəfdaş kimi qəbul edilməsi, bütün canlıların bərabərhüquqlu və eyni dəyərə malik olması, insanların hüquq və tələbatlarının azaldılması prinsiplərinə əsaslanır [72, 91, 138]. Onun əsas prinsipi həyatın əsası və dəyərinin ekosistemin tamlığından ibarət olmasına əsaslanan ekosentrizm prinsipidir. Bu prinsipə görə, istənilən canlı varlıq yalnız ekosistemin tamlığı şəraitində yaşayıb inkişaf edə bilər. Ekoloji etikanın etik problemləri öz təcili həllini tələb edən problemlər olub, cəmiyyətin reaksiyaları əsasında formalaşmışdır. Stresslər, kanserogenlər, ətraf mühitin çirklənməsi insanları dəyişdirir, onların sağlamlığına ciddi ziyan vurur, geofondu pisləşdirir və etiologiyasına (davranış normalarına) çox güclü neqativ təsir göstərir [79, s.255; 188, 192].

Ekoloji etika klassik etika ilə ekologiyanın təmas hüdudlarında meydana gəlmiş, təbiət elmləri ilə ictimai elmlərin qovşağında yaranmış elmlərarası kompleks elmi-tədqiqat sahəsidir [121,176]. Tətbiqi xarakterə malik olduğundan bu elmin predmetini konkret fəaliyyətlərin, insanın təbiətə və onun hər bir elementinə qarşı əxlaqi münasibətlərinin qiymətləndirilməsi təşkil edir. Onun metodları konkret şəraitdən asılı olaraq – dialektik, sistemli yanaşma, təkamül, ekstrapolyasiya, müşahidə, eksperiment və s. ibarət olmaqla özünün təbiəti mühafizə fəaliyyətlərini iki əsas istiqamətdə həyata keçirir:

1.İnsanlar təbiəti rifahı naminə hərəkətlər edərək və ya etməyərək təbiəti mənfəətə görə yox deyil, təbiət naminə qorumalıdır.

2.Təbiəti mühafizə tədbirləri yalnız əxlaqi prinsiplər əsasında, insanların iqtisadi maraqları nəzərə alınmadan həyata keçirilməlidir.

Ekoloji etikanın məqsədləri aşağıdakılardır:

– təbiətə qarşı mövcud olan köhnə, insanın təbiətin mərkəzində və zirvəsində dayandığı tezisə əsaslanmış antihumanist, istehlakçı təsəvvürlərin dağıdılması (antroposentrizm);

– hər şeyin insanın və onun rifahı naminə olmadığı fikrinə əsaslanmış yeni ekoloji dünyagörüşü təsəvvürünün formalaşması [80,s.256].

Bütün tarix boyu torpağın məhsuldarlığı, bir qayda olaraq, cəmiyyətin qayğı obyekti hesab olunmuş və insanların diqqətini həmişə cəlb etmişdir. Lakin torpağın həddindən artıq intensiv istismarı, ondan düzgün və məqsədyönlü istifadə olunmaması, aqrotexniki qaydalarına düzgün riayət edilməməsi, kimyəvi preparatların sistemsiz tətbiqi, onların torpağı çirkləndirməsi, eroziyaya uğraması, şorlaşması, şəhərlərin və yolların genişlənməsi, şəhər, qəsəbə, sənaye obyektlərinin inkişafı və s. onun ekoloji tarazlığını pozmaqla məhsuldarlığının azalmasına zəmin yaradır [80]. Torpaqların məhsuldarlığının müxtəlif yollarla qorunub saxlanması və gələcək nəsillərə təhvil verilməsi bəşəriyyətin müasir qlobal ekoloji problemlərindən ən prioritet kimi dəyərləndirilməli və bunun üçün elmi müddəalara əsaslanan müvafiq tədbirlər kompleksi işlənib hazırlanmalıdır [80].

BMT-nin XXI əsr üçün nüfuzlu beynəlxalq təşkilatlar, eləcə də dünya ölkələrinin rəhbərləri və hökumətləri qarşısında qoyduğu müasir tələblər aşağıdakı kimidir: “Təmiz torpaq-təmiz su-təmiz hava-ekoloji cəhətdən saf yeyinti məhsulları-ekoloji sanitariya və gigiyena tələblərini ödəyən ətraf mehit, məişət və yaşayış şəraiti – güclü iqtisadiyyat, əhalinin

maddi rifahı və sağlamlığının yaxşılaşdırılması və təmin olunması= Davamlı İnsan İnkişafı [80].

Beynəlxalq ekoetika ittifaqının prezidenti O. Kinne 6 tezis və 4 nəticədən ibarət ekoetik sistem yaratmışdır ki, həmin ekosistemin əsas momentləri aşağıdakılardır:

1. Biz təbiətin bir hissəsi kimi onu yenidən qurmağa cəhd etməməliyik;
2. Ekoloqlar ekoloji bilikləri inkişaf etdirməli, ekosistemlə bağlı üzərlərinə məsuliyyət götürməlidirlər;
3. Ekoloji cəhətdən yaxşını və pisi ayırd etməlidirlər;
4. Alturizm və məhəbbət ideallarını əldə rəhbər tutaraq qənaət, mötədillik, məsuliyyət kimi yeni dəyərləri inkişaf etdirmək, qarşıya sülh, azadlıq, ləyaqət. Elə buradaca ekoetikanın əxlaq fəlsəfəsi və teologiya ilə əlaqəsi açıqlanır;
5. Elmi bilikləri qəbul etməyən eqoizm və etik doktrinlərdən imtina etməli;
6. Bəşəriyyəti həyat səhnəsindən çıxarmaq gücündə olan müharibələr, xəstəliklər, aclıq və yoxsulluqlar, faciələrlə mübarizədə iradə gücünə malik olmaq; [201]

Torpağın mühafizə məsələlərinin elmi əsaslarla işlənilməsi – vaxtında və düzgün istifadə edilməsindən, onun üzərində nəzarətin olmasından, mövcud meşə zolaqlarının saxlanılmasından və əlavə olaraq salınmasından, torpağın tullantılar və zərərli kimyəvi maddələrlə çirklənmələrdən qorunmasından, heyvanların otarılmasının düzgün təşkil edilməsindən, eroziyaya qarşı mübarizə tədbirlərinin təşkil edilməsindən, çeyilliklərin qurudulmasından, suvarmanın düzgün təşkil edilməsindən, qum hücumunun qarşısının alınmasından, suların tərkibinə nəzarət edilməsindən, sanitar-gigiyena mühafizə tədbirlərinin yerinə yetirilməsindən, tikinti və yol işlərində, kimyəvi maddələrin tətbiqində mövcud tövsiyələrin gözlənilməsindən, alaq otları ilə mübarizədən və s. ibarətdir. Belə

olduqda torpağın məhsuldarlığı artır və xarab olmaqdan qorunur. Torpaq plansız surətdə istifadə olunduqda, ona nəzarət edilmədikdə, çirkləndikdə xarab olur, gücdən düşür [80,s.526-527].

Torpağı eroziyadan, şoranlaşmadan, defolyasiyadan qorumaq üçün mövcud kompleks təsərrüfat, təşkilat, aqrotexniki, meliorasiya, meşəsuvarma, hidrotexnika və rekultivasiya tədbirləri görülməlidir. Neft-qaz kəmərləri çəkildikdə, tikinti işləri aparıldıqda ərazinin çox korlanmasına yol verilməməlidir [80,s.527].

Ekoloji etikanın başlıca müddəaları, ekoloji elementlərin qorunmasına yönələn dövlət tədbirləri, ekoloji problemlərin həlli yolunda insan amili Heydər Əliyevin sadə, anlaqlı nitqində kütlələrin şüuruna çatdırılır. Ekoloji tarazlığın pozulması məntiqi təfəkkürə söykənən elmi-məişət üslubun köməyilə auditoriyalara ünvanlanır: "Mal-qaranın sayının artırılması haqqında bir az düşünmək lazımdır. İndi biz sevinirik ki, hamısı artır. ***Amma düşünmək lazımdır ki, bunlar üçün otlaqlar varmı?*** Biz Bakıda bəzi belə müşahidələr aparırıq. Ekologiya Nazirliyindən də mənə məlumatlar verilir. Azərbaycanda xırdabuynuzlu, iribuynuzlu mal-qara çoxalıbdır, otlaqlar isə azdır. Mal-qaranı meşələrə buraxırlar, meşələri otarırlar. Yaxud təkcə meşələr deyil. Azərbaycanın, o cümlədən Naxçıvanın təbiətinin təbii sərvətlərindən biri də onun həm torpaqlarıdır, həm də otlaqlarıdır.

Biz bunu Azərbaycanda edəcəyik. Amma mən burada sizin qarşınızda birinci dəfə deyirəm ki, gərək müəyyən edək, otlaqlara zərər vurmadan, meşələrə zərər vurmadan nə qədər mal-qara saxlamaq olarsa, o qədər saxlayaq. ***Əgər*** ondan artığı bizim təbiətə, otlaqlara, meşələrə zərər vurursa, onun qarşısı alınmalıdır. Görürsünüz, biz əvvəl istəyirdik artıraq. İndi mən sizə deyirəm ki, bu barədə fikirləşin. ***Çünki vətən bizimdir,***

***torpaq bizimdir***. Hər şeyi indi mal-qaraya verək, yesin, dağıtsın, otlaqlar dağılsın, ***10 ildən, 15 ildən sonra bizim torpaqlar necə olacaq? Buna yol vermək olmaz***" [XXXIXc.s.184]. Yuxarıdakı mətndə mai-qaranın artması ilə otlaqların sıradan çıxması arasındakı mütənasibliyin pozulması auditoriyaya "amma" qarşılaşdırma bağlayıcısı və ritorik sualla – "Amma düşünmək lazımdır ki, bunlar üçün otlaqlar varmı?" – ünvanlanır. Torpaqları və otlaqları təbii sərvət hesab edərək "əgər" şərt bağlayıcı və feilin əmr şəkli (yesin, dağıtsın), növbəti ritorik sualla (10 ildən, 15 ildən sonra bizim torpaqlar necə olacaq?) sonda qətiyyətli (buna yol vermək olmaz) dövlət başçısı nitqi auditoriyanı səfərbər edir.

Ətraf mühitin qorunmasına, ətraf mühitə sevgiyə səsləyən rəvan nitq hər yerdə işə düşür. Böyük natiqin ekoloji şüurun formalaşmasına xidmət edən nitq nümunələri bu gün də dövlət ekoloji xidmət əməkdaşları üçün, ekologiya ilə bağlı elmi-tədqiqatla məşğul olanlar üçün əvəzsiz nitq nümunələridir.

Ölkə prezidenti İlham Əliyevin çıxışlarında ekoloji vəziyyət həmişə diqqət mərkəzində qalır: "İnsanın sağlamlığı, ekoloji vəziyyət, udduğumuz hava, içdiyimiz su-bütün bunlara biz çox böyük diqqət göstərməliyik" [80,s.27].

Mən çox məmnunam ki, artıq Qaraşəhər anlayışı aradan qalxıb və bizim gənc nəslə mənsub olan soydaşlarımız, vətəndaşlarımız bəlkə də bunu heç bilmirlər. Mənim xatirimdədir, 1970-ci illərin təxminən ortasından biz bu Qaraşəhərin bütün iqlimini, atmosferini zəhərləyən zavodları, fabrikləri tədricən dağıtmağa başladıq və dağıtdıq. Onların yerində müasir texnologiyaya malik olan zavodlar, müəssisələr yaratdıq, bu ərazinin çox hissəsini isə yaşayış binaları tikilməsinə ayırdıq və burada yaşayış binaları tikildi. İndi demək olar ki, Qaraşəhərdən elə bir nişanə qalmayıbdır. Ancaq bəzi nişanələr var. O nişanələr – yerə hopmuş neft, mazut torpaqda qalıbdır

və ərazinin bir neçə hissəsində torpaq hələ mazutludur, neftlidir, təmiz deyil. Ona görə də bu işi davam etdirmək lazımdır.

Ümumiyyətlə, vaxtilə Bakının ətrafında neft mədənləri işləyərkən, quyulardan neft çıxarkən, həm torpağın dağıdılması, həm də torpağa neft qarışması prosesi uzun illər olubdur. Vaxtilə biz onları aradan qaldırmaq üçün proqramlar yaratmışdıq, ancaq bəzi səbəblərə görə o proqramlar həyata keçirilməyib. Hesab edirəmki, bu hamımızın borcudur ki, biz təkcə indi olduğumuz yeri yox, ətraf sahələri də təmizləməliyik. Bəlkə nəzərdə tutulmuş geniş proqramların hamısını birdən-birə yerinə yetirmək mümkün olmayacaqdır. Amma bunu tədricən etməliyik.

Bu baxımdan burada, şəhərin Qaraşəhər adlanan bu hissəsində yeni müasir tipli mağazaların, müasir tipli sağlamlıq mərkəzinin yaranması bir çox cəhətdən əhəmiyyətlidir. Birinci növbədə yer təmizlənir, mazutlu neftlə çirklənmiş torpaq təmizlənir, yəni biz şəhərimizi təmizləyirik. İkinci tərəfdən də ***mazutlu, çirkli, qara torpaq*** olan yerdə, yaxud bu köhnə, yararlı olmayan binalar olan yerlərdə müasir tipli yeni binalar yaranır. Bunun özü də çox əhəmiyyətlidir. Ancaq bu gün onu da qeyd edək ki, bu binalar adi binalar deyil, bunlar bizim Bakının, respublikanın vətəndaşlarına böyük xidmət göstərən müəssisələrdir, mağazalardır. Demək, bunun əhəmiyyəti daha da yüksəklərə qalxır [XIVc.s.54-55].

Yadımdadır, təxminən 1978–1979-cu illərdə, sovet hakimiyyəti dövründə Ermənistan dağda yerləşən Zod qızıl mədənini işlətmək üçün gətirib Arazın kənarında böyük bir zavod yaratmışdı və zəhərli suları həmin çaya axıdırdılar. O vaxt biz bu məsələyə öz etirazımızı bildirdik və belə halın qarşısını aldıq. Çünki həmin dövrdə Ermənistanla bizim aramızda hələ düşmənçilik yox idi və hər iki respublika vahid bir ölkənin tərkibində idi. Lakin indi həm Azərbaycan, həm də

Ermənistan müstəqil ölkədirlər və eyni zamanda, aramızda münaqişə vardır.

Yaxud Arpaçay da öz mənbəyini Türkiyədən alır, Ermənistan ərazisindən keçərək Naxçıvana gəlir. Həmin çay Naxçıvan Muxtar Respublikası ərazisinin bir hissəsini su ilə təmin etmək üçün böyük əhəmiyyətə malikdir. Bu çaydan da Ermənistanda müxtəlif yollarla istifadə edirlər və onun suyu son vaxtlar xeyli azalıbdır.

Mən bu iki faktı nəzərə çatdırdım. Amma ətraf mühitin, ekologiyanın qorunması sahəsində bu vəziyyətdə də əməkdaşlığa böyük ehtiyac var və bunu etmək olar. Çünki bu, konkret bir sahədir. Ancaq mənə izah etdiyiniz forum artıq böyük siyasi xarakter daşıyır. Ermənistanla Azərbaycan arasında münaqişə həll edilməmiş biz belə bir foruma necə gedə bilərik? Təkcə ona görə yox ki, biz bunu istəmirik, həm də mən bunun real nəticəsini hiss etmirəm. Mən Azərbaycanın, Gürcüstanın və Ermənistanın baş nazirlərinin Tbilisi görüşünə etiraz etməmişdim. Yəni bildirmişdim ki, mən dediyim prinsiplərə toxunmadan, hansı sahələrdə əməkdaşlıq etməyin mümkün olması barədə danışsınlar, sonra isə vəziyyətə baxaq. Ancaq siz bu mərhələni tamamilə ixtisar edərək böyük bir forum barədə təklif irəli sürürsünüz [XXIc.s.366-367].

"Siz ekologiya, su sahəsində bir-iki layihədən danışdınız. Mən də bununla razıyam. Ancaq bundan ötrü forum keçirmək lazım deyildir. Yenə də deyirəm, xanım Olbrayt təklif etmişdi, qoy baş nazirlər Tbilisidə görüşsünlər, bu sahədə hansı işlər görmək mümkündürsə, ilkin mülahizələr aparsınlar. Ondan sonra görək hansı layihəni həyata keçirmək olar. Həmin layihəni həyata keçirmək üçün bəlkə də bir forum lazımdır" [XXIc.s.366-367].

Türkiyə eroziyaya qarşı mübarizə, yaşıllaşdırma və ətraf mühitin mühafizəsi vəqfinin (tema) təşəbbüsü ilə keçirilən eroziya ilə mübarizə həftəsinin açılışı mərasimində nitqdə havanın təmizliyinin vacib şərti kimi ağaclar olmasını "heç bir" inkar əvəzliyini üç yerdə təkrarlamaqla prinsipial mövqe nümayiş etdirir. Aydınlaşdırma bildirən "yəni" bağlayıcısı ilə fikrini izah edir, "məhz" ədatı ilə başladığı işin əhəmiyyətini auditoriya üçün dəqiqləşdirir. "Hər bir" təyin əvəzliyi və feilin əmr şəklində işlətdiyi "əksin və böyütsün" ifadəsi ilə Bakı sakinlərinin görməli olacağı ekoloji öhdəliyi yada salır. "Bax" qüvvətləndirici ədatı ilə ekoloji nailiyyətlərə sevindiyini dilə gətirir, xitablarla (İndi burada yaratdığınız parka baxın! Ora baxın, bura baxın!) auditoriyanın diqqətini parka, yaşıllığa yönəldir. "Bu park da məni sizi görmək kimi sevindirir" ifadəsi ətraf mühit və insan dialektik vəhdətini ortaya qoyur. Növbəti nitq mərhələsində isə insanların nəyi "gözəlləşdirməli", "təmizləməli" olduğunu sadalayır, "hər bir" təyin əvəzliyi ilə şəhərin sakinlərinə, vətəndaşlarına müraciət edir, "üçün" qoşmasının təkrarı ilə ekoloji etikanın müvəffəqiyyət qazanmasında dövlət və vətəndaş birliyinin əhəmiyyətini açıqlayır: "Havanın təmizlənməsini ağaclardan başqa ***heç bir*** yol ilə, ***heç bir*** vasitə ilə təmin etmək olmaz. ***Yəni*** bunu ***heç bir*** şeylə əvəz etmək olmaz. Ağacların, yaşıllıqların havanı təmizləməsi heç bir başqa vasitə ilə əldə oluna bilməz. ***Yəni*** başqa bir üsul bunun əvəzini verə bilməz. ***Məhz*** buna görə də mən Bakının yaşıllaşması işinə başlamışam. O vaxt mən müraciət etdim ki, hər bir Bakı sakini iki ağac əksin və böyütsün. Çoxları bunu etdilər və kim etmədisə, onun əvəzinə başqaları iki yox, üç, dörd, beş, on, on beş ağac əkdilər, yetişdirdilər. İndi görürsünüz, buradan bu ağaclara baxın. İndi burada yaratdığınız parka baxın! Ora baxın, bura baxın! Bunlar hamısı insan zəhmətinin işidir, sizin əlinizin zəhmətinin

bəhrəsidir. Sizin fədakarlığınızın nəticəsidir. *Bax*, bu məni sevindirir.

Mən burada, yenə də deyirəm, bu parka baxmağa gəlmişdim, amma sizi görməkdən daha da şadam. Təbiidir ki, bu park da məni sizi görmək kimi sevindirir.

İnanmayanlar da, anlamayanlar da, dərk edə bilməyənlər də artıq inanmalıdırlar, anlamalıdırlar, dərk etməlidirlər ki, insan gərək öz ətrafını həmişə gözəl etsin. İnsan yaşadığı evin ətrafını, öz evinin içini də, eşiyini də, yaşadığı rayonu, yaşadığı şəhəri ***gözəlləşdirməlidir***, ***təmizləməlidir***. Bilirəm, indi bizim yerli hakimiyyət orqanlarının bəlkə də böyük imkanları yoxdur ki, hər yerdə təmizlik işi aparsınlar. Ancaq əgər ***hər bir*** vətəndaş, ***hər bir*** Bakı sakini öz evinin ətrafında, yaşadığı binada təmizlik işləri apar***sa*** və buna nail ol***sa***, ərazini yaşıllaşdır***sa***, öz binasını gözəlləşdir***sə***, bilin ki, bu bizim hakimiyyət orqanlarına da kömək olacaqdır. Ancaq bunun nəticəsi xalq ***üçün***, sizin ***üçün*** və vətəndaşlar ***üçün*** olacaqdır” [XXVIIc.s.9-10].

Heydər Əliyevin dilində “nə qədər” ifadəsi ədat səviyyəsinə yüksəlir. “Bu” işarə əvəzliyini həm insanlara, həm ekoloji elementlərə yönəldərək bir neçə dəfə təkrarlanması, “bax” qüvvətləndirici ədatı ilə poetikcəsinə bir nitq nümunəsi yaranır. Elə bu mətndə ekoloji etika ilə bioetika arasında, eləcə də “ədalət” etik kateqoriyası arasında harmonik nitq nümunəsinin şahidi oluruq. Ekologiyadan danışan böyük natiq təbiət və cəmiyyətin dialektik vəhdətinə keçir. “İndi görürəm, burada nə qədər çox gənc var, nə qədər gözəl uşaqlar var. Bu məni nə qədər sevindirir. Amma mən bir də ona görə sevinirəm ki, ***bu*** gənclərin, ***bu*** uşaqların ***bax***, ***bu*** ağacların altında, ***bu*** çiçəklərin arasında, ***bu*** parkda istirahət etməyə, oynamağa imkanları vardır. O ki qaldı yaşlı nəslə, bizim təqaüdçülərə – onlar üçün mütləq belə yerlər lazımdır. Çünki

onlar işləyiblər, çalışıblar, haqq qazanıblar ki, istirahət etsinlər. Amma istirahət etmək elə evində oturub, çarpayının üzərində uzanmaqdan ibarət olmamalıdır. İstirahət etmək üçün gərək təmiz hava alsın, qonşusu ilə görüşsün, danışsın, nə bilim, nərd oynasın, qeybət etsin.

Görürəm ki, bu söz hamısından çox xoşunuza gəldi. Qeybət edin, qeybət ümumi mənada pis şey deyildir: fikrini deyirsən, başqasının fikrini öyrənirsən. Amma biri onun-bunun dalınca danışır, biri düz danışır, biri yalan danışır. ***Bunlar hamısı bizim insan cəmiyyətində əsrlər boyu mövcud olan bir haldır***. Biz bunu ***nə*** dəyişdirə bilərik, ***nə də*** bundan xilas edə bilərik və buna ehtiyac da yoxdur. Ancaq mən hamınızdan xahiş edirəm ki, qeybət edəndə ***ədalətli*** olun və ***ədalətsiz*** qeybətçilərə qarşı mübarizə aparın" [XXVIIc.s.10-11].

"Bir halda siz buraya yığışmısınız, mən hesab edirəm ki, siz hamınız bu gözəl parkın yaradılmasının iştirakçısısınız. Ona görə də mən hakimiyyət orqanlarına da, sizə də bu gözəl, xeyirxah işlərə görə təşəkkür edirəm. Buranın mənzərəsi çox gözəldir. İndi yaydır, mən sizə məsləhət görürəm ki, payızda burada yaşıllaşdırma işləri aparın, ağaclar əkin. Çünki mənim həyatımda ən böyük iş, bəlkə də, hər yeri yaşıllaşdırmaqdan ibarət olubdur.

Bilirsiniz ki, 70-ci illərdə mən Bakının yaşıllaşdırılması ilə əlaqədar böyük bir proqram irəli sürüb, onunla məşğul olmuşam. İndi Bakının küçələrində, hər yerdə böyük-böyük ağaclar, yaşıllıqlar var. Yəni bu, çətin bir şey deyil, sadəcə, burada ağac əkmək və onu sulamaq lazımdır. Yəqin ki, sakinlər bu ağaclara qulluq edəcəklər. Amma hesab edirəm, siz də, rayon icra orqanı da payızda burada – hər bir həyətdə, küçədə lazımi qədər ağac əkərsiniz ki, hava ***daha da*** təmiz

olsun. Onsuz da buranın havası təmizdir. Amma ağaclar, yaşıllıq buranı ***daha da*** gözəlləşdirər” [XXXVc.s.89].

Bu gün mövcud ekoloji vəziyyəti əks etdirən ekoloji siyasətin əsas prinsipləri ilə tanış olmağa dəyər:

– qısa müddətli və uzunmüddətli iqtisadi, ekoloji və sosial nəticələr və ehtimal edilən fəsadlar nəzərə alınmaqla qərarların qəbul edilmə prosesinin həyata keçirilməsi və bu prosesdə alternativ variantların nəzərə alınması;

– ətraf mühitin mühafizəsi sahəsində qərarlar hazırlanarkən ictimai və qeyri-hökumət təşkilatlatlarının nümayəndələrinin cəlb edilməsinin genişləndirilməsi;

– ətraf mühitin hər hansı komponentinin bərpa olunmayan dərəcədə pozulmasına səbəb ola biləcək fəaliyyətin qarşısının alınması;

– ətraf mühitin mühafizəsinin təmin edilməsi üçün aztulantılı, güclü və çoxşaxəli iqtisadi inkişafın təmin edilməsi;

– beynəlxalq təşkilatlar və inkişaf etmiş ölkələrlə ətraf mühitin mühafizəsi sahəsində əlaqələrin genişləndirilməsi;

– əhali arasında ekoloji təbliğatın və maarifləndirmənin gücləndirilməsi [79,s.537].

Ekologiya məsələlərinə dövlətin münasibəti aşağıdakı mətndə dəqiqcəsinə təsvir olunmuşdur. “Yəqin siz unutmamısınız” deməklə keçən əsrin 70-ci illərində Azərbaycan hökumətinin bu sahədə gördüyü işlərin əhəmiyyətindən danışılır. Ağacların əkilməsini “təkcə gözəllik üçün deyildir” ifadəsi ilə qeyri-utilitar gözəlliklə utilitar (iqliminin daha da yaxşılaşmasına, havasının təmizlənməsinə çox kömək edir) gözəlliyin birgə təzahürünü verir. Şəhərlərin yaşıllaşdırılmasını ekoloji tərəqqi hesab edərək, “bu həqiqətdir və aparılan müşahidələr bunu göstərir” ifadəsilə bir ekoloq kimi söylənilən fikirləri sübuta yetirir: “Son illər Bakıda belə parkların yaranması çox əhəmiyyətli haldır. Çünki biz indi görürük ki,

Bakıda dənizkənarı bulvardan – Milli Parkdan əlavə, mikrorayonlarda onlarca park yaranıb və onlar vətəndaşların istirahətinə şərait yaradır. Mən o vaxt da bu təşəbbüsü dəstəkləmişdim. Çünki yəqin siz unutmamısınız, mən hələ 1970-ci illərdə Azərbaycanın, xüsusən Bakının yaşıllaşdırılması proqramını irəli sürmüşdüm. O proqramı ardıcıl surətdə həyata keçirirdim. O illdə, təxminən 25–30 il bundan öncə bizim basdırdığımız kiçik ağaclar indi böyüyüb, şəhərin müxtəlif küçələrini, prospektlərini, parklarını bəzəyir. Bu çox gözəl, xeyirxah işdir. Bu təkcə gözəllik üçün deyildir. Bakının belə yaşıllaşdırılması respublika paytaxtının iqliminin daha da yaxşılaşmasına, havasının təmizlənməsinə çox kömək edir. Bəlkə də hər insan bunu bir dəqiqədə hiss etmir. Ancaq bu həqiqətdir və aparılan müşahidələr bunu göstərir” [XLc.s.371].

## 1.2.6. Heydər Əliyevin nitqində dil etikası

Bu yarımfəsildə Heydər Əliyevin nitqində dilə sevgi, dil siyasəti, dilə məsuliyyətlə yanaşma, dilə münasibətdə əxlaqi məsələlər, Azərbaycan auditoriyasında və soydaşlar auditoriyasında dil, Ana Dilinin tədrisinə münasibət, dillə bağlı üslublar, dil varisliyi, dilə biganəlik hallarına qarşı mübarizə, təfəkkür-dil əlaqəsi və s. araşdırma mövzusu olmuşdur [104, 105, 134, 165, 166, 181, 184, 193, 207]. Dilə dövlət qayğısı Ümümmilli liderin imzaladığı aşağıdakı qərarda öz əksini tapır: "On ilə yaxın bir müddətdə latın qrafikalı Azərbaycan əlifbasına keçidin ölkəmizdə 2001-ci il avqust ayında bütövlükdə təmin edildiyini və yeni əlifbadan istifadənin müstəqil Azərbaycan Respublikasının ictimai-siyasi həyatında, yazı mədəniyyətimizin tarixində mühüm hadisə olduğunu nəzərə alaraq qərara alıram:

Hər il avqust ayının 1-i Azərbaycan Respublikasında Azərbaycan əlifbası və Azərbaycan dili günü kimi qeyd edilsin"

Ölkə Prezidenti İlham Əliyevin AMEA-nın 70-illiyində söylədiyi çıxış gözəl nitq nümunələrindən sayılır. Bu nitqdə öncə dilimizin qiyməti, rolu auditoriya üçün aydınlaşdırılır. "Doğrudan da" modal sözü ilə Prezident dillə bağlı narahatlığını bildirir, feilin lazım şəklindəki "qorumalıyıq", "təmin etməliyik" ifadələri ilə dilə münasibətdə ciddi mövqe açıqlayır. "Əlbəttə" modalı ilə dil millətçiliyindən uzaqlaşmağı, "ancaq" qarşılaşma bağlayıcısı ilə ana dilimizə olan sonsuz sevgisini ortaya qoyur: "Əsrlər boyu Azərbaycan xalqını bir xalq kimi qoruyan bizim mədəniyyətimiz, incəsənətimiz, musiqimiz, xalçaçılıq sənətimiz və digər ənənələrimiz olubdur. Bizim bu sahədəki bütün fəaliyyətimizin əsasında Azərbaycan dili dayanır. Azərbaycan dili bizi bir xalq, millət kimi qoruyub. Əsrlər boyu biz başqa ölkələrin,

imperiyaların tərkibində yaşadığımız, müstəqil olmadığımız dövrdə milli dəyərlərimizi, ana dilimizi ***qoruya***, ***saxlaya*** bilmişik. Ona görə, bu gün bəzi hallarda görəndə ki, dilimizə xaricdən müdaxilələr edilir və bəzi hallarda bu müdaxilələr Azərbaycanda da dəstək qazanır, bu, məni ***doğrudan da*** çox ***narahat*** edir. Azərbaycan dili o qədər zəngindir ki, ***heç bir*** xarici kəlməyə ehtiyac yoxdur. Bir daha demək istəyirəm ki, biz əsrlər boyu dilimizi qorumuşuq. Bu gün də ***qorumalıyıq***. Biz Azərbaycan dilinin saflığını ***təmin etməliyik***. ***Əlbəttə***, bizim vətəndaşlar, xüsusilə gənc nəsil nə qədər çox xarici dil bilsələr, o qədər yaxşıdır. ***Ancaq***, ilk növbədə, ***öz ana dilini bilməlidirlər.*** Digər tərəfdən, imkan verməməlidirlər ki, ana dilimizə yad kəlmələr daxil olsun. Buna ehtiyac yoxdur. Ancaq biz bunu görürük. Bəzi ictimai xadimlərin, hökumət üzvlərinin çıxışlarında, bəzi televiziya verilişlərində, Milli Məclisdə eşidirəm ki, kənar kəlmələrdən istifadə edilir. Buna ehtiyac yoxdur. Əlbəttə, mən bu sahədə mütəxəssis deyiləm, ancaq bir vətəndaş kimi, hesab edirəm ki, yeni kəlmələrin icad edilməsinə heç bir ehtiyac yoxdur. Lüğətimiz o qədər zəngindir ki, bunu qorusaq və gələcək nəsillərə əmanət kimi təhvil versək bu, bizim bu sahədəki ən böyük nailiyyətimiz olacaqdır" [35].

Heydər Əliyevin nitqində dil etikası yarımfəsli üzərində işləyərkən Azərbaycan nitq mədəniyyətinə dair elmi iş aparan, kitablar çap etdirən alimlərə [2, 6, 17, 43, 46, 47, 48, 53, 55, 61, 63, 70, 82, 98] o cümlədən, M.Nağısoyluya, İ.Həbibbəyliyə, R.Hüseynova, N.Xudiyevə, A.Babayevə, B.Xəlilova, Q.Kazımova, S.Həsənovaya, N.Abdullayevə və digərlərinə minnətdarlıq etməyi özümüzə borc bilirik. Araşdırmalardan öncə dillə bağlı fəlsəfi fikirləri oxucuların nəzərinə çatdırmaq pis olmazdı. Akademik R.Mehdiyevə görə: "Müasir fəlsəfənin dilə marağının artması ən azı iki mühüm amillə izah edilir. Əvvələn, dilin təbiəti barədə uzun muddət davam etmiş

intensiv debatların gedişində insanlar kommunikasiyada, idrakda, mədəniyyətin təşəkkülündə və inkişafında dilin müstəsna rolunu daha dəqiq dərk etməyə başlamışlar. Məsələyə bu cür yanaşdıqda dil ünsiyyət və dünyanın dərk edilməsi vasitəsi, həqiqətən insana xas olan nadir qabiliyyət kimi tədqiqat obyektidir. Dilin təhlili problemlərinin, ilk növbədə, dünyanın dərki problemlərindən təcrid edilə bilməyən dil kimi başa düşmək problemlərinin şərhi o deməkdır ki, dil fəlsəfəsi idrak fəlsəfəsinin üzvi hissəsi hesab olunur" [75].

İncəsənət əsərlərinin dünyanın başqa dillərinə tərcüməsini dilə gətirməklə dil millətçiliyinin qəbulolunmazlığını anladır, ümumbəşəri ideyaların millətçiliklə bir araya sığmadığını səmimiyyətlə etiraf edir. Azərbaycanın xalq şairi Bəxtiyar Vahabzadə ilə aparılan məişət üslublu söhbət ritorik sualla (Elədirmi?) qurtararaq səfərbəredici xarakter daşıyır: "Bəxtiyar müəllim, birincisi, düz deyirsiniz ki, vaxtilə sizin kitablarınız rus dilinə tərcümə olundu. Bu, çox əhəmiyyətlidir. Çünki bu gün hamı etiraf etməlidir ki, Rusiya böyük bir ölkədir. Rus dilindən həm Rusiyada, həm də keçmiş Sovetlər İttifaqı məkanında istifadə olunur, həmişə də istifadə olunacaqdır. Buna görə də bu gün məmnun olmalıyıq ki, o vaxtlar biz ədəbiyyatımızın çox hissəsini, o cümlədən müasir yazıçılarımızın, şairlərimizin əsərlərini rus dilinə tərcümə edə bildik. Dediniz ki, sizin 14 kitabınız rus dilinə tərcümə olunubdur. Bu, çox gözəldir. İndi sizin bir kitabınız da ingilis dilinə tərcümə olundu. ***Elədirmi***? [XXVIc.s.323].

Dil həmişə filosofları maraqlandırmışdır. Demokrit, Platon, Aristotel, Hegel və bir sıra digər filosoflar, xüsusən təfəkkür problemi ilə əlaqədar dili öz mülahizə obyektləri sırasına daxil etmişlər. Fəlsəfənin dilə güclü marağı zəmanəmizdə də davam edir. Bəs bu maraq nədən irəli gəlir?

Bəs dil ilə təfəkkür arasında əlaqə nədən ibarətdir? Dil təfəkkürün ***inkişafında*** və fəaliyyətində mühüm rol oynayır.

Lakin qarşılıqlı münasibətlər problemində dil və təfəkkur iki ayrıca və avtonom, hər birinin hüdudları kifayət qədər dəqiq müəyyən edilmiş anlayışlar kimi çıxış edir. Onlar bir-biri ilə sıx bağlıdır, qarşılıqlı təsirdədir və hətta ola bilsin ki, biri digərini şərtləndirir. Buna baxmayaraq, hər biri ayrıca anlayış kimi qalır. Dil təfəkkürün sonrakı sintezinə heç də həmişə daxil olmayan, lakin müəyyən forma kimi təfəkkürü onun gələcək hərəkət yollarını istiqamətləndirən və müəyyənləşdirən bilikləri təsbit edir.

Dilin təhlilində əsas diqqət sözlərə deyil, həqiqi biliyin yeganə daşıyıcısı olan cümləyə yönəldilir. Bu halda əsas məqam cümlənin həqiqilik şərtlərini bilmək, yəni onun həqiqi mənasını dərk etmək qabiliyyəti və bu qrammatik kateqoriyaların gercək istifadə praktikası arasında əlaqənin açıqlanmasıdır. Təbii dil üçün məna nəzəriyyəsi dilin daşıyıcısına sonsuz sayda mənalı cümlələri başa duşmək və onları konstruksiya etmək imkanı verən prinsipləri və strukturları aşkar etməlidir [75].

Dialektikanın əksliklərin vəhdət və ziddiyyəti qanununu əsas götürsək elmi-texniki tərəqqinin sürətli inkişafı fonunda əxlaqi dəyərlərin güclənməsini gözləmək yersiz görünər. Dil sahəsində də son illər baş verən proqreslə bağlı dildə özünü göstərə biləcək antietik dəyərlərə qarşı mübarizə bu gün hər bir vətəndaşın, hər bir dilçi alimin, ziyalının şərəf işidir. Müxtəlif tərəflərə malik etikanın bir mühüm tərəfi də dil etikası sayıla bilər ki, burada da Heydər Əliyev dühasının nitqlərinə baxışsız keçinmək çətindir.

Dilçi alimlərimiz tərəfindən elmi faktlar əsasında dilimizə olan sevgi rəsmi, beynəlxalq konfranslarda səslənir. Dilimizin kasıb olmadığı, yeri gələrsə dialektlərimizdən ədəbi dilimizə keçməyə layiq sözlərin çoxluğu auditoriyalara yönəlir [21, 46].

Bəzi müəlliflər [88, 207] "bu gün dil etikası dil millətçiliyindən yaxşı mənada uzaq durmağı tələb edir" müddəasından çıxış edirlər: "Tarixdə bəzən böyük imperiyaların dili elmi və ədəbi dil olaraq əsas götürülmüşdür. Bu siyasi zərurət alim və mütəfəkkirlərin böyük şəhərlərdə mükəmməl təhsil alması, yaratdıqları əsərlərinin təbliği və dil xüsusiyyətlərinə görə ümumi bir sərvət kimi qəbul edilə bilər. Ancaq əsərin orijinallığı onu yaradan müəllifin mənsub olduğu millətin düşüncə səviyyəsinin, təfəkkürünün kamilliyini nümayiş etdirir. Əgər elm və ədəbiyyatımızı ***yalnız anadilli nümunələrlə məhdudlaşdırsaq*** bu keçmişdə yaranmış sərvətimizdən imtina etmək deməkdir".

Müəlliflər dilə münasibətdə tolerantlığı qeyd edir: "Hər bir etnik qrupun özünəməxsus ***adət-ənənələri***, dili, dini inancları olmasına baxmayaraq, onlar iç-içə yaşadıqları digər etnoslarla yüz illərdir eyni vətəni, eyni taleyi paylaşmaqda qarşılıqlı əlaqədədirlər" [66]. Dillər arasındakı qarşılıqlı təsiri qeyd edən alimlər var (İstər aborigen, istərsə də sonradan bu torpağa köçürülmüş etnik qruplar köklərindən qidalanmamaqla – dil ailələrindən uzaqlaşmaqla içərisində yaşadığı, həm də dövlət dili funksiyasında olan Azərbaycan türkcəsinin mühüm təsirinə məruz qalmışdır. Bununla bərabər, dialekt səviyyəsində olsa belə, bu etnik qrupların dilləri Azərbaycan dilinə təsirsiz qalmamışdır.)

Türksoy təşkilatının üzvü olan ölkələrin mədəniyyət nazirləri daimi şurasının XIX toplantısının iştirakçıları ilə görüşdə Heydər Əliyevin dil haqqında şəxsi fikirləri, dil və millət dialektik vəhdəti barədə təəssüratları, türk dilləri arasında Azərbaycan dilinin yeri, dilə olan intəhasız sevgi, dil mütəxəssislərinə olan şəxsi hörməti ədəbiyyatla müqayisədə "para"nın əhəmiyyətsizliyi kimi məsələlər dil etikası baxımından araşdırılmışdır.

Milləti yaşatmaq üçün dilin qorunmasını mühüm hesab edən böyük natiq "yox" cümlə-ədatla türk dili ailəsinə mənsub dillərin hər birinin ayrıca inkişaf etməsini təbii qəbul edir: "Düz deyirsiniz. Siz bunu yaxşı bilirsiniz. Ancaq mən bu fürsətdən istifadə edərək bir də demək istəyirəm ki, milləti yaşatmaq və millətin indiyə qədər olduğu kimi əzilməsi imkanlarının qarşısını gələcəkdə almaq üçün dilimizi qorumalıyıq. İndi türkdilli millətlərin dillərində bir qədər fərq var. Amma bu dillərin kökü birdir. Mən belə düşünmürəm ki, biz gərək dilimizi tatar dilinə oxşadaq. Yaxud da ki, qırğızlar dillərini bizim dilə oxşatsınlar. Yox!" [XLIIIc.s.367].

Siyasi etikanın başlıca prinsiplərinə dərindən bələd və sadiq olan siyasi xadim dil haqqında verdiyi fərmanları və onların yerinə yetirilməsini "mən" şəxs əvəzliyinin köməyi ilə auditoriyaya ünvanlayır. "Ən" qüvvətləndirici ədatı ilə həyatının birinci vəzifəsi kimi dilin inkişafını önə çəkir. "Çünki" səbəb bağlayıcısı ilə millətin mövcudluğu və dil arasındakı dialektik vəhdətə işarə edir: "Əsrlər boyu dillərimiz belə yaranıbdır. Amma eyni zamanda dilin işlənməsi mümkün olmadığına görə, bizim dillərimiz lazımi qədər inkişaf edə bilməyibdir. Ona görə də ***mən*** Azərbaycan dili haqqında Fərman ***verdim***. Azərbaycanda latın əlifbasına keçmək barədə Fərman ***verdim*** və onun yerinə yetirilməsini təmin ***etdim***. Azərbaycan dilinin bundan sonra da inkişaf etməsi ***mənim*** həyatımın ***ən birinci vəzifəsidir***. ***Çünki*** millətin dilini əlindən alsan, onu öz dilindən məhrum etsən, o millət çox şey itirər. Amma millətin öz doğma dili, ana dili olanda, onu heç nə dəyişdirə bilməz" [XLIIIc.s.376].

"Allaha şükürlər olsun" modal sözü ilə dilin quruluşu, onun lüğət fondu, şeir dili olması auditoriyaya məişət üslublu maraqlı fikirlərlə çatdırılır: "***Allaha şükürlər olsun***, bizim Azərbaycan dili çox mükəmməlləşib, çox genişlənibdir. Dilimizin çox böyük lüğət ehtiyatı var. Bizim Azərbaycan dili

***şeir dilidir.*** Yadımdadır, mən bir-iki dəfə ya burada, ya da Türkiyədə toplantılarda nitq söyləyəndən sonra dostum Süleyman Dəmirəl mənə deyirdi ki, ***sən şeir oxudun***. Deyirdim ki, yox, mən nitq söylədim. O deyirdi ki, bilirəm, amma Azərbaycan dili o qədər şeir dilidir ki, bəzən fərqinə varmaq olmur ki, nitq söyləyirsən, yaxud şeir deyirsən" [XLIIIc.s.376].

Etik cəhətdən dilin sıxışdırılmasını tarixi faktlarla görüş iştirakçılarına izah edir. Atatürkün dil siyasətinə toxunur, "Ona görə də dil, dil, bir də dil" deməklə dilə olan sevgisini miyonlara yönəldir. Başqa dillərə olan əxlaqi münasibətlərini dilə gətirərək dil millətçiliyinə gənclər arasında yer verməməyi məsləhət bilir. Milli təəssübkeşlik hissini isə dilə münasibətdə saxlamağı (öz Azərbaycan dilimizi öyrənin) hər birimizə tövsiyə edir. "Elədir, yoxsa yox" ritorik sualla vətəndaşın dilə münasibətini açıqlayır: "Eləcə də Anadolu türk dili. Anadolu türk dili də vaxtilə çox əzablar çəkibdir. Osmanlı imperatorluğunda, sarayda fars dili, ərəb dili işlənirdi. Türkiyədə türk dilinin inkişaf etdirilməsi böyük Atatürkün adı ilə bağlıdır. Bugünkü türk dilinin yaranması böyük Atatürkün xidmətləridir. Bilmirəm siz bunu demisiniz, yoxsa yox, mən Azərbaycanda Atatürk Mərkəzi yaratmışam. Çünki Atatürk təkcə Anadolu türklərinin deyil, o bizim hamımızındır. Mən Anadolu türk dilinin nə qədər ağır vəziyyətdə olduğunu bilirdim. Əgər Atatürk dil haqqında qərarlar qəbul etməsəydi, bu gün belə gözəl Anadolu türkcəsi olmazdı. ***Ona görə də dil, dil, bir də dil...*** Dili inkişaf etdirməliyik. Mən demişəm və bu gün də deyirəm. Bizim gənclərə deyirəm ki, rus dilini yaxşı bilin, ingilis, fars, ərəb, fransız dillərini də yaxşı bilin. Amma bunların hamısından yaxşı ***öz Azərbaycan dilimizi öyrənin***. Əgər bunu bilməsən, sən tam azərbaycanlı olmursan. ***Elədir, yoxsa yox?"*** [XLIIIc.s.376-378]

"Mən siyasət adamıyam" deyən Ulu Öndər "ancaq" qarşılaşma bağlayıcısı ilə "şeirsiz, ədəbiyyatsız" yaşaya bil-

mədiyini deyir: Polad Bülbüloğlunun "Türkiyənin Mədəniyyət naziri dil və ədəbiyyat müəllimidir" replikasına Heydər Əliyev "Mənim dostumdur ki. Görürsən, mən elə bu mövzudan danışıram. Mən dil müəllimi deyiləm. Ədəbiyyat müəllimi də deyiləm. ***Mən siyasət adamıyam***. Ancaq dilsiz, ədəbiyyatsız, şeirsiz insan ***yaşaya bilməz***" [XLIIIc.s.378].

"Biz burada Şekspirin əsərlərini tamaşaya qoyuruq" fikriylə auditoriyanın diqqətini Azərbaycan xalqının dünyanın digər xalqlarının dilinə olan tolerantlığa yönəldir. Sonrakı nitq mərhələsində "vallah, məni həyatda para heç vaxt maraqlandırmayıb" ifadəsi auditoriya üçün Heydər Əliyevin həyatında dilin, ədəbiyyatın rolunu aydınlaşdırır. "Mən bunların hamısını bilirəm" deməklə dünya ədəbiyyatına olan münasibətini dilə gətirir. "Daha" qüvvətləndirici ədatı ilə "özümüzünküləri" hamısından çox bildiyini qeyd edir: "İndi Avropada şeir, ədəbiyyat yoxdur. Vaxtilə böyük Şekspir, başqaları olublar. Biz onları oxuyurduq, heyran qalırdıq. İndi də ***biz burada Şekspirin əsərlərini tamaşaya qoyuruq***. Bu yaxınlarda bizim Azərbaycan teatrında "Hamlet" pyesini tamaşaya qoymuşdular. Mən getmişdim. Yaxınlarda, deyəsən, bir başqasını hazırlayacaqlar. Elədirmi? Bunlar klassik ədəbiyyatdır. Amma indi Avropada belə ədəbiyyat yoxdur. Bizim keçmişdə də zəngin ədəbiyyatımız olubdur. Amma bu gün də, sabah da olmalıdır. İndi çoxları başını iqtisadiyyata qatır, fikirləşir ki, burada və ya orada nə qədər pul qazanacağam. ***Vallah, məni həyatda para heç vaxt maraqlandırmayıbdır.*** Amma hər bir kitab, ya bizim Azərbaycan şairinin, yazıçılarının kitabları, yaxud da rus ədiblərinin kitabları həmişə maraqlandırıbdır. Mən rus ədəbiyyatını da yaxşı bilirəm. Yaxud Avropa ədəbiyyatı... Bunları da yaxşı bilirəm. Yaxud fars ədəbiyyatı... Mən Firdovsinin "Şahnamə"sini gənc vaxtımda oxumuşam. "Şahnamə"ni bilirsiniz də. Məşhəddə Əbdülqasım Firdovsinin qəbrini də ziyarət etmişəm. Mən

bunların hamısını bilirəm. ***Amma özümüzünküləri hamısından daha çox bilirəm.*** Ona görə də bu işdə çalışın. Bu mənim sizə ***tövsiyələrimdir***. Özünüz bilərsiniz” [XLIIIc.s.378-379].

Akademik R.Mehdiyev “Dövlət dilimizin böyük himayədari” məqaləsində Ulu Öndərin sitatı (*Azərbaycan dilinin dövlət dili kimi yaşaması, möhkəmlənməsi, inkişaf etməsi də bizim ən böyük nailiyyətlərimizdən biridir. Bu, təkcə dil məsələsi deyil, həm də azərbaycançılıq məsələsidir)* ilə başlayır və dillə bağlı Heydər Əliyevin gördüyü titanik zəhməti qiymətləndirir: “Ana dilinə münasibətin ifrat dərəcədə siyasiləşdirildiyi və çox vaxt əsassız siyasi ittihamlar üçün zəmin olduğu illərdə Heydər Əliyev Azərbaycan dilinin məişət və ədəbi dil səviyyəsindən dövlət dili səviyyəsinə çatdırılmasına yönəlmiş fəaliyyətlə kifayətlənməyib, həm də öz şəxsi nümunəsi ilə ana dilimizin nüfuzunu artırır, onun elmi cəhətdən öyrənilməsi, geniş yayılması üçün stimul yaradırdı. Məsələn, onun təşəbbüsü ilə respublikanın bir qrup dilçi alimi Azərbaycan dilinin tədqiqi sahəsində araşdırmalara görə Dövlət mükafatına layiq görülmüş, respublikada ilk dəfə müstəqil Dilçilik İnstitutu yaradılmışdır. Bu da ana dilinin ictimai-siyasi nüfuzunun möhkəmlənməsinə kömək edir və dilin tarixinə, dialektologiyaya və bir çox digər problemlərə dair fundamental tədqiqatlar aparılmasına imkan verirdi” [XLVc.s.281].

Lakin respublikada yaşayan millətlərin heç də hamısı türk etnikliyinin daşıyıcıları deyildi və buna görə də identifikasiyanın bu formasının qəti seçimi cəmiyyətin bütövlüyünə mənfi təsir göstərirdi. Azərbaycanlıların etnik və dil identifikasiyası barədə debatlarda türkçülüyə üstünlük verilməsi cəmiyyətin sabitliyini laxladır, onu etnik əlamətə görə parçalanmaya sövq edirdi. Yalnız azərbaycançılığı vətəndaşlığın dövlət forması kimi etniklikdən üstün tutmuş Heydər Əliyevin bu prosesə vaxtında müdaxilə etməsi problemin

kəskinliyini aradan qaldırdı. Bu halda millətin dövlətin adı ilə eyniləşdirilmiş adı saxlandı [XLVc.s.286].

Məhz ana dili məsələsində Heydər Əliyevin prinsipiallığı və qətiyyəti sayəsində, onun aktiv fəaliyyəti nəticəsində Azərbaycan Respublikasının 1978-ci ildə qəbul edilmiş Konstitusiyasına Azərbaycan dilinin Azərbaycan Respublikasının dövlət dili olması haqda məşhur 73-cü maddə daxil edildi. O dövrdə milli dilə Konstitusiya səviyyəsində dövlət dili status vermiş üç keçmiş sovet respublikasından biri və yeganə müsəlman respublikası Azərbaycan idi [XVLc.s.282].

Dünya azərbaycanlılarının birinci qurultayındakı nitqində Ulu öndər üçün azərbaycançılıq və Azərbaycan dili ayrılmazdır. "Məhz" dəqiqləşdirici ədatı ilə azərbaycançılığın nə olduğunu auditoriyaya açıqlayır: "Müstəqil Azərbaycan dövlətinin əsas ideyası azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı – Azərbaycanın dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıdır. Azərbaycan dilinin inkişafı haqqında bizim qəbul etdiyimiz geniş qərar ***məhz*** bu məqsədi daşıyır. Biz Azərbaycanın latın əlifbasına keçməsi haqqında qərar qəbul etdik. İndi Azərbaycanda hamı, bütün dövlət orqanları yalnız latın əlifbasından istifadə edir. Bu da bizim milliliyimizi, azərbaycançılığımızı göstərən çox mühüm bir amildir. Biz bundan sonra da Azərbaycan dilinin inkişaf etdirilməsi üçün səylərimizi davam etdirəcəyik. [XXXVIc.s.422]

"Bilirsiniz" modal sözün ardınca Heydər Əliyevin dil haqqında "etik-fəlsəfi" fikirləri açıqlanır. "Ana dili" ilə "Azərbaycan dili"nin eyni işlənməsi bir daha dilə olan sevgini izhar edir. "Az da olsa", "çox da olsa" ifadələri ilə dilin inkişafında xalqın rolunu aydınlaşdırır, "xüsusən" modal sözü ilə kimlərin (yazıçılarımız, ədəbiyyatşünaslarımız, şairlərimiz) bu məsələdə rolunun çox olduğunu söyləyir. "Baxın" əmr

ədatı ilə "nə qədər" ədatını dörd yerdə təkrarlayaraq dili xarakterizə edir: "Bilirsiniz, hər bir millətin dili onun üçün çox əzizdir. Bizim üçün Azərbaycan dili, ana dilimiz həddindən artıq əzizdir. Çünki çox illər ana dilimiz, Azərbaycan dili həyatımızda geniş yer ala bilməmişdir. Amma buna baxmayaraq, hər bir azərbaycanlı dilin qorunub saxlanılmasında az da olsa, çox da olsa, öz xidmətini göstərmişdir. Xüsusən, bizim yazıçılarımız, ədəbiyyatçılarımız, şairlərimiz o ağır dövrdə Azərbaycan dilinin yaşamasında böyük xidmətlər göstərmişlər. Mən bu gün böyük iftixar hissi ilə deyə bilərəm ki, Azərbaycan dili XX əsrdə böyük inkişaf yolu keçmişdir. İndi baxın, bizim dilimiz nə qədər zəngindir, nə qədər məlahətlidir, nə qədər şirindir və bütün fikirləri ifadə etməsi üçün nə qədər böyük söz ehtiyatına malikdir" [XXXVIc.s.435].

Qəti gələcək zamanda "təmin edəcəyik" deməklə dilə dövlətin münasibətini açıqlayan böyük natiqin dilindən "ancaq" bağlayıcısını eşidən auditoriya onun arzusunun nədən ibarət olduğunu anlayır, "amma" bağlayıcısı ilə Azərbaycan dilinə qayıtmağı tələb edir: "Biz Azərbaycanda Azərbaycan dilinin hakim olmasını, Azərbaycan dilinin getdikcə inkişaf etməsini təmin edəcəyik. Ancaq eyni zamanda arzu edirik ki, hansı qitədə, hansı ölkədə yaşamasından asılı olmayaraq, hər bir azərbaycanlı o ölkənin dilini də mənimsəsin, o ölkənin adət-ənənələrindən də istifadə etsin, o ölkənin şəraitinə uyğunlaşsın. Amma Azərbaycan dilini yaşatsın və inkişaf etdirsin" [XXXVIc.s.436].

Heydər Əliyev "başqa bir vasitə yoxdur" inkar ifadəsiylə prinsipiallıq nümayiş etdirir. "Xüsusən" modal sözlə feilin əmr şəklində işlənmiş sinonim cərgə (həmrəy olsunlar, dayaq olsunlar, yardım etsinlər, dərdinə yansınlar, qeyd etsinlər) ilə diaspor nümayəndələrini Azərbaycan dili ətrafında birləşməyə səsləyir. Gələcək nəsilləri Azərbaycan dilini və milli-mənəvi

dəyərlərimizi yaşatmağa çağırır: "Xalqları dil qədər, milli-mənəvi ənənələr qədər, dəyərlər qədər birləşdirən ***başqa bir vasitə yoxdur***. Biz bu vasitədən daim istifadə etməliyik. Xüsusən, başqa ölkələrdə yaşayan azərbaycanlılar. Ona görə də mən arzu edərdim ki, hər bir ölkədə Azərbaycan icmasında azərbaycanlılar ***həmrəy olsunlar, bir-birinə dayaq olsunlar, bir-birinə yardım etsinlər, bir-birinin dərdinə yansınlar və bizim milli adət-ənənələrimizi, milli dəyərlərimizi birlikdə gözləsinlər, milli bayramlarımızı qeyd etsinlər***. Təkcə müstəqillik bayramını, Novruz bayramını deyil, bütün başqa bayramları da qeyd etsinlər. Azərbaycan dilini yeni nəslə, uşaqlara çatdırmaq üçün müəyyən tədris imkanları ***yarat-sınlar***. Biz bu barədə kömək edəcəyik ki, bizdən sonra gələn nəsillər, sizin övladlarınız, bizim övladlarımız azərbaycançılı-ğı daha da yüksəklərə ***qaldırsınlar***, Azərbaycan dilini, milli-mənəvi dəyərlərimizi ***daim yaşatsınlar"*** [XXXVIc.s.437-438].

Ukraynada yaşayan soydaşlarımızla görüşdə (Yalta, 20 iyul 2002-ci il) Heydər Əliyev dilə əxlaqi münasibəti ortaya qoyur. "Dilə kinayə ilə baxmağı" antietik kateqoriya hesab edərək, kinayə edənlərə bu dilin şeiriyyət dili olduğunu anladır. "İkinci belə dil tapa bilməzsən" ifadəsində "belə" ədatı və "ikinci" sıra sayı ilə Azərbaycan dilini yüksəkliklərə qaldırır. "Dili bilsinlər" feilin əmr şəkli ilə sərt mövqe nümayiş etdirir. Dil və adətlərin eyni dərəcədə qorunmasını "adətləri olsun" deməklə tələb edir: "Azərbaycanlılarda assi-milyasiyaya meyl başqa millətlərdən çoxdur. Bizim azər-baycanlı, tutaq ki, rus dilini daha yaxşı biləndə Azərbaycan ***dilinə kinayə ilə baxmağa*** başlayır. Mən belə hallardan çox inciyirəm. Bizim çox gözəl, zəngin dilimiz var. Azərbaycan dili şeiriyyət dilidir. ***İkinci belə*** dil tapa bilməzsən. Ona görə bu dili yaxşı bilmək lazımdır. Nəinki dilimizi bilmək, ondan istifadə etmək lazımdır, gərək sizin uşaqlarınız, nəvələriniz də

bu ***dili bilsinlər***. Evinizdə gərək Azərbaycan adətləri olsun" [XLc.s.78-79].

Bu gün tədqiqatçılar [24, 25, 26, 27, 69] dil və mədəniyyət anlayışlarını dialektik vəhdətdə götürürlər ki, "mədəniyyət və dil qədər insanın millətini ucaldan şey yoxdur" söyləyən böyük natiq sadə, sadə olduğu qədər düşündürücü cümlələrlə dilin rolunu bir daha soydaşlar auditoriyasına anladır. Polad Bülbüloğlunu nümunə çəkməklə fikirlərini asan bir dillə auditoriyanın şüuruna yönəldir: "Çünki ***mədəniyyət və dil*** qədər insanın millətini ucaldan şey yoxdur. İki şey insanın milliliyini, millətini ucaldır. Onun biri dilidir, ikincisi mədəniyyətidir. Elm, başqa xüsusiyyətlər öz yerində. Tutaq ki, Polad Bülbüloğlu böyük bir kibernetik olardı. Onu kim tanıyacaqdı? Hansısa kibernetika laboratoriyasında qurdalanacaqdı. Amma o, atasının yolu ilə gedir, həm mahnı oxuyur, həm musiqi bəstələyir. ***Xalqını tanıdır***" [XLc.s.79].

Dil etikası əgər dilə əxlaqi münasibət kimi anlaşılırsa, bu əxlaqi dəyərlərə sayğısızlıq məqamlarında dövlətin təsbit olunmuş qanunları işə düşür. "Çünki səbəb bağlayıcısı ilə Azərbaycan dilini zəif bilməyin şərtlərini aydınlaşdıran Heydər Əliyev bunu, "təbii qüsur" kimi qəbul edir, sonda isə "nəticə çıxarmaq lazımdır" qətiyyətli ifadə ilə fikrini yekunlaşdırır. İmperiya dövründə əcnəbi dilin-rus dilinin hakim olmasını "təbii" hesab edən Ulu Öndər bir şeyi qəbul etmirdi. "Ancaq" bağlayıcısı ilə həmin məsələyə aydınlıq gətirir. Davamiyyət bildirən "birincisi" modal sözlə azərbaycanlı uşaqlara, balalara dilimizin yaxşı öyrədilməsini, "ikincisi" modal sözlə keçmişin nöqsanlarını təkrar etməməyi auditoriyanın şüuruna çatdırır: "Rus dilini təmiz bilməyən adam Sovetlər İttifaqının başqa şəhərlərinə gedib təhsil ala bilməzdi. Yaxud da ki, dövlət orqanlarında da əsasən rus dili istifadə olunurdu. Ona görə də valideynlər öz övladlarını rusdilli məktəblərə verirdilər. Yəni mən o vaxt belə olmasını ***təbii***

hesab edirəm. Ancaq o vaxt bu məktəblərdə böyük bir qüsur var idi. Bu da ondan ibarət idi ki, ***birincisi***, rus dilində təhsil verərək azərbaycanlı uşaqlara, balalara Azərbaycan dilini yaxşı öyrədə bilmirdilər. ***İkincisi***, o vaxtın nöqsanlarını yada salmaq lazımdır ki, bu gün, sabah bu nöqsanlara yol verilməsin" [XXXVIc.s.12]. Heydər Əliyevin "təbii" hesab etdiyi dil problemləri prof. N.Məmmədlinin elmi araşdırmalarında öz əksini tapır: "Dilimizin leksik-terminoloji qatında daim təkmilləşmə və inkişaf prosesi baş verir. Avropa mənbəli terminlərin bu prosesdə fəal iştirakı Avropa ölkələri ilə müxtəlif xarakterli birbaşa əlaqələrin, ünsiyyət vasitələrinin yaranması, elmi kəşflərin geniş vüsət alması, müstəqil respublikanın ictimai-siyasi fəallığı, mədəni həyatda dəyişikliklər, Avropa dillərinin öyrənilməsi intensivliyinin artması, fəallaşması və s. amillərlə bağlıdır" [77].

Bilik günü və yeni dərs ilinin başlanması münasibətilə Bakının Səbail rayonundakı Tofiq İsmayılov adına riyaziyyat və informatika təmayüllü 6 saylı məktəb–liseydə keçirilən mərasimdəki (1 sentyabr 2001-ci il) nitq Azərbaycan dilinin öyrənilməsi problemlərini çözmək baxımından aktualdır. Dilin öyrədilmə prosesində müəllimin rolunu önə çəkir, auditoriya onun proqnostik fikirlərinin real həyatda özünü doğrultmasının bir daha şahidi olur. (Bu gün dünyanın ən ali kürsülərində zəngin söz ehtiyatına malik Azərbaycan dili ilə möhtərəm Prezidentimiz İlham Əliyev ölkəmizin problemlərini özünün səlis nitqiylə bəyan edir): "Emma xanım, – mənim oğluma dərs deyibdir – mən səni yada saldım, ona görə soruşdum. Emma xanım, bilirsən, oğlum indi ***Azərbaycan dilini necə yaxşı bilir!*** Sən yəqin onun çıxışlarını televiziyadan eşidirsən. O, Azərbaycan dilində rus dilindən yaxşı danışır. Bunda da sənin zəhmətin var" [XXXVIc.s.13].

"Bəs" sual ədatı ilə qurulan "bəs Azərbaycan ədəbiyyatı" ifadəsi ilə rus məktəblərində təhsil alanların Azərbaycanın

korifey sənətkarlarını tanımamasını etik cəhətdən düzgün hesab etmir. "Nizami sənin qəlbinə yatmayacaq" deyimi ilə bir daha dili öyrənməyin zəruriliyini milyonlara ünvünlayır: "Azərbaycan tarixi" çox cüzi əks olunurdu. Moskvadan gələn dərsliklər hamısı rus ədəbiyyatı idi. ***Bəs*** Azərbaycan ədəbiyyatı? Bəzən həmin bu rus məktəblərində təhsil almış, Azərbaycan dilinə meyl göstərməmiş gənclərdən Nizaminin, Füzulinin, Nəsiminin, Vaqifin, yaxud da bizim müasirlərimiz olan şair və yazıçıların şeirlərini soruşanda görürdün ki, onlardan xəbərləri yoxdur. Onlar, məsələn, Nizaminin rus dilinə tərcümə olunmuş poemalarını, şeirlərini oxuyurdular. Amma sən onu nə qədər oxusan da, Nizami ***sənin qəlbinə yatmayacaq***. Oxusalar da, bunlar Azərbaycan dilində olan şeirlər deyildi. Ona görə də rus dilində təhsil alan adamların, ***təəssüf*** ki, Azərbaycanın tarixi, onun zəngin mədəniyyəti, zəngin ədəbi irsi haqqında məlumatları çox az idi" [XXXVIc.s.15].

"Bax, bu bizim yaxın keçmişimizin əziyyətləridir" deyimində bir sıra antitetik dəyərlərin gizləndiyi məlum olur. "Təbiidir ki" gerçəkliyə münasibətdə adi təsdiq modal sözü ilə doğma dili bilməməyin hansı nəticələrə gətirib çıxaracağını "nə... nə də" inkarlıq bildirən bağlayıcılarla açıqlayır: "***Xatırlayıram***, 1970-ci illərin axırlarında mən işlədiyim yerdə – partiyanın Mərkəzi Komitəsində mənim yanımda işləyən yüksək vəzifəli şəxsə göstəriş verdim ki, get Azərbaycan Milli Teatrına, orada bir əsər var, təzə tamaşaya qoyublar, ona bax, gəl mənə o barədə danış. Çünki həmin əsər bir az mübahisəli idi. Gördüm, baxır mənə, dedim, sən əvvəllər Azərbaycan Dram Teatrında olmusan? Dedi ki, yox, olmamışam. Təsəvvür edin ki, rus dilində təhsil alıb, Rus Dram Teatrına gedib, amma bizim böyük tarixə malik olan Azərbaycan Dövlət Dram Teatrında bu, bir dəfə də olmayıbdır. Təbiidir ki, o, Azərbaycan dramaturqlarının, yazıçılarının, şairlərinin əsərlərini

bilməyəcək. Çünki ***nə*** oxuyub, ***nə də*** tamaşa edib. ***Əgər*** gedib teatrda tamaşa etsəydi, onda heç olmasa bilərdi. ***Bax***, bu bizim yaxın keçmişimizin əziyyətləridir” [XXXVIc.s.13-14].

“Hər bir” və “öz” təyin əvəzliklərinin köməyi ilə vətəndaşların borc kimi dili yaxşı bilmələri tələb olunur. “Əlbəttə” qəti təsdiq modalı ilə dili bilməyənlərin yararlı olmaması bəyan edilir. Başqa dillərin öyrənilməsinə gəldikdə “ancaq” bağlayıcıları ilə digər dillərin öyrənilməsindən öncə Azərbaycan dilinin mükəmməl öyrənilməsi tələb kimi qarşıya qoyulur: “Ancaq biz xalqımızı, millətimizi, gəncləri bununla məhdudlaşdırmamalıyıq. Çünki bir halda ki, biz müstəqil dövlət kimi, Dünya Birliyində bərabərhüquqlu yer tutmuşuq, müasir dünya tələb edir ki, hər bir azərbaycanlı öz Azərbaycan dilini, dövlət dilini yaxşı bilərək, onu işlək dil hesab edərək, eyni zamanda başqa dili də – ingilis dilini də, rus dilini də, fransız dilini də, digər dilləri də bilsin. Əgər insan müstəqil Azərbaycanda öz ana dilini, Azərbaycan dilini bilmirsə, başqa dillərdə təhsil alırsa, əlbəttə, o, Azərbaycan üçün yararlı ola bilməz. Başqa dilləri öyrənmək, mənimsəmək lazımdır. Ancaq o şərtlə ki, təhsil Azərbaycan dilində keçirilsin. Azərbaycan dilində təhsillə yanaşı, başqa dillərin də çox mükəmməl öyrənilməsi təmin olunsun” [XXXVIc.s.21-22].

Digər əcnəbi dillərə hörmət edərək onların öyrənilməsinin vacibliyini “lazımdır ki” ifadəsi ilə auditoriyaya yönəldən böyük natiq təkcə dil öyrənməklə kifayətlənməməyi tövsiyə edir. Dil və praktik iş arasında vəhdət axtaran Ulu Öndər Yaponiyanın timsalında ritorik sual verir. “Öyrənin”, “tətbiq edin”, “yayın” feilin əmr şəklində auditoriyanı səfərbər edir.

“Dünya ölkələrinə səpələnsinlər” frazeologizmi ilə qabaqcıl elmə yiyələnməyi gənclərimiz qarşısında bir tələb kimi qoyur: “Lazımdır ki, yapon dilini yaxşı bilən azərbaycanlı mütəxəssislərimiz olsun. Təksə dil öyrənmək yox, gərək siz Yaponiyanın – bu qədər inkişaf etmiş bir ölkənin bütün

imkanlarından bəhrələnəsiniz, öyrənəsiniz. Necə olub ki, yaponlar bütün dünyada bu qədər böyük bir nailiyyət əldə ediblər? Siz də bunları öyrənin, gətirib Azərbaycanda tətbiq edin, yayın.

Mən Azərbaycana neçə illər rəhbərlik etmişəm. Mənim çox arzum olub ki, Azərbaycan gəncləri dünya ölkələrinə səpələnsinlər, orada təhsil alsınlar. O vaxt dünya ölkələrinə getmək mümkün deyildi, mən bunu SSRİ miqyasında edirdim. Amma indi dünya ölkələri bizim üçün açıqdır. İndi Amerikada da, Avstraliyada da, Meksikada da, Yaponiyada da gedib oxumaq olar. Amma bunların arasında Yaponiya bizim üçün çox əhəmiyyətli ölkədir" [XIVc.s.437].

"Bu prinsipial məsələdir, kişik məsələ deyildir" cümləsinin şərhində Heydər Əliyevin dövlət dilinə, rəsmi dilə bir dövlət başçısı kimi münasibətinin şahidi oluruq. "Mən hər yerdə ancaq Azərbaycan dilində danışıram" ifadəsinə diqqət yetirdikdə "ancaq" ədatını "mən" çıxış əvəzliyi ilə birgə işlədərək birinci şəxsin dilə olan mövqeyini əks etdirir. Təkcə bu ifadə ilə Azərbaycan diplomatiyası üçün ciddi tapşırıq verir, şəxsi nümunə göstərir. "Qoy" əmr ədatının köməyilə müstəqilliyimizi bir daha bəyan edir, "yox" inkar ədatı ilə prinsipial və dönməz mövqe göstərir. Dilin estetik tərəfini "gözəl, zəngin" ifadəsiylə təsdiqləyir: "Burada Azərbaycan dilindən tərcümə etmək çox çətindir, tərcüməçilərin əksəriyyəti rus dilindən tərcümə edirlər və bəzən mənə təklif edirlər ki, rus dilində danışım. Mənim üçün rus dilində danışmaq Azərbaycan dilində danışmaq kimidir, bəlkə, ondan da asandır. ***Çünki*** mən on illərlə rus dilində ***danışmışam, nitqlər söyləmişəm, danışıqlar aparmışam.*** Ancaq artıq bizim yaxşı tərcüməçilərimiz var. ***Mən*** hər yerdə ancaq Azərbaycan dilində danışıram. Hətta bu ölkənin tərcüməçisi mənə rus dilində tərcümə edir, ancaq mənim tərcüməçim mənim danışıqlarımı Azərbaycan dilindən tərcümə edir. İki tərcüməçi var. Çünki

onlar öz tərcüməçisi ilə gəlir, mən öz tərcüməçimlə. Onların tərcüməçisi rus dilinə tərcümə edir, – aydındır, mən rus dilini başa düşürəm, – amma mənim tərcüməçim isə onların dediyini Azərbaycan dilinə tərcümə edir, mənim də Azərbaycan dilində dediyimi onlar üçün ingilis dilinə tərcümə edir.

Bu, ***prinsipial məsələdir, kiçik məsələ deyildir***. Mən hər dəqiqə Azərbaycanın müstəqilliyini və milliliyini təsdiq edirəm, bunu nümayiş etdirirəm, hər sahədə göstərirəm. Qoy onlar elə bilməsinlər ki, biz keçmişdəki kimi yenə də Rusiyanın müstəmləkəsiyik, rus dilində danışırıq. ***Yox***! Bizim öz dilimiz var və öz dilimizdə danışırıq, dilimiz də ***çox gözəl, zəngin dildir”*** [XVIc.s.412-413].

Başqa dillərin öyrənilmə prosesində Heydər Əliyev iki prizmadan: həm utilitar (faydalanmaq), həm də etik-əxlaqi cəhətdən yanaşır. “Xatirimdədir” modal sözü ilə illər öncə dediyi “rus dilini mükəmməl öyrənin” ifadəsini yada salır, sonra da bunun mənasını açıb göstərir. Feilin əmr şəklində isə Azərbaycan dilini unutmamağı, mükəmməl öyrənməyi tələb edir. Təfəkkürün zənginləşməsi baxımından “nə qədər”, “o qədər” zərflərinin vasitəsilə çoxlu dil bilməyin əhəmiyyətindən danışır. “Azərbaycan dili hökm sürməlidir” feilin lazım şəklində işlədilən ifadə dilə münasibəti açıqlayır: “Ancaq indi Azərbaycandan kənarda yaşayan azərbaycanlılara yeganə tövsiyəm var – Azərbaycanı heç vaxt unutmasınlar. Burada çıxış edənlər çox gözəl danışdılar. Bu, məni sevindirdi. Mən hesab edirdim ki, indi onlar ***bəlkə də*** Azərbaycan dilini unudublar. ***Yox***, Azərbaycan dilində danışdılar. Bu, məni çox sevindirdi. ***Xatirimdədir***, o illər burada, bu salonda sizləri yola salarkən mən bir çox tövsiyələr verirdim. Verdiyim tövsiyələrdən biri o idi ki, rus ***dilini mükəmməl öyrənin***. Bu sözləri sizə hər dəfə demişəm. Bu gün isə deyirəm ki, rus dilini mükəmməl öyrənmisiniz, Azərbaycan dilini ***unutmayın***, ***mükəmməl öyrənin***. O vaxt rus dilinin öyrənilməsinə ehtiyac

var idi, çünki siz həmin ali məktəblərdə yaxşı təhsil almalı idiniz. Təhsil aldınız, öyrəndiniz – bu, sizin qazancınızdır. İnsan ***nə qədər çox dil bilsə,*** bir o qədər də zəngin olar. Amma Azərbaycan dilini nəinki unutmayın, müasir Azərbaycan dilini öyrənin. Bütün diasporlarda ***Azərbaycan dili hökm sürməlidir***. Çünki dilini unudan adam, şübhəsiz ki, ***milli keyfiyyətlərini də xırda-xırda unudur. Buna yol vermək olmaz"*** [XVIIc.s.227-228].

"Bir var ki" və "bir də var ki" sadə xalq dilində böyük ideyaları auditoriyaya bəyan etmək Heydər Əliyev dühasına xasdır. Elə bu sadə ifadələrin ardınca dili hansı səviyyədə bilməyin yolları açıqlanır: "Şübhəsiz" modal sözlə dilimizin yaşamasında heç bir problemin olmadığını qeyd edən Ulu Öndər problemin nitq mədəniyyəti məsələlərində olduğunu göstərir. "Bu, hələ bizdə çox çatışmayan bir sahədir" müddəası dilçi alimlərə də səfərbəredici ruh aşılayır: ""Ana dili" deyəndə, şübhəsiz ki, hər bir uşaq doğulandan sonra ailəsində atasından, anasından öz dilini öyrənir. Bir var ki, sadəcə öz dilini ailədə bilmək, bir də var ki, Azərbaycan dilini yüksək səviyyədə bilmək. Keçmişdə biz buna fikir verməmişik. Bu, həqiqətdir. Yəni o qədər fikir verməmişik. Eyni zamanda onu da unutmaq lazım deyil ki, keçmiş zamanlarda Sovet İttifaqının tərkibində olarkən Azərbaycanda orta təhsil və ali təhsil sistemində Azərbaycan sektoru həmişə ən çoxluğu təşkil etdiyinə görə biz dilimizi yaşatmışıq və inkişaf etdirmişik. İndi isə, şübhəsiz, bizdə təhsilin tam əksəriyyəti Azərbaycan dilində gedir. Ancaq bir var ki, Azərbaycan dilində oxuyursan, bir də var ki, dilinin incəliklərini bilirsən, Azərbaycan dilində yüksək səviyyəli söz deyə bilirsən, fikrini ifadə edə bilirsən, nitq edə bilirsən. Bu, hələ bizdə çox çatışmayan bir sahədir" [XXIc.s.254].

Dillə ədəbiyyatın vəhdət təşkil etdiyini, eləcə də ədəbiyyatı bilməməyin "yüksək mədəni səviyyəyə çata

bilməyəcəyinə" işarə edən böyük natiq "xüsusən" modal sözü ilə ədəbiyyatın rus bölməsində rolunun artmasını diqqət mərkəzinə çatdırır. Azərbaycan dili və ədəbiyyatının imperiya dövründə o qədər də hörmətli fənn olmadığını da xatırladır: "Ədəbiyyatımızı bilmək lazımdır. Ədəbiyyatını bilməyən adam dilini yaxşı bilməyəcəkdir. Ədəbiyyatı bilməyən adam yüksək mədəni səviyyəyə çata bilməyəcəkdir. Bu dərslərə fikir vermək lazımdır. Xüsusən, o məktəblərdə ki, Azərbaycanda dərslər rus bölməsində keçir, buna fikir vermək lazımdır" [XXIc.s.255].

"Yaxud da ki, orada, rus məktəblərində Azərbaycan ədəbiyyatını, Azərbaycan dilini tədris edirdilər, amma bu, o qədər də hörmətli bir fənn hesab olunmurdu, – yəni onu bilsən də olar, bilməsən də. Bunları mən məhz o vaxtlar müşahidə etmişdim. Mən o vaxtlar rastlaşırdım ki, rus məktəblərində oxuyan gənclər şairlərimizi – Nizamini, Füzulini, başqalarını, müasir şairlərimizi tanımırdılar. Yaxud tanısalar da adlarını bilirdilər, onların əsərlərini oxumurdular, şeirlərini oxumurdular. Çünki bunlar hamısı rus dilində oxuyurdular" [XXIc.s.256].

Azərbaycan dilinə olan sevgiylə bağlı Heydər Əliyev öz şəxsi həyatını məişət üslubunda, auditoriyanın asan mənimsəyəcəyi bir dildə nümunə gətirir. Özündə "cəsarət" tapıb Azərbaycan dilində oxuduqlarını dilinə gətirə bilməyənlərdən fərqli olaraq 16 yaşınadək Naxçıvanda öz ana dilimizdə təhsil aldığını dilə gətirir.

Özündə təvazökarlığı ehtiva edən "Bağışlayın ki, mən özüm haqqında danışıram" ifadəsini işlədərək ona verilən "Azərbaycan dilini nə təhər belə səlis bilirsiniz?", "Sən Azərbaycan dilini hardan bilirsən?" suallarını səmimiyyətlə cavablandırır. "Səmimi-qəlbdən deyirəm ki" ifadəsi bir daha auditoriyanı dilimiz haqqında dərindən düşünməyə sövq edir: "Bunu cəsarətlə deyirəm, çünki mən özüm birinci sinifdən

orta məktəbi qurtarana qədər burada oxumuşam. Əvvəl orta məktəbdə, sonra iki il pedaqoji texnikumda. 39-cu ildə burada pedaqoji texnikumu qurtarmışam. O dövrdə aldığım təhsil gələcək həyatımın bütün mərhələlərində mənə yardım edibdir. Bəziləri məndən soruşurlar ki, siz, – bağışlayın ki, mən özüm haqqında danışıram, – Azərbaycan dilini nə təhər belə səlis bilirsiniz? Bu sual da təbiidir, çünki bilirlər – o təşkilatlarda ki, mən işləmişəm, onların hamısında rus dili işlənirdi. Bilirlər ki, mən ali məktəbdə rus sektorunda oxumuşam, sonra Leninqradda, Moskvada xüsusi məktəblərdə oxumuşam, onlar da hamısı rus dilində idi. Yəni, demək olar ki, on altı yaşımdan sonra mənim bütün təhsilim, iş fəaliyyətim rus dilində gedibdir. Ona görə də soruşurlar ki, sən Azərbaycan dilini haradan bilirsən? Bu gün sizə səmimi-qəlbdən deyirəm ki, on altı yaşa qədər Naxçıvan məktəbində müəllimlərimin mənə verdiyi dərslər, o cümlədən başqaları ilə bərabər ana dili, ədəbiyyat dərsləri mənim bugünkü dilimin əsasını təşkil edir” [XXIIc.s.199].

Uşinski “Ana dili” məqaləsində yazırdı: “Xalqın dili onun mənəvi həyatının heç bir vaxt solmayan və daim təzədən çiçəklənən, tarix sərhədlərindən çox uzaqlarda başlamış boyasıdır. Dildə bütün xalq və onun bütün vətəni canlanmış olur. Vətənin göyü, onun havası, fiziki hadisləri, iqlimi, çölləri, dağ və düzənlikləri, meşə və çayları, əhatə edir, fırtına və tufanları xalq ruhunun bütün yaradıcılıq qüvvəsi ilə ana dilində fikirlərə, şəkillərə və səslərə çevrilir. Dil xalqın içərisində ölüb gedənləri, yaşamaqda olanları və gələcək nəsilləri böyük tarixi və canlı bir tam şəklində birləşdirən ən canlı, ən məhsuldar, ən möhkəm əlaqədir. Dil nəinki xalqın həyatiliyini özündə ifadə edir, xalqın ağzında dili hələ yaşadıqca xalq da yaşayır” [48].

Yazıçılar qurultayında Azərbaycan dilində söylənilən nitqi “axı burada elə bir şücaət yoxdur” təvazökarlığı ilə

söyləyirsə də, o dövr üçün bu elə şücaət sayılırdı. Dilimizin dövlət dili səviyyəsinə yönəlməsinin ilk addımlarını Heydər Əliyev atır: "Yadımdadır, ilk dəfə Yazıçılar İttifaqının qurultayında mən Azərbaycan dilində nitq söyləyəndən sonra tənəffüsə çıxdıq. Hamı gəlib məni təbrik edirdi. Ona görə ki, mən orada birinci növbədə Azərbaycan dilində danışdım. Dedim ki, əziz qardaşlar, ***axı*** burada elə bir ***şücaət*** yoxdur. Bu, bizim öz ***dilimizdir***. Mən bunu anladım. Çünki dövlət adamları ***Azərbaycan dilində*** danışmamışdılar. Bu ***dil*** məişət dili olmuşdu və bir də ədəbiyyatın ***dili*** olmuşdu. Amma dövlət ***dili*** olmamışdı" [XIIIc.s.134].

Xarici səfirlik və təşkilatların əməkdaşlarının Azərbaycan dilini öyrənməsində məcburiyyəti qeyri-etik hesab edən böyük natiq "mən öz azərbaycanlılarımızı məcbur edə bilmirəm ki" ifadəsi ilə bu məsələlərə aydınlıq gətirir. "Hətta" ədatı ilə böyük dövlətlərin səfirlik işçilərinin dilimizə olan marağını auditoriyaya açıqlamaqla "kiçik" dil yoxdur müddəasını irəli sürür: "Professor Hacıyev mənə deyir ki, siz Azərbaycanda fəaliyyət göstərən xarici şirkətlərin işçilərini məcbur edin, onlar Azərbaycan dilini öyrənsinlər. Mən öz azərbaycanlılarımızı məcbur edə bilmirəm ki, Azərbaycan dilini öyrənsinlər. Amma sizə deyim ki, onlar artıq öyrənirlər. Xarici ölkələrin respublikamızda olan səfirləri artıq Azərbaycan dilini öyrənirlər. Onlar mənimlə görüşəndə çalışırlar Azərbaycan dilində danışsınlar. Mən də bunlara çox sevinirəm. Hətta Rusiyanın səfiri cənab Bloxin də burada oturubdur – o, Azərbaycan dilini öyrənir, özü də çox yaxşı öyrənir" [XIIIc.s.136].

"Nə qədər məsələlər meydana çıxır" deməklə Ulu Öndər dillə bağlı problemlərin sadə olmadığını, dil problemlərinin həlli ilə müstəqilliyin möhkəmlənməsi arasındakı dialektik vəhdəti auditoriyaya nişan verir, çıxışını "qoy" əmr ədatı ilə nikbin notlarla yekunlaşdırır: "Beləliklə, görürsünüz, dil

məsələsi ilə əlaqədar ***nə qədər məsələlər meydana çıxır.*** Ancaq yenə də ən əsas nəticə ondan ibarətdir ki, Azərbaycanın dövlət müstəqilliyi Azərbaycan dilini əbədi edibdir və bu gün Azərbaycan dilimiz yaşayır və yaşayacaqdır. ***Qoy*** Azərbaycan dili müstəqil Azərbaycanda, eləcə də dünyada yaşayan bütün azərbaycanlıların dili olsun!" [XIIIc.s.137].

Nəzərə alsaq ki, beynəlmiləlçilik millilik üzərində inkişaf tapır və millilikdən yüksəlməyən beynəlmiləlçilik yarımçıqdır, o zaman "Heydər Əliyevin millilik, milli həmrəylik kimi mənəvi-əxlaqi dəyərlərin kökündə dil durur" prinsiplərinin hansı əhəmiyyətə malik olduğu anlaşılır: "Məni *sevindirən* odur ki, Azərbaycançılıq artıq tarixdə həkk olunubdur. Azərbaycan dili – Azərbaycan xalqının ana dili, müstəqil Azərbaycan respublikasının dövlət dili artıq dünya dilləri içərisində öz yerini tapıbdır. Dünya azərbaycanlılarında millilik, milli vətənpərvərlik hissləri günü-gündən artır, bu da bizim həmrəyliyimizin güclənməsinin rəmzidir. ***Mən əminəm ki***, bütün bu proseslər bundan sonra daha da sürətlə inkişaf edəcəkdir" [XIVc.s.17].

"Bizim üçün tarixi bir amil var – Azərbaycançılıq. Bilirsiniz, ermənilər çalışırlar sübut eləsinlər ki, guya, ümumiyyətlə, Azərbaycan milləti yoxdur, köçərilər olubdur, filan olubdur. Amma azərbaycanlı kimi bizim millətimizin böyük tarixi var. Böyük, qədim tarixi var! Bizim dilimiz Azərbaycan dilidir. Bilirsiniz, 1992-ci ildə Azərbaycanda böyük səhvə yol vermişdilər ki, bizim dilimiz türk dilidir. Bəli, biz türkdilli millətlərə daxilik, əcdadlarımız birdir. Ancaq türkdilli xalqlar sonra şaxələnib, hərəsi bir millətə çevrilibdir. Özbək də türkdillidir, qırğız da, qazax da, tatar da, türkmən də, başqırd da, uyğur da türkdillidir. Amma hərəsi bir millətdir, hərənin də öz dili var. Məsələn, mən özbək dilinin, ola bilər, on faizini başa düşə bilərəm, ondan artıq başa düşə bilmərəm. Amma bizim dillərimizin kökü birdir, biz bir kökdənik. Millət kimi də, dil

baxımından da bir kökdənik. Amma biz bu kökün bir budağıyıq, budaq, şaxə kimi inkişaf etmişik. Özümüzün adımız var – Azərbaycan, özümüzün dilimiz var – Azərbaycan dili. Çox da gözəl, zəngin, çox ləzzətli dilimiz var [XVIc.s.411].

"Bakılı oğlanlar" şən və hazırcavablar komandasının konsertindən sonra komandanın üzvləri ilə görüşdəki (Respublika sarayı, 5 may 2000-ci il) söhbətdədil məsələlərinə münasibətdə Heydər Əliyev "mənəvi hüququ" önə çəkir. "Birinci növbədə o özü öyrənməlidir" ifadəsində feilin lazım şəkli "öyrənməlidir"lə qətiyyətli mövqe ortaya qoyur, feilin şərt şəklində "öyrənməsə" ilə şərt qoyur, şərtə əməl etməyənləri feilin qəti gələcək zamanında "işdən azad edəcəyəm" deməklə səfərbəredici nitq nümunəsi yaradır: "Burada daha çox rus dilində danışdınız, proqramın da çox hissəsi rus dilindədir. Amma Azərbaycan dili tədricən tətbiq olunur, bu çox yaxşıdır. Ümumiyyətlə, Azərbaycanda çox adamlar iki dili – Azərbaycan və rus dillərini bilirlər. Bununla belə, bizim ölkəmiz müstəqildir, suveren dövlətdir, dövlət dilimiz Azərbaycan dilidir. Mən rəhbər vəzifədə olan bütün işçilərimizə iki-üç dəfə xəbərdarlıq etmişəm – kim öz Azərbaycan dilini ***öyrənməsə***, onu *işdən azad edəcəyəm*. Yəqin Anar da deyə bilər ki, kim ***öyrənməsə***, komandadan çıxaracaqdır. Lakin birinci növbədə o özü ***öyrənməlidir***, ***mənəvi hüququ*** olmaq üçün özü öyrənməlidir" [XXVIIc.s.65].

Azərbaycanlıların ümumrusiya konqresinin təsis yığıncağında da "dövlət dilini öyrənə bilməyən"lərin dövlət işini tərk edəcəklərini bəyan edir. Yarısatirik, yarıciddi tərzdə "hansı dildə danışırsınız-danışın" deyir: "Azərbaycan dövlət müstəqilliyini əldə edəndən sonra Azərbaycan dili dövlət dili elan olundu. Bundan doqquz il keçir. İndiyə qədər də Azərbaycanda, Bakıda azərbaycanlılar var, hətta dövlət işində çalışan azərbaycanlılar var ki, bizim müxtəlif iclaslarda, toplantılarda xahiş edirlər ki, öz fikirlərini daha dəqiq ifadə

etmək üçün onlara imkan verilsin, rus dilində danışsınlar. Mən isə neçə dəfə onları xəbərdar etmişəm ki, sizə bir az da vaxt verirəm, ancaq əgər o müddətdə də öz ana dilinizi, ***dövlət dilinizi öyrənə bilməsəniz***, bundan sonra dövlət işini tərk edəcəksiniz. Ondan sonra ***hansı dildə danışırsınız-danışın"*** [XXVIIIc.s.246].

Azərbaycan dilinin inkişafı ilə bağlı feilin lazım şəklində- "unutmamalısan", "bilməlisən", "qorumalısan", "saxlamalısan" – istifadə etdiyi ifadələrlə konqres auditoriyasını səfərbər edir: "Amma bu, sizə aid deyil, Azərbaycanda yaşayan və dövlət işində çalışan azərbaycanlılara aiddir. Eyni zamanda, burada məndən öncə çıxış edənlər də, xüsusən professor Məmməd Əliyev dedi ki, harada olursan-ol, hansı məmləkətdə, hansı xalqın içində yaşayırsan-yaşa – öz kökünü unutmamalısan. Öz dilini nəinki ***unutmamalısan*** – ***bilməlisən***, öz adət-ənənələrini nəinki bilməlisən – bunlara həmişə riayət etməli, bunları ***qorumalısan, saxlamalısan***" [XXVIIIc.s.246-247].

Dillə bağlı Heydər Əliyevin müxtəlif üslubların çulğalaşdığı nitqinin şahidi oluruq. "Azərbaycan dili!" xitabı, "Azərbaycan dilinin nə qədər şeirə bənzədiyini, xoş ahəngli olduğu" bədii ifadələri, "Dil hər bir millətin milliliyinin əsasıdır" publisistik cümləsi, dilçilikdə əsas elmi termin kimi "dil"dən istifadə olunması bu sıradandır. Təkcə "dil" terminini həcmcə kiçik, məzmunca çox zəngin bir mətndə 15 məqamda təkrar şəklində işlədərək dilə olan ilahi sevgisini izhar edir: "***Azərbaycan dili!*** Bu gün iftixar hissi ilə deyə bilərik ki, Sovet hakimiyyəti illərində biz Azərbaycan ***dilini*** qoruduq, saxladıq və inkişaf etdirdik. Azərbaycan ***dili*** indi çox yüksək səviyyədə, yəni onun qrammatik quruluşu, başqa sahələri yüksək səviyyədə olan bir ***dildir***. Sizə deyə bilərəm ki, başqa ölkələrdə müxtəlif ***dillərə*** mənsub olan insanlar Azərbaycan ***dilini*** sadəcə eşidərək, onun mənasını o qədər bilməyərək, ***Azərbaycan dilinin nə qədər şeirə bənzədiyini, xoş ahəngli olduğunu*** də-

fələrlə qeyd ediblər. Biz dilimizlə fəxr etməliyik. ***Dil hər bir millətin milliliyinin əsasıdır.*** Ona görə də hər bir gənc öz ana ***dilini***, Azərbaycan ***dilini***, müasir Azərbaycan ***dilini*** gərək ən incəliklərinə qədər bilsin və bu ***dildən*** istifadə etsin. Biz müstəqil Azərbaycanda Azərbaycan ***dilini*** dövlət ***dili*** etdiyimiz kimi, cəmiyyətimizdə də, xalqımızın içində də Azərbaycan ***dilini*** mütləq hakim ***dil*** etməliyik" [XXVIIIc.s.247].

Heydər Əliyevə görə, azərbaycançılığın əsas tərkib hissələrindən biri və birincisi də dildir. Müstəqil Azərbaycan dövlətinin əsas ideyası ***azərbaycançılıqdır***. "Biz bundan sonra da Azərbaycan dilinin inkişaf etdirilməsi üçün səylərimizi davam etdirəcəyik" feilin qəti gələcək zamanında işlədilən cümlə dövlət başçısının prinsipial mövqeyini ortaya qoyur: "Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və ***azərbaycançılığı – Azərbaycanın dilini***, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıdır. Azərbaycan dilinin inkişafı haqqında bizim qəbul etdiyimiz geniş qərar məhz bu məqsədi daşıyır. Biz Azərbaycanın latın əlifbasına keçməsi haqqında qərar qəbul etdik. İndi Azərbaycanda hamı, bütün dövlət orqanları yalnız latın əlifbasından istifadə edir. Bu da bizim milliliyimizi, azərbaycançılığımızı göstərən çox mühüm bir amildir. Biz bundan sonra da Azərbaycan dilinin inkişaf etdirilməsi üçün səylərimizi davam etdirəcəyik" [XXXIXc.s.244].

Bilkənd universitetində İhsan Doğramacının abidəsinin açılış mərasimindəki nitqində Azərbaycan və türk dili arasında olan yaxınlıqları müqayisə edir, "axı" qüvvətləndirici ədatı ilə və "eyni dildir" ifadəsini işlətməklə Türk və Azərbaycan dillərinin eyni kökdən qaynaqlanan dillər olduğunu açıqlayır. "Ləhcə" dilçilik terminini bir neçə dəfə təkrarlayaraq dialektologiya sahəsinin aparıcı mütəxəssisi kimi fikirlərini bəyan edir. Türk auditoriyasında "bilgili" deməklə doğmalıq yaradır, "elədirmi" ritorik sualla dillərin yaxınlığına olan yad

şübhələri aradan qaldırır: "İhsan Doğramacının çox böyük xüsusiyyətləri var. Məsələn, Azərbaycanda ləhcələr var – Bakı ***ləhcəsi***, Naxçıvan ***ləhcəsi***, Gəncə ***ləhcəsi***, Qarabağ ***ləhcəsi***, başqa yerin ***ləhcəsi***… Bu ***ləhcələrin*** hamısını bilir. Bizim adamların çoxu bunu bilmir. Mən sizə deyim, mən ***dilçi*** deyiləm, ***linqvist*** deyiləm. Ancaq mən də, hər halda, ***bilgili*** adamam. Amma bunları mən də onun qədər bilmirəm. Bizim dilimiz birdir ***axı***, türk dili, Azərbaycan dili eyni dildir. Yəqin ki, siz məni tam anlayırsınız. ***Elədirmi***? Azərbaycanda biz keçmişdə türk dilini çox sevdiyimizə görə, amma türklərlə bir təmasımız, yəni danışığımız olmadığına görə, insanlar hansısa bir türklə görüşəndə onunla bir neçə kəlmə türk dilində danışmaq istəyirlər. Məsələn, biz "gəlirəm" deyirik, türklər isə "gəliyorum", "gediyorum" deyirlər" [XXXIXc.s.244].

"Yüz faiz" miqdar sayı ilə dillərin yaxınlığını dilə gətirən Ulu Öndər son dövrlərdə dillər arasında yaranan belə müxtəlifliyi faktlarla izah edir. İhsan Doğramacı ilə söhbətdə "bu öz işinizdir" deməklə başqa ölkələrin daxili işinə qarışmamağı nəzərdə tutur, "bilirsənmi nə üçün belə olubdur" ritorik sualla ermənilərin türklərə qarşı bütün sahələrdə, o cümlədən dil sahəsində yeritdiyi əxlaqa zidd hərəkətlərini həm ifşa edir, həm də türkdilli xalqları ayıq salır: "Mən bir dəfə söhbət edirdim. Dedim ki, məsələn, biz, mənim kimi yaşlı adamlar İhsan Doğramacı ilə, başqa yaşlı adamlarla danışanda bir-birimizi ***yüz faiz başa düşürük***. Türk dilində, Azərbaycan dilində bu sözlər dəyişilməyibdir. Amma türk dilində bir-iki islahatlar keçirilibdir, ona görə də bəzi sözlər dəyişilibdir, daha çox Avropa sözləri götürülübdür. Məsələn, "siyasət" sözü var, onu "politika" etmisiniz. "Siyasət" yaxşı bir sözdür. Nə fərqi var, "siyasət" ərəb sözüdür, "politika" Avropa sözüdür. ***Bu öz işinizdir***. Amma bir dəfə zarafat edəndə dedim ki, ***bilirsənmi nə üçün belə olubdur***? Dedi ki, nə üçün? Dedim, çünki sizdə dil islahatı keçiriləndə islahatınızın qurum

genel başqanı erməni olmuşdur – Akop Dilaçar. Onu tanıyırsınızmı? Görürəm tanımırsınız. Amma o tanıyır. Erməni Akop özünü türk kimi qələmə vermək üçün də deyibdir ki, Akop Dilaçar. O, islahat keçiribdir. Bu tarixdən çox danışmaq olar" [XXXIXc.s.248-249].

Ana dilinə münasibətin ifrat dərəcədə siyasiləşdirildiyi və çox vaxt əsassız siyasi ittihamlar üçün zəmin olduğu illərdə Heydər Əliyev Azərbaycan dilinin məişət və ədəbi dil səviyyəsindən dövlət dili səviyyəsinə çatdırılmasına yönəlmiş fəaliyyətlə kifayətlənməyib, həm də öz şəxsi nümunəsi ilə ana dilimizin nüfuzunu artırır, onun elmi cəhətdən öyrənilməsi, geniş yayılması üçün stimul yaradırdı. Məsələn, onun təşəbbüsü ilə respublikanın bir qrup dilçi alimi Azərbaycan dilinin tədqiqi sahəsində araşdırmalara görə Dövlət mükafatına layiq görülmüş, respublikada ilk dəfə müstəqil Dilçilik İnstitutu yaradılmışdır. Bu da ana dilinin ictimai-siyasi nüfuzunun möhkəmlənməsinə kömək edir və dilin tarixinə, dialektologiyaya və bir çox digər problemlərə dair fundamental tədqiqatlar aparılmasına imkan verirdi [XLVc.s.281].

Heydər Əliyevin "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" və "Azərbaycan Respublikasında dövlət dili haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsinə dair" fərmanları sayəsində ədəbi dilimizin fəaliyyət sahəsi daha da genişlənmiş, onun müxtəlif üslublarının potensialı bir daha aşkar edilmiş, bütövlükdə bizim dil mədəniyyətinin qarşısında yeni üfüqlər açılmışdır [XLVc.s.284].

"İnamla demək olar ki, Heydər Əliyev özünün çoxillik yorulmaz, titanik fəaliyyəti ilə həm Azərbaycan dövlətinin, həm də Azərbaycan dilinin nüfuzunu yüksəltmişdir. Məhz onun müdrik rəhbərliyi ilə Azərbaycan dili dünyanın siyasi xəritəsində öz yerini tutmuş dövlətimizin rəsmi dilinə çevrilmişdir" [XLVc.s.285].

“Məni sevindirən odur ki, azərbaycançılıq artıq tarixdə həkk olunubdur. Azərbaycan dili – Azərbaycan xalqının ana dili, müstəqil Azərbaycan respublikasının dövlət dili artıq dünya dilləri içərisində öz yerini tapıbdır. Dünya azərbaycanlılarında millilik, milli vətənpərvərlik hissləri günü-gündən artır, bu da bizim həmrəyliyimizin güclənməsinin rəmzidir. Mən əminəm ki, bütün bu proseslər bundan sonra daha da sürətlə inkişaf edəcəkdir” [XIVc.s.17].

“Bu diskussiyanın gedişində sırf elmi arqumentlər prioritet əhəmiyyət kəsb edirdi. Bununla belə, son söz yenə xalqa verildi. Dilin adının özü yeni konstitusiya layihəsində əks etdirildi və referenduma çıxarıldı. Beləliklə, dünyada geniş yayılmış “Azərbaycan dili” anlayışının qanuni yaşamaq hüququ ona qaytarıldı. Bu halda dövlətimizin başçısı haqlı olaraq qeyd etmişdir ki, belə bir qərar qəbul edilməsi “həm bizim keçmişimizə böyük hörmət, həm də gələcək nəsillər üçün böyük dəyərdir. Hesab edirəm ki, biz çox düzgün və əsaslandırılmış qərar qəbul etmişik” [XLVc.s.285-286].

“Azərbaycan dili hökm sürməlidir” feilin lazım şəklində işlədilən ifadə dilə münasibəti açıqlayır.

Dillə bağlı Heydər Əliyevin müxtəlif üslubların çulğalaşdığı nitqinin şahidi oluruq.

Azərbaycan dilinin inkişafı ilə bağlı feilin lazım şəklində- “unutmamalısan”, “bilməlisən”, “qorumalısan”, “saxlamalısan” – istifadə etdiyi ifadələrlə konqres auditoriyasını səfərbər edir:

Azərbaycan dilinə olan sevgiylə bağlı Heydər Əliyev öz şəxsi həyatını məişət üslubunda, auditoriyanın asan mənimsəyəcəyi bir dildə nümunə gətirir.

## 1.2.7. Heydər Əliyevin nitqində dini etika

Siyasi və elmi dünyagörüşümüzün formalaşması zəminində, eləcə də xalqımızın dini dünyagörüşünün zənginləşməsində, dini dəyərlərimizin şüurlara çatdırılması yolunda Ulu Öndər Heydər Əliyevin nitqlərinin araşdırılması bu gün də öz vacibliyini, öz aktuallığını saxlayır. Heydər Əliyevin dini məsələlərlə bağlı beynəlxalq konfranslardakı çıxışları, dini bayram və mərasimlərdə xalq qarşısındakı görüşləri, din xadimləri ilə rəsmi qəbullardakı söhbətləri, dini icmalarla aparılan, çoxsaylı məscidlərin dindarların istifadəsinə verilməsi və ziyarətgahların xalqa qaytarılması və təmiri zamanı söylənilən dini və dini-elmi üslublu nitqləri dini araşdırmalar üçün mühüm mənbə rolunu oynayır.

Sovetlər dönəmində dilçilik sahəsində dini üslubdan danışmaq mümkünsüz görünürdü [139]. Bu üslubun elmi cəhətdən tədqiqi üçün Heydər Əliyevin dini çıxışları əvəzsiz material verir. Təküslubluluğa sığmayan Heydər Əliyev nitqində dini üslubun öz yeri var [130]. Anlaşıqlı bir tərzdə sadə cümlələrlə kütlələrə yönələn bu üslub müstəqillik illərində Heydər Əliyev tərəfindən inkişaf etdirilmişdir desək birmənalı şəkildə yanılmarıq. Bu fəsildə Ulu Öndərin şifahi, spontan söylənilən nitqləri əsasında islami dəyərlərimizin araşdırılmasını qarşımıza məqsəd qoyduq.

Böyük natiqin dilində dini etika dövlətin, əsasən də Azərbaycan dövlətinin dini dəyərlərə qayğısını, vətəndaşların bir-birinin dini inanclarına hörmətini, din ocaqlarından istifadəni, dünyəvi dövlət quruculuğunda dinin yerinin müəyyənləşdirilməsini, dinin müasir elmlərlə sıx əlaqəsini, din tarixinin qərəzsiz öyrənilməsini, din tariximizdəki şanlı səhifələri bugünkü reallıqlarımızla uyğunlaşdırmağı, dini dəyərlərdən dövlət idarəçiliyində istifadəni, dövlətçiliyin dayaqla-

rını sarsıtmağa yönələn dini təmayüllərə qarşı sivil mübarizəni və s. ehtiva edir.

Sovetlər dönəmində məscidlərin, kilsələrin, sinaqoqların, eləcə də digər din ocaqlarının bütöv xalqların üzünə qapandığı dövrlərdə dilçilik elmində dini üslubdan danışmaq mümkünsüz idi. Müstəqillik qazandıqdan sonra dindarlar qarşısında Heydər Əliyevin söylədiyi nitqlər, beynəlxalq və respublika miqyaslı dini konfranslardakı çıxışlar dini, dini-elmi üslubların əsasını qoydu. Bu üslub Ulu Öndərin dilində dini məsələlərin sadə xalq dilində, nitqin şüurlara çatdırılması yolunda təsirli ifadələrdən-frazeologizmlərdən [31, 40, 45, 62, 87, 94, 115, 117, 133, 162], sinonimlərdən [33, 39, 78, 95], təkrarlardan, modal söz [37, 54] və ədatlardan [50] yararlanmaqla yerinə yetirilir. Dini üslub dini etikanın qarşısına qoyduğu məsələlərin həlli yolunda dindarlar auditoriyasının mühazirəçiləri üçün əvəzsiz rol oynayır. Təküslubluluğa sığmayan Heydər Əliyev nitqində bu üslub özündə publisistik, elmi və digər üslubların çalarlarını əks etdirir. "Respublikamızda son illər gedən proseslər cürbəcür ziddiyyətlər yaradır. Bəzi adamlarda bir-birinə qarşı kin-küdurət, ədavət, qisasçılıq hissləri yaranıb. Bunların hamısını kənara qoymaq lazımdır. Allah-təala belə buyurub, Qurani-Kərim də bunu bizdən tələb edir. Dinimizin əsasını qoyan və mənim bu günlərdə məbədini ziyarət etdiyim Həzrəti Məhəmməd peyğəmbər də bizə bu yolu göstərir. Ona görə də mən həm sizə, bütün dindarlara, həm də bütün azərbaycanlılara müraciət edirəm. O müqəddəs yerləri ziyarət edəndən sonra bir daha mənəvi cəhətdən özümü hüquqlu hesab edərək xalqa müraciət edirəm ki, xalq birləşsin" [IIc.s.85]

Hörmətli konfrans iştirakçıları!

Sizi – paytaxtımız Bakı şəhərində təşkil olunmuş beynəlxalq konfransın iştirakçılarını Azərbaycan torpağında səmimiqəlbdən salamlayıram.

Konfrans son vaxtlarda baş qaldırmış terror, təcavüzkarlıq, zorakılıq kimi mənfi təzahürlərə qarşı mübarizədə islam dininin tutduğu yeri və mövqeyi obyektiv şəkildə araşdırıb aydınlaşdırmaq, bəzi qüvvələrin öz qərəzli siyasi məqsədlərini həyata keçirmək üçün dindən bir vasitə kimi istifadə etmək cəhdlərinin əsl mahiyyətini açıb göstərmək məsələlərinə həsr olunmuşdur. Həmişə sülh, əmin-amanlıq, qardaşlıq kimi humanist prinsiplərin carçısı olmuş islam dini ona etiqad edən insanlarda yüksək mənəvi keyfiyyətlərin formalaşmasına xüsusi diqqət yetirmişdir. Bu baxımdan tam qətiyyətlə demək olar ki, öz cinayətkar əməllərini dini şüarlarla pərdələməyə çalışan bəzi terrorçu qrupların, ayrı-ayrı adamların fəaliyyətinin islam dini ilə heç bir əlaqəsi yoxdur, onların əməlləri dinimizin humanist prinsiplərinə tamamilə ziddir [XXXVIIc.s.182].

Dini dəyərlərin tədqiqindən öncə İslamın bir din kimi yaranması, mövcudluğu, möhkəm dayaqlar üzərində bərqərar olması, müsəlmanların öz dininə sadiqliyi, bu yolda göstərdikləri iman və əqidə kimi məsələlər böyük natiq tərəfindən auditoriyalara–həm sadə dindarlar auditoriyasına, həm də beynəlxalq elmi-dini konfranslar auditoriyasına ünvanlanır. Bu cür çıxışlarda Ulu Öndər öncə bütövlükdə din anlayışına tərif verir, dinin insanların həyatındakı rolundan bəhs edir: “Din nə deməkdir? Din – xalqların müxtəlif dövrlərdə qəbul etdikləri əsas yaşayış qaydaları və mənəviyyatının başlıca qaynaqlarıdır. Odur ki, ateist təbliğatı, ateizm o zaman heç bir nəticə vermədi. Doğrudur ki, din rəsmən qadağan edilmişdi, lakin adamların böyük əksəriyyəti qəlbən özünün dinə, milli dəyərlərə mənsub olduğunu yaddan çıxarmır, dilini unutmurdu. Halbuki Sovetlər İttifaqında hamının ancaq rus dilində, millətlərarası ünsiyyət dilində danışmalı olması, digər dillərin isə getdikcə ölməli olması fikri təlqin edilirdi. Bəli, bunu çoxmillətli ölkədə qəbul etmək olardı, lakin bir şərtlə ki,

hər bir xalq öz dilini də inkişaf etdirsin. Çünki dil insanın milli mənsubiyyətini, milli köklərini müəyyənləşdirən mühüm amillərdən biridir ” [XXIXc.s.229].

Heydər Əliyevin dini üslublu çıxışlarında auditoriyalar religioz sistemlərin etik nüvəsi ilə tanış olur. Mühüm etik kateqoriya olan mənəviyyatın inkişafında dinin – islam dininin xüsusi rolu auditoriyalara sadə anlaşıqlıqlı bir dildə çatdırılır: “İslam dini əsrlər boyu bizim ***mənəviyyatımızın*** əsasını təşkil etmiş, müsəlmanların dünyada layiqli yer tutmasını təmin etmişdir. Qurani-Kərimin bütün kəlamları bu gün Azərbaycanda Allahın yolu ilə getməyimiz üçün ***məşəldir***. Biz bu yolla gedirik və gedəcəyik” [IIc.s.144].

Heydər Əliyev dinin qüdrətini, dinin gücünü “o qədər” ədatı ilə auditoriyalara anladır. “Heç bir” inkar əvəzliyi ilə dinin qarşısıalınmaz gücə malik olduğunu prinsipial şəkildə bəyan edir. Auditoriya böyük natiqi sanki ilahiyyat elminin aparıcı mütəxəssisi kimi qəbul edir: “Kommunist ideologiyasının bəşəriyyətə vurduğu zərbələrdən ən böyüyü 70 il müddətində dinə qarşı aparılmış təbliğat və xüsusən dinin qadağan olunması və dinin təhrif edilməsi olmuşdur. Ancaq eyni zamanda bu tarix onu da göstərir ki, din və o cümlədən bizim mənsub olduğumuz islam dini ***o qədər*** qüdrətə malikdir ki, *o qədər* gücə malikdir ki, ***heç bir*** ideologiya, ***heç*** *bir* hakimiyyət, ***heç bir*** hökmdar onunla bacara bilməz və 70 illik tarix də göstərdi ki, bunu bacara bilmədi” [IIc.s.144].

“Həzrəti Məhəmməd peyğəmbərin mövlud günü bizim böyük bayramımızdır. Çünki biz müsəlmanlar həyatımızın başlanğıcını Allah tərəfindən göndərilmiş Məhəmməd peyğəmbərin və onun yaratdığı Qurani-Şərifin əsasında görürük”. İslam dininin insanlara bəxş etdiyi etik dəyərlər sinonim çərgə ilə (səadət, xoşbəxtlik, mənəviyyat) dini bayramlarda dindarlar auditoriyasına yönəlir: “Xalqımızın, müsəlmanların, Allahın göstərişi ilə Məhəmməd peyğəmbərin, Quran-Şərifin

qoyduğu yolla getdiyi illər, əsrlər biz müsəlmanları daim yaşadıb, çətinliklərdən çıxarıb, xoşbəxt günlərə gətirib, bizə xoşbəxtlik, səadət bəxş edibdir. Ona görə də bu bayram bizim üçün ən böyük bayramdır. Bu ***səadət, xoşbəxtlik, mənəviyyat*** bayramıdır. Biz bu bayramı böyük iftixar hissi ilə qeyd edirik. Ona görə ki, bizim müqəddəs Qurani-Şərif kimi kitabımız var. Ona görə ki, biz müsəlmanlar Allahın qoyduğu yol ilə gedərək nailiyyətlərdən-nailiyyətlərə çatmışıq" [IVc.s.195]

Həcc ziyarətinə gedən bir qrup zəvvarlarla görüşdəki söhbətdə öz şəxsi həyatından nümunələr gətirir. Bu zaman "mən" şəxs əvəzliyindən geniş istifadə edir ("mənim həyatımda", "mən deyirəm ki", "qəlbimdə yaşayan"), həyatdakı çətinlikləri sinonim cərgəylə (müxtəlif qayğılar, çətinliklər, problemlər) sadalanır, Həcc ziyarətininsə bu çətinlikləri dəf edən yeni etik dəyərlər (cəsarət, məğrurluq) yaratdığını qeyd edir: "Çox şadam ki, illər boyu qəlbimdə yaşayan arzumu 1994-cü ildə həyata keçirə bildim, müqəddəs yerləri – Məkkəni, Mədinəni, Kəbəni ziyarət etdim. Bu, ***mənim həyatımda*** ən dəyərli tarixi bir hadisə olubdur. Deyə bilərəm ki, belə bir ziyarətdən sonra insan ***nə qədər*** yüksəlir, ***nə qədər*** yüksək hisslərə qovuşur. Buna görə də ***mən deyirəm ki***, siz artıq xoşbəxt bir insansınız. Təbiidir, hər bir insanın həyatında ***müxtəlif qayğılar, çətinliklər, problemlər*** vardır. Ancaq bunların içərisində Həcc ziyarəti etmək insanlarda müəyyən qədər rahatlıq yaradır və başqa çətinliklərin öhdəsindən gəlmək üçün insanları daha da ***cəsarətli*** edir, daha da ***məğrur*** edir [XIXc.s.327-328].

Dini etik dəyərlər böyük natiqin dilində "Allaha şükürlər olsun ki" modal sözü ilə auditoriyalara ayaq açır. Qurani-Kərimin müddəaları sadə xalq dilində insanlara ünvanlanır: **"**İndi əgər biz burada ***keçmişimizi qurdalasaq***, qaldırsaq, – nə təhər oldu, nə cür oldu, bunlar bizə xeyir gətirməyəcəkdir. ***Allaha şükür olsun ki***, müstəqil dövlətimiz var. ***Allaha şükür***

***olsun ki***, ictimai-siyasi sabitlik yaranıbdır. ***Allaha şükür olsun ki,*** tam sülh olmasa da, sülh şəraitində yaşayırıq. ***Allaha şükür olsun ki***, hamımız bir yerdəyik. Vaxtilə kimin başına nə gəlib, nə təhər olub, filan olub – bunlar keçmişdə qalıbdır. Mən bunları unuduram. Xahiş edirəm siz də unudasınız" [XIIIc.s.19]. Bu kiçik mətndə "Allaha şükürlər olsun ki" modal sözün dörd yerdə təkrarlanması, "keçmişimizi qurdalasaq", "nə təhər oldu", "nə cür oldu" ifadələrinin yarıməişət, yarıdini bir üslubda, ümumişlək sözlərin ekspressivliyi fonunda işlədilməsi ilə ağsaqqal öyüdü tipində nitq yaradılmasının şahidi oluruq.

Tarixi olduğu kimi qəbul etmək, auditoriyaya da bu fikri, bu ideyanı qəbul etdirmək Heydər Əliyev dühasına xasdır. Dini üslubun tələb etdiyi sadə cümlələrlə islam əxlaqı auditoriyalara yön alır: "Şübhəsiz ki, tarixən hər bir cəmiyyətdə mənfi ünsürlər olmuşdur və bu gün bizim cəmiyyətmizidə də var. Əgər belə olmasaydı, Qurani-Kərimdə də insanları *bəd əməldən*, *xətalı yoldan* çəkinməyə çağıran ayələr yazılmazdı. İnsanların həmişə *düz* yolla, *təmiz mənəviyyat yolu* ilə getməsinə çalışmaq lazımdır. Cinayətə, cürbəcür təxribata əl atan adamların həm qarşısını almaq, həm də onları tərbiyə etmək lazımdır. Bunu bizdən Allah-taala tələb edir, bizə bu dərsi peyğəmbər vermişdir. Bütün bunlar Allahın Məhəmməd peyğəmbərə nazil etdiyi müqəddəs kitabımızda yazılmışdır" [IIc.s.147]. Elə yuxarıdakı mətndə "bəd əməl", "xətalı yol", "düz yol", "təmiz mənəviyyat yolu" kimi əxlaqi anlayışların köməyi ilə dindarların qəlbi fəth olunur.

Dini üslubun tələb etdiyi dini terminlərlə (Allah-taala, Qurani-Kərim, Həzrəti Məhəmməd peyğəmbər) nitqini davam etdirən böyük natiq dinimizdə bəyənilməyən antietik dəyərləri sinonim cərgə ilə sadalayaraq nitqin şüurlara çatdırılmasını sürətləndirir. "Həm", "həm də" iştirak bağlayıcıları, "bir daha" ədatının köməyilə hüquqi etikanın ona verdiyi "mənəvi

hüquqdan" istifadə edərək auditoriyanı səfərbər edir: "Respublikamızda son illər gedən proseslər cürbəcür ziddiyyətlər yaradır. Bəzi adamlarda bir-birinə qarşı ***kin-küdurət, ədavət, qisasçılıq*** hissləri yaranıb. Bunların hamısını kənara qoymaq lazımdır. Allah-taala belə buyurub, Qurani-Kərim də bunu bizdən tələb edir. Dinimizin əsasını qoyan və mənim bu günlərdə məbədini ziyarət etdiyim Həzrəti Məhəmməd peyğəmbər də bizə bu yolu göstərir. Ona görə də mən ***həm*** *sizə*, bütün dindarlara, ***həm də*** bütün azərbaycanlılara müraciət edirəm. O müqəddəs yerləri ziyarət edəndən sonra ***bir daha mənəvi*** cəhətdən özümü ***hüquqlu*** hesab edərək xalqa müraciət edirəm ki, xalq birləşsin" [IIc.s.85].

"...Mən bir neçə ay bundan əvvəl bu barədə öz fikrimi demişdim, bu gün bir daha deyirəm. Azərbaycanda keçmişdə bu qədər araq, spirtli içkilər olmayıbdır. ***Necə olubdur ki, xalqımız bu qədər spirtli içkilər içməyə başlayıbdır?*** Bu, bizim üçün zərərlidir. Bir tərəfdən, bol olanda onun qiyməti də aşağı düşür. Spirtli içkilər, xüsusən araq istehsal etməklə bizim xalqımızın ənənələri pozulur. Bunu sübut etmək lazım deyil ki, spirtli içkilər, xüsusən araq hər bir insan üçün zərərli bir içkidir. Xalqımız keçmiş zamanlarda heç vaxt araq, spirtli içki içməyibdir. Bizim islam dinimiz də bunu yasaq, qadağan edibdir. Ancaq yenə də deyirəm, bəzi iş adamları fikirləşirlər ki, daha çox qazancı araq istehsalından götürmək olar. Biri orada, biri burada araq sexi, spirt sexi yaradır. Mənə məlumat gəlir ki, bizim yüksək vəzifəli bəzi şəxslər də belə araq, spirt istehsalına himayədarlıq edirlər, çünki oradan qazanc götürməyə çalışırlar.

Mən bu gün bir daha bəyan edirəm: Azərbaycanda belə hallara son qoyulmalıdır. Mən Azərbaycanda spirtli içkiləri qadağan etmirəm. Ancaq üzümü öz soydaşlarıma tutub sadəcə demək istəyirəm ki, ***gəlin*** bizim milli, dini, mənəvi ənənələrimizi – ulu babalarımızdan əsrlərdən əsrlərə bizə qalmış

ənənələrimizi pozmayaq. ***Gəlin*** onlara sadiq olaq, arağa bu meylin artmasına nəinki imkan verməyək, hətta onun qarşısını alaq. Bu, mənim ümumi fikrimdir. Amma konkret istehsalla əlaqədar onu demək istəyirəm ki, Azərbaycanda spirt, araq, yaxud da ki, spirtli içkilər əhaliyə nə qədər lazımdır, o qədər istehsal olunmalıdır. Başqa istehsalın qarşısı alınmalıdır. Mən bizim Nazirlər Kabinetinə, müvafiq nazirliklərə, komitələrə bu haqda göstəriş vermişəm. Bu gün bir daha bunu təkrar edirəm – bunların qarşısı alınmalıdır" [XIVc.s.34-35]. Dini dəyərlərimizə əngəl ola biləcək zərərli adətlər Ulu Öndərin nitqində auditoriyalara açıqlanır. "Necə olubdur ki, xalqımız bu qədər spirtli içkilər içməyə başlayıbdır" ritorik sualı auditoriyanı səfərbər etməklə yanaşı, həm də düşündürür. Elə bu ritorik sualın arxasında dini dəyərlərə sadiqlik, dindarların şüurunda təbəddülat dayanır. "Gəlin" ədatının təkrarlanması ilə spirtli içkilərə olan münasibət tam ciddiyyəti ilə ortaya qoyulur.

Etik dəyərləri – əməl, sədaqət, milli istiqlaliyyət ruhu-dini-poetik bir dillə çatdırmaq Heydər Əliyev şəxsiyyətinə xasdır. "Onlar cismən bu dünyadan gediblər, ancaq ruhən bizim qəlbimizdədirlər". İfadəsi Mövlana Cəlaləddin Ruminin "bədənlərimiz, cisimlərimiz ruhlarımızın gəmisidir" fikri ilə, "Dünyaya gələn hər bir insan bu dünyanı tərk edəcəkdir. Bu dünya heç kim üçün əbədi deyildir" ifadəsi isə Səməd Vurğunun "Əldən ələ keçir vəfasız həyat, Biz gəldi − gedərik sən yaşa dünya" misraları ilə həmahəng səslənir. "Ancaq" bağlayıcısı ilə şəhidlərin ölməzliyini bəyan edir, auditoriyanı nikbinliyə hazırlayır: "***Dünyaya gələn hər bir insan bu dünyanı tərk edəcəkdir. Bu dünya heç kim üçün əbədi deyildir***. ***Ancaq*** öz əməlləri ilə, xalqa, millətə sədaqəti ilə, xalqın milli istiqlaliyyət ruhunu yüksəklərə qaldırmaları ilə dünyalarını dəyişənlər ən müqəddəs insanlardır. Onlar ***cismən bu dünyadan gediblər, ancaq ruhən bizim qəlbimizdədirlər***, bütün

Azərbaycan xalqının qəlbindədirlər. Bu gün Şəhidlər xiyabanına ümumxalq axını və hər bir Azərbaycan vətəndaşının gəlib müqəddəs qəbirləri ziyarət etmək arzusu və ziyarəti onu sübut edir ki, onlar – bu şəhidlər bütün xalqımızın qəlbində yaşayırlar. Onlar heç vaxt unudulmayacaqdır" [XIVc.s.142].

Şəhidliyi ən yüksək etik-mənəvi dəyər hesab edən Ulu Öndər "baş əymək" frazeologiyası ilə şəhidliyin qiymətini hər bir vətəndaşımıza anladır. Müstəqilliyə aparan yolda şəhidlərin şərhsiz rolunu "bəli" təsdiq ədatı ilə əyaniləşdirir. "Onlar əmin ola bilərlər ki," ifadəsi ilə şəhid ruhlarına xitabən müraciət edir, "heç vaxt unudulmayacaq" la qəti gələcək zamanda prinsipial bir mövqe tutmağımızı tələb edir: "Şəhidlər öz qəhrəmanlıqları, şəhidlikləri ilə xalqımızın mənəviyyatını yüksəklərə qaldırmışlar. Bizim insanlar buraya gələrkən, biz də hər dəfə bu məzarları, bu qəbirləri ziyarət edərkən onlara Allahdan rəhmət diləyirik. Amma eyni zamanda onların hər birinin qarşısında şəxsən mən baş əyirəm. Çünki onlar öz şəhidliyi ilə bizim xalqımızı yüksəltdilər. ***Bəli***, onlar bizim müstəqilliyimizə yol açdılar. Onlar sübut etdilər ki, xalqımızı müstəqillik yolundan çəkindirmək olmaz və biz bu müstəqilliyi də əldə etdik. Biz bu müstəqil dövlətdə yaşayırıq, ***yaşayacağıq*** və o şəhidlərin bugünkü müstəqilliyimizin əldə edilməsində xüsusi xidmətləri vardır. Onlar bizim bu müstəqilliyimizin təməlini qoyan insanlardır. ***Onlar əmin ola bilərlər ki***, onların tökülən qanları heç vaxt ***unudulmayacaq***, onların qəhrəmanlığı heç vaxt ***unudulmayacaqdır***. Onların şəhidliyi Azərbaycan xalqını daha da mətinləşdirib, Azərbaycan xalqının daim müstəqil yolla getməyinə kömək ***edir*** və kömək ***edəcəkdir***" [XIVc.s.145].

Heydər Əliyev üçün dini adət-ənənələr, dini dəyərlər bütövlükdə milli sərvət hesab edilir. İmperiya əsarəti dövründə dinə qarşı olan zorakılıqlar (qadağan edib, mənfi münasibət gösyərib) və xalqın bu yoldakı çətinlikləri (əziyyət

çəkirlər, məhrumiyyətlərə, cəzalara məhkum olublar) sinonim cərgələrlə auditoriyanın diqqətinə çatdırılır: “Xalqımızın çoxminillik tarixi var və çox əsrlərdir ki, islam dininə itaət edirik. İslam dini bizim doğma dinimizdir. Xalqımızın milli−mənəvi dəyərləri, dinimizin adət-ənənələri və dini dəyərləri – hamısı birlikdə bizim milli sərvətimizdir. Biz fəxr edə bilərik ki, xalqımız çox dəyanətli xalqdır və zaman-zaman, əsrlər boyu cürbəcür məhrumiyyətlərə məruz qalaraq bütün bu adət-ənənələri unutmayıbdır. Nə vaxt ki, rəsmi dairələr bunu ***qadağan edib***, yaxud da buna ***mənfi münasibət göstərib***, insanlar bunu qəlbində, öz ailəsində, evində yaşadıblar. Hətta bizim bəzi fədakar insanlar bu adət-ənənələrimizi yaşatdıqlarına görə çox ***əziyyətlər çəkiblər,*** bəzən də ***məhrumiyyətlərə, cəzalara məhkum olublar***.

Bu onu göstərir ki, bizim ənənələrimiz, mənəvi, milli, dini dəyərlərimiz ölməzdir və bundan sonra da yaşayacaqdır. ***Biz, bizim nəsil, hamımız*** birlikdə – indi yaşayan insanlar xoşbəxtdirlər ki, bu günə gəlib çatmışıq, bizim müstəqil ölkəmiz, müstəqil dövlətimiz var, öz taleyimizin sahibiyik, dini, mənəvi, milli adət-ənənələrimizi bərpa etmişik və daha da geniş təbliğ edirik [XVc.s.166-167].

Xalqın etik dəyərlərinə (düzlüyə, saflığa, xeyirxahlığa, əməlisalehliyə) dəvət olunduğu ziyarətgahlar Heydər Əliyevin dilində xüsusi əhəmiyyət daşıyır. Xalqın mənəvi cəhətdən “daha da” qüvvətləndirici ədatı ilə “sağlam, saf ” olmasını hesab edir: “İndi mən onun qəbrini ziyarət edirəm. Hesab edirəm ki, millətimiz üçün, millətimizi, xalqımızı ***düzlüyə, saflığa, xeyirxahlığa, əməlisalehliyə*** dəvət etmək üçün belə ziyarətgahlar çox əhəmiyyətlidir. Xüsusən Mirmövsüm ağanın qəbri, bu ziyarətgah. Əminəm ki, bu ziyarətgah sizin kimi insanların səyi nəticəsində daha da genişlənəcək, inkişaf edəcək və xalqımız bu ziyarətgahdan bəhrələnərək mənəvi cəhətdən ***daha da sağlam, saf olacaqdır*** [XVc.s.170].

Xalqın içərisində mövcud olan antietik dəyərləri (bədxahlığı, pis yola gedənləri, cinayət edənləri, vətəninə sədaqətli olmayanları) aradan qaldırmaq yolunda ziyarətgahları mühüm hesab edir: “Görürsünüz, nə qədər vaxt keçib, amma yenə də insanları mənəvi cəhətdən saflığa dəvət etmək, mənəvi saflığı təmin etmək, xalqın içində ***bədxahlığı, pis yola gedənləri, cinayət edənləri, vətəninə sədaqətli olmayanları*** aşkar etmək, bunları cəmiyyətdən kənarlaşdırmaq, yaxud tərbiyələndirmək – bu, bizim qarşımızda olan problemdir. Ona görə də hesab edirəm, bu ziyarətgah həmin problemlərin həll edilməsində öz rolunu oynayacaqdır [XVc.s.170-171].

Bu gün dünyəvi dövlət qurmaq yolunda milli dəyərlərimizə xor baxanlara Heydər Əliyevin hazır fikirləri mövcuddur. Hüquqi, dünyəvi dövlət qurmaq “ana xətt”, “strateji yol” olsa da “dini adət-ənənələrimizdən ayrıla bilmərik və imtina da edə bilmərik” deməklə dünyəvi dövlət qurmaqla dini dəyərlərdən istifadənin dialektik vəhdətini verir. “Daha da” qüvvətləndirici ədatla həyatımızın inkişafını, gözəlləşdirilməsini təmin etmək baxımından dini dəyərlərdən istifadəni önə çəkir: “Ümumiyyətlə, bilin, – biz Azərbaycanda demokratik, hüquqi, dünyəvi dövlət qururuq. Bu, müstəqil Azərbaycanın gələcək yolunun ***ana xəttidir***, indiki ifadə ilə desək, ***strateji yolumuzdur***. Çünki bu, xalqımızın gələcəyi üçün ***ən düzgün*** və xalqımızı səadətə aparan ***ən ağıllı*** yoldur. Biz bu yolu seçmişik və bu yolla gedirik. Ancaq bununla bərabər, biz demokratik, dünyəvi, sivilizasiyalı dövlət quraraq, bütün bəşəri dəyərlərdən istifadə edərək, ümumbəşəri dəyərlərin xalqımız üçün və milli mentalitetimiz, mənəviyyatımız üçün uyğun cəhətlərini götürüb tətbiq edərək heç vaxt dinimizdən, dini adət-ənənələrimizdən ayrıla bilmərik və imtina da edə bilmərik.

Heydər Əliyev qəbul etdiyi qərarların müşahidəyə əsaslandığı, faktlara söykəndiyi məlumdur. “Mənim son qərarım”,

"mən son illər, son zamanlar respublikamızda baş vermiş müsbət dəyişikliklərlə əlaqədar bəzi mənfi hadisələrin, meyillərin də meydana çıxdığını müşahidə edirdim", "məni narahat edirdi" kəlmələri mənəviyyatımızla bağlı mənfi təmayüllərə qarşı mübarizəni zəruri edir. Sinonimlərlə (qanunsuz, gizli, qeyri-qanuni) auitoriyaya yönələn antietik dəyərlər və onlara qarşı mübarizə aparılması auditoriyanı səfərbər edir: "***Mənim son qərarım*** təsadüfi qərar deyildir. Mən son illər, son zamanlar respublikamızda baş vermiş müsbət dəyişikliklərlə əlaqədar bəzi mənfi hadisələrin, meyillərin də meydana çıxdığını müşahidə edirdim. Bu, ***məni narahat edirdi***. Məsələn, spirtli içkilərdən istifadə olunmasının yayılması, onların istehsalının artırılması, yaxud da narkotik maddələrdən istifadə edilməsinin yayılması məni çox narahat edirdi. Bunlardan sonra son vaxtlar respublikamızda kazinoların, qumarxanaların açılması, qanuni, qanunsuz, gizli, qeyri-leqal şəkildə ayrı-ayrı gecə klublarının açılması – bunlar hamısı xalqımızın mənəviyyatına zidd olan, onun mənəviyyatını, xüsusən gənclərimizin, gənc qız-qadınlarımızın tərbiyəsini pozan hallardır. Bunlar ***məni çox narahat edirdi*** [XIVc.s.194].

Heydər Əliyevin dini etika ilə bağlı çıxışlarının əksəriyyəti dini-publisistik üslubdadır. Publisistik üslublu cümlələr (Mən Azərbaycan xalqının yüksək mənəviyyatını xalqımızın böyük sərvəti hesab edirəm) dini üslubun tələb etdiyi sadə, dini terminlərlə zəngin (yaşadan, fəlakətlərdən xilas edən o böyük Allahdır, "böyük Allahın adı ilə") cümlələrlə çulğalaşır: "Sizi əmin edirəm ki, mən həmişə yüksək mənəviyyat uğrunda mübarizə aparmışam, mənim həyatım saf mənəviyyat əsasında qurulubdur, mənim gördüyüm işlər də, ***saf, təmiz*** mənəviyyat əsasında qurulubdur. Mən Azərbaycan xalqının yüksək mənəviyyatının xalqımızın böyük sərvəti hesab edirəm. Ona görə də mən indiyə qədər buna sadiq olduğum kimi, bundan sonar da sadiq olacağam.

Sizə təşəkkür edirəm. Sizə cansağlığı arzu edirəm. Bizim xalqımızı əsrlər boyu yaşadan o böyük ***Allahdır***. Hər birimizi yaşadan, o cümlədən məni də həyatımda böyük fəlakətlərdən xilas edən ***böyük Allahdır***. ***Böyük Allahın adı ilə*** sizə cansağlığı, səadət, yeni-yeni uğurlar arzulayıram [XVIIIc.s.16].

Dindarlar auditoriyası qarşısında islamla bağlı öz şəxsi həyatından nümunələr gətirməklə Heydər Əliyev islamın böyük və səmimi təbliğatçısına çevrilir: "***Bilirsiniz***, mən həyatımda ilk dəfə bir hadisəni sizə danışacağam. Bunu indiyə qədər heç kəsə danışmamışam və rəhmətlik anamdan savayı heç kəs bunu bilmir. 1943-cü ildə mənim iyirmi yaşım vardı. Bizim ailədə çətinliklər vardı. Mən də, anam da bir nəzir dedik. Mən onda Bakıda yaşamırdım, Naxçıvanda yaşayırdım. ***Gəldim Bakıya, getdim İçərişəhərdə Mirmövsüm ağanın evinə***, onu ziyarət etdim və nəzirimi də verdim. İndi biz onun qəbri üstünə gəlirik, amma mən sağlığında gedib onu ziyarət etmişəm – 1943-cü ildə, 55 il bundan qabaq ziyarət etmişəm. ***Bacısı da orada idi, evi indi də gözümün qabağındadır***" [XVc.s.168-169]. Fəlsəfi düşüncələrini, keçmişlə bağlı fikirlərini auditoriyaya açıqlamaq məqamlarında böyük natiq "bilirsiniz" modal sözündən istifadə edərək dinləyicilərin qəlbini riqqətə gətirirməklə yanaşı onları səfərbər edir. Öz şəxsi həyatını dini-məişət üslublu nitqin köməyilə dindarlar auditoriyasına çatdırmaqla mənsub olduğu islam dininə sevgisini açıqlayır. "Gəldim Bakıya", "getdim İçərişəhərə Mirmövsüm ağanın evinə", "bacısı da orada idi", "evi indi də gözümün qabağındadır" kimi məişət üslublu xatırlamalar xalq-prezident birliyini ortaya qoyur, xalqla bir olmağın bariz nümunəsini göstərməklə yanaşı, belə nitqlər öz təsirini daimi yaddaqalan edir.

İslami dəyərləri bugünkü adət-ənənələrlə harmonik şəkildə uzlaşdıran böyük natiq sivil dünyaya islam əxlaqını, islami dəyərləri əyani misallarla nümayiş etdirir: "Qafqazın adət-

ənənələrindən biri ondan ibarətdir ki, Qafqazda həmişə ağsaqqala hörmət olubdur. Bu, bizim islam dininin xüsusiyyətlərindən biridir. Cəmiyyətdə seçilən adama, cəmiyyətdə mötəbər din xadiminə, özündə yüksək mənəvi dəyərləri cəm edən insana, müdrik insana, dünyagörmüş insana, ağsaqqal insana həmişə hörmət olub, ehtiram olub və onun da sözünə həmişə baxıblar. Xüsusən gənclər, cəmiyyətin başqa hissəsi. Bu, gözəl adət-ənənədir. Başqa yerlərdən, başqa diyarlardan, şimaldan, qərbdən Qafqaza gələn qonaqlar bəzən bizim bu xüsusiyyətimizə təəccüb edirlər, bəzən də heyran qalırlar" [XVIIc.s.398].

Dinin insanları hara apardığı yol sinonim cərgə ilə (saflığa, təmizliyə, saf mənəviyyata), "şübhəsiz" qəti təsdiq modalı ilə auditoriyalara çatdırılır. Məscid komplekslərinin tikinti işinə şəxsən nəzarət edən dövlət başçısı "ona görə də" səbəb bağlayıcısı ilə "məscid binası, təhsil yeri, universitetinin filialı" nın kompleksə daxil olmasını, dinlə təhsilin vəhdətini açıqlayır: "Din həmişə bizim mənəvi dəyərlərimizin qoruyucusu olubdur, mənəvi dəyərlərimizi yaşadan olubdur. Mənəvi dəyərlərimizin əksəriyyəti keçmişdə islam dininin dəyərləri əsasında, müqəddəs kitabımız Qurani-Şərifin ayələri əsasında, surələri əsasında yaranıbdır. ***Ona görə də*** dinimizə yenidən qayıtmaq, yenidən müqəddəs kitabımızın, həzrəti Məhəmməd peyğəmbərin qoyduğu yolla getmək və Qurani-Şərifin tələblərinə riayət etmək, şübhəsiz, insanları həmişə ***saflığa, təmizliyə, saf mənəviyyata*** aparır, düz yola, doğru yola aparır. ***Ona görə də*** mən burada böyük bir məscid kompleksinin tikilməsini – ***məscid binasının, təhsil yerinin, İslam Universiteti filialının*** yaranmasını çox əlamətdar hadisə hesab edirəm və bu işin ***təşəbbüskarlarına***, bunu yaradanlara təşəkkürümü bildirirəm" [XVIIIc.s.13].

Ziyarətgahlarımızın bərpası ilə bağlı dindarlar qarşısındakı çıxışlarda (Bibiheybət məscid-ziyarətgah kompleksinin

açılışı mərasimində) Heydər Əliyevi din tariximizin araşdırıcısı kimi görür, bu tarixin zəngin nitqlərlə dinləyicilərə çatdırılmasının şahidi oluruq. Öncə Bibiheybət məscidinin yaranmasına ekskurs edən Ulu Öndər məscidin başına gətirilənləri, sonra xalqın və millətin çəkdikləri əziyyətləri (zərbəni almış, yaralanmış, əzilmiş) sinonim cərgələrlə bəyan edir. "Lakin" bağlayıcısı ilə xalqın dəyanətini (dayaq, mənəvi güc, dəstək) dilə gətirir: "Burada, bu müqəddəs yerdə vaxtilə ucaldılmış məscid 60 il bundan öncə vəhşicəsinə partladılmışdır, dağıdılmışdır. Bizim mənəviyyatımıza, mənəvi dəyərlərimizə, islam dininə böyük zərbə vurulmuşdur. Xalqımız, millətimiz bu ***zərbəni almış, yaralanmış, əzilmiş,*** ancaq məhv, məğlub olmamış, bu ***zərbələrə, yaralara, əziyyətlərə*** dözməyə məcbur olmuşdur. ***Lakin*** bütün bunlara dözərək, bu müqəddəs yerə olan ***sevgisini, məhəbbətini, inamını*** qəlbində yaşatmış və bu müqəddəs yerdən heç vaxt ayrılmamışdır. Təsadüfi deyildir ki, bu məscid dağılandan sonra da və burada həzrəti Hökümənin qəbri bərbad olunandan sonra da insanlar bu yeri özləri üçün daim ***nicat, ümid*** yeri etmişlər. Bu yer bir ziyarətgah kimi öz mənasını heç vaxt itirməmişdir. İnsanlar buraya daim ziyarətə gəlmişlər, burada öz arzularını yerinə yetirmişlər, yaşamaq, yaratmaq üçün bu müqəddəs yerdən ***dayaq, mənəvi güc, dəstək*** almışlar" [XVIc.s.230].

Heydər Əliyev məscid komplekslərinin tikintisi zamanı texniki estetikaya xüsusi fikir verməyi lazım bilir (bu müqəddəs yerin ətrafı da ona layiq olmalıdır).

"Hesab edirəm ki" modalla "layiqli" etik dəyərinə işarə edir. "Çünki" səbəb bağlayıcısı ilə "çevriləcəkdir", "artacaqdır" qəti gələcək zamanda proqnostik, yaddaqalan nitq yaradır: "***Bu müqəddəs yerin ətrafı da ona layiq olmalıdır***. Ona görə mən hesab edirəm ki, bu məscidin ətrafında abadlıq işləri aparılmalıdır. Ola bilər, bu abadlıq işləri ətrafdakı bəzi binaların yerinin dəyişdirilməsi ilə əlaqədar olsun. ***Hesab***

***edirəm ki***, biz bu müqəddəs yeri gərək hər cəhətdən layiqli edək. ***Çünki*** artıq bu məscid tikiləndən, onun içərisində həzrəti Hökümənin və imam övladlarının qəbirlərinin yeri xüsusi müəyyən ediləndən sonra bu müqəddəs yer təkcə Azərbaycan müsəlmanları üçün yox, bütün dünya müsəlmanları üçün böyük bir ziyarətgaha ***çevriləcəkdir***. Buraya ziyarətə gələnlərin sayı ilbəil ***artacaqdır***. Ona görə də, hesab edirəm ki, bu məscidin ətrafında böyük bir kompleks yaradılmalıdır. Din xadimlərimiz əgər mənim bu fikirlərimlə razılaşsalar, belə bir layihənin mənə təqdim olunmasını arzu edərdim. Mən belə bir layihənin həyata keçiriləcəyinə söz verirəm” [XVIc.s.233].

Tam və hissə dialektik vəhdətindən söhbət açan böyük natiq Azərbaycanda olan ziyarətgahların “ən” qüvvətləndirici ədatla qiymətini verir, “tanımalıdır”, “təbliğ olunmalıdır” feilin lazım şəkli ilə həm dövlət orqanlarını, həm də dini işlərlə məşğul olan qurumları hərəkətə gətirir. Təkliflərinin vacib olduğunu natiq “siz bunula razısınızmı” ritorik sualla yaddaqalan nitq nümunəsinə çevirir: “Biz islam aləminin bir ***hissəsiyik***. İslam dünyasında islam tarixinə məxsus olan müqəddəs yerlər, ziyarətgahlar vardır. Biz fəxr etməliyik ki, bu müqəddəs yerlərdən, ziyarətgahlardan Azərbaycanda da vardır. Onların ***ən*** hörmətlisi və ***ən*** qiymətlisi bu gün bizim toplaşdığımız yerdir. Ona görə də islam aləminin müqəddəs ziyarətgahı kimi bu yer dünyada tanınmalıdır, təbliğ olunmalıdır ki, ***islam tarixi*** bu yerin, bu gününün və keçmişinin izahı ilə daha da dolğunlaşsın. ***Bir də ona görə ki,*** islam tarixinin hər bir müqəddəs yeri ümumi tarix kitablarında öz yerini tapsın. Bu işi də görmək lazımdır. Hesab edirəm ki, bunların hamısını etmək üçün mənim irəliyə sürdüyüm təkliflər çox lazımdır. ***Siz bununla razısınızmı***? [XVIc.s.234]

Həcc ziyarəti ilə bağlı Ulu Öndər yenə də şəxsi nümunə göstərir. Bu şəxsi nümunə ilə bağlı çıxışında “mən” şəxs

əvəzliyi müxtəlif vəziyyətlərdə işlənərək şəxsiyyətə hörmət hissini gücləndirir. "Mən də", "səfərdə olmuşam", "mənə imkanı verilibdir", "mənim üzümə açdılar", "mənimlə olan adamlar" kimi ifadələr şəxsiyyətin böyüklüyünü təsdiq edir, auditoriya çıxış edənin şəxsiyyətinə daha da yaxından bələd olur: "***Mən də*** vaxtilə çox illər Məkkəni, Mədinəni ziyarət etmək arzusunda olmuşam. Əziz dostum, qardaşım kral Fəhd ibn Əbdüləziz əl-Səudun dəvəti ilə mən 1994-cü ildə Səudiyyə Ərəbistanında rəsmi ***səfərdə olmuşam***. O zaman mənə bütün bu müqəddəs yerləri ziyarət etmək imkanı verilibdir. Şeyxülislam həzrətləri burada qeyd etdi, – Səudiyyə Ərəbistanında Kəbənin də qapısını ***mənim üzümə açdılar***. ***Mənimlə olan adamlar*** da böyük bir xoşbəxtlik hissi keçirdilər ki, biz Kəbəyə də daxil ola bildik [XVc.s.128].

Nitqin ekspressivliyini artırmağa yönələn vasitələr həddindən artıq çoxdur ki, bu natiqin auditoriyanı fəhmlə seçmək bacarığından asılı olur. Elə Heydər Əliyev natiqliyinin mühüm bir gücü də "şəxsi nümunə" ilə danışmaqdır. "Uşaq ikən məni də məscidə aparırdılar" deyimi kifayət edər ki, auditoriyanın qəlbi riqqətə gəlsin: "Mənim atam da, anam da namaz qılırdılar. Onlar daim məscidə gedirdilər, ***uşaq ikən məni də məscidə aparırdılar***. Mənim o uşaqlıq dövrümdə məktəbdə aldığım təhsil, tərbiyə ilə bərabər, məscidə getməyim ***paklıq***, ***sədaqət*** formalaşmasında da öz əksini tapıbdır" [XXIIc.s.161].

Azərbaycanın gözəl guşələrindəki ziyarətgahları (Nardaran, Şüvəlan) milyonlar auditoriyasına tanıdır, həmin müqəddəs yerlərin qorunmasını məntiqi ardıcıllıqla (bu yerləri mühafizə edək→saxlayaq→abadlaşdıraq→inkişaf etdirək) çatdırır: "Şüvəlan, Mərdəkan Azərbaycanın gözəl guşələrindən biridir. Məsələn, indi mənə "Əli ayağı"nın medalını təqdim etdilər, çox məmnunam. Oraya ziyarətimi çox məmnuniyyətlə xatırlayıram. Təəssüf edirəm ki, bunu gedib orada

ala bilməmişəm, burada təqdim etdiniz. Amma sizə söz verirəm ki, oranı bir daha ziyarət edəcəyəm, mütləq gələcəyəm. Nardaran pirinə də mütləq gedəcəyəm. Bütün bu yerlər bizim üçün – müsəlmanlar, azərbaycanlılar üçün çox əziz yerlərdir. Bundan sonra bizim də vəzifəmiz ondan ibarətdir ki, bu yerləri ***mühafizə edək, saxlayaq, abadlaşdıraq, inkişaf etdirək*** ki, insanlar bu yerlərdən daha da səmərəli istifadə edə bilsinlər [XVc.s.172].

Bakının Bibiheybət ziyarətgahında Qurban bayramı mərasimindəki çıxış ümumbəşəri etik dəyərləri əks etdirir. Bu bayramların etik nüvəsini, mahiyyətini sadə, anlaşıqlı cümlələrlə açmaqla islam bayramları ilə həm daxili, həm də xarici auditoriyaları tanış edir. Öncə sinonim cərgə ilə (dostluq, məhəbbət, birlik, mehribanlıq) etik dəyərlər sadalanır, sonra feilin arzu şəklində dualar edilir (arzular, niyyətlər yerinə yetsin. Hər kəs xoşbəxt, sağlam olsun): “Qurban bayramı dostluq bayramı, məhəbbət, birlik, mehribanlıq bayramıdır. Bu gün kəsilən qurbanlarla hər bir şəxs, hər bir xalq, millət arzularının, niyyətlərinin yerinə yetməsi üçün Allahdan rəhm, kömək istəyirlər. Arzu edirəm ki, Azərbaycan torpağında müsəlmanların bu gün bayram münasibətilə kəsdikləri qurbanlar hamısı qəbul olunsun. Hər kəsin qəlbində olan arzular, niyyətlər yerinə yetsin. Hər kəs xoşbəxt, sağlam olsun. Bütün ölkəmizə, xalqımıza səadət arzulayıram” [XIXc.s.367].

Əgər geniş xalq kütlələri qarşısında xalqın təbii fikri önə keçirsə, dindarlar auditoriyasında, ziyarətgahlarda, islam bayramlarında bu “Allah-taalanın əmri ilə” kəlmələri ilə əvəzlənir. Bu zaman nitqin ilkin gözəlliyində heç bir dəyişiklik baş vermir. “Doğrudur” gerçəkliyə münasibətdə qəti təsdiq bildirən modal sözlə, keçmişə qayıdış, tarixə bir baxış kimi təkrarlanan “o vaxt” ifadəsi ilə elmi-publisistik dildə çıxış edir. Növbəti nitq mərhələsində şəxsi nümunə göstərir, valideynlərinin islama bağlılığını dilə gətirir, “imanımı heç

vaxt itirməmişəm" lə prinsipial mövqe nümayiş etdirir, auditoriya "şübhə etmirdim ki" ilə Heydər Əliyev uzaqgörənliyinin şahidi olur: "O illərdə və xüsusən 1992-ci ildə, ***Allah-taalanın əmri*** ilə mən Naxçıvan Muxtar Respublikasında yaşadığım və bu muxtar respublikaya rəhbərlik etdiyim zaman Naxçıvan məscidini daim ziyarət edirdim, dindarlarla görüşürdüm. Mən o məscidi yaxşı tanıyıram. ***Çünki uşaq ikən atam, anam məni həmin məscidə aparırdı***. ***Doğrudur***, o vaxt biz sovet hakimiyyəti dövründə, kommunist ideologiyasını həyata keçirən bir ölkədə yaşayırdıq. ***O vaxt*** din qadağan edilmişdi, ardıcıl surətdə din əleyhinə, yəni ateist təbliğatı aparılırdı, insanları dindən ayırmağa çalışırdılar. ***O vaxtkı*** dövlət buna zahirən müəyyən qədər nail ola bilirdisə də, daxilən heç bir şey əldə edə bilmirdi.

***Mənim atam da, anam da namaz qılırdılar***. Onlar daim məscidə gedirdilər, uşaq ikən məni də məscidə aparırdılar. Mənim o uşaqlıq dövrümdə məktəbdə aldığım təhsil, tərbiyə ilə bərabər, məscidə getməyim paklıq, sədaqət formalaşmasında da öz əksini tapıbdır. ***Mən imanımı heç vaxt itirməmişəm***, mənsub olduğum millətin islam dini ilə həmişə fəxr etmişəm. ***Şübhə etmirdim ki***, vaxt gələcək, bizim ölkədə də insanlar tam azad olacaqlar, o cümlədən insanlara vicdan azadlığı veriləcək və onda onlar öz arzu və istəklərini daha da açıq bildirə biləcəklər" [XXIIc.s.162].

"İslam memarlığı minilliklər ayrıcında" beynəlxalq seminarinin iştirakçilarina ünvanlanmış çıxışda Azərbaycan estetik dünyagörüşünü dini sahəyə şamil edir. Elə burada biz Heydər Əliyevi memarlıq sahəsinin aparıcı mütəxəssisi kimi görürük. Auditoriya estetik terminlərin üstünlük təşkil etdiyi "öz əzəmətli, orijinal üslublu və yüksək sənətkarlıq keyfiyyətləri" "misilsiz sənət inciləri dinimizin humanist fəlsəfi dəyərlərinin parlaq ifadəsi", "müsəlmanların daim qurub-yaratmaq eşqinin əyani, maddi təcəssümüdür" ifadələrlə qurulan ecazkar nitq

nümunəsinin sehrinə düşür: "Dünya sivilizasiyalarının formalaşıb inkişaf etməsində islam elminin və mədəniyyətinin böyük rolu danılmazdır. Müxtəlif müsəlman xalqlarının birgə səyləri ilə təşəkkül tapmış islam mədəniyyətinin ən mühüm tərkib hissələrindən biri isə memarlıqdır. Xalqlarımızın əsrlər boyu yaratdıqları nadir memarlıq abidələri ***öz əzəmətli, orijinal üslublu və yüksək sənətkarlıq keyfiyyətləri*** ilə mütəxəssisləri bu gün də heyran edir. İslam memarlıq məktəbinin bəşəriyyətə bəxş etdiyi ***misilsiz sənət inciləri dinimizin humanist fəlsəfi dəyərlərinin parlaq ifadəsi***, müsəlmanların daim qurub-yaratmaq eşqinin ***əyani, maddi təcəssümüdür***" [XXIIc.s.42].

Şüvəlanda Mirmövsüm Ağanin ziyarətgahındakı nitq dini ocaqlarımızın bərpası yolunda dövlət rəhbərinin dini-siyasi xəttini auditoriyalara nişan verir.

"Bu" işarə əvəzliyinin təkrarı ilə nələri etməyimizi nişan verir. "Bir daha" ədatının təkrarı ilə dini abidələrimizin yolunda çalışanların əməyinə qiymət verir: "Mən keçən dəfə buraya gələndə ancaq onun qəbrini və ətrafındakı tikilini gördüm. Amma indi burada geniş bir kompleks yaranıbdır. ...Çünki bu, bizim ümumxalq işimizdir. ***Bu***, bizim öz dərin, qədim milli-mənəvi köklərimizə sadiqliyimizi nümayiş etdirir və gələcək nəsillər üçün örnək olur. ***Bu***, bizim müqəddəs islam dininə olan bağlılığımızı bir daha sübut edir. Bunların hamısı olduqca təqdirəlayiqdir və burada zəhmət çəkən, əziyyət çəkən, qəlbən bu işi görən adamların hamısının əməyini ***bir daha, bir daha*** yüksək qiymətləndirirəm [XXXIc.s.243].

Sadə məişət üslublu cümlələrlə dərin fəlsəfi fikirləri kütlələrə çatdırmaq, şüurlarda dərin məzmunlu ideyaları canlandıra bilmək Heydər Əliyev şəxsiyyətinə xasdır. Bu fikirlərin təsdiqi "Bir az loru dildə desək, onda qarnımız daha dolu idi. Ancaq qəlbimiz dolu deyildi, boş idi. İnsan isə təkcə qarın üçün yaşamır" cümlələrində öz əksini tapır: "Heydər Əliyev:

İndi bizim həyatımız bir neçə çətinliklərlə rastlaşır. Bunu bilirsiniz. Bir vaxtlar həyatda bu qədər çətinlik yox idi. Ancaq biz dinimizdən, milli-mənəvi dəyərlərimizdən məhrum idik. Hamımız sovet hakimiyyətinin, sovet ideologiyasının qanun-qaydaları ilə yaşayırdıq. ***Bir az loru dildə desək, onda qarnımız daha dolu idi. Ancaq qəlbimiz dolu deyildi, boş idi. İnsan isə təkcə qarın üçün yaşamır.*** Azərbaycan xalqı əsrlər boyu, islam dinini qəbul edəndən sonra dini adət-ənənələri, dini-mənəvi dəyərlərimizi hər şeydən üstün tutubdur [XXXIc.s.244-245].

Dini etikadan danışarkən öz şəxsiyyəti ilə, özünün dini dünyagörüşü [30, 112, 162] ilə Heydər Əliyev insanların düzgün dini istiqamət götürməsinə zəmin yaradır. Dindarların bir araya gəldiyi ibadət yeri, ibadət evi sayılan məscidləri həm də memarlıq abidəsi kimi təqdim edir.“Bu gün özümü çox xoşbəxt hesab edirəm”, “nəsillər bizə rəhmət oxuyacaqdır”, “bundan böyük mükafat ola bilməz” ifadələri dinlə bağlı Ulu Öndərin içdən gələn, səmimi qəlblə söylənilən fikirlərini milyonlara yönəldir: “Mən bunları ona görə geniş danışıram ki, bir də deyim, – ***bu gün özümü çox xoşbəxt hesab edirəm***. Mən çox şadam, çox sevinirəm ki, Azərbaycanda, o cümlədən Naxçıvanda yaratdığım böyük memarlıq əsərləri ilə yanaşı, İran İslam Cümhuriyyəti ilə bərabər, bilavasitə onların köməyi ilə Naxçıvanda yeni məscid, eyni zamanda Şərq aləminin memarlıq nümunəsi olan böyük bir bina yarada bilmişik. Naxçıvanda indiki məscidin, səhv etmirəmsə, 100-dən çox yaşı vardır. Amma bu yeni bina yüz illər yaşayacaqdir. Bizdən sonra gələn ***nəsillər bizə rəhmət oxuyacaqlar. Mənim üçün isə bundan böyük mükafat ola bilməz***” [XXIIc.s.166]

Bakıda keçirilən beynəlxalq konfransda və Qafqaz Müsəlmanları Qurultayındakı nitqdə dinə vurulan zərbələri “ən” ədatı ilə ayırır, “ancaq” qarşılaşma bağlayıcısı ilə dinə vurulan zərbələrə baxmayaraq dinin gücü “o qədər” ədatı ilə

auditoriyanın diqqətinə çatdırılır: “Kommunist ideologiyasının bəşəriyyətə vurduğu zərbələrdən ən böyüyü 70 il müddətində dinə qarşı aparılmış təbliğat və xüsusən dinin qadağan olunması və dinin təhrif edilməsi olmuşdur. Ancaq eyni zamanda bu tarix onu da göstərir ki, din və o cümlədən bizim mənsub olduğumuz islam dini o qədər qüdrətə malikdir ki, o qədər gücə malikdir ki, heç bir ideologiya, heç bir hakimiyyət, heç bir hökmdar onunla bacara bilməz və 70 illik tarix də göstərdi ki, bunu bacara bilmədi.

Dini üslublu çıxışlarda da poetiklik Heydər Əliyevin nitqlərini tərk etmir. Qafqazın gözəlliklərini (Qafqaz gözəl təbiətə, çox yüksək məğrur dağlara, gözəl çaylara, bulaqlara, gözəl meşələrə, dünyada təbiətin yaratdığı ən böyük gözəlliklərə malik yerdir) təsvir edir, qurultay iştirakçılarının diqqətini Qafqaz evinə yönəldir: “Bu münasibətlə Qafqaz müsəlmanlarının X qurultayının keçirilməsini də mən çox əhəmiyyətli hesab edirəm. Qafqaz həqiqətən bir-biri ilə bağlı olan dövlətlərin, ölkələrin, xalqların ümumi evidir. “Ümumqafqaz evi” şüarı çox gözəl şüardır, mən bunu dəstəkləyirəm. Cəsarətlə deyə bilərəm ki, dünyanın bəlkə heç bir guşəsində, heç bir regionunda Qafqaz kimi çoxmillətli, çoxdinli və rəngarəng bir region, bir bölgə tapmaq mümkün deyildir. Bizim Qafqaz ərazi cəhətdən kiçik bir yerdir. Bizim o qədər böyük ərazimiz yoxdur. Ancaq eyni zamanda Qafqaz ***gözəl təbiətə, çox yüksək məğrur dağlara, gözəl çaylara, bulaqlara, gözəl meşələrə, dünyada təbiətin yaratdığı ən böyük gözəlliklərə*** malik olan yerdir. Qafqazın xüsusiyyəti bir də ondan ibarətdir ki, burada əsrlər boyu müxtəlif millətlərə, müxtəlif dillərə mənsub olan insanlar bir ailədə yaşamışlar [XVIIc.s.397].

İslam dinin ayaq basdığı ərazilərə islami dəyərləri gətirməsi fikri Heydər Əliyev tərəfindən tarixi faktlarla açıqlanır. İslamın xalqlara nələri gətirməsi sinonimlərlə (səadət, xoşbəxtlik, inkişaf, islami dəyərlər) bəyan edilir. İslama

qədərki mənəvi dəyərlərlə sintezi anlaqlı bir dillə auditoriyanın nəzərinə çatdırır: "Məlumdur ki, Qafqazda islamın yayılması və inkişaf etməsi Azərbaycandan başlayır. İslam Qafqaz xalqlarına ***səadət, xoşbəxtlik gətiribdir, inkişaf, islami dəyərlər*** gətiribdir. Bu dəyərlər – müqəddəs kitabımız Qurani-Kərimdən gələn islami dəyərlər Qafqaz xalqlarının milli-mənəvi dəyərlərinin əsasını təşkil edibdir. Məlumdur ki, Qafqazda yaşayan xalqlar islam dinini qəbul edənə qədər də böyük mədəniyyətə, tarixə və özlərinə məxsus adət-ənənələrə malik olmuşlar. İslamın dini-mənəvi dəyərləri Qafqaz xalqlarının qədimdən yaranmış və inkişaf etmiş mənəvi dəyərləri ilə birlikdə xalqların yüksək milli-mənəvi dəyərlərini təşkil ediblər" [XVIIIc.s.351].

İslam mədəniyyəti, islam dini ilə bağlı olan görkəmli şəxsləri antroponimik sıralarla (Nizami, Füzuli, Nəsimi, Tusi, Qətran Təbrizi) sadalayan böyük natiq auditoriyaya yeni fikirlər aşılayır: "Azərbaycanda islam dini VII əsrdən yayılıb və Azərbaycan xalqının milli-mənəvi dəyərlərinin əsasını təşkil edir. Bizim çoxəsrlik islam dövrü tariximiz zəngindir. Bu gün iftixar hissi ilə deyirik ki, Azərbaycanın islam mədəniyyəti, islam dini ilə bağlı olan dahi insanları – ***Nizami, Füzuli, Nəsimi, Tusi, Qətran Təbrizi*** və bir çox digər böyük şəxsiyyətləri dünya sivilizasiyasına böyük töhfələr vermiş və islam mədəniyyətini zənginləşdirmişlər. Biz bunlarla fəxr edirik.

Biz azərbaycanlılar öz tariximizlə, milli-mənəvi dəyərlərimizlə fəxr edirik, öz doğma ana dilimizlə fəxr edirik. Bunlar hamısı bizim milli mənəviyyatımız, milli-mənəvi dəyərlərimizdir. Bunlara görə də biz islam dininə, islam mədəniyyətinə mənsub olmağımızla da fəxr edirik.

Dinimizlə bağlı çıxışlarında Heydər Əliyev "öz fikirlərini" dinşünas və digər sahə tədqiqatçılarına yönəldir. "Hesab edirəm ki" modal sözlə indiyədək aparılan elmi işləri

yetərli hesab etmir. "İslam dininə subyektiv hissiyyatlar nöqteyi-nəzərindən baxılması" fikrini dinləyicilərə aşılayır: "Ancaq bu gün mən bu fürsətdən istifadə edərək, elm xadimlərinin qarşısında ***öz fikrimi*** bildirmək istəyirəm. ***Hesab edirəm ki***, indiyə qədər görülən işlər yetərli deyildir. Məsələn, əgər keçmiş çar Rusiyası imperiyası ərazisində, sonra Sovetlər İttifaqı ərazisində islam mədəniyyəti haqqında araşdırmalara nəzər salsaq, çox dəyərli əsərlərlə yanaşı, eyni zamanda subyektiv fikirlər də hökm sürür. Məndə belə təəssürat var ki, Avropa ölkələrində, o cümlədən Rusiyada keçmişdə də, indi də bəzi tədqiqatçılar islam mədəniyyətinə, ***islam dininə subyektiv hissiyyatlar nöqteyi-nəzərindən baxırlar*** [XVIIIc.s.353].

Hələ Sovetlər dönəmində dini etikanın ziddinə olaraq dini ayrı-seçkiliyə yol verildi. "Nə üçün" sual əvəzliyi ilə auditoriyaya sual verilir, "çünki" səbəb bağlayıcısı ilə ritorik sual cavablandırılır. "İş burasında idi" sadə, ümumişlək ifadə ilə fikrini yekunlaşdırır. "Amma" qarşılaşma bağlayıcısı ilə sovetlər dönəmində xristian dininə münasibətin islamdan fərqli olduğunu auditoriyanın diqqətinə çatdırır: "Nə üçün belə hadisə var idi, nə üçün Quran rus dilinə tərcümə olunmuşdu, ancaq Azərbaycan dilinə tərcümə edilməmişdi? Çünki Qurandan istifadə etməyi azərbaycanlılara qadağan edirdilər. Hesab edirdilər ki, Quran rus dilinə tərcümə olunubdur və guya xristianlar tərəfindən islam dinini öyrənmək üçün lazımdır. Amma Quran Azərbaycan dilinə tərcümə olunsa, bu, azərbaycanlıların islam dininə meylini artıracaqdır. İş burasında idi.

Amma eyni zamanda, xristian dininə məxsus kitabların rus dilində nəşr olunması qadağan deyildi. Elə bunun özü də Sovetlər İttifaqı zamanı müxtəlif xalqlara müxtəlif münasibət olduğunu göstərirdi. Bu səbəbdən də Azərbaycan alimləri çox az, nadir halda islamşünaslıqla, islam dinini öyrənməklə

məşğul olurdular, bu barədə kitablar yazırdılar. Çünki hesab edirdilər ki, bu kitablar, tədqiqatlar onlar üçün qiymətli deyildir. Yenə də deyirəm, bəziləri də qorxurdular, çəkinirdilər" [XVIIIc.s.360].

Cənab Medvedkonun burada olmasından istifadə edərək demək istəyirəm ki, gərək Rusiyanın özü də bu işlərə ***ciddi fikir versin***. Çünki Rusiyada 30 milyon müsəlman yaşayır. Bu, Rusiyanın 150 milyonluq əhalisinin böyük bir hissəsini təşkil edir. ***Demək***, əhalinin bu hissəsini nəzərə almaq lazımdır.

Keçmişdə, sovet hakimiyyəti dövründə din qadağan edildiyinə görə kim müsəlmandır, kim xristiandır – hamısı bir idi, hamısı da sovet xalqı hesab olunurdu. Hətta xalqların adını da xırda-xırda aradan götürmək meyilləri inkişaf edirdi. "Vahid sovet xalqı", "insanların yeni tarixi birliyi" kimi terminlər var idi. Amma indi gərək Rusiya Federasiyası da ***düşünsün ki***, bu ölkədə 30 milyon müsəlman yaşayır. Onların əksəriyyəti də yığcam şəkildə öz ərazilərində – Şimali Qafqazda, Tatarıstanda, Başqırdıstanda, başqa yerlərdə yaşayırlar [XVIIIc.s.361].

Dialektik özünəməxsusluğu diqqət mərkəzində saxlayan Ulu Öndər tək özünəməxsusluğu "hər bir" təyin əvəzliyi ilə elan edir. "Dünyanın hər bir bölgəsinin xüsusiyyətini nəzərə almalıyıq" ifadəsi ilə islamşünas alimlər qarşısında ciddi tələb qoyur: "Bunları deməklə mən onu bildirmək istəyirəm ki, islam dünyanın bir çox ölkələrində mövcud olduğu halda, ***hər bir*** bölgənin özünəməxsus xüsusiyyəti var. Əgər biz, ümumiyyətlə, islamşünaslıqla dərindən məşğul olmaq istəyiriksə və islam sivilizasiyasının bəşər mədəniyyətinə verdiyi töhfələri dünyaya daha da nümayiş etdirmək istəyiriksə və islamın müasir həyatda rolunu daha düzgün müəyyən etmək istəyiriksə, dünyanın ***hər bir bölgəsinin xüsusiyyətini nəzərə almalıyıq***" [XVIIIc.s.373].

“Mən güman etmirəm ki” ifadəsini Ulu Öndərin dilindən eşidən auditoriya böyük bir nikbinliklə gələcəyə hazırlanır. “Mən buna inanıram” deməklə auditoriyanı da bu inama qoşur. İslamın əsl mənəvi güc mənbəyi olan inamı insanlara qaytarır. Qərbi Azərbaycan torpaqları üzərində qurulan Ermənistan adlı dövlətdən müsəlmanların çıxarılmasına “təəssüflər olsun ki” deməklə dünyanın, bəşəriyyətin diqqətini “erməni millətçiliyinə, erməni ekstrimizinə, erməni şovinizminə” yönəldir: “İndi Ermənistan adlanan ərazidən islamın bütün üzvləri təəssüflər olsun ki, silinibdir. Yəni o ərazidə qədim zamanlardan müsəlmanlar, azərbaycanlılar yaşamışlar. Mən bildiyimə görə, – bunu siz daha da dəqiq deyə bilərsiniz, – Azərbaycanda islam qəbul edilən zaman, demək olar ki, Azərbaycanın bütün ərazisində qəbul olunubdur. İndi Ermənistan adlanan ərazi, Qərbi Azərbaycan – İrəvan mahalı, Göyçə mahalı, Zəngibasar mahalı, Zəngəzur mahalı – bunlar hamısı müsəlmanlar, azərbaycanlılar yaşayan diyarlar olubdur. Təəssüf ki, bu ərazilərdən, diyarlardan müsəlmanlar çıxarılıblar, indi bu ərazilərdə bir nəfər də olsun müsəlman yoxdur. Bu da Ermənistan millətçiliyi, erməni ekstremizmi, erməni şovinizmi siyasətinin nəticəsidir. Əgər Qafqazda islam sivilizasiyası haqqında danışırıqsa, həqiqəti demək lazımdır.

Mən güman etmirəm ki, o torpaqlardan islam əbədi olaraq silinibdir, – mən belə hesab etmirəm. İslam harada olubsa, ora bir də gələcəkdir. Mən buna inanıram. İnanıram ki, o yerlərin sahibləri – müsəlmanlar, azərbaycanlılar oraya qayıdacaqlar. Ona görə o yerləri islamın xəritəsindən heç vaxt silmək olmaz.

Moskvanın və bütün Rusiyanın patriarxı II Aleksi ilə söhbət digər dinlərə əxlaqi münasibətdə Heydər Əliyev fikirlərini açıqlayır. Hamısı hüquq bərabərliyi şəraitində yaşanmışlar deyimi ilə hüquqi etikanın dini etikadan ayrılmaz olduğu fikrini ortaya qoyur. “Axı” ədatı ilə Azərbaycanda

digər dinlərə mənsub olan məbədlərin toxunulmazlığın bəyan edir. Dinlərin sinonim cərgəylə (bədxah münasibət, ədavət, düşmənçilik, xoşagəlməz daha nəyisə) antietik dəyərlərə imkan verməməsini Rusiya patriarxına ünvanlayır: "Xalqlarımız müxtəlif dinlərə mənsubdurlar və burada təəccüblü bir şey yoxdur. Çünki dünyada vahid din yoxdur, bir Allah var. Xalqlar müxtəlif dinlərə etiqad edirlər, amma bununla belə, dini mənsubiyyətdəki fərq ***bədxah münasibətləri, ədavət və düşmənçiliyi, yaxud xoşagəlməz daha nəyisə*** heç zaman şərtləndirmir.

Ona görə də Azərbaycanda rus əhali və ümumiyyətlə, pravoslavlığa etiqad etmiş olanların və etiqad edənlərin hamısı hüquq bərabərliyi şəraitində yaşamışlar. Bu, keçmiş vaxtlarda da olmuşdur, bu, Sovet İttifaqı illərində – dinin yasaq edildiyi, lakin bununla belə, mövcud olduğu illərdə də olmuşdur. Əks halda, sizin gördüyünüz bu məbədlər, sadəcə, olmazdı, ***axı*** onlar heç də indi tikilməyibdir. Bu sözləri məscidlər haqqında da demək olar. Yasaq vardı, din elədir ki, o, bütün əsrlərdə ***həm*** sıxıntılara, ***həm də*** təqiblərə məruz qalmışdır. Bunu istənilən dinin tarixinə aid etmək olar. Lakin bununla belə, din həmişə həyata yol açmış, mövcud olmuşdur və indiyədək mövcuddur. Şübhə yoxdur ki, rus xalqı Azərbaycan xalqının həyatında olduqca böyük rol oynamışdır – mən elmin, təhsilin, mədəniyyətin inkişafını, iri sənaye kompleksləri nin tikilməsini nəzərdə tuturam [XXXIVc.s.219].

Həyat Heydər Əliyev proqnozlarının həmişə doğru olduğunu təsdiq edir. "Hesab edirik ki" modal sözlə dünya ictimaiyyətini ümumbəşəri ideyaların qorunması yolunda səfərbər edir: "Hesab edirik ki, terrora qarşı mübarizə bütün dövlətlərin və beynəlxalq təşkilatların əlbir fəaliyyətini tələb edir. Bununla bağlı düşünürəm ki, İqtisadi Əməkdaşlıq Təşkilatı da üzərinə düşən tarixi vəzifəni ***yerinə yetirməli*** və bundan sonra da ümumbəşəri dəyərlər uğrunda mübarizəni

***davam etdirməli***, bu təşkilatın üzvü olan Azərbaycanın haqq işinə ***dəstək verməlidir***" [XLIIc.s.50].

İki yerdə "hesab edirəm ki" modal sözünü işlədərək incə, yumşaq şəkildə "islamın əsas prinsiplərindən müəyyən qədər uzaqlaşırlar" deməsi böyük mətləblərdən xəbər verir. İslam mənəvi dəyərlərinin təhrif olunmasını "günah" hesab edir: "Millilik, islamilik, ümumbəşəri dəyərlərin sintezi ilə xalqı inkişaf etdirə bilər. İndi dünyadakı bəzi mərkəzlərdə "islam fundamentalizmi, islam ekstremizmi, fanatizmi" haqqında da fikirlər söylənilir.

***Hesab edirəm ki***, bizim müqəddəs kitabımız Qurani-Şərif heç vaxt fundamentalizmin əsasını qoymayıbdır. Kimsə bu fundamentalizm, ekstremizm meyllərini islam dinindən istifadə edərək yaradır və inkişaf etdirirsə, ***hesab edirəm ki,*** onlar islamın əsas prinsiplərindən müəyyən qədər uzaqlaşırlar. Biz islam mədəniyyətini, islam mənəvi dəyərlərini müqəddəs kitabımız Qurani-Kərimdə olduğu kimi qəbul edirik. Onların təhrif olunması, əgər dini dildə desək, ***günahdır***. Biz istəmirik ki, kimsə ***günaha*** batsın" [XVIIIc.s.357-358].

İslam dini, islam mədəniyyəti Heydər Əliyevin dilində vəhdət halındadır: "İslam dini Qafqazın, demək olar, əksər hissəsini əhatə edib və bu gün də əhatə edir və ***islam mədəniyyəti*** hər yerdə öz izlərini buraxıbdır. Kimlərsə bu izləri dağıtmaq, pozmaq istəsə də, bəşəriyyət buna yol *verməməlidir* və *verməyəcəkdir*. Hesab edirəm ki, bu məsələlər Bakıda keçirilən və indi işinə başlayan beynəlxalq simpoziumda öz əksini tapmalıdır" [XVIIIc.s.353].

"Heç bir əlaqəsi yoxdur" ifadəsi ilə böyük natiq islama qarşı çıxışlara tutarlı cavab verir. "Bəzi" ifadəsi bir daha islama qarşı bütünlüklə xristianlığın bu işə dəxli olmadığını göstərir. "Şübhəsiz ki" modal sözlə səmimiyyət yaradır, səmimiyyətində qəti olduğunu dilə gətirir. İslamla bağlı antietik dəyər olan ədalətsizliyin bir araya sığmayacağını izah

edir: "Doğrudur, son vaxtlar dünyanın müxtəlif regionlarında müsəlmanları ekstremist, təməlçi, tolerantlıq prinsiplərini tapdalayan insanlar kimi göstərməyə cəhdlər edilir. Bunu ***bəzi*** xristian ölkələrində edirlər. Amma bu ***ədalətsizlikdir***.

***Şübhəsiz ki***, hər bir xalqın içərisində, hər bir ölkədə quldurlar, terrorçular, cinayətkarlar, ekstremistlər var. Ancaq bunun xalqların dini kökləri, yaxud onların dini prinsipləri ilə heç bir əlaqəsi yoxdur" [XXIIIc.s.119].

Dini üslublu çıxışlarda, dindarlar auditoriyasındakı nitqlərdə Ulu Öndər Azərbaycan tarixinin şanlı səhifələrini açıqlayır, dünyəvi dövlət qurmaq ənənəmizin keçmişini yada salır. İslam təməlçiliyi, islam terrorizmi adı altında ölkəmizə qarşı aparıla biləcək kampaniyaların qarşısını alır: "Çünki islam dininin mənəvi dəyərləri insanları həmişə inkişafa aparmışdır, insanlara həmişə qarşıdakı uzaq və işıqlı yolu göstərmişdir və insanları daha da irəli getməyə, daha da savadlanmağa, mədəniyyətə daha da qovuşmağa, müasir həyatın bütün vasitələrindən öz həyatını, öz millətinin həyatını, xalqının həyatını daha da yaxşılaşdırmaq üçün, maddi və mənəvi vəziyyətini yaxşılaşdırmaq üçün daha da səmərəli istifadə etməyə yönəldilmişdir. Mən güman edirəm ki, siz məsələləri məhz bu istiqamətdə müzakirə edəcəksiniz. Əminəm ki, beynəlxalq konfrans islam aləmində tarixi bir hadisəyə çevriləcəkdir" [XVIIc.s.395-396].

Azərbaycandakı dini konfessiyaların başçıları ilə görüşdə söhbətdə Heydər Əliyev dini terminlərə elmi üsluba söykənən bir dildə izah verə bilir. "Həm", "həm də" iştirak bağlayıcılarından istifadə etməklə tolerantlıq terminінə aydınlıq gətirir: "Bildiyiniz kimi, tolerantlıq, dözümlülük çox geniş anlayışdır. O, həm insani münasibətlərin, həm insan cəmiyyətində gedən proseslərin, həm də dövlətlərarası, millətlərarası, dinlərarası münasibətlərin bir çox cəhətlərinə aiddir" [XXIIIc.s.116].

"Ən ideal, çox gözəl" münasibətlərin mövcudluğu cümləsi ilə Azərbaycanda yaşayan xalqlar arasındakı münasibətlərə aydınlıq gətirir, xalqları adlarıyla çağırır. "Görə" qoşması ilə xalqımızın tolerantlıq hissinə malik olmasını genetik cəhətdən izah edir: "Bununla belə, həmin hadisə bəzi insanlarda, ola bilsin, əhalinin bəzi təbəqələrində iz buraxmışdır. Bu şəraitdə də, hətta millətlərarası münasibətlər baxımından bu hadisəyə düzgün qiymət verilməməsinin olduğu şəraitdə Azərbaycanda azərbaycanlılarla ruslar arasında ***ən ideal, çox gözəl münasibətlər mövcuddur***. Azərbaycanlılarla yəhudilər arasında münasibətlər çox gözəldir. Azərbaycanlılarla ukraynalılar, osetinlər, digər xalqların nümayəndələri arasında da münasibətlər beləcə gözəldir. Yəni, məsələn, mən hesab edirəm ki, Azərbaycan xalqı özlüyündə, təbiətinə ***görə***, öz xarakterinə ***görə*** yüksək tolerantlıq hissinə malikdir. Azərbaycan əhalisinin çox hissəsinin etiqad etdiyi müsəlman dinində, onun kökündə də tolerantlıq var" [XXIIIc.s.119].

"Demokratikləşdirmə və demokratik dövlət quruculuğu" anlayışının "azadlıqla" bağlı olması təkrarların köməyi ilə həyata keçirilir. "Mən doğru deyirəm ya yox?", "Siz mənimlə razısınızmı?" ritorik suallarla insan azadlığı haqqında fikirlərini auditoriya ilə bölür. "Məcbur etmək olmaz", "heç kim ona qadağan edə bilməz" qətiyyət dolu fikirlər ölkədə dini azadlığa yüksək qiymət verilməsindən xəbər verir: "***Demokratikləşdirmə və demokratik dövlət quruculuğu***, demokratik cəmiyyətin formalaşdırılması hər şeydən öncə şəxsiyyət azadlığını, insan azadlığını, söz azadlığını, mətbuat azadlığını, bir sözlə, bütün insan azadlıqlarını, dini etiqad azadlığını, vicdan azadlığını nəzərdə tutur. İnsan azaddır. Hansı Allaha sitayiş etmək istəyirsə, qoy ona da sitayiş etsin. İnsanı bir dindən başqa bir dinə keçməyə ***məcbur etmək olmaz***. Əgər insan özü daxilən bunu istəyirsə, onda bunu ***heç***

***kim ona qadağan edə bilməz. Mən doğru deyirəm, ya yox? Siz mənimlə razısınızmı?*** [XXIIIc.s.121]

Dini etikanın başlıca prinsiplərini elan edən Ulu Öndər hüquqi etikadan da yan keçmir. "Ən vacib prinsip" kimi "hüquq bərabərliyi"ni əsas götürür. "Onlar vətəndaşlardır" deməklə dini ayrı-seçkiliyə meyil edən qüvvələrə sərt mövqe nümayiş etdirir. "Çox xoşdur ki" deyərək ölkədəki konfes-siyalar (müsəlman, xristian və yəhudi) arasındakı qarşılıqlı hörmətə işarə edir: "Demokratikləşmənin ***ən vacib prinsip-lərindən*** biri milli mənsubiyyətindən, dilindən, dərisinin rəngindən, dini etiqadından asılı olmayaraq, hamının ***hüquq bərabərliyi*** prinsipidir. Azərbaycanda bu azadlıqların hamısı verilmişdir. Azərbaycan da çoxmillətli dövlətdir, hansı millətə mənsub olmasından asılı olmayaraq, bizdə insanların hamısı bərabər hüquqlardan istifadə edir, ***onlar vətəndaşlardır***. Azərbaycanda üç konfessiya – müsəlman, xristian və yəhudi konfessiyaları var. Onlar tamamilə sərbəst şəkildə, müstəqil fəaliyyət göstərirlər və çox xoşdur ki, müsəlman, xristian və yəhudi konfessiyaları arasında sıx qarşılıqlı əlaqə var" [XXIXc.s.231].

Vahid sovet xalqı ideyasının düzgün olmadığını "öz" təyin əvəzliyini təkrarı və "çünki" səbəb bağlayıcısı ilə xatırladır: "Amma həyat göstərdi ki, bu siyasət düzgün ol-mamışdır. ***Çünki*** hər bir xalqın ***öz*** tarixi, ***öz*** kökləri, ***öz*** etnik tərkibi var, hər bir xalq öz əcdadlarının dininə mənsubdur" [XXIXc.s.228].

Hər bir xalqın öz milli dəyərlərini inkişaf etdirmək (dirçəltmək), öz bayramlarını qeyd etmək haqqının olmasını "bax" əmr ədatını işə salaraq "öz" təyin əvəzliyindən istifadə edərək. Xalqların sayının rol oyanamamasını etik cəhətdən düzgün qəbul edilməməsini bəyan edir: "***Bax***, siz öz mənəvi dəyərlərinizi, öz milli dəyərlərinizi dirçəldirsiniz. Rusiya müsəlmanlarının da dini birdir, ancaq müxtəlif ***adətlər,***

***mərasimlər, müxtəlif fərqlər*** var. Amma bunlar onları bir-birindən çox fərqləndirmir. Çünki hər halda, xalqlarımız islamı qəbul edəndən bəri bu din onların mənəvi həyatında mühüm rol oynamışdır. Davranış normaları da, milli dəyərlər də, adətlər də, mərasimlər də dini prinsiplər əsasında, Quranda yazılmış müddəalar əsasında yaranmışdır" [XXIXc.s.231].

Məsələn, müxtəlif bayramlar var – xristianların bir cür, müsəlmanların başqa cür. Hər ikisinə hörmətlə yanaşmaq lazımdır. Başqa sözlə, bizə qarşılıqlı hörmət lazımdır. Din baxımından sayca böyük xalqlardır, sayca kiçik xalqlardır – heç bir ayrı-seçkilik olmamalıdır" [XXIXc.s.233].

Yəhudilərin timsalında Heydər Əliyev ölkədə yaşayan azsaylı xalqların dininə olan yüksək hörmət və ehtiramı dilə gətirir: "İndi müstəqil Azərbaycanda yəhudilər tam bərabərhüquqlu insanlar, vətəndaşlar kimi yaşayır, işləyir, ölkəmizin ictimai-siyasi həyatında iştirak edirlər. Azərbaycanda müsəlman, islam konfessiyası ilə yanaşı, xristian və yəhudi konfessiyaları da fəaliyyət göstərir. Bunlar müstəqil Azərbaycanın bugünkü reallığıdır. Biz yəhudi xalqına öz həyatını qurmaqda və öz arzularına çatmaqda uğurlar arzulayırıq" [XXc.s.62].

"Ziyarət insanlarda böyük təmizlik əmələ gətirir" müddəası ziyarətgahlara olan münasibəti də açıqlayır. "Təbrizin yerini heç nə vermir" cümləsi ilə Təbrizin müqəddəs yerlərlə eyni səviyyədə adını çəkməklə azərbaycanlılar üçün dərin mətləblərdən xəbər verir: "Bəli, Məşhəddə İmam Rza bizim hamımız üçün ən yüksək zirvədir. Mən sizə deyim ki, İmam Rzanın qəbrini, məbədini ziyarət edəndə heyran olmuşdum. Heyran olmuşdum ki, İran xalqı, milləti nə qədər əsrlər boyu bunu belə qoruyub saxlayıb, abadlaşdırıb, gözəlləşdirib. Doğrudan da, bu ziyarət insanlarda ***böyük təmizlik əmələ gətirir***.

Mən Naxçıvanda olanda gəldim, İmam Rzanın qəbrini ziyarət etdim. Burada olanda isə getdim Məkkəni, Mədinəni

ziyarət etdim. Siz bunları da bilirsiniz. Getdim, oranı da ziyarət etdim. Bunlar hamısı hər bir müsəlman üçün, şübhəsiz ki, müqəddəs yerlərdir. Ancaq düz deyirsiniz, Təbrizin yerini heç nə vermir. Ona görə də mən Təbrizə gəlmək arzusundayam. İndi sən dəvət edirsən, amma cənab Hatəmi də məni Təbrizə dəvət edir" [XXIc.s.135].

"Dostluq" etik kateqoriyasını dini mövzularla bağlı söhbətlərə gətirməklə həm ümumetik kateqoriya olan dostluqla dini etikanın vəhdətini verir. "Bax" əmr ədatını ritorik sualda işlədərək diqqəti dostluğun şərtlərinə (gərək hər şey açıq olsun) yönəldir. "Hər dövrün bir hökmü var" cümləsi ilə zaman fəlsəfi kateqoriyasını gündəmə gətirir. "Qardaş" sözünü də "dostluq" sözü kimi təmizlik olsun, paklıq olsun dəyərləndirir: "***Bax***, mən bu sözləri bir dost kimi, qardaş kimi niyə deyirəm? Bilirsən, ***dostluqda*** gərək hər şey açıq olsun. Hər şey açıq olanda hər şey də düz olur. Bunları deyirəm ona görə ki, xüsusən, bəzi hallarda bizi narahat edən ayrı-ayrı din adamlarının gəlib burada dini öz istədiyi kimi təbliğ etməsidir. Buna ehtiyac yoxdur. Artıq bizdə Quran da Azərbaycan dilinə tərcümə olunubdur. İnsanların burada Qurana da etiqadı var, məscidlərə də etiqadı var, istədikləri qədər məscid də tikirlər.

O vaxt mən istəmişdim siz Naxçıvanda məscid tikəsiniz. Çünki bizim gücümüz yox idi. Amma indi istəmirəm. Çünki Azərbaycanda indi o qədər məscid tikiblər ki, buna ehtiyac yoxdur. Hər dövrün bir hökmü var. O vaxt bu lazım idi, amma indi buna ehtiyac yoxdur, hər şey var. Mən bunları sizə bir qardaş kimi deyirəm. Xahiş edirəm, bu sözləri ***qardaş*** sözü kimi qəbul edəsiniz. Ona görə deyirəm ki, bizim münasibətlərimizdə həmişə təmizlik olsun, həmişə paklıq olsun" [XXIc.s.134].

"Hər bir" təyin əvəzliyinin köməyi ilə vətəndaşları ayırmır, "daha böyük şərait" yaradılacağına söz verir. "mən buna inanıram" deməklə auditoriyanı nikbinliyə çağırır. Aparılan

islahatların nələrə gətirib çıxaracağını məntiqi zaman ardıcıllığı ilə sadalayır: “Azərbaycanın hər bir vətəndaşına öz imkanlarını daha dolğun həyata keçirmək üçün getdikcə daha böyük şərait yaradılacaqdır. Mən buna inanıram, çünki gördüyümüz işlər, xüsusən apardığımız və yaxın illərdə aparacağımız islahatlar Azərbaycanda bütün vətəndaşlar üçün daha yaxşı həyat şəraiti yaradacaqdır. İqtisadiyyat dirçələcək, həyat şəraiti yüksələcəkdir, insanlar firavan yaşayacaqlar və buna görə də hər hansı millətdən olan hər bir vətəndaş öz imkanlarını həyata keçirə biləcəkdir. Yeri gəlmişkən, onlar bəzi digər ölkələrlə müqayisədə Azərbaycanın fərqləndirici xüsusiyyətidir. Biz bunu Azərbaycan üçün səciyyəvi hesab edirik, xüsusən ona görə ki, bu fəaliyyətimizi, – mən dövlət tərəfindən fəaliyyəti nəzərdə tuturam, – çox mühüm hesab edirik, ona böyük əhəmiyyət veririk”.[XIXc.s.164-165].

Heydər Əliyev Azərbaycan Xalq Cümhuriyyətini nümunə gətirməklə Azərbaycanda mövcud olan tolerantlığın təsadüfi, son illər yaranmayan bir dəyər olduğunu sübut edir: “Biz bu gün haqlı olaraq fəxr edirik ki, müsəlman Şərqində yeni tipli məktəblər, demokratik mətbuat, qadın təhsili, seçmək və seçilmək hüququ ilk dəfə Azərbaycanda reallığa çevrilmiş, 1918-ci ildə bütün islam dünyasında Avropa tipli ilk dövlət – ***Azərbaycan Xalq Cümhuriyyəti bizim ölkəmizdə qurulmuşdur*** [XXXVIIIc.s.363].

Papa II İohann ilə söhbətində Ulu Öndərin sadə dini üslublu yox, akademik-dini üslublu və ya elmi-dini üslublu çıxışının şahidi oluruq. Dünyadakı mövcud dinlərin tarixinə bələdlik, həmin dinlərə sayğı ön plana keçir. “Söz” haqqında dəyərli fikirlərlə yanaşı “söz”ə Heydər Əliyev münasibəti, “söz”ə Heydər Əliyev tərifi açıqlanır. Allaha məxsus sözün din, elm, mədəniyyət və incəsənət xadimləri tərəfindən şüurlara çatdırılmasını və bu zaman dinin təsiri sinonim cərgələrlə (mənəvi cəhətdən saflaşma, gözəlləşmə) sıralanır. Minlərlə

tolerant Azərbaycan vətəndaşının xristian din xadiminin çıxışlarından faydalandıqlarını dilə gətirməklə ölkəsinin dini əxlaqını Roma papasına nümayiş etdirir: "Zati-Müqəddəsləri!

Sizin Azərbaycana qısamüddətli, lakin zəngin səfər proqramınızda din, elm və incəsənət xadimləri ilə görüşə xüsusi yer ayırmağınız əlamətdar hadisədir. Bəşəriyyətin qədim kitablarından biri olan Bibliyada deyilir ki, insanı yaşadan təkcə çörək deyil, həm də ilahi dərgahdan gələn ***Sözdür***. Din, elm, mədəniyyət və incəsənət xadimləri həmin ilahi ***Sözün*** insanlara çatdırılmasını təmin edirlər, onların əxlaqını ***gözəlləşdirir***, mənəvi cəhətdən ***saflaşmalarına, təmizlənmələrinə*** yardım göstərirlər. Düşünürəm ki, bütün bu nəcib işləri görmək, böyük və müdrik ***Sözü*** demək Sizin də səfərinizin başlıca məqsədlərindən biridir. İki gün ərzində Sizinlə təmasda olan, ibrətli kəlamlarınızı dinləyən hər bir azərbaycanlı Sizin timsalınızda yer üzündə insan ömrünün necə yaşanmalı olduğu haqqında daha dərindən fikirləşəcəkdir. Bu mühüm və məsuliyyətli anları minlərlə Azərbaycan vətəndaşına yaşatdığınız üçün Sizə minnətdarlığımı bildirirəm. Təşəkkür edirəm" [XXXVIIIc.s.365].

Üzeyir Hacıbəyovun timsalında milliliklə ümumbəşəriliyin vəhdətini verə bilmişdir. Ulu Öndər xalqın inkişafına xeyir verən adamları gördükləri işlərə görə qiymətləndirir: "Dahi bəstəkarımız Üzeyir Hacıbəyov ***nə qədər milli olubsa, o qədər də ümumbəşəri*** olubdur. Biz bunu qiymətləndiririk. Biz heç vaxt yalnız milli, dini dəyərlərə qapılaraq, onun çərçivəsindən kənara çıxmayan, yaxud ondan kənarda heç bir şeyi görməyən insanları, alimləri xalqın inkişafına xeyir verən adam hesab etmirik. ***Ancaq*** milli xüsusiyyətlərini qoruyub saxlayan, milli-mənəvi dəyərlərinə sadiq olan, milli-mənəvi dəyərlərini yüksək qiymətləndirən, onlarla fəxr edən, eyni zamanda, ümumbəşəri dəyərlərin xalqımız üçün faydalı hissələrini götürüb Azərbaycan ictimai, elmi, mədəni fikrini

inkişaf etdirən şəxsiyyətlər Azərbaycanın mədəniyyətini, elmini bax, bu səviyyəyə gətirən insanlardır. Bu baxımdan, Azərbaycanın XIX-XX əsrlərdəki böyük şəxsiyyətlərinin yaratdığı əsərlər, gördüyü işlər, eyni zamanda islam sivilizasiyasının – ***təkcə*** Azərbaycanda yox, bütün Qafqazda, o cümlədən Mərkəzi Asiyada – müasir tələblərə uyğun inkişaf etməsinə böyük töhfələr vermişdir”.

Roma Papasi II İohann Pavelin Azərbaycanın din, elm və incəsənət xadimləri ilə görüşündəki nitqdə katolik dini icmasının Bakıda mövcudluq tarixini “görə” qoşması ilə Roma papası II İohann Pavelə xatırladır. Növbəti nitq mərhələsində katolik icmasının Bakıda gördükləri işləri “xüsusən” modal sözü ilə diqqətə çatdırır. “Müqəddəs Məryəm” kilsəsinin dağıdılmasına “təəssüf” edir. Sonrakı mərhələdə “müsəlman və xristian sivilizasiyasının sintezindən danışır. Bu zaman böyük natiq dinşünas alim kimi araşdırmalar aparır: “Digər dini icmalar kimi, katoliklər də Azərbaycanda hər zaman hörmət və etimad görmüşlər. Tarixçilərin verdiyi məlumatlara görə, Azərbaycanda ilk katolik icması XIX əsrin 30-cu illərində formalaşmağa başlamışdır.

XIX əsrin sonu – XX əsrin əvvəllərində katolik icmasının nümayəndələri Bakının mədəni-ictimai həyatında mühüm rol oynamış, xüsusən də səhiyyə, mədəniyyət və memarlıq sahələrində bu gün də minnətdarlıqla xatırlanan izlər qoymuşlar. 1912-ci ildə yerli katolik icmasının təşəbbüsü və əhalinin ianəsi ilə Bakının mərkəzi hissəsində “Müqəddəs Məryəm” kilsəsi ucaldılmışdı. Təəssüf ki, stalinizm dövründə islam, xristianlıq və yəhudiliklə bağlı bir çox din ocaqları kimi, bu katolik məbədi də dağıdılmışdı. Din və etiqad sərbəstliyinin hökm sürdüyü Azərbaycanda indi digər dini icmalar kimi, katoliklər də bütün hüquq və azadlıqlara malikdirlər.

Etik, əxlaqi anlayış olan təhsillə din arasındakı sıx əlaqə böyük natiqin nitqlərində ciddi şəkildə elmi faktlar əsasında

aydınlaşır. Bu zaman elmi-publisistik üslub dini üslubla çulğalaşır. Kütlələrin şüuruna yönələn nitqin mühüm bir təsir gücü onun inandırıcı olmasıdır. Bu inandırıcılıq faktlara söykənir ki, Heydər Əliyev nitqləri faktlar və rəqəmlər dili ilə bəzənir. UNESCO tipli beynəlxalq təşkilatların təntənəli şəkildə yubileylərini qeyd etdiyi görkəmli mütəfəkkirlərin yetişməsində islamın rolunu açıb göstərməklə islam əleyhdarlarını doğru, düzgün mövqe tutmağa, etik normalara əməl etməyə çağırır: “Siz bu günlərdə yəqin ki, Bakı ilə tanış oldunuz, gördünüz. Azərbaycanda tarixə, keçmişə böyük hörmət var. Bunun əlamətlərindən biri də Azərbaycanda, o cümlədən onun paytaxtı Bakıda tarixi şəxsiyyətlərə qoyulan, onları əbədiləşdirən ***heykəllər***, ***abidələrdir***. Simpoziumun başlanğıc günü biz danışırdıq ki, Azərbaycanın dahi şəxsiyyətləri islam mədəniyyətinin, sivilizasiyanın inkişafında böyük xidmətlər göstəriblər. Nizaminin, Füzulinin, Nəsiminin adları çəkildi. Siz Nizaminin abidəsini də, Füzulinin abidəsini də, Nəsiminin abidəsini də gördünüz. İslam aləminin, Azərbaycan mədəniyyətinin bu üç dahi insanı Azərbaycan xalqının qəlbindədir. Baxmayaraq ki, onların yaşadıqları dövrdən indiyə qədər çox əsrlər keçibdir, Azərbaycanda Nizami adı daşıyan ***nə qədər*** insanlar var, ***nə qədər*** Füzuli adı daşıyanlar var, ***nə qədər*** Nəsimi adı daşıyanlar var. Biz hesab etmirik ki, Nizami, Füzuli, Nəsimi yalnız azərbaycanlılara məxsusdur. Onlar Azərbaycan çərçivəsindən elə yaşadıqları zaman çıxıblar. Sonrakı dövrlərdə isə onların əsərləri o qədər geniş yayılıbdır ki, onlar ümumbəşəri olublar və xüsusən bütün islam aləminə mənsub insanlardır. Onların xidmətlərinə verilən böyük qiymət və XX əsrin ikinci yarısında, – mən bunu xüsusi qeyd edirəm, – bu şəxsiyyətlərin xidmətlərinə verilən böyük qiymət və onların adlarının, xidmətlərinin əbədiləşdirilməsi, əsərlərinin nəşr edilib geniş yayılması və təbliğ olunması, Bakının ən gözəl meydanlarında onların abidələrinin, heykəllərinin

ucaldılması bizim ***həm*** tariximizə, ***həm*** şeirimizə, ***həm*** mədəniyyətimizə, ***həm də*** islam sivilizasiyasına olan sədaqətimizin əlamətidir" [XVIIIc.s.377-378].

Bu işləri görmək üçün Azərbaycanda islamşünaslıq elmini inkişaf etdirmək lazımdır. Azərbaycanın Elmlər Akademiyası, Bakı Dövlət Universiteti və elmi-tədqiqat institutları bəlkə də bu sahə üçün xüsusi təşkilatlar, orqanlar, elmi mərkəzlər yaratmalıdırlar. Hər halda, mən indi qəti deyə bilmərəm. Belə təşəbbüslər olsa, mən onları dəstəkləyəcəyəm, bunlar üçün şərait də yaradacağam. Buna arxayın olun.

Yenə də deyirəm, Azərbaycan elmində böyük bir dövr ərzində biz bu işlərlə ciddi məşğul olmamışıq. Ancaq bu, təkcə Azərbaycan alimlərinin işi deyil və çətindir. İndi bizim üçün çox mötəbər mərkəz olan, İstanbulda yerləşən İslam Konfransı Təşkilatının Elmi-Tədqiqat Mərkəzi, yaxud da ki, Rusiyanın Moskvada olan elmi-tədqiqat təşkilatları, Avropadakı elmi tədqiqat təşkilatları ilə əməkdaşlıq edilməlidir.

Beləliklə, böyük natiqin dini etika ilə bağlı fikirləri bu gün üçün də, sabah üçün də təzə-tərdir:

– Etik, əxlaqi anlayış olan təhsillə din arasındakı sıx əlaqə böyük natiqin nitqlərində ciddi şəkildə elmi faktlar əsasında aydınlaşır. Bu zaman elmi-publisistik üslub dini üslubla çulğalaşır;

– "Dostluq" etik kateqoriyasını dini mövzularla bağlı söhbətlərə gətirməklə həm ümumetik kateqoriya olan dostluqla dini etikanın vəhdətini verir;

– "Ziyarət insanlarda böyük təmizlik əmələ gətirir" müddəası ziyarətgahlara olan münasibəti də açıqlayır;

– Ziyarətgahların qorunması üçün hazır sinonim cərgələri var (***mühafizə edək, saxlayaq, abadlaşdıraq, inkişaf etdirək*** ki, insanlar bu yerlərdən daha da səmərəli istifadə edə bilsinlər) ;

– Dini etikayla bağlı çıxışlar əsasən sadə xalq dilində, əsasən sinonim və frazeologizmlərlə bəzənmiş olur;

– Həmişə ***sülh, əmin-amanlıq, qardaşlıq*** kimi humanist prinsiplərin carçısı olmuş islam dini ona etiqad edən insanlarda yüksək mənəvi keyfiyyətlərin formalaşmasına xüsusi diqqət yetirmişdir;

– Bəzi adamlarda bir-birinə qarşı ***kin-küdurət, ədavət, qisasçılıq*** hissləri yaranıb. Bunların hamısını kənara qoymaq lazımdır. Allah-taala belə buyurub, Qurani-Kərim də bunu bizdən tələb edir

– Həzrəti Məhəmməd peyğəmbərin qoyduğu yolla getmək və Qurani-Şərifin tələblərinə riayət etmək, şübhəsiz, insanları həmişə ***saflığa, təmizliyə, saf mənəviyyata*** aparır, ***düz yola, doğru yola*** aparır.

## 1.2.8. Heydər Əliyevin nitqində tibbi-bioloji etika

Tibbi-bioloji etika yarımfəsli Ulu Öndərin tibb ictimaiyyəti qarşısında, sağlamlıq problemlərinə həsr olunmuş respublika və beynəlxalq əhəmiyyətli konfranslarda, idman komplekslərinin, elmi-tədqiqat institutlarının, tibb ocaqlarının açılış mərasimlərində, Azərbaycan Tibb Universitetində, eləcə də bir sıra tibb müəssisələrində baş tutan görüşlərdəki çıxışlarının əsasında yazılmışdır.

Son illər tibb sahəsində mühüm uğurlara imza atılması bu sahədə etik məsələlərə ciddi yanaşma tələb edir ki, bu özünü filosofların elmi-tədqiqat işlərində göstərir [148, 158, 185, 200, 202, 208]. "Həkim yüksək mənəviyyata malik olmalıdır. Təsadüfi deyil ki, heç bir sahədə "Hippokrat andı" kimi and yoxdur. Hansı bir mütəxəssis, mühəndis ali təhsilini qurtarandan sonra and içir ki, "Mən yaxşı mühəndis olacağam". Hansı bir aqronom and içir ki, "Mən yaxşı aqronom olacağam". Ancaq həkim and içir. And içir ki, "Mən bu şərəfli peşəmə sədaqətlə xidmət edəcəyəm" [XXVIIIc.s.207-208]. Heydər Əliyevin söylədiyi yuxarıdakı sətirlərindən sonra respublikamızda qəbul olunmuş həkim andını bütövlükdə monoqrafiyada vermək və elə bu and əsasında da tibbi deontologiya–tibbi-bioloji etika barədə Ulu Öndərin təfəkkür süzgəcindən süzülən fikirlərini araşdırmaq qərarına gəldik:

*Həkim andı*

*Ömrüm boyu yüksək həkim adını uca tutacaq, bu peşənin paklığını qoruyacağam. İşə başlayan andan bütün qüvvəmi, bilik və bacarığımı insanların sağlamlığının qorunmasına həsr edəcəyəm.*

*Peşəm üzrə vicdanla çalışacaq, tibbi yardım göstərməyi özümə borc hesab edərək bu işə həmişə hazır olacaq, xəstələrə və peşəmlə bağlı təmasda olduğum adamlara yüksək*

*qayğı və diqqətlə yanaşacaq, həkim etikasına həyatım boyu əməl edəcək, həkim sirlərini qoruyacağam.*

*Aldığım biliklərlə kifayətlənməyəcək, ixtisasıma daha dərindən yiyələnmək üçün daim oxuyub − öyrənəcək, bilik və peçə səriştəliyimi dönmədən artıracağam. Həmkarlarımdan öz köməyimi əsirgəməyəcəyəm.*

*Xalqımın və dövlətimin qarşısındakı məsuliyyət hissimi unutmayacaq, böyük Allahın, Müqəddəs Kitabların həkimdən tələb etdiyi şəfqət və mərhəmətini insanlardan əsirgəməyəcəyəm.*

*Bu anda bütün ömrüm boyu sadiq qalacağıma söz verirəm.*

Həkim üçün hər bir keyfiyyət lazımdır. Amma ən əsas keyfiyyət yüksək mənəviyyatdır. Mən sizə arzu edirəm ki, hər biriniz öz peşənizlə bərabər, yüksək mənəviyyata malik olasınız [XVIIc.s.375-376].

"Həkim yüksək mənəviyyata malik olmalıdır" fikrindən öncə böyük natiq mənəviyyat haqqında öz düşüncələrini auditoriya ilə bölüşür. Mənəviyyata münasibətdə də dialektik qanunların verdiyi biliklərə söykənir. "Yox" inkar ədatının köməyi ilə tarix boyu mənəviyyat və mənəviyyatsızlıq kimi kateqoriyaların vəhdətini açıqlayır. Sonra təfəkkür feilləri: "düşünmək", "dərk etmək"lə dünyanın faniliyi, daimi olmaması haqqında fikirlərini irəli sürür: "Mənəviyyat ən yüksək insani keyfiyyətdir. İnsanlar mənəviyyatı əsrlər boyu qoruyub saxlayıblar. Bu heç də o demək deyil ki, keçmiş zamanlarda hamı yüksək mənəviyyata malik olub, amma mənəviyyatsızlar olmayıbdır. ***Yox***. İnsan cəmiyyəti belədir ki, mənəviyyatlı ilə mənəviyyatsız arasında daim mübarizə gedir. Çünki mənəviyyatsızlıq cəmiyyətə zərbələr vurur, insanları pozur. Amma mənəviyyat insanları yüksəldir. Mənəviyyatlı çalışır ki, mənəviyyatsızlıq olmasın. Ancaq bu çətindir, ağırdır. Eyni zamanda, hər bir şəxs ***düşünməli, dərk etməlidir*** ki, onun üçün

bu dünya daimi deyil. Bu dünya heç kim üçün daimi deyildir. Hamı bu dünyaya gəlir, hamı bu dünyadan gedir. Biri çox yeyir, biri az yeyir. Birinin var-dövləti çox olur, o birininki az olur. ***Amma hamının yeri oradadır və orada da hamı bərabərdir. O dünyada hamı bərabərdir***.

Ona görə də bu dünyada yaşayan insanlar birinci növbədə yüksək mənəviyyata malik olmalıdırlar və bunu qorumalıdırlar. Çünki həyatda belə amillər var ki, bəzən insanları özlərinin xəbəri olmadan da düz yoldan çəkirlər. Ona görə də onlar özlərini qorumalıdırlar" [XIVc.s.305-306]. Bu zəngin fikirlər Nizami Gəncəvinin "İsgəndərnamə" poemasındakı misralarla uzlaşır. Şeyx Nizami yeddi ölkə hakimi olan İsgəndərin dünyadan köçdüyü andakı vəziyyətini təsvir edir:

"O saysız-hesabsız xəzinələrdən
Bir ovuc torpaqdır əlində gedən!
Sizin də dünyadan gedərkən ancaq
Payınız bir ovuc torpaq olacaq!" [110,s.111]

Azərbaycan xalqının sağlamlığı Heydər Əliyevin qarşısında duran ümdə vəzifədir. "Nə üçün" sual əvəzliyi ilə başlayan ritorik sualla auditoriyaya müraciət edir. Spirtli içkilərdən istifadə olunmaması fikrini irəli sürür. Bu fikir "yaxud ümumiyyətlə, istifadə olunması insan üçün zərərlidir" ifadəsi ilə gənclər auditoriyasına ünvanlanır: "Bunu sübut etməyə ehtiyac yoxdur ki, narkotik maddədən istifadə edən adam öz sağlamlığını itirir. Nə üçün gənc hələ həyatı görməmiş sağlamlığını itirməlidir? Spirtli içkilərə meyil məsələsi barədə mən bir neçə dəfə demişəm, bu gün bunu bir daha deməyi zəruri hesab edirəm ki, Azərbaycanın mənəvi, milli adət-ənənələri və dini ənənələri spirtli içkilərin qəbul olunmasına heç vaxt yol vermir. ***Ancaq*** eyni zamanda, biz spirtli içkiləri qadağan da etmirik. Çünki biz hər sahədə ***müasirliyi,***

***çağdaşlığı*** təmin etmək istəyirik. Ona görə də, əgər biz insanlara sərbəstlik veririksə, onları nədənsə zorla məhrum etmək, belə bir qadağan qoymaq olmaz. Ancaq insanları başa salmaq lazımdır. Gənclər bilməlidirlər ki, spirtli içkilərdən həddindən artıq, yaxud ümumiyyətlə, istifadə olunması insan üçün zərərdir. Hər bir gənc bilməlidir ki, əgər, o, spirtli içkiyə qoşulmağa başlayırsa, spirtli içkidən istifadə etməkdə israfçılığa yol verirsə, beləliklə, o öz gəncliyini pozur. Bunun qarşısı alınmalıdır [XIVc.s.306].

Növbəti nitq mərhələsində akademik Zərifə Əliyevanın timsalında deontologiya problemini publisistik-məişət üslubda auditoriyanın diqqətinə çatdırır: "Naxçıvanda akademik Zərifə Əliyeva adına poliklinikadakı nitqində ilahi bir fəhmlə elmin yüksək vüsət tapması fonunda "mənəviyyat təcrübəsini" ötürməyin vacibliyini irəli sürür. "Həkimlik sahəsinin" fərqli olduğunu özünün polad məntiqi ilə əsaslandırır. Feilin əmr və lazım şəkillərində səhiyyə qarşısında, həkimlər qarşısında dövlət tələblərini ortaya qoyur. "Yəni" aydınlaşdırma bağlayıcısı ilə deontologiya haqqında sadə bir dildə, anlaşıqlı bir tərzdə auditoriyanı məlumatlandırır: "Mən çox sevindim ki, Əbdüləli həkim bu gün də buradadır, bu gün də öz xidmətlərini göstərir. Mən sizin hamınızı dəvət edirəm ki, o kişiyə yaxşı baxın, ona qayğı göstərin. O, nə qədər fəaliyyət göstərsə, həkimlik təcrübəsini sizə versə və ***xüsusən*** həkimə məxsus olan ***mənəviyyat təcrübəsini*** sizə versə, siz o qədər zəngin olacaqsınız" [XXXIVc.s.396].

Feilin arzu şəklindən adətən az istifadə edən böyük natiq tibblə bağlı, həkimliklə bağlı çıxışlarında "olsun", "bilsin" ifadələri ilə çıxış edir: "Mən həmişə həkimlər haqqında danışanda Hippokrat andını yadıma salıram. Bu, təsadüfi deyildir. Heç bir başqa peşə sahibi olan, yaxud diplom alan mütəxəssis heç bir şeyə and içmir: diplomunu aldı – sərbəstdir, gedib işləyir, çalışır. Amma həkimlik bütün başqa peşələrdən fərqli

bir sənətdir, fərqli bir sahədir – həkimlik sahəsi. Ona görə də həkim gərək həqiqi həkim ***olsun***, bunun üçün gərək onun mükəmməl həkimlik biliyi ***olsun***, yaxşı təcrübəsi ***olsun*** və xəstənin diaqnozunu düzgün qoya ***bilsin***, onun müalicəsinin yollarını düzgün müəyyən edə ***bilsin***. Amma eyni zamanda, həkim gərək böyük insan ***olsun***, həkim gərək yüksək mənəviyyata malik insan ***olsun***. Həkim öz insani keyfiyyətləri ilə bütün başqa peşə sahiblərindən daha da yüksəkdə ***durmalıdır***. Ona görə də tibb elmində belə bir sahə var – ***deontologiya***. Yəni bunu həkimlər yəqin bilirlər. Amma bilməyənlər üçün bir balaca izah edim, – yəni həkimliyin mənəvi xüsusiyyətləri. Deontologiya Hippokrat andından meydana gələn qədim bir məfhumdur" [XXIIc.s.227].

Bilirsiniz ki, mərhum Zərifə xanım göz həkimi idi və öz peşəsini çox yaxşı bilirdi. Əmək fəaliyyəti, həkimlik fəaliyyəti dövründə çoxlarının gözünü yaxşı müalicə etmişdi, onların gözlərinə işıq vermişdi. Çox işlər görmüşdü. Eyni zamanda böyük elmi fəaliyyətlə məşğul idi, elmi əsərlər yazırdı. Bilirsiniz ki, mən 1969-cu ildə Azərbaycanda rəhbərliyə başlayanda bu mənfi hallar çox geniş yayılmışdı. Mən onlarla mübarizəyə başladım və təbiidir ki, Zərifə xanım da mənim bu mübarizəmi görürdü, – onda o, deontologiya haqqında bir çox kitablar oxudu və deontologiya haqqında kitab yazdı. Hətta o vaxt bir neçə dəfə Sovetlər İttifaqının ayrı-ayrı yerlərində – Moskvada, başqa şəhərlərdə elmi konfranslarda çox uğurla çıxış etdi. Bu, məni çox sevindirdi. Çünki həkim üçün çox əhəmiyyətli olan bu mövzu onu maraqlandırırdı. [XXIIc.s.228]

Sağlamlıq problemi həm filosofların [60, 167, 195], həm də tibb alimlərinin həmişə diqqət mərkəzində olmuşdur. İnsanlarımızın sağlamlığı kimi mühüm etik məsələnin həllini Ulu Öndər gənclərimizin böyük potensialında, eləcə də dövlət siyasətinin əsas istiqamətində görür. Avstraliyanın Sidney şəhərində keçirilmiş XI yay paralimpiya oyunlarında iştirak

etmiş əlil idmançılarla olan görüş həkimlər üçün, tibb işçiləri üçün örnək ola biləcək, nümunə ola biləcək nitqdir. Əsil həqiqətdə ciddi fiziki çatışmamazlığı necə deyərlər "müəyyən fiziki çatışmazlıq" deməklə yumşaldır. Onların fəaliyyətini "elə" ədatı ilə yüksək qiymətləndirir. Fərd, xalq, dövlət vəhdətini ortaya qoyur: "Təəccüblənmək olar ki, insan bəzən bir az xəstə, yaxud da bir çatışmazlığı olanda onda bir bədbinlik əmələ gəlir, özünü ələ ala bilmir. Amma siz öz əzmkarlığınızla, iradənizlə və bacarığınızla aradan qaldırmısınız. ***Elə*** buradan Sidneyə getməyin özü də bir problemdir. O yarışlarda iştirak etmək, onun bütün əziyyətini çəkmək və yüksək nəticələr əldə etmək, Azərbaycanın bayrağını qaldırmaq, ölkəmizin himnini orada çaldırmaq təbiidir ki, sizin ***hər birinizin, Azərbaycan xalqının, dövlətinin*** nailiyyətidir [XXXIc.s.61].

Xəstələrin sağalması yolunda sözün ilahi gücündən istifadə yeni bir şey deyildir. Heydər Əliyevin xalq yazıçısı Yusif Səmədoğluya onun xəstəliyi ilə əlaqədar baş çəkməsi zamanı söylədiyi məişət üslublu nitq diqqətçəkəndir. İnsanların müşkül bir işə düşdüyü, xəstəliyə düçar olduğu hallarda dini dəyərlərə qiymət vermək gündəmə gəlir. Xəstələrin dini dünyabaxışlarına uyğun sözlərə ciddi ehtiyac yaranır. "İnşallah", "Allaha şükürlər olsun ki" dini üslubun tələb etdiyi terminlər işə düşür. Qəti gələcək zamanda işlədilən "xəstəliyin ötüb keçəcəkdir", "sağalacaqsan, duracaqsan və on illərlə yaşayacaqsan" ifadələrinin xəstəyə olan təsirini izah etməyə ehtiyac duyulmur. "Düzdür" gerçəkliyə münasibətdə qəti təsdiq modal sözünün istifadə olunduğu "düzdür, bu, həkimlərin öz işi deyildi" ifadəsi ilə həkimlik peşəsinə olan ülvi sevgisini də auditoriya üçün açıqlayır: "Sənin bu ***xəstəliyin ötüb keçəcəkdir. İnşallah***, hər şey keçəcək və ayağa duracaqsan. Ona görə də sənin vaxtını çox almaq istəmirəm. Mən bilirəm, çünki özüm də vaxtilə xəstə olmuşam. Bilirsiniz ki, mən üç ay Moskvada xəstəxanada yatmışam. Özü də elə xəstə idim ki,

deyirdilər heç ayağa dura bilməyəcəkdir. Çoxları da deyirdi ki, o, ayağa dursa yaşaya bilməyəcəkdir. Hətta həkimlər də deyirdi. ***Düzdür***, bu, həkimlərin öz işi deyildi. O vaxt Qorbaçov onlara göstəriş vermişdi və onlar bütün professorlar, akademiklər gəldilər, yığıncaq keçirdilər. Mənə dedilər ki, sən işləyə bilməyəcəksən. Mən dedim ki, siz nə istəyirsiniz? Dedilər ki, sən ərizə ver, get, səni işdən çıxarsınlar. Mən də dedim ki, yaxşı, buradan çıxandan sonra işləyə bilməsəm, onda işdən çıxaram. Sonra xəstəxanadan da çıxdım və iki aydan sonra vəzifədən də getdim. Ondan sonra da, ***Allaha şükürlər olsun ki***, yaşayıram. İndi ***sən*** də ***sağalacaqsan, duracaqsan və on illərlə yaşayacaqsan*** [XVc.s.386-387].

Xəstəxanada olan böyük söz adamının iti nəzərlərindən heç nə qaçmır, bu gün də biz səhiyyə sahəsinin insanlarına öyüd verir. İnsanın daşıdığı ümumbəşəri funksiyasını, missiyasını, qısaca desək, Yaradan qarşısında insanlıq borcunu yada salır. Eləcə də xəstələrin sağalması yolunda, həyata qayıdış yolunda onlara baş çəkməyin, onların ziyarətinin nə dərəcədə vacibliyini göstərir. "Xatirimdədir" modal sözü ilə ürək-dirək verdiyi xəstəni yada salır, vaxtilə xüsusi imtiyazlar alan şəxslərdən umduğunu dilə gətirir, sonda ilahi bir fəhmlə, uzaqgörənliklə "yox" inkar ədatı ilə ciddi, prinsipial mövqe nümayiş etdirir, "dünyanın dövranı uzundur, həyat hələ qabaqdadır" deməklə burnundan uzağı görməyənləri qınağa çəkir. Bu gün də xəstəxanada olanlara, gözü yolda qalanlara baş çəkməyin vacibliyini ortaya qoyur, həm də xəstələrə öz həyatından nümunə gətirməklə onları gələcək günlərə hazırlayır. Heydər Əliyev dilində səslənən bu sətirlər həkimlərin cib dəftərçələrində öz layiqli yerlərini tutmalıdır: "***Xatirimdədir***, Qurban Xəlilov birinci dəfə operasiya ediləndə əməliyyatdan əvvəl telefon etdim, on beş dəqiqə danışdım, ürək-dirək verdim. Gələndən sonra göz yaşları ilə mənə deyirdi ki, hər şeyi etdin, amma cərrahiyyə otağına gedərkən telefon

etməyin mənə həqiqətən mənəvi ruh verdi. Bunlar hamısı olan şeylərdir.

Amma mən xəstə olanda nəinki xəstəliyimlə, müalicəmlə məşğul olsunlar, heç olmasa mənə bir diqqət göstərsinlər, – onu da etmədilər. Ona görə mən onlara dedim, bilirsiniz, ***dünyanın dövranı uzundur, həyat hələ qabaqdadır***, siz nahaq elə başa düşürsünüz ki, Heydər Əliyev artıq fəaliyyətdən uzaqlaşıbdır, ***yox***. Siz nahaq elə başa düşürsünüz ki, Heydər Əliyev bəlkə də bu xəstəxanadan çıxmayacaq, ***yox***. Amma siz öz sifətinizi göstərdiniz. Çıxın gedin, özünüz haqqında düşünün. Söhbət təxminən iki saatdan artıq çəkdi, baxmayaraq ki, həkim demişdi on dəqiqədən artıq ola bilməz [XXc.s.343-344].

İdmanla məşğul olmamaq hesabına fiziki cəhətdən zəif olmaq, tez-tez infeksiyalara tutulmaq, gözəl bədən quruluşuna malik olmamaq özlüyündə etik cəhətdən normal sayıla biməz. Dövlət başçısı tərəfindən bu cür tibbi etikaya zidd olan halları aradan qaldırmaq üçün tədbirlər görülməsi auditoriyalar tərəfindən rəğbətlə qarşılanır: “Mən vaxtilə Moskvada Nazirlər Sovetində işləyəndə idman işinə də rəhbərlik edirdim. Biz hətta o vaxt məsələ qoymaq istəyirdik ki, məktəblərdə, universitetlərdə idman dərsinin saatı artırılsın. Əgər uşaq, gənc idmanla məşğul olsa, bədən tərbiyəsinə aludə olsa, yəni ona bağlı olsa, o, sağlam olacaq, qriplə xəstələnməyəcək, başqa şeylə xəstələnməyəcək, demək, o biri fənləri də yaxşı öyrənəcək. Amma sağlam olmayanda, fiziki cəhətdən zəif olanda soyuq dəyən kimi xəstələnir, bir infeksiya düşən kimi xəstələnir, yaxud, ümumiyyətlə, zəif olur, yaxşı oxuya bilmir. Nə olar, ***gəlin*** bir saat da artıraq, ***dünya dağılmayacaq ki***?! Amma bu şərtlə ki, idman dərsinin hörmətini qaldırmaq lazımdır.

Mən özüm də bunu görmüşəm, ona görə deyirəm. Bəzən idman müəllimlərinin özü də bu məsələyə bir az başdansovdu yanaşırlar. Ona görə gərək biz həm şərait yaradaq, həm də idman müəllimləri gərək o dərsi elə keçsinlər ki, şagird, tələbə

hiss etsin. Necə ki, fizika, kimya, yaxud riyaziyyat dərsləri onları çətinliyə salır, bu, idmanda da olsun. Onda bizim gənclərimizin hamısı gözəl bədən quruluşlu, sağlam olacaqlar. Mən sizə öz təcrübəmdən deyirəm, daim idmanla məşğul olmuşam, bu gün də məşğul oluram və onun faydasını da görürəm. Bu, sadəcə, nümunədir" [XLIIc.s.11-12].

Heydər Əliyevin tibb auditoriyası qarşısındakı ecazkar nitqlərinin kökündə onun tibb ictimaiyyəti ilə yaxından təması, əlaqəsi durur. Görkəmli ictimai dövlət və səhiyyə xadimi Əziz Əliyevlə, akademik Zərifə xanım Əliyeva ilə, özünə dost adlandırdığı əməkdar elm xadimi Tamerlan Əliyevlə, akademik Cəmil Əliyevlə və ölkənin görkəmli tibb sahəsi alimləri ilə mütəmadi görüşləri və sonda isə SSRİ miqyasında Nazirlər Sovetində səhiyyənin onun rəhbərliyi altında olması, probleмə dərindən bələdliyinə gətirib çıxarmışdır. Heydər Əliyevin yaxın çərçivəsində olan görkəmli təbiblərin şərəfli, qüsursuz həyat yolu, anda sadiq olmaq kimi deontoloji etika aşağıdakı fikirlərin səslənməsinə gətirib çıxarır: "Ancaq mən ailədə öz ailəmlə, həkimlərlə çox yaxın olmuşam. Bilirsiniz ki, mənim ailəmin bir hissəsi həkim olubdur. Ona görə də mən elə gənc vaxtlarımdan bu həkimlik, tibb sahəsini şəxsi həyatımda da hiss etmişəm, maraqlanmışam və bu barədə həm Azərbaycanda, həm də Moskvada işləyəndə çox tövsiyələr də vermişəm. Bu gün mənim sizə tövsiyə verməyimə ehtiyacınız yoxdur. Siz hər şeyi bilirsiniz. Amma mən həmişə həkimlərə bir şeyi demişəm: elminizi inkişaf ***etdirin***, biliyinizi ***artırın***, müalicə işinizi ***gücləndirin***. Ancaq keçmişdə də demişəm, bu gün də deyirəm – Hippokratın andını heç vaxt ***unutmayın*** [XVIIc.s.372-375].

Azərbaycan Respublikası Səhiyyə Nazirliyi Elmi-Tədqiqat Ağciyər Xəstəlikləri İnstitutu binasının açılışı mərasimindəki nitq həkimlik sənətinə yüksək qiymətin, həkimlərin cəmiyyətdəki rolunu açıb göstərmək baxımından, xəstələrin

müalicəsi və profilaktikası baxımından, həkimlərin cəmiyyətdəki nüfuzunun qiymətləndirilməsi baxımından ciddi etik dəyərləri özündə ehtiva edən bir nitqdir.

"Ən" qüvvətləndirici ədatı ilə həkimliyin bu gün də hörmətli sənətlərdən biri olduğunu "heç bir" inkar əvəzliyi ilə həkimliklə bağlı mövqeyinin prinsipiallığını ortaya qoyur. Sonrakı nitq mərhələsində uşağın doğulduğu andan ömrünün sonunadək həkimliklə bağlı sağlamlıq vəziyyəti sadalanır, "üçün" qoşması ilə bu sahənin gərəkliliyi diqqətə çatdırılır.

Həkimləri özünə "bir nömrəli dost" hesab edən Heydər Əliyev sağlamlığın profilaktikasında həkimlərin rolunu qiymətləndirməklə yanaşı "Allah mənə elə bir səhhət veribdir ki" deməklə şükranlığını dilə gətirir. Dini-məişət üslublu ifadələrlə yaddaqalan, düşündürücü bir nitq nümunəsi yaradır: "Həkimlik sənəti dövrü-qədimdən şərəfli sənət olmuşdur, hörmətli sənət olmuşdur. Həkimlik sənəti indi də ən şərəfli, ən hörmətli sənətlərdən biridir. Mən hesab edirəm ki, dünyada heç bir sənət tapa bilməzsən ki, o, həkimlik kimi hər bir insana lazım olsun. Biz mütəxəssislərin, alimlərin, mühəndislərin gördükləri böyük işi qiymətləndiririk. Müəllimlərin işini qiymətləndiririk, çünki təhsil verir, bizim gənc nəsli yetişdirir. Kənd təsərrüfatında çalışanları qiymətləndiririk, xidmət sahəsində çalışanları qiymətləndiririk. Bunların hamısı, şübhəsiz ki, hər bir cəmiyyətin inkişafını təmin edən sahələrdir. Cəmiyyət də insanlardan ibarətdir. İnsanların isə yaşayışı üçün, sağlamlığı üçün bütün başqa vasitələrlə bərabər, ən çox həkim yardımı lazımdır, səhiyyə yardımı lazımdır.

Yəqin ki, dünyada elə bir insan tapmaq olmaz ki, o, həkim yardımından istifadə etməsin. Uşaq doğularkən onun dünyaya gəlməsini həkim təmin edir və ilk günləri həkimin nəzarəti altında keçir. İnsanlar yaşbayaş artarkən daim həkimin yardımına ehtiyacı olur və nəhayət, insanlar yaşa dolduqca həkimə daha da çox ehtiyacı olur. Amma həkim, səhiyyə təkcə

insanları müalicə etmək üçün yox, həm də xəstəliklərin qarşısını almaq, geniş profilaktik iş aparmaq üçündür. Elə etmək ki, insanlar xəstələnməsinlər, insanlar, xəstələr tezliklə müalicə olunsunlar. Bu da böyük bir sahədir. Səhiyyə həddindən artıq geniş, həyatın bütün sahələrini əhatə edən və cəmiyyət ***üçün***, dövlət ***üçün***, hər bir insan ***üçün*** çox lazımlı bir sahədir. Ona görə də hər bir insan həkimə hörmət edir, səhiyyə işçisinə hörmət edir. Həkimlər də insanlara tibbi yardım göstərməklə, onları müalicə etməklə özlərinə böyük ***mənəvi hörmət, ehtiram*** qazanırlar.

Mən həkimi çox sevirəm, səhiyyəni çox sevirəm. Deyə bilərəm ki, mən sizlərin dostuyam. Siz isə mənim bir nömrəli dostumsunuz. Ona görə yox ki, mənim həkimə çox ehtiyacım olubdur. ***Allah mənə elə bir səhhət*** veribdir ki, demək olar, 1987-ci ilə qədər mənim heç vaxt heç bir həkimə ehtiyacım olmayıbdır [XXc.s.375-376].

Xalqın sağlamlığı yolunda əsas əngəllərdən biri narkotik maddələrin yayılmasıdır ki, buna "təəssüflər olsun ki" modal sözü ilə münasibət göstərilir. "Təəssüflər olsun ki" modal sözün ardınca dövlətin bu sahədə gördüyü işlər sadalanır, İlham Əliyevin başçılıq etdiyi Milli Olimpiya Komitəsinin gördüyü işlər qiymətləndirilir. "İdman kompleksləri yaransın", "imkanlar yaransın"kimi feilin əmr şəklində işlənən ifadələrlə auditoriyalarda nikbin əhvali-ruhiyyə yaradılır. Narkomaniyanın qarşısına sipər çəkilməsi "yalnız və yalnız idmandan keçir" müddəasını irəli sürür: "Son illər dünyanı bürüyən xəstəliklər var. Onlar insanlara, bəşəriyyətə faciələr gətirir. Onların qarşısını təkcə tibbi vasitələrlə yox, birinci növbədə, hər bir insanın öz sağlamlığı yolunda çalışması vasitəsilə almaq lazımdır. Burada yenə də mən gənclərə müraciət edirəm. Həmin bu faciələr birinci növbədə, dünyada narkotik maddələrdən istifadə olunması ilə əlaqədardır. İndi dünyanın, demək olar ki, əksər dövlətlərinin narkotik maddələrin isteh-

salı, yayılması, onların satışı ilə mübarizə aparmasına baxmayaraq, təəssüflər olsun ki, narkotik maddələr yayılır. ***Təəssüflər olsun ki***, insanlar, xüsusən gənclər bunun təsiri altına düşürlər.

Biz Azərbaycanda bu barədə böyük proqram tərtib etmişik. Lazımı işlər görülür. Amma bu işlərin sırasında, yenə də deyirəm, yalnız və yalnız gənclərin özlərini fiziki cəhətdən möhkəmləndirməsi, bədən tərbiyəsi ilə, idmanla məşğul olması narkotik maddələrin istifadə edilməsindən uzaqlaşmanın ən birinci vasitəsidir və birinci şərtidir. Bunlara görə də biz çalışırıq ki, gənclərimiz üçün, onların sağlamlığını təmin etmək üçün müxtəlif idman kompleksləri yaransın. Bədən tərbiyəsi ilə kütləvi məşğul olmaq üçün imkanlar yaransın. Azərbaycan Milli Olimpiya Komitəsinin bu sahədə gördüyü işlər çox yüksək qiymətə layiqdir. Buna nümunə Gəncə şəhərində ucaldılmış bu gözəl Olimpiya İdman Kompleksidir. Burada İlham Əliyev dedi, bu, dördüncü idman kompleksidir ki, yaranıbdır. Bakıda, Maştağa qəsəbəsində, Naxçıvanda, dördüncüsü isə burada yaradılıbdır. Təbiidir ki, burada idmanla məşğul olan hər bir adam çempion olmayacaqdır. Bəlkə də o qədər çempion lazım da deyildir. Ancaq burada idmanla məşğul olan hər bir gənc potensial çempiondur. Əgər onun fiziki hazırlığı yüksək səviyyədə olarsa, əgər o, əzmlə çalışarsa, öz fiziki keyfiyyətlərini inkişaf etdirə bilərsə və yüksək mənəviyyatla bu işə yanaşarsa, təbiidir ki, çempion da olacaq və çempionlar da daha çox olacaqdır [XLIc.s.103-104].

Jurnalist Gennadi Roqovun Siz səhərlər idman edirsinizmi sualına Heydər Əliyev "ömrüm boyu", "həmişə" səhərlər idman etməsini dilinə gətirməsi və bunu sağlam həyat tərzi adlandırması gənclik üçün ən gözəl əxlaqi örnəkdir:

"**Gennadi Roqov:** Siz səhərlər idman edirsinizmi?

**Heydər Əliyev:** Mən ***ömrüm boyu*** səhərlər idman etmişəm. Gəncliyimdə daha çox gimnastika ilə məşğul olurdum.

Sonra, burada işləməyə başladıqda dənizdə çox üzürdüm. Mən ***həmişə*** səhərlər idman etmişəm. Bu, artıq vərdişdir. Ona görə yox ki, belə istəyirəm, sadəcə, çoxdan, ən gənc yaşlarımdan belə olmuşdur. Bizdə deyildiyi kimi, bu, sağlam həyat tərzidir. Ən başlıcası budur” [XLIc.s.105].

Tibbi təhsil ocağı kimi Azərbaycan Tibb Universitetindəki görüşdə Ulu Öndər elmi-publisistik bir dildə universitetin 70 ildə “tarixi bir missiyanı” yerinə yetirməsindən söhbət açır. Universitet əməkdaşları qarşısında onların “əvəzsiz rolundan” danışır, Universitetdə çalışanları “təhsili, elmi və təbabəti” üzvi şəkildə birləşdirən böyük natiq elmi-publisistik üslublu nitq bəxş edir. Bu nitq tibb terminləri ilə (insan sağlamlığı, tibb, səhiyyə, yoluxucu xəstəliklər, epidemiya, sanitariya maarifi) zənginliyi ilə seçilir: “Mübaliğəsiz demək olar ki, universitetin 70 ili Azərbaycanda ***tibb*** elminin və ***səhiyyə*** sisteminin təşəkkül tapıb inkişaf etməsi yolunu əks etdirən mühüm bir dövrdür. Ölkəmizi yüksək ixtisaslı kadrları ilə təmin edən bu təhsil mərkəzi ***tarixi bir missiyanı*** uğurla yerinə yetirmiş və qısa müddət ərzində Azərbaycanda ***insan sağlamlığının*** keşiyində duran böyük həkimlər ordusu yaranmışdır. Yarandığı ilk illərdən respublikada tüğyan edən ***yoluxucu xəstəliklərin, epidemiyaların*** qarşısının alınmasında, əhali arasında sanitariya maarifi işinin gücləndirilməsində tibb universiteti ***əvəzsiz rol*** oynamışdır” [XXVIIIc.s.171].

Universitetin ölkə qarşısındakı xidmətlərini, “təhsil, elm və təbabəti” üzvi şəkildə birləşdirən kollektiv üzvlərinin gördüyü işləri qiymətləndirir: “Azərbaycanda tibb elminin inkişafında universitetinizin xidmətləri yüksək qiymətə layiqdir. Milli tibb kadrlarının hazırlanması üşün əsas təhsil mərkəzi olmaqla yanaşı, universitet ciddi elmi nailiyyətləri ilə ölkəmizdə və onun hüdudlarından kənarda nüfuzlu elm mərkəzi kimi də yaxşı tanınır. Bu gün respublikamızın tibb

profilli elmi-tədqiqat institutlarının əksəriyyətinin fəaliyyəti Azərbaycan Tibb Universiteti ilə sıx bağlıdır.

***Təhsil, elm və təbabəti*** öz fəaliyyətində üzvi şəkildə birləşdirən universitetdə çalışanların əksəriyyəti müəllim, alim olmaqla yanaşı, həm də ölkə səhiyyəsinin müxtəlif sahələrində aparıcı qüvvə hesab olunurlar. Həkim adına ***sadiq***, öz peşəsinə sıx bağlı olan bu vətənpərvər insanların səyləri nəticəsində ölkəmizdə səhiyyənin inkişafı yolunda böyük uğurlar əldə edilmişdir" [XXVIIIc.s.172].

Azərbaycan Tibb Universitetinin 70 illiyinə həsr olunmuş təntənəli yubiley mərasimindəki nitqdə sağlamlıqdan, bu sağlamlığın keşiyində dayanan həkimlərdən danışır, "demək, insan sağlamlığı ən əsas amillərdən biridir" müddəasını irəli sürür: "Yer kürəsindəki insanların hərəsi öz fəaliyyətini bir sahədə göstərir. Hər bir sahə lazımdır. Amma özünü həkim sənətinə, insanların sağlamlığına, səhhətinə həsr edənlər ***ən*** qiymətli insanlardır. Çünki hər bir sahədə işləyən insan canlı bir orqanizmdir. Bu canlı orqanizm nə qədər sağlam olsa, öz sahəsində o qədər də yeni ixtiralar edəcək, nailiyyətlər qazanacaq və cəmiyyəti irəli aparacaqdır. ***Demək, insan sağlamlığı ən əsas amillərdən biridir.*** Ona görə də mən belə hesab edirəm ki, həkimlik sənəti, yəni insanın sağlamlığının qorunması və müxtəlif xəstəliklərdən xilas edilməsi, onun daha da çox yaşaması üçün çalışan sahə tibb, səhiyyə sahəsidir. Mən bunu heç bir kitabdan oxumamışam və heç kimin fikrini demirəm. Bu mənim şəxsi fikrimdir, amma o həqiqətdir. Çünki həkim, tibb işçisi – lap kiçikdən başlayaraq yuxarıyadək – öz həyatını, biliyini, bacarığını insanların sağlamlığına sərf edir. Dünyada ən sağlam adam da həkimə möhtacdır. Ona görə ki, onu həm xəstəlikdən müalicə etsin, həm də sağlamlığının səviyyəsini müəyyənləşdirsin. Təsadüfi deyildir ki, səhiyyə sahəsində ən əsas istiqamətlərdən biri insanların

vaxtaşırı profilaktikadan keçirilməsidir. Doğrudur, bu çox böyük proqramdır” [XXVIIIc.s.199-200].

Qədim vaxtlarda deyilmişdir. Bu gün bu səhnədə də səsləndi: sağlam bədəndə sağlam ruh olur. Bəli, sağlam ruhun olması üçün, insanların daim sağlam olması üçün, millətimizin həyatın bütün sahələrində sağlam olması üçün və bizim ordumuzda sağlam gənclər olması üçün mən idmanı, bədən tərbiyəsini böyük vasitə hesab edirəm. Yəni bu mənim icad etdiyim bir şey deyildir. Bu, dünyada qədim zamanlardan məlumdur. Mən həyatı görmüş adamam, ancaq təəssüf ki, həyatda insanların bəziləri bədən tərbiyəsi ilə – Azərbaycanda belə bir ifadə var – zorən təbib kimi məşğul olurlar [XLIIc.s.10-11]. Təkcə bu mətnin natiqlik nöqteyi-nəzərdən araşdırılması tibbi etika sahəsində gözəl nitq nümunəsindən xəbər verir. Hələ Mövlana Cəlaləddin Rumi həzrətləri deyirdi ki, cismimiz ruhumuzun gəmisidir. Ruhların gəmilərinə yüksək sayğı Ulu Öndərin dilində “Bəli” təsdiq ədatının dörd yerdə “üçün” qoşmasının təkrarı ilə harmoniyada verilərək idmanın rolunu kütlələrə aşılayır. “Mən həyatı görmüş adamam” ağsaqqal öyüdü kimi səslənən fikir “təəssüf ki” modal sözü ilə birgə insanları Allahın verdiyi sağlamlığı qorumağa səsləyir

Zaqafqaziya ölkələrinin onkoloqlarının ikinci konqresindəki çıxış tibbi problemlərin çözülməsi ilə məşğul bir elmi üslublu çıxışdır. Konqresin 2001-ci ildə çağırılması faktından böyük natiq yerindəcə yararlanaraq, zaman anını (*konqresinizin yeni yüzilliyin və yeni minilliyin ilk ilində keçirilməsi*) auditoriyanın yaddaşına həkk edir, “məhz” dəqiqləşdirici ədatının köməyilə onkologiya sahəsində hər bir uğura insanların sevincini əks etdirir, “inanıram ki” modal sözlə, “dönüş yaradacaq” və “həyat ümidini artıracaq” frazeoloji birləşmələrlə nikbin əhvali-ruhiyyə yaradır: “Onkologiyanın mürəkkəb problemlərinin həlli yollarına həsr olunmuş forumunuz bəşəriyyəti bu qorxulu bəladan qurtarmaq naminə səylərinizi

birləşdirmək işinə xidmət edir. Sizin bu konqresinizin yeni yüzilliyin və yeni minilliyin ilk ilində keçirilməsi də xüsusi əhəmiyyət kəsb edir. Bu gün Yer kürəsinin müxtəlif guşələrində milyonlarla adam onkoloji xəstəliklərdən əziyyət çəkir. ***Məhz*** buna görə də təbabətin bu sahəsində qazanılmış hər hansı nailiyyəti insanlar səbirsizliklə gözləyirlər. ***İnanıram*** ki, XXI əsrdə onkologiya elminin inkişafı sayəsində əldə ediləcək müvəffəqiyyətlər onkoloji xəstəliklərin müalicəsində ***dönüş yaradacaq*** və bu bəlaya düçar olmuş insanların ***həyat ümidini artıracaqdır***" [XXXIVc.s.118-119].

Azərbaycan Milli Olimpiya Komitəsinin idman-sağlamlıq kompleksinin istifadəyə verilməsinə həsr olunmuş təntənəli açılışı mərasimində Heydər Əliyev öz möhtəşəm nitqi ilə gəncləri öz qüvvələrinə inanmağa çağırır. Öncə Avropa ölkələrində idmanın yüksək səviyyəsindən danışır, "amma" ziddiyyət bağlayıcısı ilə Azərbaycan gəncinin böyük potensialından danışır. Daha sonra çıxışında populizmə yer qoymayan böyük natiq feilin şərt şəklindəki ifadələrlə "şərait yaratmaq", "kütləvi etsək", "həyatının bir hissəsinə çevirsək" qəti gələcək zamanla – təmin edəcəyik fikrini ortaya qoyur

Bu gün ölkədə idmanla bağlı aparılan 2015-ci il Avropa oyunları, 2017-ci il islam oyunları Ulu Öndərin uzaqgörənliklə deyilmiş fikirlərinin bariz nümunəsidir:

Onu da demək lazımdır ki, əgər Avropa ölkələrində, Amerikada, inkişaf etmiş bir neçə başqa ölkələrdə idman çox yüksək səviyyədədirsə, bizim ölkəmizdə, Azərbaycanda, təkcə bizdə deyil, yəni Şərq ölkələrində hələ ki, bu səviyyəyə çatmayıbdır. Amma Azərbaycan gəncinin, Azərbaycan insanının potensial gücü çox böyükdür. Həm fiziki gücü böyükdür, həm də onun mənəvi iradəsi böyükdür. Ona görə də əgər biz hamımız bu işə kömək etsək, idmanın inkişafına şərait yaratsaq, idmanı kütləvi etsək və bütün insanlar üçün bədən tərbiyəsini mütləq onların həyatının bir hissəsinə çevirsək,

xalqımızın fiziki sağlamlığını, mənəvi sağlamlığını təmin edəcəyik” [XXXc.s.242].

“Ancaq bəzi vətəndaşlarımız müxtəlif xəstəliklərdən xilas olmaq üçün başqa ölkələrə getmək məcburiyyəti qarşısında qalırlar. Kimin imkanı yoxdursa, bunu edə bilmir. ***Bu bizim çatışmazlığımız, boşluğumuzdur.*** Biz bu boşluğu doldurmalıyıq. Bunu doldurmaq üçün də iki əsas vasitə vardır. Bunlardan birincisi, maddi-texniki baza yaratmaqdır. Təbiidir ki, bu daha çox özümüzdən asılıdır. İkincisi isə, müxtəlif sahələrdə çalışan tibb mütəxəssislərimiz gərək öz fəaliyyətlərini indi gördükləri işlərlə ***məhdudlaşdırmasınlar***, dünyanın elmi nailiyyətlərinin hamısı ilə yaxşı ***tanış olsunlar***. Belə olduqda, biz hər bir mütəxəssisin imkanını ölkəmizin imkanları ilə birləşdirərək Azərbaycan səhiyyəsinin səviyyəsini daha da yüksəklərə qaldıra bilərik” [XXVIIIc.s.202]. İlk baxışda bu kiçik mətndə etik dəyər çatışmazlığını görmək olar: Müalicə üçün imkanı olmamaq ; eləcə də təhsil etikasının tələblərinə uyğun olaraq dünya elminin qabaqcıl nailiyyətlərini mənimsəmək. Bu etik çatışmazlıq səmimi ifadələrlə – “Bu bizim çatışmazlığımız, boşluğumuzdur” dinləyicilərə yönəlir, vəziyyətdən çıxış isə feilin əmr şəklində ifadə olunan “məhdudlaşdırmasınlar”, “tanış olsunlar” ifadələri ilə sonuclanır.

Azərbaycan üçün əhəmiyyətli, xüsusi bir mövzu deyərək, tibb ictimaiyyətinin diqqətini qohumlararası nikaha yönəldir. Qohumluq münasibətlərini qorumaq, bu münasibətləri möhkəmləndirmək baxımından müsbət qiymətləndirilə bilən, sonda isə irsi-genetik xəstəliklərin artması ilə müşaiyət olunan “etik” cəhətdən qəbul olunmayan qohumlararası nikaha yönəldir. Belə bir neqativ hala “təəssüf” edir: “Bir də bizim Azərbaycan üçün əhəmiyyətli, yəni xüsusi bir mövzu vardır. Bəlkə bunu desəm, indi hamı məni anlaya bilməsin. Ancaq bu, xalqımızın bu günü, gələcəyi üçün tibbi nöqteyi-nəzərdən,

insanların, cəmiyyətin sağlamlığı nöqteyi-nəzərindən çox əhəmiyyətli bir sahədir. Bu da ondan ibarətdir ki, Azərbaycanda qədimdən belə adət var – qohumun qohumla evlənməsi, ailə qurması. Nəslin gələcəyinə bunun nə qədər mənfi təsir göstərdiyini təəssüf ki, indi də çoxları bilmirlər" [XXIIc.s.230].

Təfəkkür feilləri "fikir verməyiblər", "dərk etmək", "bilmək", "mövzu üzərində işləmək" ilə zərfin mətndə qohumlararası nikahın zərərindən məlumat verir, bu məlumatı bir qədər nağılvari, məişət üslublu çalarlarla auditoriyanın diqqətinə çatdırır. "Xüsusən" modal sözünü işlətməklə bu patologiyaların təkcə akademik Zərifə Əliyevanın məşğul olduğu göz xəstəlikləri ilə yox, digər – sinir sistemi patologiyaları arasında geniş yayılmasını vurğulayır: "Keçmişdə bizim Azərbaycanın çox müdrik insanları, o cümlədən təbibləri olubdur. Amma nədənsə bu sahəyə ***fikir verməyiblər***. Mən həkim deyiləm, ancaq o illər bu məsələ ilə çox ciddi məşğul olduğuma görə bu adətin Azərbaycan xalqının nəsil sağlamlığı üçün nə qədər zərərli olduğunu mən yaxşı ***dərk etmişdim***. Mən bu barədə bəzi həkimlərlə söhbət aparırdım və şübhəsiz ki, ən yaxın söhbətimi də Zərifə xanımla evdə aparırdım. O mənə danışırdı ki, onu da bu mövzu çox maraqlandırır və göz xəstəliklərindən bir çoxunun – ola bilər, onu burada Zəhra xanım da təsdiq edər – kökünü qohumun qohumla nikahında və ondan sonra əmələ gələn uşaqların gözlərinin xəstəliklərində görürlər. O, bu mövzunu da çox sevdi və bu ***mövzu üzərində işlədi***, bir çox materiallar topladı. Bəzən biz evdə söhbət edirdik. Gəlirdi, mənə deyirdi ki, nə qədər xəstəliklərin kökünü axtaranda görürsən ki, bu, qohumluq əlaqələri ilə bağlı olan xəstəlikdir. Yəni mən bunu bilirdim. Bu mənfi hal təkcə gözə təsir etmir, başqa xəstəliklərə də, xüsusən ağıl, şüur xəstəliyinə də çox təsir edir" [XXIIc.s.231].

Məsələn, son vaxtlar mənə deyirlər ki, sonsuzluq xəstəliyi yaradır, başqa xəstəliklər yaradır. Bunlar məni çox narahat

etdi. Nə üçün? Çünki mən o illərdə də, 70-ci illərdə də təkcə öz yaşadığım günü, öz yaşadığım dövrü düşünmürdüm. Mən Azərbaycan xalqının gələcəyini düşünürdüm, Azərbaycan xalqının sağlamlığını düşünürdüm. Xalqın sağlamlığı ayrı-ayrı adamların, ya da böyük bir qrupun sağlamlığı deyil. Xalqın sağlamlığı xalqın kütləvi sağlamlığıdır, yəni xalqın hamısının sağlam olmasıdır. İndi tibb elmi və tibb təcrübəsi o qədər irəli gedibdir ki, bu sahədə dünyada böyük nailiyyətlər vardır. O nailiyyətlər profilaktik tədbirlərin həyata keçirilməsi vasitəsilə dünyada belə xəstəliklərin çoxunu artıq aradan çıxarıbdır. Mən o vaxt bax, bu düşüncələrlə millətimin, Azərbaycan xalqının daha da sağlam olmasını istəyərək, gələcək nəsillərin bizim nəslimizdən daha da sağlam olmasını istəyərək bu məsələ ilə çox ciddi məşğul oldum.

Heydər Əliyev öz nitqinə xas olan “xatirimdədir” modal sözü ilə auditoriyanı keçmişə aparır, elə keçmişdə də problemin aktual olduğunu gündəmə gətirir. “Rəhmətlik” akademik M.Topçubaşovla ətraflı söhbətini yada salır. Tibbdə görkəmli şəxslərə olan səmimiyyətini dilə gətirərək tibb auditoriyasının qəlbini riqqətə gətirir. Keçmişdə işlənən ritorik sualla auditoriyanı bu gün səfərbər etmək kimi nitq üslubundan bəhrələnir, ritorik sualın ardınca akademikin cavabını dilə gətirir: “***Xatirimdədir***, mən bunu Azərbaycanda bir neçə dəfə – bizim rəhbər orqan o vaxt Mərkəzi Komitənin Bürosu idi – büronun üzvləri ilə müzakirə etdim. Bizim böyük həkimləri, akademikləri dəvət etdim. ***Rəhmətlik*** Mustafa bəy Topçubaşovla da çox ətraflı söhbət etdim. O, bu fikirlərin tamamilə düzgün olduğunu dedi. Ancaq mən ona dedim – bəs siz nə üçün bu məsələni qaldırmırsınız, nə üçün bu məsələni ümummilli məsələ kimi ortaya atmırsınız? Dedi ki, bilirsiniz, insanlar başa düşmürlər. Bu adət – əmioğlunun əmiqızı ilə evlənməsi, yaxud başqa hallar – bunlar Azərbaycanda o qədər dərin köklərə malikdir ki, insanlar o adət-ənənəni o qədər

qəbul ediblər ki, bunun qarşısına çıxmaq mümkün deyildir [XXIIc.s.230-233].

Heydər Əliyev nitqlərinin bir mühüm xüsusiyyəti odur ki, böyük natiq çıxışlarının bir qrup üçün yox, ölkə üçün ünvanladığını bildiyi üçün trubunadan maksimum yararlanmağa çalışır və buna da nail olur. Qohumlararası nigahın nə dərəcədə zərərli olduğunu başqa dinlərə mənsub olan xalqlar timsalında eyni bir fikri müxtəlif formalarda xalqın şüuruna yönəldə bilir. 1999-cu ildə "Naxçıvanda akademik Zərifə Əliyeva adına poliklinika"dakı nitqində biz bunun şahidi oluruq. Ruslarda, xristian dininə mənsub olanlarda "Bu adət yoxdur, qadağandır" və "Dini adət-ənənələri yol vermir" fikirləri bir neçə yerdə nitqin gözəlliyini pozmadan müxtəlif formada təkrarlanır. Ənənələrin əməli nəticələrini bir tibb mütəxəssisi kimi açıqlayır. Milyonlar auditoriyası üçün xəstəlikləri sadalayır, acı və ağır da olsa, gələcək törəmələrdə bu xəstəliklərin üzə çıxacağını bircə-bircə açıqlayır: "Amma onu bilin ki, xristianlarda bu adət yoxdur, qadağandır. Məsələn, ruslarda bu adət ***yoxdur***, qadağandır. Ona görə də onlarda bu problem yoxdur. Amma bu problem onlar yaxşı bilirdilər. Mənim bu danışıqlarımdan onlar başa düşürdülər ki, mən rus xalqı üçün maraqlanmıram. Çünki rus xalqında belə adət ***yoxdur***. Orada qohum qohumla evlənə bilməz. Onların dini, adət-ənənələri buna ***yol vermir***. Kimsə evlənirsə, ola bilər, bu, sadəcə hadisədir. Amma dini adət-ənənə buna ***yol vermir***. Ancaq bizdə bu problem var idi və mən onların da fikirlərini öyrəndim. Sonra bildim ki, bir çox sahələrdə tədqiqatlar aparılıbdır. Bir çox xəstəliklərin, xüsusən, yenə də deyirəm, əqli xəstəliklərin, şüur xəstəliklərinin, göz xəstəliklərinin, başqa xəstəliklərin kökü qohumların nikah bağlamasından irəli gəlir. Yəni bundan onların özləri xəstələnmir, amma onlardan törəmiş uşaqlar xəstələnir. Bəlkə öz övladı

xəstələnmir, amma nəvəsi xəstələnir, o biri törəməsi xəstələnir" [XXIIc.s.233].

"İkinci də, bizim millətimiz üçün ən vacib olan həmin məsələ – irsi, xromosom xəstəliyi. Zərifə xanım çalışıb ki, bizim gələcək nəsilləri bu xəstəlikdən xilas etsin, sağlamlaşdırsın. Bunu da o, göz xəstəliklərində tapdığına görə, orada gördüyünə görə bu fikrə gəlmişdi.

İndi mən Azərbaycanın prezidenti kimi, bu fikri burada açıram və öz fikrimi bildirirəm. Qohumluq əlaqələri olan adamlar arasında nikah bizim gələcək nəsillərimiz üçün, onların sağlamlığı üçün zərərlidir və hesab edirəm ki, təhlükəlidir. Tibb alimlərimizi dəvət edirəm ki, onlar nəinki öz elmi araşdırmaları ilə, ya elmi mühazirələri ilə, çıxışları ilə bunu ***desinlər***, onlar bu problemin Azərbaycanda həll edilməsi üçün düşünsünlər. Mən Səhiyyə Nazirliyinə bu göstərişi verirəm – bir proqram *təşkil etsinlər*. Başa düşürəm ki, bu, asan məsələ deyildir. Başa düşürəm ki, bunu biz bir ildə, iki ildə, on ildə edə bilmərik. Amma bizim bir strateji proqramımız olsa ki, müstəqil Azərbaycanın, millətimizin, xalqımızın gələcək sağlamlığını daha da təmin edək – ***bu problem üzərində biz işləməliyik***". Hələ Ulu Öndərin 1999-cu ildə ölkənin ciddi problemlərlə üzləşdiyi bir dövrdə söylədikləri bu gün öz real nəticələrini verir. Etibarlı əldə olan dövlətçilik sükanının İlham Əliyev dönəmində bu gün ailə quran gənclik genetik xəstəliklərə görə yoxlanılır, ciddi maneələrə isə rast gəlmir.

"Göstəriş verirəm" – ifadəsi ilə səhiyyə strukturlarını hərəkətə gətirən "təşkil etsinlər", "desinlər" düşünsünlər

Çətinlikləri təkrarlayan "başa düşürəm ki" səmimi ifadəsi ilə Ulu Öndər sonda "bu problem üzərində biz işləməliyik" qətiyyəti ilə fikrini yekunlaşdırır, səhiyyə strukturlarını səfərbər edir.

Beləliklə, Ulu Öndərin tibb sahəsində etik dəyərlərlə bağlı fikirlərini aşağıdakı kimi yekunlaşdırmaq olar:

– Tibbi etika sahəsində Heydər Əliyev nitqlərinin əsas nüvəsini xalqın sağlamlığı, genofondun qorunmasına yönələn çıxışlardır;

– Tibb ictimaiyyəti qarşısındakı nitqlərin əksər hissəsi tibbi terminologiyaya söykənən elmi üslubdadır;

– "Xatirimdədir" modal sözü ilə Azərbaycan səhiyyəsinin keçmişi ilə bu günü arsındakı fərqləri və varisliyi diqqətə çatdırır;

– Xəstələrə baş çəkərkən böyük natiqin nitqləri yarı-məişət, yarıpublisistik üslubda, ruhlandırıcı, təskinliklə dolu, nikbin ruhda auditoriyalara yönəlir;

– Xəstələrlə söhbət məqamlarında dini dəyərləri özündə əks etdirən modal sözlərdən − "Allaha şükürlər olsun ki", "inşallah" − istifadə edir;

– "Həkim yüksək mənəviyyata malik olmalıdır" ifadəsi Heydər Əliyev dilində aforizm səviyyəsinə yüksəlir.

## 1.2.9. Heydər Əliyevin nitqində etika və terrorizm

Bu gün dünyada terrorizmin geniş yayıldığı müasir dövrdə filosofların terrora münasibətində fikir ayrılıqlarının mövcudluğu şəraitində [64] Heydər Əliyevin terrorla bağlı çıxışlarının araşdırılmasına ehtiyac göz qabağındadır. Böyük natiq "nə....nə" inkar bağlayıcıları ilə terrorizmin ümumbəşəri bəla olduğunu anladır. Bu bəladan qurtulmaq yolunun kökündə mədəniyyətlər və sivilizasiyalar dayanan etik dəyərləri göstərir: "Bu gün, terrorizm təhlükəsi qarşısında hamımızın əl-ələ verdiyimiz bu vaxtda xüsusi vurğulamaq istəyirəm ki, həm Azərbaycan, həm də Rusiya terrorizm təhlükəsi ilə digər dövlətlərdən çox-çox əvvəl üzləşmişdir. Terrorizmin ***nə*** vətəni, ***nə*** milli və ya dini mənsubiyyəti vardır. Biz dünyada onu da hamıdan yaxşı dərk edirik ki, bu məsələni təkcə silah gücü ilə birdəfəlik həll etmək mümkün deyildir. Yalnız mədəniyyətlərin və sivilizasiyaların səmərəli dialoqu bu təhlükənin qarşısını almağa və onun kökünü birdəfəlik kəsməyə qadirdir" [XXXIXc.s.43-44].

Heydər Əliyevin terrora qarşı mübarizəsi təkcə öz ölkəsinə yox, bəşəriyyətə ünvanlanır. "Əksinə artmışdır" ifadəsi dünyanı ayıq olmağa səsləyir. "Məhz" dəqiqləşdirici ədatı ilə Ermənistanın beynəlxalq terrorun içində olduğu auditoriyalara çatdırılır: "Dünyada separatizm, terrorizm, dini ekstremizm təhlükəsi hələ də azalmamış, ***əksinə, artmışdır***. ***Məhz*** qonşu Ermənistanın hərbi təcavüzü, Azərbaycana qarşı haqsız ərazi ideyaları nəticəsində 1988-ci ildə Ermənistan–Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi yaranmışdır [XXXIIIc.s.397].

"Terrorizm indi dünyada geniş yayılıbdır" fikrinin ardınca əhalimizi, xalqımızı bu bəladan qorumaq dövlətin ümdə vəzifəsi olduğunu "həyata keçirməlidir" feilin lazım şəklində Milli Təhlükəsizlik Nazirliyinə göstəriş verir: "Terrorizm indi

dünyada geniş yayılıbdır. Burada gətirilən faktlar əyani sübut edir ki, Azərbaycanda terror aksiyaları keçirmək cəhdləri, dövlətçiliyimizi sarsıtmaq məqsədi daşıyan cəhdlər son illər olmuşdur. Ancaq bu gün də bunların mümkünlüyü var. Ona görə də Milli Təhlükəsizlik Nazirliyi terror aksiyalarına qarşı xüsusi tədbirlər hazırlayıb həyata ***keçirməlidir***" [XIXc.s.360].

Yəhudi xalqının soyqırım tarixini əks etdirən "Xolokost" xatirə muzeyində çıxışda soyqırımı əks etdirən "Xolokost" xatirə muzeyindəki çıxış Heydər Əliyevin terrora, soyqırıma olan münasibətini ifadə edir. "Doğrusu" modal sözü ilə soyqırımların müşahidəsinin çox ağır və çətin olduğunu dilə gətirir, "insan insana qarşı bu qədər vəhşilik edərmi" ritorik sualla öz münasibətini ifadə edir: "Alman faşistlərinin yəhudilərə qarşı həyata keçirdiyi soyqırım siyasəti dünyada misli görünməmiş, dəhşətli şəkildə olubdur. "Xolokost" muzeyi bunu əyani şəkildə göstərir. ***Doğrusu***, bu faciələri bilməyimizə, ayrı-ayrı kinofilmlərdə bunları gördüyümüzə baxmayaraq, bu gün "Xolokost" muzeyindəki eksponatları görmək, müşahidə etmək çox ağır və çətindir. Bəzən təsəvvür etmək mümkün deyil ki, insan insana qarşı bu qədər vəhşilik edərmi? Ancaq bu həqiqətdir. Yəhudilərə qarşı belə vəhşiliklər edilmişdir, bunu alman faşistləri etmişlər" [XXc.s.60].

Soyqırıma məruz qalan xalqın hər dəfə "ancaq" qarşılaşdırma bağlayıcısı ilə yeni keyfiyyət (mənliyini qoruyub saxlamaq, məhv etməyə nail olamamaq) halını ortaya qoyur, "ona görə" səbəb bağlayıcısı ilə auditoriya üçün bəzi məsələlərə aydınlıq gətirir: "Yəhudi xalqı tarix boyu çox böyük sınaqlara çəkilmiş və çox böyük çətinliklərlə üzləşmişdir. Ancaq bunlara baxmayaraq, yəhudi xalqı bütün bu sınaqlardan keçərək ***öz*** qədim, zəngin mədəniyyətini, ***öz*** mənliyini qoruyub saxlamışdır. Yəhudi xalqını tamamilə məhv etməyə çalışmışlar. Ancaq ***heç kəs*** buna nail ola bilməmişdir. Ona görə nail ola bilməmişdir ki, yəhudi xalqı bəşər mədəniyyətini

zənginləşdirmiş və bəşər tarixində böyük izlər qoymuş bir xalqdır. Tarix sübut etmişdir ki, bu xalqı məhv etmək mümkün deyildir” [XXc.s.60-61].

“Xolokost” muzeyinə baxdıqdan sonra “hər bir” şəxsin nəticə çıxarmalı olduğunu anladır. Feilin lazım şəklində dünya birliyini nə etməli olduğu haqqında düşünməyə, hərəkət etməyə çağırır: “***Hər bir*** insan bu muzeylə tanış olarkən, eksponatları seyr edərkən özü üçün nəticə çıxarmalıdır. Yeganə nəticə ondan ibarətdir ki, bəşəriyyət bundan sonra heç yerdə, heç bir xalqa qarşı soyqırıma yol verməməlidir. Dünya birliyi müharibə alovlarını söndürməli, münaqişələri ləğv etməli, dünyada sülhün, əmin-amanlığın yaranması üçün daha ***çox səylər göstərməlidir***. Bunlar muzeyə baxarkən çıxarılan nəticədir” [XXc.s.61].

Heydər Əliyev terror hərəkətlərinə məruz qalan qonşu dövlətlər və azərbaycanlılar yaşayan dövlətlərdəki vəziyyətə münasibət göstərir. Dağıstanda çoxsaylı azərbaycanlıların mövcudluğu, orada yaşayan xalqların islama mənsubluğunu nəzərə alıb “şübhəsiz ki” modal sözü ilə Rusiyanın daxili işlərinə qarışmamağı nəzərdə tutur. “Biz arzu edirik ki” ifadəsi ilə “proseslərə son qoysunlar”, “sabitliyi, əmin-amanlığı təmin etsinlər” feilin əmr yox, arzu şəklində fikrini auditoriyaya bəyan edir: “Şimali Qafqazda və konkret olaraq indi Dağıstanın ərazisində gedən proseslər, yəni terror aktları, Dağıstanın ərazisinə soxulmuş quldurlar bizi çox narahat edir” [XXIc.s.386].

Bir də bilməlisiniz ki, Dağıstanda təxminən 120-130 min azərbaycanlı yaşayır. Dağıstanla Azərbaycan arasında belə bir vəziyyət var ki. Dağıstanda olan ləzgilərdən Azərbaycanda da yaşayanlar çoxdur. Azərbaycanda avarlar da çoxdur və Dağıstanın başqa etnik qruplarından da Azərbaycanda var. Ona görə də bunlar hamısı tarixən həmişə bizi bir-birimizə bağlayıblar [XXIc.s.386].

Başqa bir nitq məqamında “bizim arzumuz odur ki” ifadəsi feilin əmr şəklində səslənəcək fikirləri (son qoysun, onlaın qarşısını alsın) əmr şəklindən sanki arzu şəklinə çevirir: “Rusiyadakı partlayışlar, şübhəsiz ki, çox qeyri-adi bir haldır. Rusiyanın, yaxud keçmiş Sovet İttifaqının tarixinə nəzər salsanız, mən belə şeyləri xatırlaya bilmirəm. Mən bunu xatırlaya bilmirəm. Çünki hər halda o dövrün böyük bir hissəsi mənim gözümün qarşısında olubdur. Bir də biz kitabları da oxuyuruq, tarixi oxuyuruq. 20-ci illərdən bu tərəfə mən Rusiyanın ərazisində belə partlayışlar olduğunu görməmişdim, eşitməmişdim. ***Bizim arzumuz odur ki***, Rusiyanın hökuməti, Rusiyanın hakimiyyəti tezliklə bu hadisələrə ***son qoysun, onların qarşısını alsın***. Cinayətkarlar yaxalansın, cəzalansın və ümumiyyətlə, Rusiyada ictimai-siyasi sabitlik təmin olunsun.

Rusiya bizim üçün dost ölkədir. Rusiya ilə bizim geniş əlaqələrimiz vardır və istəyirik ki, Rusiyada, o cümlədən, Rusiyanın böyük bir hissəsi olan Şimali Qafqazda sülh olsun, əmin-amanlıq olsun, sabitlik olsun” [XXIc.s.386-387].

31 mart – azərbaycanlıların soyqırımı günü münasibətilə Azərbaycan xalqına müraciəti özlüyündə zəngin bir nitq nümunəsidir. Sinonim cərgələrin (sevinc, qələbə) antonim şəklində (kədər, məğlubiyyət) verilməsi nitqi yaddaqalan edir. Dövlətin antietik dəyər kimi soyqırımına olan münasibəti dövlət rəhbərinin dilində birbaşa xalq auditoriyasına – milyonlara yönəlir: “Əziz həmvətənlər! Xalqımızın çoxəsrlik zəngin, şərəfli qəhrəmanlıqlar və yüksək yaradıcılıq nümunələri ilə dolu, eyni zamanda mürəkkəb və keşməkeşli bir tarixi vardır. Bu tarixdə ***sevinc və kədər, qələbə və məğlubiyyətlər*** əkiz yaşamış, daim bir-birini əvəz etmişdir. Təsadüfi deyildir ki, ümumxalq təntənələri və ruh yüksəkliyi ilə qeyd etdiyimiz Novruz bayramından sonra, Sizə keçmişimizin kədərli, faciəli səhifələrini yad etmək üçün müraciət edirəm”.

Erməni terrorunun iç üzünü publisistik bir dildə siyasi icmalçı kimi məntiqi ardıcıllıqla araşdırır. Feilin nəqli keçmiş zamanında (tarixi saxtalaşdırılmış, şişirdilərək qədimləşdirilmiş, azərbaycanlılara qarşı kəskin mənəvi təcavüz kampaniyası aparılmasıdır) baş verən hadisələr auditoriyaya çatdırılır: "Məkrli və qəddar düşmənlərimizin məqsədyönlü şəkildə apardıqları soyqırımı və deportasiya siyasəti lap əvvəldən genişmiqyaslı, düşünülmüş informasiya müharibəsi ilə müşayiət olunmuşdur. Bu məqsədlə onlar öz arsenallarında olan ən müxtəlif üsul və vasitələrdən istifadə etmişlər. Nəticədə Azərbaycanın və bütün Qafqazın tarixi saxtalaşdırılmış, ermənilərin tarixi şişirdilərək qədimləşdirilmiş, azərbaycanlılara qarşı kəskin mənəvi təcavüz kampaniyası aparılmışdır. Qafqazda baş verən hadisələr şüurlu surətdə təhrif olunmuş Qərb və Rusiya ictimaiyyətinin nəzərində "yazıq, məzlum, əzabkeş erməni xalqı" obrazı formalaşdırılmışdır. Xalqımızın zəngin mədəniyyət abidələri, musiqisi və digər maddi-mədəniyyət nümunələri ermənilər tərəfindən mənimsənilib və bu günün özündə də özününküləşdirilməyə cəhdlər göstərilir. Dünyanın müxtəlif ölkələrində yaşayan və mütəşəkkil fəaliyyət göstərən erməni icmaları, böyük dünya dövlətlərinin siyasi fəaliyyətlərinə təsir göstərə bilən erməni lobbisi onilliklər boyu planlı surətdə iş aparır" [XXVIc.s.100-101].

Terrorla bağlı Heydər Əliyevin nitqləri dünya ictimaiyyətinə yönəlmişdir. "Lakin" qarşılaşma bağlayıcısı ilə terrorizmin azalmadığı bəyan edilir. "Məhz" dəqiqləşdirici ədatla erməni terrorunun nələr törətdiyini əxlaqa zidd hərəkətlərini pisləyir. Terrora qarşı "sülhsevər siyasəti" qoyur: "Lakin bununla yanaşı, dünyada separatçılıq, terrorizm, dini ekstremizm təhlükəsi heç də azalmamışdır, əksinə, artmışdır. Məhz Ermənistanın hərbi təcavüzü nəticəsində Ermənistan-Azərbaycan hərbi münaqişəsi yaranmışdır. Azərbaycan ərazisinin 20 faizi Ermənistan silahlı qüvvələrinin işğalı altındadır, bir

milyondan artıq azərbaycanlı hələ də qaçqındır və çadır şəhərciklərində ağır şəraitdə yaşayır. Azərbaycan tərəfi ardıcıl surətdə sülhsevər siyasət yeridərək münaqişənin beynəlxalq hüquq normalarına uyğun surətdə ədalətli həllinə, işğal olunmuş ərazilərimizin azad edilməsinə və qaçqınların doğma yurdlarına qayıtmasına çalışır [XXVIc.s.153].

"Hər bir" təyin əvəzliyi ilə "amma" bağlayıcısı ilə kiçik münaqişələrin mövcud olmasını, dünya birliyinin "qəti tədbirlər görməsini" tələb edir. Terrorizmi sinonimlərlə (separatizm, terrorizm, dini ekstremizm) sadalayaraq türkdilli dövlətlərin birgə fəaliyyət göstərmələrinin vacibliyini qeyd edir: "Ermənistanın Azərbaycana hərbi təcavüzü bizim xalqımıza böyük zərbələr vurmuşdur. Biz bu münaqişəni aradan qaldırmaq üçün var qüvvəmizlə çalışırıq. ***Amma*** bildiyiniz kimi, təhlükə sovuşmayıb. Hər bir hərbi təcavüzün qarşısı vaxtında alınmalıdır və dünya birliyi belə təhlükələri aradan qaldırmaq üçün ***qəti tədbirlər görməlidir***. Vəziyyətdən hamı düzgün nəticə çıxarmalıdır. ***Separatizmin, terrorizmin, dini ekstremizm*** qarşısını almaq üçün dünya birliyi, eləcə də türkdilli dövlətlər birliyi səmərəli birgə fəaliyyət göstərməlidirlər" [XXVIc.s.154].

31 mart – azərbaycanlilarin soyqırımı günü münasibətilə Azərbaycan xalqina müraciətdə terrorla bağlı Heydər Əliyevin müraciət və çıxışları feilin lazım şəklində yekunlaşır. Təsadüfi deyil ki, bu tip çıxışlar hüquqi etikanı da özündə ehtiva edir (hüquqi – siyasi qiymətini almalıdır). Dünya dövlətlərinin görəcəkləri işləri "dəqiqləşdirməli", "imtina etməli" kimi ifadələrlə onların diqqətinə çatdırır. "Əleyhinəyik", "yolverilməzdir" ifadələri ilə prinsipial mövqe nümayiş etdirir. Azərbaycan xalqının özündə daşıdığı, uzaq dövrlərdən bu günədək yaşatdığı dəyərlərin ifadə vasitələri "bizim vətəndaşlıq borcumuzdur", "bütöv xalqlara nifrət hissi azərbaycanlılara yaddır", "firavan həyat qurmaq istəyirik"–bir daha

xalqın mütərəqqi etik dəyərlərə malik olmasına sübutdur: “Bu dəhşətli hadisələr bəşəriyyətə qarşı cinayət kimi hüquqi-siyasi qiymətini almalıdır. Dünya dövlətləri bu prinsipial məsələdə mövqelərini yenidən ***dəqiqləşdirməli***, erməni təbliğatı nəticəsində formalaşmış stereotiplərdən imtina etməlidirlər. Bu, bir tərəfdən, həmin hadisələrin bir daha təkrarlanmasına yol verməmək üçün vacibdir, o biri tərəfdən isə, soyqırımı qurbanlarının xatirəsi qarşısında ***bizim vətəndaşlıq borcumuzdur***.

Biz tarixdə baş verən hadisələrin erməni millətçilərinin mütəmadi olaraq həyata keçirdiyi eybəcər formada bu günümüzə köçürülməsinin, insanlar və xalqlar arasındakı münasibətlərdə düşmənçilik yaratmaq üçün istifadə olunmasının ***əleyhinəyik***. Müasir dünyada müharibə təbliğatı, insana nifrət ideologiyası, başqa dövlətlərə qarşı ərazi iddiaları bizim üçün ***yolverilməzdir***. ***Bütöv xalqlara nifrət hissi azərbaycanlılara yaddır***. Biz müstəqilliyimizin verdiyi imkanlardan istifadə etməklə ölkəmizin daim tərəqqisinə nail olmaq, vətəndaşlarımız üçün firavan həyat qurmaq istəyirik” [XXXVIIIc.s.61].

Azərbaycanın yəhudi icmasına olan müraciətdə terrorun antietik dəyər olduğunu elmi terminlərlə auditoriyaya bəyan edən Ulu Öndər elmi-publisistik üslubda çıxış edir “ayrı-seçkilik, faşizm, soyqırımı siyasəti hüquqi-siyasi qiymət, bəşər sivilizasiyası, antiinsani aksiyalar, deportasiya, milli fəlakətlər” kimi çoxsaylı terminlərin qısa bir müraciətdə yer alması bir daha böyük natiqin siyasi-fəlsəfi dünyagörüşünü əks etdirir “Hörmətli həmvətənlər!

Hər il bütün mütərəqqi bəşəriyyət tərəfindən yəhudi xalqının müsibəti və qəhrəmanlıq günü qeyd olunur, faşizmin yəhudilərə qarşı həyata keçirdiyi soyqırımı siyasətinin günahsız qurbanlarının xatirəsi ürək ağrısı ilə yad edilir.

İkinci dünya müharibəsi zamanı altı milyon mülki əhali yəhudi xalqına mənsub olduğu üçün dəhşətli ayrıseçkilik

siyasətinə məruz qalmış, qəddarlıqla kütləvi surətdə məhv edilmişdir” [XXXVIIIc.s.92].

Faşizmin bu qanlı cinayətinə zamanında hüquqi-siyasi qiymət verilsə də, faciənin dəhşətləri hələ də tarixin yaddaşında qara ləkə kimi yaşamaqdadır. Təəssüf ki, bütövlükdə bəşər sivilizasiyasını hədəf götürmüş belə antiinsani aksiyalar bu gün də təkrar olunur. Son on dörd ildə Ermənistanın Azərbaycana hərbi təcavüzü, xalqımıza qarşı həyata keçirilən deportasiya və soyqırımı siyasəti, misli görünməmiş Xocalı müsibəti XX əsrdə dünyanın ən böyük milli fəlakətlərindəndir” [XXXVIIIc.s.92].

İslam Əməkdaşlıq Təşkilatına üzv ölkələrin dövlət başçılarının VII zirvə görüşündəki nitqdə (İstanbul, “Çırağan Palas” mehmanxanası) terrorun ölkəmizə vurduğu zərər sadə, anlaşıqlı bir dildə öz izahını tapır. Əsasən məişət üslubunda “dəhşətli faciə”, “ağrı-acılarını” terrorun xalqımıza “daha yaxşı tanış olduğu” məlum olur. “Odur ki” xəbər budaq cümləsi ilə antiterror əməliyyatı “işğalın nəticələri ölkəni ciddi iqtisadi və sosial problemlərlə üz-üzə qoymuşdur” cümləsi problemlərin ardınca etik və estetik dünyagörüşünün formalaşmasında çətinliklərin ortaya çıxması labüdləşir: “Bir çox dövlətlər üçün bu dəhşətli faciə yeni bir hadisə idi. Lakin bizim ölkələrimizin bir çoxunda etnik münaqişələrin və dinc insanlara qarşı çevrilmiş terrorçuluğun, təcavüzkar separatçılığın və şovinizmin nə olduğunu çox yaxşı bilirlər. Minlərlə insan bunun ağrı-acılarını öz şəxsi həyatlarında yaşayıb və bu gün də yaşamaqdadır.

Etnik münaqişələrdən və terrordan zərər çəkən bir dövlət olaraq, Azərbaycana bu münaqişələr daha yaxşı tanışdır. Odur ki, biz dərhal antiterror mübarizəsində ölkəmizin bütün imkanlarından istifadə etməyi, bu dəhşətli faciə ilə mübarizəyə hazır olduğumuzu birmənalı bəyan etdik.

Biz neçə ildir ki, Azərbaycanda etnik separatizm və bunun nəticəsində yaranmış terrorçuluqla təkbaşına mübarizə aparırıq. Qonşu Ermənistanın Azərbaycana qarşı 14 il əvvəl əsassız ərazi iddiaları ilə başladığı hərbi təcavüz nəticəsində Azərbaycan torpaqlarının 20 faizi işğal olunmuş, bir milyondan çox azərbaycanlı öz doğma yurdlarından zorla çıxarılaraq qaçqın və köçkünə çevrilmişdir. Bu münaqişə nəticəsində 35 min azərbaycanlı öz torpaqlarında həlak olmuş, yaxud qətlə yetirilmişdir. İşğalın nəticələri ölkəni ciddi iqtisadi və sosial problemlərlə üz-üzə qoymuşdur" [XLIIc.s.49-50].

Terrora qarşı mübarizədə Heydər Əliyev əlbir fəaliyyət göstərilməsini hesab edir. İqtisadi Əməkdaşlıq Təşkilatı qarşısında feilin lazım şəklində ("yerinə yetirməli", "davam etdirməli", "haqq işinə dəstək verməlidir") tələblər irəli sürür: "Hesab edirik ki, terrora qarşı mübarizə bütün dövlətlərin və beynəlxalq təşkilatların əlbir fəaliyyətini tələb edir. Bununla bağlı düşünürəm ki, İqtisadi Əməkdaşlıq Təşkilatı da üzərinə düşən tarixi vəzifəni ***yerinə yetirməli*** və bundan sonra da ümumbəşəri dəyərlər uğrunda mübarizəni ***davam etdirməli***, bu təşkilatın üzvü olan Azərbaycanın ***haqq işinə dəstək verməlidir***" [XLIIc.s.50].

Beləliklə, terrora olan siyasətçi münasibəti, bu münasibətin şifahi söylənilən nitqlərdə auditoriyalara ünvanlanması yarımfəsildə öz əksini tapır. Terrorla mübarizənin əsas yolu multikultural dəyərlərdən keçir ki, bu da öz əksini növbəti "multikultural dəyərlər" yarımfəslində tapır.

## 1.2.10. Heydər Əliyevin nitqində multikultural dəyərlər

Azərbaycan nitq mədəniyyətinin inkişafında mühüm rolu olan Ulu Öndərin-Heydər Əliyevin çıxışlarında səslənən istənilən fikirlər bu gün də öz aktuallığını saxlayır. Nitqin bir cazibədar xüsusiyyəti də onun proqnostikliyində, uzaq gələcəyə tuşlanmasındadır ki, sivil dünyanın bu gün yüksək qiymətləndirdiyi multikulturalizm ideyalarının böyük natiqin dilində necə səslənməsi elmi ictimaiyyət üçün maraqlı olardı.

Prof. İ.Məmmədzadəyə [129] görə qlobalizasiya erasında əxlaq və mədəniyyət multikulturalizm və tolerantlıq kimi başa düşülür. Müasir mədəniyyət, o cümlədən Azərbaycan mədəniyyəti getdikcə multikultural xarakter daşıyır. Milli mədəniyyət multikulturalizmi qəbul edərək tarixə, fəlsəfə tarixinə baxışların dəyişməsini tələb edir [47, 66].

Heydər Əliyev mənəvi tərbiyədə, yüksək mənəviyyat tərbiyəsində ümumbəşəri dəyərlərlə yanaşı, Azərbaycan xalqının etno-mədəni və milli-mənəvi dəyərlərinin mənimsənilməsinə birinci dərəcəli yer verirdi [88]. Siyasi hakimiyyətə qayıdan Ulu Öndərin ilk çıxışları ölkə ərazisində yaşayan xalqların, millətlərin yekdilliyinə çağırışdan ibarət olmuşdur: “Azərbaycan on illərlə, yüz illərlə bu torpaqda yaşayan bütün insanların vətəni olub, bundan sonra da vətəni olmalıdır. Azərbaycan Respublikasının ərazisində olan hər bir vətəndaş milliyyətindən, dinindən, siyasi mənsubiyyətindən asılı olmayaraq, eyni hüquqa malik olmalıdır. Əgər biz bu məfhumları rəhbər tuta bilsək və bunu əməli surətdə həyata keçirə bilsək, biz Azərbaycan Respublikasında olan bütün xalqların, bütün millətlərin tam birləşməsini təmin edə bilərik. Bu bizim əsas vəzifələrimizdən biridir. ***Güman edirəm ki***, biz buna nail olacağıq [Ic.s.11]. Azərbaycanda yaşayan millətlər arasındakı münasibətlərin qiyməti aşağıdakı mətndə öz əksini tapmışdır. Bu mətndə nitqin şüurlara çatdırılmasında Azərbaycan dilinin

cazibədarlığından, ahəngdarlığından, xəlqiliyindən maksimum istifadə olunmuşdur. "Bəli" təsdiq ədatı ilə başlanan nitq ardıcıl ritorik suallarla auditoriyanı silkələyir, səfərbər edir. Növbəti nitq mərhələsində qaçqınların acınacaqlı vəziyyəti estetik bir tabloda (*İnsanlar çöllərə tökülüb. İndi hələ ki, hava istidir, yaşamaq olur. Ağac altında, çadır altında yaşayırlar. İlan vurur onları)* dinləyicilərə göstərilir. "Bəs onlar insan deyildilərmi" ardıcıllığı ilə ritorik cümlələrin ikinci dalğası gəlir. Auditoriya "bunu da tamamilə açıq demək lazımdır" ifadəsi ilə Ulu Öndərin yenidən səmimiyyət dolu nitqinin sehrinə düşür. Sonra "ləyaqət" etik kateqoriyası ilə talış əhalimizə müraciət edir, bu gün bizlərin obrazlı şəkildə işlətdiyi "qlobalizasiya" terminini xalqın dilində əsrlərlə mövcud olan hazır ifadələrlə-"əti dırnaqdan ayırmaq olmaz", "birləşmə", "qovuşma"− əvəz edir. Azərbaycançılıq yolunda ən kəsərli sayıla biləcək nitq parçası xalqın adından danışmaq səlahiyyətləri olan dövlət başçısı kimi inkar əvəzliklərinin (Bizim birliyimizi ***heç kəs*** poza bilməz, bizi bir-birimizdən ***heç kəs*** ayıra bilməz) köməyilə prinsipial, qəti mövqe nümayiş etdirilir: "***Bəli,*** həmin zonada, həmin bölgədə sosial-iqtisadi problemlər var. Ancaq gəlin fikirləşək. Azərbaycanın hansı zonasında sosial-iqtisadi problemlər yoxdur? Dedilər Lənkəranda işsizlər var. Azərbaycanın hansı zonasında işsizlər yoxdur?

– Burada çıxış edənlər qeyd etdilər ki, 600 minə qədər qaçqın var. Evi yox, eşiyi yox, çöllərdə yaşayır. Biz getdik Qarabağa, Ağcabədidə olduq, Bərdədə olduq. ***İnsanlar çöllərə tökülüb. İndi hələ ki, hava istidir, yaşamaq olur. Ağac altında, çadır altında yaşayırlar. İlan vurur onları. Bəs*** onlar insan deyildilər***mi***? Onlara sosial-iqtisadi təminat lazım deyil***mi***? Belə çıxır ki, onlar da respublika yaratmalıdırlar***mı***? Onlar da silahlı dəstələr qurub cürbəcür cinayət etməlidirlər***mi***? Demək istəyirəm ki, Lənkəran rayonunun, Lənkəran

zonasının, bu cənub zonasının sosial-iqtisadi problemləri tamamilə şəksizdir. Bu məsələ ilə biz məşğul olmuşuq. Nazirlər kabineti müvafiq qərarlar qəbul edib və edəcəkdir. Məsələlər həll olunacaqlar. Ancaq bu da həqiqətdir ki, Lənkəranın və bu zonanın bugünkü sosial-iqtisadi vəziyyəti başqa zonaların vəziyyətindən üstündür. Bunu da tamamilə ***açıq demək*** lazımdır [Ic.s.78-79].

Ancaq bilin ki, Azərbaycanın başqa bir bölgəsi, Naxçıvan il yarımdır işıqsızdır. Beş ay elektrik enerjisi olmadı, yollar kəsildi, adamlar soyuqdan dondu orada, uşaqlar öldü, ağacların 70 faizi kəsildi. Camaat kerosin tapa bilmirdi ki, lampasını yandırsın [Ic.s.78-79].

Əlikram Hümbətov və onun ətrafındakı mafioz dəstələr öz çirkin niyyətlərini həyata keçirmək üçün bir məsələ ortaya atmışlar: guya "Talış Respublikası" yaratmaq istəyirlər. Bilirsiniz, bizim Azərbaycan vahid Azərbaycandır. Onun vətəndaşlarının hamısı eyni hüquqlara malikdir. İndiyədək Azərbaycanda heç vaxt talış-azərbaycanlı, türk və sair söhbəti olmamışdır. Bu süni surətdə ortaya atılmış şeydir. Talış köklü olan adamların hamısı azərbaycanlı ***kimi,*** Azərbaycanın ***ləyaqətli*** vətəndaşları ***kimi*** yüz illərlə Azərbaycanın vahid ailəsində yaşamışlar. Birləşmişlər, bir-birinə qovuşmuşlar. Onları bir-birindən ayırmaq olmaz. Bu, ***əti dırnaqdan ayırmağa*** bərabərdir. Ayrı-ayrı avantüristlərdən savayı buna heç kəs yol verməz. Ona görə də bizim, şəxsən mənim talış köklü adamların hamısına həmişə böyük hörmətim olub, o bölgənin adamlarına şəxsən mən, nəinki mən, bütün Azərbaycan rəhbərliyi böyük hörmət və rəğbətlə, qayğı ilə yanaşmışıq və bundan sonra da bu davam edəcəkdir. Bizim birliyimizi ***heç kəs*** poza bilməz, bizi bir-birimizdən ***heç kəs*** ayıra bilməz [Ic.s.97].

Bir vaxtlar bütün Qərb, elə Şərq də sovet xalqlarının hamısına ən böyük şər kimi baxırdılar, səbəb də onların,

Allaha "inanmaması" idi. Bəs indi, adamlar, xalqlar Allaha, dinə üz tutduqları vaxtda necədir, onlar yenə də günahkardırlar? ...Sonra, təməlçilik niyyətləri və sair təhlükəli meyillər barəsində söhbətlərin əksəriyyəti mənə uydurma kimi görünür... o ki qaldı milli xüsusiyyətlərə, burada hətta səthi etnoqrafik bilik, ***zənnimcə,*** hər şeyi ətraflı şəkildə izah edir. Türk və Azərbaycan dilləri qohum dillərdir, elə bunun özü də yaxınlığın labüdlüyünü qabaqcadan müəyyənləşdirir. İranda on milyonlarla azərbaycanlı yaşayır. Məgər bu amillər iki böyük ölkə ilə yaxınlığın olmasını zərurətə çevirmirmi?

Daha bir məsələ barəsində. Yetmiş ildən artıq bir müddətdə biz cənub qonşularımızdan, demək olar, tamamilə ayrı düşmüşdük, indi, birləşmə, inteqrasiya əhvali-ruhiyyəsi bütün dünyaya hakim kəsildiyi bir vaxtda nəyə görə də bizim qonşularla normal münasibətlərimiz olmasın? [Ic.s.121].

Yəhudi xalqı dünyada, demək olar, ən çox əzab-əziyyət çəkmiş və böyük soyqırımlarına məruz qalmış xalqdır. İkinci dünya müharibəsi, alman faşizmi dünyanın bir çox xalqlarına faciələr gətirmişdir. Ancaq ən çox faciəyə yəhudilər məruz qalmışlar.

Amma bu itkilər, yəhudilərə qarşı edilmiş bu vəhşilik, vandalizm heç də onların iradəsini sındırmamışdır. Onlar öz dövlətini qurmuşlar və onun hüdudlarından kənarda da dünyada elmin, mədəniyyətin, iqtisadiyyatın inkişafında çox görkəmli yer tuturlar. Azərbaycan ilə İsrail arasında olan dostluğun dərin kökləri var. Azərbaycanda yəhudilər əsrlər boyu yaşamış, Azərbaycanın bərabər hüquqlu insanları kimi yaşamışlar. Azərbaycanlılar heç vaxt onları burada hansısa əcnəbi xalqın nümayəndəsi kimi hesab etməmişlər. Bizim xalqımız heç vaxt unutmayacaqdır ki, Azərbaycanda yaşayan yəhudilər XIX əsrin sonu və XX əsrin əvvəlindən başlayaraq indiyə qədər Azərbaycan elminin, mədəniyyətinin, səhiyyə-

sinin, iqtisadiyyatının, sənayesinin inkişafında böyük xidmətlər göstərmiş və çox silinməz izlər qoymuşlar.

Bunlar ona görə mümkün olmuşdur ki, Azərbaycan xalqı sülhsevər xalqdır. Azərbaycan xalqı heç vaxt heç bir millətə qarşı pis niyyətlər, mənfi münasibət göstərən xalq deyildir. Məhz buna görə də yəhudilər Azərbaycanda əsrlər boyu sərbəst yaşamış, öz həyatlarını qurmuş, Azərbaycanın həyatının bütün sahələrində fəaliyyət göstərmiş və Azərbaycanın inkişafında fəal iştirak etmişlər. Bu gün də müstəqil dövlətimizdə yəhudilər Azərbaycanın bərabər hüquqlu vətəndaşları kimi yaşayırlar. Onlar burada öz ölkələri, vətənləri kimi yaşayırlar [XXVIIc.s.147-148].

Heydər Əliyev dilində mühüm bir multikultural dəyər də dünya xalqlarının, Azərbaycanda yaşayan xalqların dilinə olan etik münasibətdir. Dünya xalqlarının dilinə olan münasibət sonda Azərbaycan dövlətinin müstəqilliyinə xidmətdir: “Böyük bir nailiyyət kimi yox, sadəcə olaraq xalqıma xidmət kimi deyə bilərəm ki, Moskvada işlədiyim dövrdə Nizami Gəncəvinin “Xəmsə”sinə daxil olan əsərlərin rus dilində ayrı-ayrılıqda nəşr olunmasına nəzarət etdim. Lakin Moskvada mənə dedilər ki, Nizaminin əsərlərinin rus dilinə tərcüməsi istənilən səviyyədə deyildir. O zaman Mirzə İbrahimovdan və başqalarından xahiş etdim ki, mən artıq Azərbaycanda deyiləm, görün nə etmək olar ki, Nizami Gəncəvinin əsərləri rus dilinə yenidən tərcümə edilsin. Bəzi adamlar isə buna etiraz edirdilər. ***Axı*** rus dili böyük dildir, Rusiya böyük dövlətdir. Rusiyadan kənarda, başqa dövlətlərdə də rus dilində oxuyurlar. Əgər məktəblilərimiz ingilis, fransız, alman dillərində dərs keçirlərsə, bu, böyük nailiyyətdir, əgər rus dilində də təhsil alırlarsa, bu da böyük nailiyyətdir [Ic.s.157]. Təkcə “axı” qüvvətləndirici ədatının köməyilə rus dilinin böyüklüyü ilə yanaşı böyük bir ərazidə məskunlaşmış slavyan və türkdilli xalqların Nizami irsini tanıması məsələsi gündəmə gəlmişdir.

Hələ keçən əsrin axırlarında Heydər Əliyev qlobalizasiya prosesinin hamar gedəcəyini iddia edən filosofların [102, 103, 180] əksinə olaraq burada da "Nədənsə, çox əcaib adət-ənənələr meydana çıxıb" ifadəsi ilə antietik dəyərlərin də cəmiyyətə ayaq açmasını şifahi nitqdə, sadə xalq dilində şüurlara yönəldirdi: "Gənclər arasında son vaxtlar elə bir təbəqə yaranıb ki, təhsil onları o qədər də maraqlandırmır, mədəniyyət də maraqlandırmır. ***Nədənsə, çox əcaib adət-ənənələr meydana çıxıb*** ki, nə qədər ***mədəniyyətsiz*** olsan, ***ədəbsiz*** olsan, ***kobud*** danışsan, bəzən hətta ədəbsiz sözlər də işlətsən, o qədər də qəhrəman görünərsən, başqalarından seçilərsən. Bunlar dövrün bəlalarıdır, keçib gedən hallardır. Bu adətlər, belə hallar ***uzun sürə bilməz, yaşaya bilməz***.

Əsrlər boyu inkişaf etmiş dünya sivilizasiyası möhkəm təhsil və elm üzərində qurulmuşdur, yüksək tərbiyə üzərində qurulmuşdur. Mən bizim gənclərimizi də bu yola dəvət edirəm. ***Güman edirəm ki,*** müstəqil Azərbaycan Respublikası gənclərinin yolu da bu yoldur, onlar bu yolla getməlidirlər. Biz də bu yolla getməkdə sizə kömək edəcək, şərait yaradacağıq [Ic.s.169]. Təhsil etik kateqoriya kimi böyük natiqin çıxışlarında həmişə öndə olmuşdur. Hələ XX əsrin 90-cı illərində qloballaşan dünyada təhsilin rolunu dəqiq qiymətləndirirdi. "Güman edirəm ki" modal sözü ilə başlayan nitqdə Heydər Əliyevin qarşıya qoyduğu ideyalar proqnostik cəhətdən bu gün özünü real həyatda tam doğrultmuşdur: "Mən təhsil məsələsi üzərində çox dayandım. Çünki təhsili olmayan gənc, ***şübhəsiz***, həyatda lazımi yer tuta bilməz. İndi dünya mədəniyyət ***dünyasıdır***, intellektual ***dünyadır***, elmi-texniki tərəqqi ***dünyasıdır.*** Azərbaycanı elmi-texniki tərəqqi səviyyəsində inkişaf etdirmək üçün ***şübhəsiz ki***, yüksək təhsilə, elmə nail olmalıyıq. Bununla yanaşı istərdik ki, gənclərimiz həm milli ənənələrimiz əsasında, həm də bəşəri mənəvi dəyərlər əsasında əxlaq, mənəviyyat məsələlərinə çox fikir

versinlər" [Ic.s.172]. Həyatda yüksək ideallara çatmağın yolunun təhsildən keçdiyini "şübhəsiz" qəti təsdiq modal sözlə gənclər auditoriyasına ünvanlayır, təkrarların köməyi ilə dünyanın – qloballaşan dünyanın tərifini verirdi.

Dini tolerantlıq böyük natiqin nitqlərində xüsusi yer alır. Bütün nitqlərində olduğu kimi burada da əminlik, nikbinlik Ulu Öndərin nitqlərinə hakimdir: "Bildiyiniz kimi Azərbaycanda islam dini ilə yanaşı, xristianlıq və iudaizm dinləri də var və onlar bir-biri ilə çox mehriban şəraitdə fəaliyyət göstərirlər. Biz bunu bəyan etmişik. Azərbaycanın prezidenti kimi, mən dəfələrlə qeyd etmişəm ki, ölkəmizin vətəndaşları dini, irqi mənsubiyyətindən, siyasi baxışlarından asılı olmayaraq eyni hüquqlara malikdirlər və onların hüquqları Azərbaycan dövləti tərəfindən qorunur. ***Əmin ola bilərsiniz*** ki, biz bu prinsiplərimizə daim sadiq qalacağıq və Azərbaycan vətəndaşlarının din, dil mənsubiyyətindən və siyasi baxışlarından asılı olaraq bir-biri ilə münaqişəyə girməsinə gələcəkdə də yol ***verməyəcəyik***" [Ic.s.387].

Bir milli ideya kimi azərbaycançılıq etniklərarası tolerantlığın, milli həyat harmoniyasının, demokratik konsolidasiyanın əsasıdır. Azərbaycançılıq yüksək nizam-intizamın, dövləti şüurun, birgəyaşayış və birgəfəaliyyət mədəniyyətinin həm səbəbi, həm də nəticəsidir [173]. Heydər Əliyevin nitqlərində azərbaycançılıqla bağlı səslənən fikirlərin araşdırılması filosoflarımızın [3] bu gün də aktuallığını qeyd etdiyi bir sıra məsələlərə aydınlıq gətirilir: "Azərbaycanda tarixən çox millətlər yaşamışdır. Burada azərbaycanlılarla yanaşı ruslar, ermənilər, yəhudilər, gürcülər, ukraynalılar və başqaları da yaşamış və gələcəkdə də yaşayacaqlar. Azərbaycan Respublikasının çoxmillətli dövlət olmasını ölkəmiz üçün böyük üstünlük hesab edirik" [Ic.s.389].

Ölkəmizdə birgə yaşayan dindarların dini bayramlarında onun bayram təbrikləri xüsusi diqqət çəkir. Bu təbriklərdə

səslənən fikirlər müxtəlif dinlərə etik münasibəti əks etdirir: "Sizi xristianlığın ən müqəddəs və əziz bayramı – pasxa münasibətilə səmimi qəlbdən təbrik edir, bu bayram günlərində sizə xoş əhvali-ruhiyyə, əmin-amanlıq və səadət arzulayıram. Azərbaycan torpağı əsrlər boyu müxtəlif etiqadlara tapınan insanlar üçün doğma vətən olmuşdur. Onlar da həmişə bu vətənin qeyrətini çəkmiş, onun uğrunda canlarını belə əsirgəməmişlər. İndiki ağır və məşəqqətli günlərimizdə də xristian həmvətənlərimiz Azərbaycanın digər övladları ilə birlikdə çətinliklərə sinə gərir, müqəddəs torpaqlarımızı rəşadətlə qoruyurlar"[Ic.s.545].

Filosofların [74, 96, 173,] diqqət mərkəzində olan Sovetlər imperiyası çökəndən sonra Azərbaycanda islam hansı yolu tutacaq, ölkənin modernizasiyasında islamın rolu necə olacaq kimi sualların dolğun və dəqiq cavabı böyük natiqin elmi üsluba söykənən qətiyyətli nitqlərində öz əksini tapır: "Müsəlman xalqları və ölkələri dünyada gedən mürəkkəb proseslərlə üzləşirlər. Bir tərəfdən elm və texnika güclü surətdə inkişaf edir, yeni ixtiralar, texnologiyalar Yer kürəsinin simasını dəyişdirir, o biri tərəfdən bir çox xalqlar ***aclıqdan, yoxsulluqdan***, ***cəhalətdən*** əzab çəkirlər. Ona görə biz tərəqqi ilə ayaqlaşmalıyıq, inkişaf etmiş ölkələrin səviyyəsinə qalxmalıyıq. Son illər ərzində Azərbaycan müsəlman ölkələri ilə siyasi, iqtisadi, ticarət və mədəni əlaqələri xeyli inkişaf etdirmişdir. Həm İslam Konfransı Təşkilatı, həm də başqa beynəlxalq təşkilatlar çərçivəsində əməkdaşlığımız məhsuldar və faydalı olmuşdur" [XIIIc.s.339].

Feilin "gərək" arzu şəkli ilə çıxış edən Ulu Öndər milliliyin qorunub saxlanmasını təkid edir. "Həm", "həm də" iştirak bağlayıcıları ilə azərbaycançılığın əsas ideya olduğunu auditoriyaya bəyan edir. "Sintez", "inteqrasiya" sinonimlərini birgə işlədərək ümumbəşəriliyi önə çəkir: "İnsan hansı ölkədə yaşamasından asılı olmayaraq, gərək öz milliliyini qoruyub

saxlasın. Dünyada eyni zamanda assimilyasiya prosesi də var. İnsanlar – mən azərbaycanlılar haqqında danışıram – gərək yaşadıqları ölkədə, yenə deyirəm, o şəraiti mənimsəyərək, orada özləri üçün yaxşı mövqelər tutsunlar. Ancaq daim öz milli-mənəvi dəyərlərinə, milli köklərinə sadiq olsunlar. Bizim hamımızı birləşdirən məhz bu amillərdir. Bizim hamımızı birləşdirən, həmrəy edən azərbaycançılıq ideyasıdır, azərbaycançılıqdır.

Azərbaycan dövlət müstəqilliyini əldə edəndən sonra azərbaycançılıq aparıcı ideya kimi, həm Azərbaycanda, həm də bütün dünyada yaşayan azərbaycanlılar üçün əsas ideya olubdur. Biz həmişə bu ideya ətrafında birləşməliyik. Azərbaycançılıq öz milli mənsubiyyətini qoruyub saxlamaq, milli-mənəvi dəyərlərini qoruyub saxlamaq, eyni zamanda onların ümumbəşəri dəyərlərlə sintezindən, inteqrasiyasından bəhrələnərək hər bir insanın inkişafının təmin olunması deməkdir [XXXVIc.s.431-432].

Digər xalqlarla qarşılıqlı münasibəti əks etdirən “dostluq, mehribanlıq” kimi etik dəyərlər Azərbaycanın milli bayramlarında öz əksini tapır: “Novruz dostluq, mehribanlıq, mənəviyyat, mədəniyyət bayramıdır, xalqımızın qəhrəmanlığını, rəşadətini, şücaətini nümayiş etdirən bayramdır. Novruz bayramı bizim xalqımızı bir-biri ilə həmişə daha da sıx birləşdirib, insanlarımız arasında ***dostluq, mehribanlıq*** əlaqələri yaradıb, insanları bir-birinə dost edibdir [XVc.s.74].

Rus xalqının nümayəndələrinin Azərbaycanda sərbəst, sıxıntısız yaşaması sadə, lakonik, prinsipiallıq bildirən ifadələrlə həyata keçirilir. “Nə...nə də” inkar bağlayıcıları ilə, “həqiqətən” modal sözü, eləcə də “heç kim”, “heç bir” əvəzlikləri ilə dönməz xarakterli nitq nümunəsi yaradılır. “Yox” inkar ədatı və “ona görə ki” səbəb bağlayıcısı “hesab edirəm ki” modala qoşularaq ruslara qarşı tolerant dövlət siyasətini açıqlayır: “Mən çox şadam ki, ***nə*** uydurulması, ***nə***

***də*** gizlədilməsi mümkün olmayan bu faktlara siz özünüz diqqət yetirmisiniz. Həqiqətən də, rus mədəniyyəti və ümumiyyətlə, ruslar burada tam hüquqa malikdirlər, – heç kimə qarşı heç bir məhdudiyyət yoxdur. Bu, təsadüfi hal yox, düşünülmüş siyasətin nəticəsidir. Biz rus mədəniyyətinə ona görə belə hörmətlə yanaşmırıq ki, Rusiya böyük ölkədir və onunla hesablaşmaq lazımdır. Yox. Ona görə ki, əgər biz elan etmişiksə ki, milliyyətindən, dərisinin rəngindən, dini etiqadından asılı olmayaraq Azərbaycanın bütün vətəndaşları bərabər hüquqa malikdirlər, deməli, bu hüquq bərabərliyinə işdə nail olmalıyıq.

Mən hesab edirəm ki, ölkəmizin bu xüsusiyyəti Rusiyada lazımınca qiymətləndirilmir. Əgər orada bütün bunları dərk etsəydilər, onda Azərbaycana qarşı münasibət daha səmimi, daha xeyirxah, daha mehriban olardı" [XVc.s.160].

Qafqaz multikultural dəyərlərindən danışan Ulu Öndər ağsaqqal sözünün etik dəyərlər baxımından tərifini verir. Elə buradaca ağsaqqal sözünün sinonimlərlə Heydər Əliyev tərifi verilir (seçilən adam, cəmiyyətdə mötəbər din xadimi, özündə yüksək mənəvi dəyərləri cəm edən insan, müdrik insan, dünyagörmüş insan, ağsaqqal insan). "Xatirimdədir" modalla auditoriyanı keçmişə aparan böyük natiq məişət üslublu, nağılvarı bir nitq söyləyir. "O vaxt deyə bilmirdim ki" ifadəsi ilə səmimiyyət yaradır. "Həqiqətən" modalı ilə o vaxt deyə bilmədiyini bu gün təsdiqləyir: "Qafqazın adət-ənənələrindən biri ondan ibarətdir ki, Qafqazda həmişə ağsaqqala hörmət olubdur. Bu, bizim islam dininin xüsusiyyətlərindən biridir. Cəmiyyətdə ***seçilən adama, cəmiyyətdə mötəbər din xadiminə, özündə yüksək mənəvi dəyərləri cəm edən insana, müdrik insana, dünyagörmüş insana, ağsaqqal insana*** həmişə hörmət olub, ehtiram olub və onun da sözünə həmişə baxıblar. ***Xüsusən*** gənclər, cəmiyyətin başqa hissəsi. Bu, gözəl adət-ənənədir. Başqa yerlərdən, başqa diyarlardan, şimaldan,

qərbdən Qafqaza gələn qonaqlar bəzən bizim bu xüsusiyyətimizə təəccüb edirlər, bəzən də heyran qalırlar. Xatirimdədir, 70-ci illərdə mən Azərbaycanda rəhbər olan zaman Azərbaycana cürbəcür qonaqlar gəlirdilər. Onlar ayrı-ayrı məntəqələrə, kəndlərə, şəhərlərə gedirdilər, görürdülər ki, məsələn, bir meydanda gənclər, insanlar oturublar. Bu qonaq ora daxil olan kimi hamı ayağa qalxır. Sonra gəlib bunu mənə çox təəccüblə danışırdılar ki, bu nə gözəl adətdir! Nə gözəl ənənədir, siz buna nə cür nail ***olmusunuz***? Mən isə deyirdim ki, biz buna nail olmamışıq. Bu, bizim xalqımızın nəsildən-nəslə keçən xüsusiyyətidir. Bu, bizim xalqımızın mənəvi dəyərləridir. Sizinlə açıq danışıram, – o vaxt deyə bilmirdim ki, bu, islam dininin mənəvi dəyərləridir. Çünki biz hamımız o vaxtlar islam dinini qadağan edən adamlar idik. Amma bu gün deyirəm ki, bu, həqiqətən islam dininin bəşəriyyətə və islam aləminə bəxş etdiyi çox yüksək mənəvi dəyərlərdir [XVIIc.s.398].

Söhbət zamanı Azərbaycanda fəaliyyət göstərən dini konfessiyalar “əvvəla” və “ikincisi” davamiyyət bildirən modallarla fəaliyyətlərini açıqlayır. “Bu” işarə əvəzliyi ilə təkrar olunan “reallığın” feilin qəti gələcək zamanında (qoruyub saxlayacaq, möhkəmləndirəcək və inkişaf etdirəcəyik) həyata keçirildiyini bəyan edir: “Rus pravoslav kilsəsi Baki-Xəzəryanı yeparxıyasının başçısı yepiskop Aleksandr ilə görüşdə söhbət Sizli-bizli hamımızın çox mühüm nailiyyətidir ki, Azərbaycanda bütün dini konfessiyalar – müsəlman dini də, Pravoslav-xristian dini də, yəhudi dini də, əvvəla, öz vəzifələrini sərbəst surətdə həyata keçirir, ***ikincisi***, sizin doğru dediyiniz kimi, bir-biri ilə xoş münasibətdədir, qarşılıqlı fəaliyyət göstərir və bununla bütün Azərbaycan vətəndaşlarının həmrəyliyinin möhkəmlənməsinə kömək edirlər.

Bildiyiniz kimi, mən bütün çıxışlarımda deyirəm ki, milli və dini mənsubiyyətindən asılı olmayaraq, bütün Azərbaycan

vətəndaşları Azərbaycanın tam hüquqlu vətəndaşlarıdır. Siz bilirsiniz ki, ***bu***, sadəcə olaraq sözlər, sadəcə olaraq bəyannamə deyildir, bugünkü Azərbaycanın ***reallığıdır***. Biz bu vəziyyəti, bu reallığı qoruyub saxlayacaq, möhkəmlədəcək və inkişaf etdirəcəyik. Bu baxımdan dini konfessiyaların səyləri çox böyük əhəmiyyətə malikdir və bizim üçün, dövlət üçün böyükköməkdir" [XIXc.s.163-164].

Multikultural dəyərlərdən ümubəşərilikdən öncə milliliyə xüsusi qiymət verən Ulu Öndər milliliyin əsasında dilin [41, 113] dayandığını qeyd edir. Rus dilinə münasibətində bu dilə qiymət verir (o dünya səviyyəli dillərdən biridir), "doğrudur" modal sözlə Azərbaycan dilini rus dilindən pis bilənləri də yada salır. "Hesab edirəm ki" modalla onların da Azərbaycan dilini yaxşı öyrənəcəkləri inamını itirmir: "Biz, milli respublikalar Sovetlər İttifaqının tərkibində heç nə itirmədik. Biz azad deyildik, yəni müstəqilliyimiz, dövlətçiliyimiz yox idi. Amma öz dilimiz vardı, onu qoruyub saxladıq, nəinki saxladıq, həm də zənginləşdirdik. Məsələn, əgər əsrin əvvəlindəki Azərbaycan dilini və bugünkü Azərbaycan dilini müqayisə etsək – bugünkü çox zəngin dildir. Yəni biz öz dilimizi zənginləşdirmişik, dilimiz tədricən inkişaf etmişdir. Biz milli məktəblərimizi, milli mətbuatımızı, milli elmimizi qoruyub saxlamışıq, bütün milli kadrları – hər şeyi qoruyub saxlamışıq. Ona görə də müstəqillik qazananda heç bir problemimiz olmadı. Amma bir üstünlük var, rus dilini yaxşı bilən adamlar vardır – bu da çox lazımdır, o, dünya səviyyəli dillərdən biridir – onlar öz dillərini də yaxşı bilirlər. Doğrudur, elələri var ki, rus dilini öz dilindən yaxşı bilir. Bu da var. Amma bu da müvəqqəti haldır. Hesab edirəm ki, onlar da rus dilini yaxşı bilməklə yanaşı, öz milli dilində danışmağı, ondan yaxşı istifadə etməyi öyrənəcəklər [XXIXc.s.232-233].

Dağ yəhudilərinə münasibətdə azərbaycanlı mentalitetinin xarakterik xüsusiyyətlərini (yüksək tolerantlıq, milli

dözümlülük, humanizm sadalayır, bir sıra antietik halların (irqi, milli, dini ayrı-seçkilik, antisemitizm) azərbaycanlı mentalitetinə aidiyyatı olmamasını dilə gətirir: "Qafqazın dağ yəhudiləri" Beynəlxalq Elmi Simpoziumuna qədim və keşməkeşli tarixi keçmişə malik dağ yəhudiləri yüz illərdir ki, Azərbaycanın digər xalqları ilə birgə çiyin-çiyinə, dostluq, mehribanlıq və əmin-amanlıq şəraitində yaşayırlar. Məmnuniyyət hissi ilə qeyd etmək istəyirəm ki, yüksək tolerantlıq, milli dözümlülük və humanizm ilə səciyyələnən azərbaycanlı mentalitetinə yad olan irqi, milli, dini ayrı-seçkilik, o cümlədən antisemitizm halları tarixən Azərbaycanda mövcud olmamış, burada məskunlaşan hər bir xalq etnik özünəməxsusluğunu, milli adət-ənənələrini qoruyub saxlamışdır [XXXIIIc.s.361].

"Layiqli övladlıq borcu" deməklə Azərbaycanda yaşayan, Azərbaycan vətəndaşlığını qəbul edən hər bir vətəndaşın övlad olduğunu bəyan edir. "Öyrənilməli", "xidmət etməlidir" ifadələri ilə elmi simpozium iştirakçılarına elmi istiqamət verir, "əminəm ki" modal sözü ilə Qafqazda yaşayan xalqların Ümumqafqaz dəyərlərinə sadiqliyinə əminliyini bildirir: "Dağ yəhudiləri Azərbaycanın ictimai-siyasi, elmi-mədəni həyatında, müstəqil dövlət quruculuğu prosesində yaxından iştirak edir, vətən qarşısında layiqli övladlıq borcunu yerinə yetirirlər.

Qafqaz fenomeninin nadir xüsusiyyəti onun etnik baxımdan rəngarəngliyi ilə yanaşı, həm də pozulmaz bütövlüyündədir. Buna görə də bölgədə yaşayan xalqların tarixi, mədəniyyəti, dili, etnik özünəməxsusluğu, adət-ənənələri Ümumqafqaz dəyərlərinin tərkib hissəsi kimi öyrənilməli və bu sahədə atılan hər bir addım Ümumqafqaz evinin qorunub saxlanılmasına, regionda sülhə, xalqlar arasında əmin-amanlığa xidmət etməlidir. Bu baxımdan Bakıda dağ yəhudilərinə həsr olunmuş beynəlxalq elmi toplantını Qafqazın, eləcə də

Azərbaycanın elmi-ictimai həyatında mühüm hadisə kimi qiymətləndirirəm. Əminəm ki, keçirəcəyiniz elmi müzakirə və diskusiyalar xalqlarımızın bir-birinə daha da yaxınlaşması işinə layiqli töhfəsini verəcək və belə xoşməramlı tədbirlər bir ənənə halını alacaqdır [XXXIIIc.s.362].

Azərbaycan yəhudi icmasına ünvanlanan müraciətdə onları Ro-ha-şana təqvim ili münasibətlə təbrik edir, "ən" qüvvətləndirici ədatla arzularını dilə gətirir. "Demokratik hüquqi-siyasi şərait bərqərar edilmişdir "fikriylə hüquqi etikadan danışır. "Dini etiqadından asılı olmayaraq" söz birləşməsi həm dini tolerantlığı, həm də multikultural dəyəri özündə əks etdirir: "Hörmətli həmvətənlər!

Sizi yəhudi təqvimi ilə yeni il – Roş-ha-şana münasibətilə ürəkdən təbrik edir, respublikamızın bütün yəhudi vətəndaşlarına ən səmimi arzu və diləklərimi yetirirəm. Azərbaycan yəhudiləri, respublikamızın digər milli və dini azlıqları kimi, öz bayram və mərasimlərini azad və sərbəst şəkildə, böyük təntənə ilə qeyd edirlər. Bu, Azərbaycanda tarixən formalaşmış tolerantlığın, xoşməramlı milli-dini münasibətlərin, mehriban dostluq və qardaşlıq mühitinin göstəricisidir. Müstəqil Azərbaycan Respublikasında yaşayan milli azlıqlara öz tarixi köklərini, adət-ənənələrini qoruyub saxlamaq, dil və mədəniyyətini inkişaf etdirmək üçün beynəlxalq normalara uyğun demokratik hüquqi-siyasi şərait bərqərar edilmişdir. Bu gün hər bir Azərbaycan vətəndaşı milli mənsubiyyətindən, dini etiqadından asılı olmayaraq, milli dövlətçiliyimizin və demokratiyanın bu əvəzsiz bəhrələrindən yararlanmaqdadır.

Əsrlərdən bəri ölkəmizdə məskunlaşıb yaşayan yəhudilər Azərbaycanda heç zaman təqiblərə, ayrı-seçkiliyə məruz qalmamış, milli-mədəni adət və ənənələrini qoruyub saxlamışlar. Hazırda yəhudi vətəndaşlarımız respublikamızın elmi-mədəni, ictimai-siyasi həyatında yaxından iştirak edir, müstəqil dövlət

quruculuğu prosesində vətəndaşlıq borclarını sədaqətlə yerinə yetirirlər [XXXVIc.s.65].

Vatikan dövlətinin başçısı, Roma Papasi II İohann Pavelin rəsmi qarşilanma mərasimində nitqdə "Bütün dünyanın vətəndaşına çevrilmisiniz" müraciəti ilə Roma papası II İohann Pavelin Azərbaycan xalqının da problemlərinə yanaşmağı xahiş edir. Sinonim cərgələrlə Roma papasının bəşəriyyət qarşısındakı xidmətlərini sadalayır (şəfqət və rəhmdillik ideyalarının təbliği, səbir və təsəlli diləmə): "Zati-Müqəddəsləri! Vatikan dövlətinin başçısı və Roma papası kimi, Siz əsrlər boyu mövcud olan ənənələrin hüdudlarını cəsarətlə aşmısınız. Siz dini, irqi, milli mənsubiyyətindən asılı olmayaraq, bütün insanların və xalqların dostu kimi tanınmış, bütün dünyanın vətəndaşına çevrilmisiniz.

Həmişə öz dini dözümlülüyü, tolerantlığı ilə seçilən Azərbaycan xalqı Sizin fəaliyyətinizin bu nəcibliyini və insanpərvərliyini yaxşı başa düşür və yüksək qiymətləndirir.

Azərbaycan da daxil olmaqla, islam dininin geniş yayıldığı ölkələrə Sizin səfərləriniz iki böyük dünya dini arasında sülhə və qarşılıqlı etimada xidmət edir.

Siz insanlar arasında şəfqət və rəhmdillik ideyaları təbliğ edir, ağır fəlakətə düşənlərə səbir və təsəlli diləyirsiniz. Azərbaycanda da belə fəlakət qurbanları var. Onlar qonşu Ermənistanın Azərbaycan torpaqlarını işğal etməsi nəticəsində öz yurd-yuvalarını itirmiş bir milyondan çox azərbaycanlı qaçqınlardır. Bu insanlar Sizin xeyirxah sözünüzə, təsəllinizə ehtiyac duyurlar. Onlar haqqın öz yerini tutmasında Sizdən də kömək umurlar [XXXVIIIc.s.358].

Ölkədə fəaliyyət göstərən yəhudi konfessiyasını "demək" modal sözü ilə, eləcə də davamiyyət bildirən "birincisi", "ikincisi", "üçüncüsü" modallarla tərkib hissələrinə ayırır. Azərbaycandakı dini konfessiyaların mehribanlığını, dostluğunu mürəkkəb tərzi-hərəkət zərfləri ilə (qol-qola gəzirlər,

yan-yana otururlar) auditoriyaya ünvanlayır. Miqdar sayını (100 faiz səs aldın) işə salaraq dostluq etik kateqoriyasını dilə gətirir: “Demək, bizdə üç yəhudi icması vardır. Birincisi, dağ yəhudiləri, ikincisi, Avropa yəhudiləri, üçüncüsü, gürcü yəhudiləri. Hər icmanın öz başçısı vardır. Amma mən onlarla görüşəndə üç icmanın başçıları bir yerdə gəlirlər. Ancaq xarakterik cəhət bir də ondan ibarətdir ki, bizdə müsəlman konfessiyası, xristian, provaslav konfessiyası – əsasən ruslardır – bir də yəhudi konfessiyası var. Demək, bizim üç dini rəhbərimiz vardır. Həmişə üçü də qol-qola gəzirlər. Bizim dövlət tədbirlərində həmişə üçü də yan-yana otururlar. 1998-ci ildə prezident seçkilərində onlar üçü də bir yerə yığışıb bəyanat verdilər ki, Heydər Əliyevin namizədliyini dəstəkləyirlər və axıra qədər də dəstəklədilər. Mən yəhudilərdən 100 faiz səs aldım. Bu bizim əlaqələrimizə aid kiçik bir xülasədir. Mən bununla bir daha bəyan etmək istəyirəm ki, bizim dostluğumuz sarsılmazdır” [XXXc.s.24].

Roma Papası II İohann Pavelin Azərbaycanin din, elm və incəsənət xadimləri ilə görüşündəki nitq auditoriyanın təhsil səviyyəsindən, dünyagörüşündən asılı olaraq söylənilən möhtəşəm nitq nümunəsidir.

“Bütün insanlara xidməti özünün həyat idealına çevirmiş böyük humanistsiniz” fikri, yaxud Papanın keçdiyi yolların “məhz” dəqiqləşdirici ədatıyla təsnifi bu qəbildəndir. Bu nitq növbəti mərhələdə din tarixinə səyahət xarakterli bir şəkil alır. XIX əsrin sonu – XX əsrin əvvəllərində Bakıda katolik icmasının gördüyü işlər xatırlanır, “təəssüf ki” modalı ilə stalinizim dövrünün repressiyaları yaddaşlarda təzələnir, bu gün Azərbaycanda yaşayan katoliklərin real vəziyyəti Roma Papasına təqdim olunur: “Roma Papası II İohann Pavelin Azərbaycanın din, elm və incəsənət xadimləri ilə görüşündə nitq Siz müasir dünya tarixində mühüm rol oynayan şəxsiyyətsiniz, dini, irqi, milli sosial və siyasi fərqlərindən asılı

olmayaraq, bütün insanlara xidməti özünün həyat idealına çevirmiş böyük humanistsiniz. Məhz buna görə Sizin yolunuz yalnız xristian katoliklərin yaşadığı ölkələrdən deyil, digər dinlərin, mədəniyyətlərin mövcud olduğu, insanların yaşadığı hər yerdən keçir. Bu gün həmin yol Sizi Azərbaycan torpağına gətirmişdir.

Azərbaycan ən qədim zamanlardan dinlərin, dillərin və mədəniyyətlərin təmas və ünsiyyət yeri olmuşdur. Azərbaycanlılar artıq 1300 ildən çoxdur ki, islam dininə etiqad edirlər. Onlar eyni zamanda, dini dözümlülükləri ilə seçilir, başqa xalqların dinlərinə və mədəniyyətlərinə ehtiramla yanaşırlar.

Digər dini icmalar kimi, katoliklər də Azərbaycanda hər zaman hörmət və etimad görmüşlər. Tarixçilərin verdiyi məlumatlara görə, Azərbaycanda ilk katolik icması XIX əsrin 30-cu illərində formalaşmağa başlamışdır.

XIX əsrin sonu – XX əsrin əvvəllərində katolik icmasının nümayəndələri Bakının mədəni-ictimai həyatında mühüm rol oynamış, xüsusən də səhiyyə, mədəniyyət və memarlıq sahələrində bu gün də minnətdarlıqla xatırlanan izlər qoymuşlar. 1912-ci ildə yerli katolik icmasının təşəbbüsü və əhalinin ianəsi ilə Bakının mərkəzi hissəsində "Müqəddəs Məryəm" kilsəsi ucaldılmışdı. ***Təəssüf ki***, stalinizm dövründə islam, xristianlıq və yəhudiliklə bağlı bir çox din ocaqları kimi, bu katolik məbədi də dağıdılmışdı. Din və etiqad sərbəstliyinin hökm sürdüyü Azərbaycanda indi digər dini icmalar kimi, katoliklər də bütün hüquq və azadlıqlara malikdirlər [XXXVIIIc.s.362-363].

"Yəni" aydınlaşdırma bağlayıcısı ilə (tarixi seçimimizi bəyan edir, "üz tutmaq" frazeologizmi ilə milli simamızı qoruyaraq) çağdaş dəyərlərə doğru gedən yolu auditoriyaya nişan verir. Dini-publisistik bir dillə bir milyondan çox qaçqının necə bir humanitar fəlakətlə üzləşdiyi haqqında aydın təsəvvür yaradır: "Mənəvi dəyərlərimizi dirçəldirik. İnsan haqlarının

qorunmasına, əsas hüquq və azadlıqların təmin edilməsinə çalışırıq.

Biz tarixi seçimimizi etmişik, yəni, öz ənənələrimizdən qopmadan, milli simamızı itirmədən Qərb dünyasına, onun humanist və çağdaş dəyərlərinə üz tutmuşuq" [XXXVIIIc.s.363].

Beləliklə, Heydər Əliyevin nitqlərində səslənən multi-kultural dəyərlərimiz etik fəlsəfənin prizmasından süzülərək dünyaya − Ulu Öndər demiş − "mədəniyyət dünyasına, intel-lektual dünyaya, elmi-texniki tərəqqi dünyasına" − yayılır.

# II FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ ESTETİKA

Azərbaycanın xalq şairi Zəlimxan Yaqub Ulu Öndərə həsr olunmuş "Əbədiyyət dastanı" poemasında yazırdı: "Rəssamın da, şairn də, bəstəkarın da, heykəltəraşın da, memarın da, xalçaçının da, müğənninin və xanəndənin də, aktyorun və rejissorun da yaxını, əzizi, doğması idi Heydər Əliyev!

Məndə zərrə qədər şübhə yoxdur ki, şair qələmi, rəssam fırçası, memar zövqü, heykəltəraş tişəsi, xalçaçı ilməsi, bəstəkar bəstəsi, muğam sehri Heydər Əliyevin bənzərsiz və rəngarəng, çoxşaxəli fəaliyyəti ilə bağlı hələ çox işlər görəcək" [132].

Heydər Əliyevin nitqlərində ekspressivliyi yüksəltmək baxımından səmimiyyət, qətiyyət, nikbinlik, proqnozlar, fəlsəfi fikirlər, poetik duyğular kimi nitq ünsürləri tərəfimizdən yazılmış "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının birinci hissəsində [130] müəyyən qədər işıqlandırılsa da etik və estetik kateqoriyalara az yer verilmişdir. Ulu Öndərin nitqlərinə baxış zamanı nitqin məzmununu maraqlı edən, nitqin ekspressivliyini yüksəldən estetik mətn parçalarının kifayət qədər çoxluğu tədqiqatın aparılmasına təkan verdi. Məhz bu niyyətlə də II fəsildə Heydər Əliyev nitqlərində estetik dəyərlərin öyrənilməsini qarşımıza məqsəd qoyduq. Bu zaman həm estetik kateqoriyaları (gözəllik, faciəvilik, komiklik), həm də incəsənətin müxtəlif növləri haqqında Heydər Əliyev fikirlərinin araşdırılmasına çalışdıq. Estetik zövqün inkişafında incəsənətin rolu əvəzolunmazdır ki, biz Ulu Öndərin tez-tez incəsənət xadimləri ilə görüşlərdə söylədiyi çıxışlar əsasında bu rolu öyrənməyə çalışdıq.

Prezident İlham Əliyevin multikulturalizmə, tolerantlığa verdiyi siyasi dəyərin dünya miqyasında real elmi, mədəni,

sosial müstəvilərə köçürülməsi işində Heydər Əliyev Fondunun böyük xidmətləri danılmazdır. Fondun prezidenti, UNESKO və İSESKO-nın xoşməramlı səfiri ***Mehriban xanım Əliyeva***nın təşəbbüsü ilə keçirilən "Mədəniyyətlərarası dialoqda qadınların rolunun genişləndirilməsi", "Qloballaşma şəraitində mədəniyyətlərin rolu", "Çoxmədəniyyətli dünyada sülh şəraitində birgəyaşama", "Azərbaycan-tolerantlıq məkanı" layihələrini xüsusi qeyd etmək olar. [74]

Heydər Əliyevi estetlərin toplaşdığı auditoriyanın aparıcı mütəxəssis-alimi kimi görürük. Bu özünü incəsənət xadimlərinin fəaliyyəti ilə bağlı çıxışlarda daha da bariz göstərir. Aşağıdakı mətndə biz bunun şahidi oluruq. Auditoriya Üzeyir Hacıbəyov haqqında dolğun və dərin tarixi məlumatları səhihcəsinə Heydər Əliyev dilindən eşidir: "Tariximizdə olan şəxsiyyətlərin hamısı bizim üçün qiymətlidir. Onların heç birinə toxunmaq olmaz. Dahi bəstəkarımız Üzeyir Hacıbəyovu götürək. O, əsrin əvvəlində Azərbaycanda klassik müsiqinin ***yaradıcısı***, opera sənətinin ***banisidir***, Müsavat Partiyasının üzvü, Azərbaycan Demokratik Respublikası himninin müəllifi olmuşdur. Sonrakı dövrdə "Koroğlu operası və başqa əsərlər yaradaraq sovet dövründə Azərbaycanın mədəniyyətini zənginləşdirmiş bir adamdır" [Ic.s.159].

Heydər Əliyevin "ola bilsin" ifadəsi ilə Cavidi Şekspirlə müqayisə etməsi onun incəsənətimizə münasibətdə milli təəssübkeşlik hissinin nə dərəcədə dərin olmasından xəbər verir. "Ancaq" qarşılaşma bağlayıcısı ilə incəsənətimizə, ədəbiyyatımıza olan etinasızlığı (Ancaq biz belə inciləri lazımi qədər qiymətləndirə bilmirik) qınağa çəkir: "İndi Hüseyn Cavidin əsərləri xalqa hava-su kimi lazımdır. Təkcə ədəbi baxımdan deyil, həm də fəlsəfi, elmi baxımdan lazımdır. Lakin bu əsərlər lazımi səviyyədə nəşr olmuşdurmu? Hüseyn Cavidi Şərqin Şekspiri adlandırırdılar. Ancaq onu, bəlkə də, Höte ilə müqayisə etmək düzgün olardı. Əsərlərindəki fəlsəfi

fikirlərinə görə, ***ola bilsin***, Cavid Şekspirdən də yüksək səviyyəyə qalxmış bir adamdır. Hüseyn Cavidin "İblis" əsəri heç də Hötenin "Faust"undan geri qalmır. ***Ancaq*** biz belə inciləri lazımi qədər qiymətləndirə ***bilmirik***" [VIIc.s.160].

Mədəniyyətimizə biganə yanaşmağa "təəssüf" edən Ulu Öndər bazar iqtisadiyyatının "öz" qanunları olmasına baxmayaraq "həm" elmi, "həm də" mədəni potensialı işə salmağı tələb kimi qarşıya qoyur: "Azərbaycan Respublikasının ***həm elmi, həm də mədəni*** potensialı böyükdür. Keçmişdə yaşayıb-yaratmış alimlərimiz, yazıçılarımız, şairlərimiz, bəstəkarlarımız böyük irs qoyub getmişdir. İndiki nəslin borcudur ki, bunların əsasında elmimizi, mədəniyyətimizi inkişaf etdirsin. Ancaq bir tərəfdən biz müstəqillik əldə edirik böyük iftixar hissi ilə yaşayırıq, digər tərəfdən isə təəssüf ki, elmi dağıdır, mədəniyyətə biganə yanaşırıq. Bazar iqtisadiyyatına keçmək o demək deyildir ki, elmə, mədəniyyətə ayrılan vəsait azaldılmalı, bu sahələr ağır maddi vəziyyətə salınmalıdır" [Ic.s.160].

Nitq mədəniyyətinin [93, 128, 145, 150, 151, 155, 197] mühüm tərkib hissəsi kimi sözün estetik tutumunun əsasında nitq üslublarının harmonik şəkildə istifadəsini [8, 15, 16, 22] zəruru edir. Sözə estetik tutum vermək, onu estetik cəhətdən gözəlləşdirmək Azərbaycan şair və yazıçılarının, el müdriklərinin ümdə vəzifələri olmuşdur. O cümlədən, ümummilli lider Heydər Əliyevin nitqlərində bu estetiklik müasir Azərbaycan dilinin üslubi-qrammatik xüsusiyyətləri ilə dialektik vəhdət təşkil edir. Monoqrafiyanın hər iki fəslində dilin bu xüsusiyyətlərinə – əsas [4; 32; 56; 120; 186] və köməkçi [125; 153, 184] nitq hissələrinin üslubiyyat yaratmasına, leksik sinonimləşməyə [3, 49, 84, 175], frazeoloji birləşmələrdən [18, 94, 97, 100] yerindəcə yararlanmağa, modallaşmaya [20, 73, 153, 154], ritorik suallardan [127] və antroponimiyadan [23, 34, 114] istifadə etməyə, eləcə də nitqdə

ekspressivlik və emosionallıq [42,44, 51, 58, 68, 83, 85] yaradılmasına mühüm diqqət yetirilmişdir. Auditoriyalarda estetik tablolar yaratmaqla, ritorik fiqurlardan yerindəcə, dəqiqcəsinə istifadə etməklə auditoriyaları nitq sehrinə salmaq Heydər Əliyev şəxsiyyətinə xasdır. Aşağıdakı kiçik mətndə "600 min" müəyyən miqdar sayı, "insanlar çöllərə tökülüb", "ilan vurur onları", "ağac altında yaşayırlar" ifadələri ilə qaçqınların şəraitini auditoriyanın gözü qarşısında canlandırır. Ritorik sualların kəskinliyi cümlədən-cümləyəgüclənir. "Açıq demək lazımdır" səmimiyyəti qətiyyətlə birgə təsadüf edir: "Burada çıxış edənlər qeyd etdilər ki, 600 minə qədər qaçqın var. Evi yox, eşiyi yox, çöllərdə yaşayır. Biz getdik Qarabağa. Ağcabədidə olduq. Bərdədə olduq. İnsanlar *çöllərə tökülüb*... Ağac altında, çadır altında yaşayırlar. *İlan vurur* onları. Bəs onlar insan ***deyildirlərmi***? Onlara sosial-iqtisadi təminat lazım ***deyilmi***? Belə çıxır ki, onlar da respublika ***yaratmalıdırlarmı***? Onlar da silahlı dəstələr qurub cürbəcür cinayət ***etməlidirlərmi***? Demək istəyirəm ki, Lənkəran rayonunun, Lənkəran zonasının, bu cənub zonasının sosial-iqtisadi problemləri tamamilə şəksizdir. Bu məsələ ilə biz məşğul olmuşuq. Nazirlər Kabineti müvafiq qərarlar qəbul edib və edəcəkdir. Məsələlər həll olunacaqdır, ancaq bu da həqiqətdir ki, Lənkəranın və bu zonanın bugünkü sosial-iqtisadi vəziyyəti başqa zonaların vəziyyətindən üstündür. Bunu da tamamilə ***açıq demək*** lazımdır" [Ic.s.78-79]. Ritorik sualların kəskinliyi cümlədən-cümləyə güclənir. Səmimiyyət, cəsarətlə birgə təsadüf edir.

Siyasətin estetika ilə, məişət üslublu çıxışla çulğalaşdığı bir nitq nümunəsinə misaldır. Elə Heydər Əliyev nitqinin fenomenallığı da bundadır. "Ən" qüvvətləndirici ədatının köməyi ilə "ən dadlı üzüm" ifadəsi ləzzət mənasında işlənib məişət çalarları qazanır, utilitar gözəllik yaradır. Sinonim cərgəylə "quru, isti, qumsal" Abşeron torpaqları üstündə

uzanması estetik zövq yaradır. Üzümçülüyün inkişafının 5 dəfə aşağı düşməsi "olsa-olsa" ifadəsinin köməyilə qarşıda duran ciddi dövlət işi kimi qabardılır: "Biz üzüm istehsalını ildə 2 milyon tona çatdırmışdıq. Abşeron üzümü mənim görüb daddığım bütün sortlar içərisində ***ən dadlı*** üzümdür. Abşeron torpaqları ***quru, isti, qumsal*** torpaqlardır, üzüm bu isti torpaqlara uzanaraq onların hərarətini, şirəsini-şəkərini canına çəkir. Hər şey məhv olub getdi. Bu il biz ***olsa-olsa*** 400 min ton üzüm yığa biləcəyik" [Ic.s.58].

İncəsənətimizə xor baxanları, öz keçmişimizi qiymətləndirməyənləri "axı" qüvvətləndirici ədatı ilə maarifləndirir. Əcəmi Naxçıvanini və Şirvanşahlar sarayını tikən memarları nümunə göstərməklə Azərbaycan memarlığına münasibətdə auditoriyanı heyran qoyur: "***Axı*** Azərbaycanın böyük memarlıq, rəssamlıq məktəbi var. 800–900 il bundan əvvəl Azərbaycan memarları bütün Şərqdə məşhur olan abidələr yaratmışlar. Əcəmi Naxçıvaninin yaratdığı abidələr təkcə Naxçıvanda deyil, Şərq ölkələrinin bir neçəsində indi də qalmaqdadır. Şirvanşahlar sarayını tikən memarlar öz işlərinə əsl milli təfəkkürlə yanaşmışlar" [Ic.s.161]

Heydər Əliyevin nitqlərində estetikanın kateqoriyaları – gözəllik, ülvilik, rəzillik, eybəcərlik, çirkinlik və s. daxildir və onlar estetik ölçü kateqoriyalarıdır. Kateqoriyaların digər bir hissəsi − estetik zövq, qavrayış, həyəcan (təəssürat), ideal və s. isə estetik şüur sahəsinə aiddir [38; 81; 124; 140; 164; 187; 189; 190; 191].

Dünyanın estetik baxımından öyrənilməsinin ən mühüm üsullarından biri incəsənətdir. Mühakiməyə əsaslanan bilik gözəlliyin dərk edilməsində hisslərin ifadəsini əvəz edə bilməz.

Estetik zövq qabiliyyəti gözəlliyi daha dərindən dərk etmək, qiymətləndirmək qabiliyyətidir, gözəllik haqqında bir növ fəlsəfi mühakimədir. Estetik zövq insanın hissi həyatı ilə

əlaqədar olmaqla bərabər, əqli-intelektual həyatı, idrak qabiliyyəti ilə də möhkəm tellərlə bağlıdır. Estetik funksiya − incəsənətin heç nə ilə əvəz olunmayan və heş nə ilə müqayisə edilməyən spesifik xüsusiyyətidir; o insanda estetik zövq, qabiliyyət və tələbatları formalaşdırır, bunula da onu dünyanın dəyər meyarları ilə silahlandırır; o şəxsiyyətdə yaradıcılıq ruhunu, yaradıcı başlanğıcı oyada bilir [38; 189].

Yuri Borevə görə insanın mənəvi aləminin psixoloji analizi incəsənətin imkanlarını genişləndirir, onun dünyanı dərk etmək qabiliyyətini dərinləşdirir. Estetika-incəsənətin psixologiyası və bədii qavrayışın nəzəriyyəsidir [19].

"Mən teatra, kinoya, incəsənətin bütün növlərinə həmişə maraq göstərmişəm. Çünki, mən bunları sevirəm, çünki özünü sənətə həsr etmiş adamların əməyinə həmişə hörmət bəsləmişəm və bəsləyirəm. Özünü sənətə həsr etmiş adamların əməyi əsl hünərdir. Siz fədakar və əməksevər insanlarsınız. Siz bütün digər adamlara zövq vermək, sevinc bəxş etmək üçün fədakarlığa hazır olan insanlarsınız" [VIIc.s.449].

Estetik zövqün hər bir kəs üçün fərqli olduğu Heydər Əliyevin nitqlərində tez-tez səslənir: "Tofiq Quliyevin mahnıları çoxdur, lakin "Sənə də qalmaz" bunların zirvəsidir. Onun oğlu bugünkü gecənin rejissoru idi və gözəl də təşkil etmişdir. Rauf Abdullayev bu gün fərqlənirdi, orkestri çox yaxşı idarə edirdi. Mən heç kimə heç bir dərəcə vermək istəmirəm, hər bir musiqisevərin öz rəyi var" [VIIc.s.338]. "Hər bir" təyin əvəzliyinin köməyi ilə incəsənətə − musiqiyə münasibətdə estetik zövqlərin müxtəlifliyi başa düşülür.

Böyük natiqin incəsənətə fəlsəfi yanaşması, incəsənətin bütün növlərinə dərindən bələdliyi həmişə auditoriyaları heyran qoyur: "Görürsünüz, bu, adi bir əsər deyil. Bu əsərdə məni valeh edən-bu sözü tam həqiqətlə deyirəm-sevindirən və məndə böyük hissiyyatlar doğuran odur ki, bu əsərdə böyük fəlsəfə, məna vardır. Ən birincisi odur ki, Zərifə xanımın

daxili mənəviyyatını, onun simasını, daxili və zahiri simasını Ömər Eldarov əks etdirə bilibdir. Eyni zamanda, o gözəl bir heykəltəraş kimi Azərbaycan heykəltəraşlıq sənətinin, məktəbinin, dünya heykəltəraşlıq məktəbinin elementlərini, yaxud onların müəyyən cəhətlərini − bu əsərində həyata keçirə, tətbiq edə bilibdir" [IXc.s.156]. "Azərbaycan heykəltəraşlıq məktəbi" ifadəsi ilə böyük natiq incəsənətin bu sahəsində də azərbaycançılıq ideyalarını öndə saxlayır.

Gələcəkdə Azərbaycan nitq mədəniyyətinin inkişafı baxımından Heydər Əliyevin nitqlərində fəlsəfi fikirlərin tədqiqinin dərinləşdirilməsi zərurəti ortaya çıxır.

Təkcə "Azərbaycan xalqının ürəyində olan hissiyyatlar çoxdur" deyimi xalqımızın estetik dünyagörüşünün zənginliyindən xəbər verir. Estetik hissləri "ürək sözlərimizi" incəsənət vasitəsilə biruzə vermək xalqın böyüklüyünə işarədir: "Azərbaycan xalqının ürəyində olan hissiyatlar çoxdur. Bunu sözdə də, şeirdə də, musiqi ilə də, rəsm əsərləri ilə də demək olar. Ancaq biz fikirləşdik ki, ürək sözlərimizi sizə dəqiq çatdırmaq üçün böyük rəssamımız Kamil Əliyev sizin portretinizi xalıda yaratsın. Azərbaycan incəsənətinin əsrlərdən-əsrlərə keçən ənənələrindən biri də xalı üzərində rəsmlər, mənzərələr əks etdirmək, tarixin böyük şəxsiyyətlərinin portretlərini yaratmaqdan ibarətdir. Azərbaycan incəsənəti, rəssamlıq məktəbi bununla fəxr edə bilər. Belə bir nümunə, yəni sizin portretiniz Azərbaycan ornamentləri ilə bəzədilmiş xalı üzərində toxunub hazırlanıb. Mən doğum gününüz münasibətilə bu xalını sizə hədiyyə edirəm. İcazənizlə, bu hədiyyəni sizə təqdim edim. Əziz dostum, doğum gününüzü təbrik edirəm. Sizə uzun ömür, cansağlığı, xoşbəxtlik arzulayıram" [IIc.s.485].

İncəsənət ustalarının işinə qiymət yüksək estetik peşəkarlıq tələb edir ki, biz bunları Ulu Öndərin nitqlərində addımbaşı görürük. Xalq rəssamı Maral Rəhmanzadənin

əsərlərindən ibarət yubiley sərgisinin açılışı mərasimindəki çıxışda olduğu kimi: "Həm də o şeyi ki, rəssam görür, adi adam bəlkə də bunu dərk edə bilmir. Rəssamın gözü ilə adi adamın gözü arasında böyük fərq var. Ona görə də sizin yaradıcılığınızın bu xüsusiyyətini mən daha yüksək qiymətləndirirəm" [VIIc.s.197].

Rəqs, rəssamlıq, arxitektura, heykəltəraşlıq tətbiqi və dekorativ incəsənət "dilində" verilən informasiya – söz "dilində" verilən informasiyadan daha anlaşıqlıdır, digər xalqlar tərəfindən daha asan mənimsənilir (Dünya bir dildə danışır deyərək ümumbəşərilik duyğusu açıqlanır).

Buna görə də incəsənətin informativ-kommunikativ imkanları, ümumiyyətlə genişdir, adi dildəkindən kəmiyyətcə böyükdür, Bundan başqa "onlar keyfiyyətcə də daha yüksəkdir, çünki incəsənətin dili (o cümlədən, ədəbiyyatın da dili) təbii danışıq dilinə nisbətən həmişə daha əlvandır, metaforik cəhətdən dolğun, çevik, məcazi, paradoksal və emosional, estetik cəhətdən zəngindir [19].

Auditoriya böyük natiqin dilindən incəsənətimizə olan dərin sevginin şahidi olur. Nəsillər arasındakı varisliyin, bu varisliyə sayğının şahidi olur. H.Əliyevin dilində "Bilirsiniz" modal sözü ***ilə*** çıxışa başlamaq auditoriyada fəlsəfi fikirlərin açıqlanmasına işarədir.

Azərbaycanı, onun görkəmli övladlarını dünyaya tanıtmaq onun əsas işi və məqsədiydi. "Tarixində" ifadəsini üç dəfə təkrarlamaqla bunları auditoriyanın hafizəsinə, yaddaşına həkk etdirir: "Hesab edirəm ki, bəşər ***tarixində***, Şərq aləminin ***tarixində***, İslam aləminin ***tarixində*** "Leyli və Məcnun" mövzusunda məhz Məhəmməd Füzulinin poeması əsasında dahi bəstəkar Üzeyir Hacıbəyov tərəfindən opera yazılıbdır.

Biz bəzən bunu tariximizdə adi bir hadisə hesab edirik. Ancaq bu, adi hadisə deyildir. Birincisi, ona görə ki, ümumiyyətlə, Şərq aləmində Üzeyir Hacıbəyovdan əvvəl opera

yazan olmayıb. Bu operanı yaradan Üzeyir Hacıbəyovdur. Ola bilərdi ki, bu operanı hər hansı başqa bir mövzu üzərində yazsın. Üzeyir Hacıbəyov bu operanı məhz Füzulinin poeması əsasında yazıb. ***Bilirsiniz,*** Füzulinin Üzeyir Hacıbəyovla bağlanması, 500 il bundan əvvəl yaşamış Füzulini 100 il bundan əvvəl yaşamış Üzeyir Hazcıbəyovun Şərq aləminə xas olmayan ***opera*** sənəti əsasında bağlanması tarixi ***bir hadisədir.*** Bu, xalqımızın incəsənətdə, mədəniyyətdə, musiqidə nə qədər yüksəklərə qalxdığını göstərir. Biz bununla fəxr edirik və fəxr etməliyik. Yenə də deyirəm, bunu adi hadisə kimi qəbul etmək lazım deyil. Bu, ***qeyri-adi*** bir hadisədir" [VIIc.s.164].

O incəsənətimiz üçün ürəyindən keçən, qəlbindən doğan arzularını bir dövlət başçısı kimi, yüksək zövqlü estetik kimi dilə gətirir. Bəstəkarlar auditoriyasını incəsənətimizin gələcəyi üçün düşünməyə vadar edir. Arzuların səmimiyyətə söykəndiyini (ancaq, gərək) duyan auditoriya özü üçün qərar qəbul edir: "***Ancaq*** bizim sonrakı bəstəkarlarımız gərək Üzeyir Hacıbəyovun yolu ilə gedəydilər. "Leyli və Məcnun" mövzusunda bir balet yazaydılar. Qara Qarayevin "Leyli və Məcnun" simfonik əsəri çox dəyərli bir əsərdir. Mən onu dəfələrlə dinləmişəm. ***Yadımdadır,*** biz Qara Qarayevin 60 illik yubileyini qeyd edəndə həm Moskvada, həm də Bakıda məhz bu əsəri ifa etdilər. Ancaq bu mövzuda balet yazmaq lazımdır. Arif Məlikov "Məhəbbət əfsanəsi" adlı çox gözəl bir əsər yaradıb. Bu əsər dünyanın ən böyük teatrlarında tamaşaya qoyulub və bu gün də qoyulur. Ancaq **gərək** bir başqa bəstəkarımız da "Leyli və Məcnun" baleti yaradaydı. Bunu Arif Məlikovun özü də edə bilərdi. Çünki onun yaratdığı birinci balet çox uğurlar qazanıb, bir çox teatrlarda bu gün də uğurla gedir" [VIIc.s.164].

Memarlıq sənətinin sirlərini auditoriyaya bəyan edən Ulu Öndər "eksteryer", "interyer" terminlərindən istifadə etməklə

çıxışına elmi üslub verir, forma və məzmunun dialektikasına daxil olur.

“Azərbaycan memarlıq sənəti” deməklə milliliyi ümumbəşəriliklə (dünya standartlarına uyğunluq) qovuşdurur. Memarlıqla bağlı ana fikirlər “həm”, “həm də” iştirak bağlayıcıları ilə həyata keçirilir: “Tikintisinə başlanan diplomatik mərkəz binasının ***həm xarici*** görünüşü, ***həm də daxili*** quruluşu, yəni ***eksteryeri***, ***interyeri*** Azərbaycan memarlıq sənətinin ənənələrinə uyğundur. Ancaq bu gün mən ***həm*** inşaatçılardan, ***həm də*** memarlardan bir daha xahiş etmək istəyirəm ki, tikinti zamanı bu xətti nəinki qorusunlar, hətta daha da zənginləşdirsinlər, inkişaf etdirsinlər. Bir halda ki, mən bu işlə məşğul oluram, indicə şirkətin prezidentinə də dedim ki, buna özüm nəzarət edəcəyəm, tikintinin vaxtında başa çatdırılması, eyni zamanda binanın keyfiyyətli, ***dünya standartlarına*** uyğun olması, bütün bunlarla yanaşı, ***Azərbaycan memarlıq*** sənətinin burada tam öz əksini tapması əsas şərtlərdən biridir” [IIc.s.88].

Estetikanın Ulu Öndərin həyatına daxilən xas olması aşağıdakı mətndən bəlli olur. Bu mətn parçası bir daha estetik kateqoriyaların təkcə zövq mənbəyi olmaq yox, siyasi liderin əməlində, işində vacib real həyat kateqoriyası olmasını sübuta yetirir. Böyük natiqin nitqlərində estetika təkcə yaradıcı sənət adamlarının yox, hamının malına çevrilir: “Həyat sevimli əyləncə və qalan məşğuliyyət üçün imkan vermirdi. Halbuki mən uşaqlıq illərində şeir də yazır, şəkil də çəkirdim. Başlıca arzum arxitektor olmaq idi. Həmin ixtisas üzrə hətta bir az oxumuşdum da, lakin sonra bu arzumdan əl çəkməli oldum. ***Hərçənd*** o, qəlbimdə qalır. ***Yeri gəlmişkən***, Azərbaycanın rəhbəri olarkən şəhərsalma sahəsində az iş görmədim. Ümumiyyətlə, geridə qalmamağa, arxitekturada baş verən hadisələri izləməyə çalışırdım” [Ic.s.4].

Texniki estetikaya aid olan şəhərsalma Heydər Əliyevin həyatda ən çox sevdiyi incəsənət sahəsidir. Bu sahə XX əsrin ikinci yarısından etibarən Ulu Öndərin hakimiyyət illərinə təsadüf edir. XXI əsrin əvvəlində başlayan yeni şəhərsalma bu gün dünya memarlıq ənənələrinin milli memarlıqla sintezi şəklində davam etdirilir: "Azərbaycanın paytaxtı Bakı dünyanın ***ən gözəl*** şəhərlərindən biridir. Bu gözəlliyi təmin edən amillərdən biri əsrlərdən bəri Bakıda böyük memarlıq abidələrinin yaranmasıdır. Biz XII–XIII əsrlərdən indiyədər yaşayan bu abidələrlə fəxr edirik. Son dövrlərdə, yəni XX əsrdə də Bakı şəhərində bir sıra mühüm memarlıq abidələri tikilmişdir" [IIc.s.87].

"Bu gün burada, Bakının ***ən yüksək nöqtələrindən*** biri olan bu yerdə yaradılmış radio-televiziya qülləsi Bakını ***daha da*** gözəlləşdiri. Bu, yeni bir abidə, memarlıq abidəsidir. Güman edirəm ki, gələcək nəsillər indiyə qədər yaranmış abidələr kimi, bu abidəni də qiymətləndirəcəklər. Bu baxımdan radio-televiziya qülləsinin Azərbaycan və onun paytaxtı üçün çox böyük əhəmiyyəti var. Ümidvar olduğumu bildirmək istəyirəm ki, bu abidə qorunub saxlanacaq, onun zahiri və daxili görünüşü bundan sonra görülməli tədbirlərdə **daha da** gözəlləşdiriləcək və o, şəhərimizin ***həqiqətən ən yüksək nöqtəsində*** olan bir memarlıq abidəsi kimi daim bizə fərəh verəcəkdir" [VIIc.s.77]. İncəsənətimizə münasibətdəki nitqi milli təəssübkeşlik, milli özünüdərkin inkişafına ciddi önəm verir: "ən yüksək nöqtəsi" fikrini təkrarlamaqla nitqin ekspressivliyini artırır.

## 2.1. Heydər Əliyevin nitqində estetik anlayışlar

Estetika "hissiyyatlar" haqqında bir elmdir desək, səhv etmərik. Bəs bu hissiyyatlar necə ifadə olunur?! Azərbaycan xalq dastanlarını ifa edən aşıqlar dastan qəhrəmanlarının dili ilə deyərdilər: "İcazə verin dərdimi sazla deyim, sözlə desəm dilim od tutub yanar". Demək dərin hissiyyatların, estetik dəyərlərin adi danışıqla, adi eşitmə və görmə ilə ifadə oluna bilməməsini böyük natiq zamanında anladır, estetikanın bir mühüm qolu olan bədii ədəbiyyata hər zaman ehtiyac olduğunu dilə gətirir: "Azərbaycan mənim ürəyimdir. Azərbaycan mənim nəfəsimdir. Azərbaycan mənim həyatımdır. Azərbaycan haqqında hər bir vətəndaş öz ürək sözlərini deyə bilər. Mənim ürəyim daim öz doğma vətənim Azərbaycanla bağlı, Azərbaycan haqqında hissiyyatlarla dolu olubdur. ***Bu hissiyyatları sözlə demək mümkün deyildir.*** Hətta böyük şairimiz Səməd Vurğunun dediyi sözlər də bunun hamısını əhatə etmir. Ancaq şeirə ehtiyac olduğuna görə Səməd Vurğunun sözlərini bir daha təkrar etmək istəyirəm:

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam məskənimsən.
Anam doğma vətənimsən,
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan! [XVIIIc.s.74-75]"

Azərbaycan dilinin qorunması bütün məqamlarda gündəmdə olur. Dilin təmizliyi baxımından "şübhəsiz ki" modal söz ilə "Xəzər dəniz neft" anlayışını verən adın götürülməsi fikrini irəli sürür. Milli özünəqayıdışın tələbinə uyğun olaraq "Dədə Qorqud" yenidən həyata vəsiqə alır: "Bu qazma qurğusuna "Dədə Qorqud" adı verildi. Bu adın verilməsi haqqında da müzakirə aparılmışdır. Bilirsiniz ki, bu qurğunun adı

indiyədək "Kaspmorneft" olubdur. ***Şübhəsiz ki***, bu da bizim bugünkü həyatımıza uyğun olmayan bir addır. Eyni zamanda, bu qurğu yenidən doğulubdur... Təqdim olunan adların hamısı doğrudan da dəyərli idi. Ancaq mən bu qurğuya "Dədə Qorqud" adı verilməsi barədə qərar qəbul etdim. Hesab edirəm ki, hər bir azərbaycanlı üçün bu, ***müqəddəs*** və əziz ad, bu qurğu üçün ***ən*** dəyərli, görkəmli addır. "Dədə Qorqud" qurğusuna böyük uğurlu yol arzulayıram. Bu qurğuda çalışanların hamısına cansağlığı və yen-yeni uğurlar arzulayıram! Yaşasın "Dədə Qorqud" qurğusu!" [VIIc.s.248].

Yuri Borevə [19] görə dünyanın estetik mənimsənilməsi insəcənətdə olduğu kimi, istehsal sahəsində də baş verir. Texniki estetika sənaye incəsənətinin insana və bütünlüklə cəmiyyətə münasibəti haqqında incəsənət nəzəriyyəsidir. Elmin bu qolu utilitar (praktiki cəhətdən faydalı) və estetik keyfiyyəti özündə birləşdirən əmək alətlərinin (maşınlar, dəzgahlar) kütləvi istehsalı sahəsində bilikləri ümumiləşdirir və müasir sənaye vasitələri sahəsində dünyanın gözəllik qanunları ilə mənimsənilməsi təcrübəsini yekunlaşdırır.

Əxlaqi estetik hisslər bir-biri ilə sıx bağlıdır, çünki yaxşılıq və gözəllik arasında dərin daxili vəhdət vardır.

Filosoflar gözəlliyi tarix boyu müxtəlif şəkildə başa düşmüş və izah etmişlər. Gözəllik haqqında təsəvvürlərimizin əsasını təşkil edən fikir deyil, müəyyən daxili hissdir. Mühakiməyə əsaslanan bilik gözəlliyin dərk edilməsində hisslərin ifadəsini əvəz edə bilməz [75].

Şəxsiyyət–millət–bəşəriyyət dünya ziddiyyətlərinin çərtləndirdiyi bu üç konkret – tarixi əsas arasında dialektik qarşılıqlı təsir obrazlı təfəkkürün strukturunu müəyyənləşdirir [19,s.120]. Heydər Əliyev üçün incəsənət təkcə millimiklə qapanıb qala bilməz. "Əgər" şərt bağlayıcısı ilə Nizami yaradıcılığının ümumbəşəriliyinə toxunur, ritorik suallarla − "bilirlərmi, oxuyurlarmı, bəhrələnirlərmi" − ümumbəşəriliyə

gedən yolun da millilikdən keçməsini auditoriyaya bəyan edir: “Eyni zamanda, milli məhdudluq çərçivəsində yaşamaq olmaz. Azərbaycanın o dahi şəxsiyyətləri də bu zirvəyə qalxmaq üçün bəşəri dəyərlərdən istifadə etmişdir. Əgər belə olmasaydı Nizami Gəncəvi “İsgəndərnamə” kimi böyük bir poema yazmazdı. Bu poema Homerin “İliada” poemasından heç də geri qalmır. “İsgəndərnamə” bir tərəfdən tarixi əsərdirsə, digər tərəfdən dərin fəlsəfi fikirlərlə zəngindir. Ancaq gənclərimiz bunları ***bilirlərmi***, ***oxuyurlarmı***, bunlardan ***bəhrələnirlərmi***?

Biz ***həm*** milli tariximizdən aldığımız mənəvi sərvətlərdən istifadə etməli, ***həm də*** bəşəriyyətin yaratdığı mənəvi dəyərlərə yiyələnməliyik, o cümlədən, Avropa mədəniyyətindən, Rusiya mədəniyyətindən, Şərq mədəniyyətindən istifadə etməliyik” [Ic.s.175].

Estetik funksiya – incəsənətin heç nə ilə əvəz olunmayan və heç nə ilə müqayisə edilməyən spesifik xüsusiyyətidir; o insanda estetik zövq, qabiliyyət və tələbatları formalaşdırır, bununla da onu dünyanın dəyər meyarları ilə silahlandırır; o şəxsiyyətdə yaradıcılıq ruhunu, yaradıcı başlanğıcı oyada bilir [19,s.150].

İncəsənətin bu funksiyası Heydər Əliyevin müxtəlif auditoriyalardakı nitqlərində səslənir, Azərbaycan milli incəsənətinin təbliğində özünə yer alır. “Elegiya” əsərinin təqdimat mərasimindəki çıxışda akademik Zərifə Əliyevanın heykəlinə baxarkən dediyi fikirlər bu sıradandır. [IXc.s.158].

Estetik zövq qabiliyyəti gözəlliyi daha dərindən dərk etmək, qiymətləndirmək qabiliyyətidir, gözəllik haqqında bir növ fəlsəfi mühakimədir. Estetik zövq insanın hissi həyatı ilə sıx əlaqədar olmaqla bərabər, əqli-intellektual həyatı, idrak qabiliyyəti ilə də möhkəm tellərlə bağlıdır [19].

Heydər Əliyevin yarıpublisistik, yarıməişət üslublu nitqlərində estetik kateqoriyaların harmonik şəkildə uzlaşmasının şahidi oluruq. Həmişəki kimi fəlsəfi düşüncələrin auditoriyaya

bəyan edilməsindən öncə "bilirsiniz" modal sözü auditoriyanı çıxışı dinləməyə hazırlayır, səfərbər edir. "Misilsiz", "barlı-bərəkətli" ifadələri ilə utilitar gözəllik tablosu yaradır. "Yadımdadır" modalı ilə auditoriyanı keçmişə aparır, "heyran qalmağın" elə estetik həzzin sinonimi olduğunu deyir. "Bəs" sual ədatı ilə auditoriyanın diqqətini faciənin sinonimi ola biləcək "bərbad" ifadəsi ilə "işsizlik" kimi sosial bəlanı yada salır: "***Bilirsinizmi***, biz Lənkəranda boş yerlərdə, çöllü-biyabanlıqda *misilsiz, barlı-bərəkətli* tərəvəz plantasiyaları yaratmışdıq. O yerləri "Ümumittifaq bostanı" adlandırırdılar. Orada əla faraş pomidor, xiyar, digər bostan məhsulları əkilib-becərilir və bütün bu nemətin hamısı Norilskə, Urala, Moskvaya göndərilirdi. Respublika olduqca böyük məbləğdə gəlir götürür, Rusiyanın sənaye mərkəzləri isə ***dadlı-ləzzətli*** tərəvəz alırdılar. Yadımdadır, Finlandiya prezidenti Urxo Kekkonen bu yerlərə istirahətə gəlmişdi və plantasiyalara heyran qalmışdı. Bəs hanı indi bu plantasiyalar? Hər şey başlı-başına buraxılmış, ***bərbad*** hala salınmışdır – yenə əvvəlki düzəngahlığa, çöllü-biyabanlığa çevrilmişdir. Camaat işsizdir" [Ic.s.58].

Əməyin məhsulundan başqa əmək prosesinin özü də estetik zövq mənbəyidir. İnsan dəyişdirdiyi obyektdə, yəni maddədə, əmək materialında özünün mənliyini təcəssüm etdirir. Heydər Əliyevin nitqində "əmək", "əməksevərlik" kimi anlayışlar elmi-texniki inqilabın nailiyyətləri ilə əmək prosesləri arasında uyğunluğu aşkar etməyə imkan verir: "Almaniya nəhəng elmi-texniki və iqtisadi potensialı olan böyük ölkədir. O, elmdə, texnikada, təhsildə və şübhəsiz ki, iqtisadiyyatın inkişafında yüksək məqsədlərə, səviyyələrə çatmağa qadir olduğunu keçmişdə də, son 50 ildə də dünyaya nümayiş etdirmişdir. Alman xalqının xüsusi istedadı, Almaniyanın görkəmli adamlarının xüsusi qabiliyyəti, əməksevərliyi, istər keçmiş dövrlərdə, istərsə də indi getdikcə daha çox şeyə nail

olmaq səyləri Almaniyanı iqtisadi və sosial baxımdan dünyanın ən inkişaf etmiş, ən böyük ölkələri sırasına çıxarmışdır" [VIIc.s.38].

Xalqın estetik dünyagörüşünün zənginliyinin onun iqtisadi cəhətdən güclü inkişafı ilə bağlı olduğunu gözəl bilən böyük natiqin nitqlərində "iqtisadi estetika" mühüm yer tutur.

Heydər Əliyevin nitqlərində Azərbaycanın korifey sənətkarları yüksək nitq ustalığı ilə öz xalqımıza, eləcə də bütün dünya xalqlarına tanıdılır. Ulu Öndərin Üzeyir Hacıbəyov şəxsiyyəti haqqındakı fikirləri bu sıradandır: "***Bəli***, yenə də deyirəm, Üzeyir Hacıbəyovu böyük bir musiqiçi kimi hamı, bütün dünya tanıyır və biz də Üzeyir Hacıbəyovun adı çəkiləndə onu bir bəstəkar, musiqiçi kimi tanıyırıq. Amma o, ***nə qədər*** böyük filosofdur, alimdir, Azərbaycanın həyatını o vaxtlar təhlil edərək ***nə qədər*** belə dahi əsərlər yarada bilibdir. Yenə də deyirəm, o, "Məşədi İbad" pyesinin musiqisini yazmazdan əvvəl əsərin özünü yazıbdır. Onun süjeti, məzmunu həyatdan götürülmüşdür. Ancaq bunlar Üzeyir Hacıbəyov fəlsəfəsindən, onun fikir və mülahizələrindən keçərək yaranmış ***obrazlar***, ***fikirlər***, ***sözlərdir"*** [XVIIIc.s.331]. "Bəli" təsdiq ədatı ilə öz fkrinin sabitliyini ortaya qoyur, "nə qədər" miqdar zərfi ilə öz heyranlığını dilə gətirərək auditoriyanı da heyran qoyur. "Obrazlar, fikirlər, sözlər" nisbi sinonim cərgə ilə nitqin şüurlara çatdırılmasını sürətləndirir.

Bakı, Şəhidlər Xiyabanı 20 yanvar 1998-ci ildə ümumxalq hüzn günündə öz doğmalarının məzarlarını ziyarət etmək üçün gəlmiş şəhid ailələrinin üzvləri ilə görüşdə böyük natiqin çıxışını araşdırarkən faciə kateqoriyasının Heydər Əliyev dilində izahının şahidi oluruq.

Faciəviliyi digər estetik kateqoriyalardan fərqləndirən cəhətərdən biri münaqişədə olan qüvvələrin böyüklüyü, əhəmiyyətliliyidirsə, digəri insanın ölümünə, ictimai hərəkatın, ideal-ların məhvinə səbəb olan konfliktlərin həlledilməzliyidir.

Bundan başqa, "yeni köhnə ilə açıq-açığına mübarizəyə qoşulduqda, yeninin qələbəsi üçün şərait olmadıqda faciəvi sonluq baş verir. ...köhnə hələ müəyyən qüvvəyə malik olduqda, lakin ölümə məhkum olunduğunu dərk etmədikdə də faciəvilik özünü göstərə bilər" [19]. Təsadüfi deyildir ki, estetlər ölümün faciəvi təsir bağışlaması üçün onun ictimai-bəşəri mahiyyətə malik olması gərəkdir. Elə bu baxımdan Azərbaycan xalqının taleyində 20 Yanvar faciəsi də yuxarıdakı mahiyyətdədir: "Bu gün sizin üçün də, bizim üçün də böyük matəm günüdür. Bu, tək sizin faciəniz deyil, bütün millətimizin, bütün xalqımızın faciəsidir. O dəhşətli gecədən, dəhşətli gündən səkkiz il keçibdir. Ancaq bizim xalqımız o günü heç vaxt unutmayacaqdır. Çünki o, ayrı-ayrı insanlara edilən qəsd, təcavüz deyildi, bu, bütün Azərbaycan xalqına, Azərbaycan millətinə, Azərbaycan ölkəsinə edilən hərbi təcavüz idi və bizim xalqımıza qarşı soyqırım idi. Bu təcavüz nəticəsində həlak olanlar xalq ***qəhrəmanlarıdır***, onlar millətimizin qəhrəmanlarıdır. Onların həlak olması bizim üçün, xalqımız üçün, sizlər üçün, ailə üzvləri üçün böyük itkidir, faciədir. ***Ancaq*** eyni zamanda onların şəhid olması zamanı tökülən qan bütün xalqımızın ***qanıdır***. O qanın hər damcısında bizim xalqımızın qüdrəti var, xalqımızın qəhrəmanlığı var, xalqımızın milli azadlıq, müstəqillik arzuları vardır. O gecə tökülən qanlar müqəddəs qanlardır. Onlar bizim xalqımızın əsrlər boyu milli azadlıq, müstəqillik uğrunda tökdüyü qanlara qovuşmuş qanlardır, o gecə tökülən qanlar Azərbaycanın müstəqilliyini nümayiş etdirən milli bayrağımızın üstündəki qandır [XIVc.s.141-142].

Böyük natiqin dilində "bu təcavüz nəticəsində həlak olanlar xalq qəhrəmanlarıdır" ifadəsi estetikadakı "qəhrəmanlıq – faciəvilik və ülviliyin ortaq modifikasiyasıdır" ifadəsinin siyasi lider dilində təsdiqidir.

Komiklik də estetikanın mühüm kateqoriyalarından hesab olunur. Komiklik çox geniş şəkildə ancaq ədəbiyyatda, teatrda və kinoda öz təzahürünü və inkişafını tapır. Komikliyi estetik kateqoriya edən, onu gözəlliklə yaxınlaşdıran başqa bir mühüm amil də vardır. Bu da ondan ibarətdir ki, komik hadisələr də gözəl və başqa estetik hadisələr kimi insanda qərəzsiz sevinc hissi doğurur, insana həzz verir və bunun da sayəsində katarsis əmələ gətirirlər [19, 38, 122]. Komikliklə qərəzsiz sevinc hissi gülüş vasitəsilə ifadə olunur və gülüşdə təzahür tapır. Gülüş isə çox yüksək katarsis əmələ gətirir. Bu kateqoriya böyük natiqin dilində ən çox Üzeyir Hacıbəyovun “Məşədi İbad” komediyası ilə bağlıdır: “Ancaq mən burada tamaşanın əvvəlindən indiyə qədər bu əsər haqqında düşünürəm. Şübhəsiz ki, birinci növbədə bizim dahi bəstəkarımız, dahi insanımız Üzeyir Hacıbəyov haqqında da düşünürəm. Bəzən bu “Məşədi İbad”ı xalq arasında gülməli bir tamaşa kimi qəbul edirlər. İnsanlar gəlir, baxır, gülür, əylənir və hesab edirlər ki, elə bunun mənası budur. ***Ancaq bunun çox dərin bir mənası vardır.*** Bilirsiniz, bu əsər dahi bir əsərdir. Üzeyir Hacıbəyovun əsərlərinin hamısı dahi əsərlərdir. Məsələn, biz adətən öyrənmişik və deyirik ki, “Koroğlu” operası Üzeyir Hacıbəyovun şah əsəridir. Bunu bizim musiqişünaslar deyir, hamımız deyirik. Doğrudan da “Koroğlu” operası əzəmətli bir əsərdir və bizim opera sənətində ən yüksək zirvədə duran bir əsərdir. Ancaq gəlin baxaq görək, Üzeyir Hacıbəyovun hansı əsəri şah əsər deyildir? Bunu bir-birindən seçmək mümkün deyildir. Çünki hərəsinin özünəməxsus yeri, məzmunu və mənası vardır. Mən indi bütün personajlara diqqətlə fikir verirdim. Bunları Üzeyir Hacıbəyov sadəcə olaraq insanları güldürmək üçün yox, o vaxtkı cəmiyyəti göstərmək üçün yazıbdır və cəmiyyəti o qədər gözəl, ağıllı, real göstəribdir ki, buna heyran olursan” [XVIIIc.s.327-328].

Vaxtilə komediyanı faciə hesab edən yunan estet filosoflarının bu fikirləri sonralar sanki unuduldu. Komediya janrı təbii ki faciədən ayrıca tədqiq olunmağa başladı: "Mən əvvəllər də bu əsər haqqında belə düşünmüşəm. Amma bu gün bir daha bunu başdan-ayağa gördüm. Bir var ki, buna televiziyada kinoya baxırsan, bir də var ki, səhnədə canlı insanlara baxırsan və şübhəsiz ki, onların ifaçılıq sənətini qiymətləndirərək, eyni zamanda hər obrazın əhəmiyyətini görərək mən şəxsən belə qənaətə gəlirəm ki, bu əsər dahi bir əsərdir. Bu, heç də gülmək üçün yazılmayıbdır, bəlkə də bəzilərinin ağlaması üçün yazılıbdır. Bu, zamanın reallığıdır, ***faciəsidir***. Bu, əsərdəki hər bir epizodda görünur. Demək, kasıb Rüstəm bəydən pulnan qız almaq olarmış. Bu, doğrudan da o dövrün həqiqətidir. Yaxud, indi də bəzi jurnalistlər gəlib deyirlər ki, "pul ver, gedim məqalə yazım". Bəzən hesab edirlər ki, bu, demokratiyanın, mətbuat azadlığının nəticəsidir. Demək, bu, yüz il bundan öncə də olubdur" [XVIIIc.s.329-330].

Heydər Əliyevin dilində sözün böyük estetik gücə malik olması bir daha gündəmə gəlir: "Ancaq mənim ən çox xoşuma gələn söz, əgər unutmadımsa, bundan ibarətdir: təbiət dünyanı dəyişdirərkən cənnəti qadınla əvəz etdi. Həqiqətən belədir! ***Nə qədər gözəl sözdür, ədalətli ifadədir!*** Cəmiyyətdə, həyatda, insan cəmiyyətində qadının yerini nə qədər gözəl göstərir! Həqiqətən, biz kişilər cənnət haqqında düşünməməliyik. Cənnət – qadınlar bizim yanımızdadır. Qoy qadınlar cənnət haqqında düşünsünlər və cənnətə çatmaq üçün bu dünyada öz işlərini görsünlər. Bizim cənnətimiz buradadır" [XIXc.s.255].

Estetik dünyagörüşün formalaşması təkcə estetik dəyərlərlə məhdudlaşmır. Böyük natiqin nitqində etik dəyərlər estetikliklə dərin, daxili vəhdətdədir. Qadınlar qurultayında qadınların gözəlliyinə ünvanlanmış fikrlərdən öncə etik dəyərlər auditoriyaya ayaq açır. Azərbaycan qadınının öz xalqı

qarşısındakı xidmətləri sadalanır: "Azərbaycan qadını mərd, cəsarətli, qeyrətli, namuslu qadındır. Biz fəxr edirik ki, Azərbaycan qadını xalqımız üçün qəhrəman ərlər yetişdirir. Biz fəxr edirik ki, Azərbaycan qadını dünyaya böyük alimlər bəxş edir. Azərbaycan qadını dünyaya böyük sənət ustaları, siyasi, dövlət xadimləri bəxş edir. Bunlar hamısı Azərbaycan qadınının xidmətidir" [XIXc.s.255].

Gerçəkliyə estetik münasibətin ən yüksək forması olan incəsənət məhz estetik funksiya hesabına insanların estetik idealını, estetik hisslərini, estetik tələbatlarını, estetik maraqlarını, estetik zövqünü formalaşdırır. İncəsənətin əksər müəlliflər tərəfindən qəbul edilən funksiyaları (estetik, idraki, tərbiyəvi) arasında estetik funksiya əsas, digərləri köməkçidir [38].

Heydər Əliyevin Azərbaycan xalqının estetik dünyagörüşünün formalaşmasındakı rolu əsasən incəsənət xadimlərinin yubileylərində, onların əsərlərinin təqdimat mərasimlərindəki nitqləri, ən əsası, ən başlıcası isə dövlət səviyyəsində bu dünyagörüşün öz yerini tutmasında əməli köməkdir: "Xalqımızın estetik tərbiyəsini daha da gücləndirmək üçün Səttar Bəhlulzadənin əsərlərindən istifadə etməliyik. Ona görə də belə bir mərkəzin, belə bir muzeyin yaranması çox zəruridir" [IIIc.s.49].

Həyatı daimi hesab edən böyük estet mədəniyyətimizi də həyatla eyniləşdirir. Ən çətin dövrlərdə belə mədəniyyətə olan qayğını əsas götürür: "İndi həyatımız nə qədər çətin, ağır olsa da, biz heç vaxt mədəniyyəti unutmamalıyıq. Mədəniyyət həmişə bizimlə bərabər olmalıdır, mədəniyyətə qayğı göstərməliyik, onu inkişaf etdirməliyik. Çünki bu çətin günlər müvəqqətidir. Ancaq həyat daimidir. Mədəniyyət də, rəssamlıq da daimidir" [IIIc.s.49].

Xalqın estetik dünyagörüşünün cilalanmasında Heydər Əliyev nitqlərinin araşdırılması bu gün də aktualdır. Estetik

zövqün inkişafında incəsənətin rolu əvəzolunmazdır və bu baxımdan Ulu Öndərin tez-tez incəsənət xadimləri ilə görüşlərdə söylədiyi çıxışlar öyrənilməyə layiqdir.

Estetik dünyagörüşümüzün formalaşmasında mühüm rolu olan memarlıq eyni vaxtda insanların həm utilitar-praktiki, həm də mədəni-estetik tələbatlarının birlikdə ödənilməsini nəzərdə tutan tətbiqi, tikinti incəsənətidir [122]. Memarlıq abidələri incəsənət növü kimi Heydər Əliyevi nə qədər maraqlandırırsa, bu abidələr tariximizi, dövlətçilik tariximizi öyrənmək baxımından da o qədər maraqlıdır: "Əlbəttə, bu abidənin qiyməti yoxdur. Məsələn, çox vaxt, elə bu gün də bunu gözəl memarlıq abidəsi kimi təblig edirlər. Bu təbiidir, dogrudan da belədir. Dagılanlar dagılıb, amma qalanlar içərisində Mömünə Xatun məqbərəsi XII əsrdə, orta əsrlərdə Azərbaycanın nə qədər zəngin mədəniyyəti olduğunu, doğrudan da böyük memarlıq məktəbi oldugunu göstərir. Sən də dedin, biz də bilirik ki, Əcəmi Naxçıvani və onun yaratdığı məktəb ***təkcə*** Naxçıvanı əhatə etmir, Şərq aləminin böyük bir hissəsində onun memarlıq üslubu, memarlıq məktəbi davam edib, böyük əsərlər yaradıbdır.

Ancaq hesab edirəm ki, bu abidənin memarlıq qiyməti ilə bərabər, bizim üçün bəlkə daha da böyük qiyməti Azərbaycanın qədim dövlət olmasını göstərməsidir. Bu, ***təkcə*** memarlığın zənginliyini yox, dövlətçiliyin ***nə qədər*** zəngin olduğunu, ***nə qədər*** möhkəm olduğunu da göstərir. Əgər dövlətçilik ***o qədər*** yüksək səviyyədə olmasaydı, onlar bu cür abidənin yaradılması üçün qərar qəbul elə bilərdilərmi?" [XXIIc.s.269-270]. Memarlıqla bağlı bu kiçik mətndə "təkcə" məhdudlaşdırıcı ədatının köməyi ilə Möminə xatun abidəsinin Azərbaycanla məhdudlaşmayan, bütövlükdə Şərqi əhatə edən memarlıq abidəsi olduğunu dilə gətirir. Eləcə də "təkcə" ədatı, "nə qədər", "o qədər" miqdar zərfləri ritorik sualla hələ XII

əsrdə Azərbaycan dövlətçiliyinin zəngin ənənələrə malik olduğunu auditoriyaların şüuruna çatdırır.

Beləliklə, Heydər Əliyevin nitqlərində estetik kateqoriyaların tez-tez işlədilməsini nəzərə alaraq gələcəkdə bu sahədə geniş elmi-tədqiqatlar aparılması zərurəti göz qabağındadır.

Diqqətlə izlədikdə Heydər Əliyev nitqlərinin sanki mənəviyyat və hissiyyatdan ibarət olduğu qənaətinə gəlirsən. Keçən əsrin 90-cı illərində Naxçıvanla bağlı xatirələrində biz bunun bariz nümunəsini görürük. Blokada şəraitində yaşayan Naxçıvanda körpələrin donmasını poetik-estetik bir dillə təsvir edir. Faciə estetik tablosunu auditoriyaya sözlə-nitqlə göstərir.

Gözəlliklə (gözəl ağaclar) faciəviliyin (nə qədər uşaq çaxtadan donub öldü) sintezini verir, “bax” əmr ədatı ilə hansı şəraitdə insanların yaşamasını auditoriyaya anladır. “Amma” qarşılaşdırma bağlayıcısı ilə mənəviyyata qayıdır. “İradəsini itirməmək”, “əyilməmək” kimi etik dəyərləri eləcə də “dostluq” mənəvi dəyərini bəyan edir: “İnsanlar ağır vəziyyətdə yaşayırdı. Naxçıvanın qışı çox şaxtalıdır. Biz gecə dona-dona yatırdıq. Səhər əlimizi yumağa su tapmırdıq. Yaxşı xatirimdədir, məlumat gəldi ki, Şərur rayonunun doğum evində bir qadın uşaq doğub, sonra gedib evə. Uşaq evdə donub, ana donmuş uşağı gətirib doğum evinin baş həkiminin üstünə atıb ki, götürün. Dəhşətli faciədir!

Mən Şərura gedirdim. Vaxtilə yol boyunca gözəl ağaclar əkilmişdi. Qar dizə qədər idi. Gördüm ki, qadınlar əyinlərinə cürbəcür palaz-paltar keçiriblər, ağacları mişarlayır, kəsirlər. Gəldim bunların yanına, dedim ay bacılar, ay qardaşlar, axı, nə edirsiniz? Bu ağaclar sizə lazımdır. Dedilər ki, bilirik, bizə lazımdır, biz bu soyuğa dözürük, amma uşaqlarımız donur. Burada nə qədər uşaq şaxtadan donub öldü. Bax, belə ağır şəraitdə biz yaşadıq. Yaşadıq, amma Naxçıvan əyilmədi. Naxçıvan öz iradəsindən dönmədi. Naxçıvan yaşadı və Naxçıvan bu günlərə çıxdı” [XXIIc.s.207].

Estetiklik Ulu Öndərin dilində siyasi çalarlarla auditoriyalara yönəlir: "O vaxt bizə kömək edənlər kimlər olubdur? Birinci növbədə Türkiyə Cümhuriyyəti və onun lideri, əziz dostumuz, qardaşımız ***prezident*** Süleyman Dəmirəl" [XXIIc.s.208].

Xalqın yaşadığı faciəli günlər Heydər Əliyevin nitqində müqayisələrlə, paralellərlə auditoriyalara ayaq açır. Ritorik suallarla auditoriyanın diqqətini çadırlarda məcburi köçkün adı ilə yaşayan həmvətənlərimizin düşdüyü faciəli hallara yönəldir: "Lakin mən yenə də ümidlə yaşayıram. Son günlər bizdə yağışlar yağır. Elə leysan olmuşdu ki, Suraxanıda Ramana kəndini, başqa yerləri su basmışdı. Mən bərpa işləri görülməsi üçün xüsusi olaraq vəsait ayırmışam. Dünəndən bəri leysan yağış yağır. Əlbəttə, hər bir insan bundan əziyyət çəkir. Amma siz çadırlardakı adamların vəziyyətini təsəvvür ***edirsinizmi***? Göydən tökülən bu qədər suyu çadır necə saxlaya ***bilər***? Buna görə də vəziyyət çox ağırdır" [XXIIIc.s.198-199].

İncəsənətin gözəlliyi həm forma kamilliyində, həm də məzmun dərinliyindədir. Plutarx, qədim dünyanın iki böyük tribununun natiqlik sənətini müqayisə edərək yazmışdı ki, Siseron danışanda dinləyicilər fikirləşərdilər: "O necə istedadlıdır, necə dilavərdir, necə gözəl danışır". Demosfen danışanda dinləyicilərin hamısını bir ovqatda kökləyən ehtiras bürüyərdi: "Rədd olsun tiranlar!" Əlbəttə, Siseronun nitqinin forma gözəlliyindən Demosfenin nitqinin məzmun gözəlliyi yüksəkdir [19,s.47].

İncəsənət adamları sənətkar olmağa həvəsləndirir, daha doğrusu, onlarda predmetlərin daxili meyarını tapmaq, onların xüsusiyyətlərini insanın mənəvi dünyası ilə əlaqələndirmək qabiliyyətini tərbiyə edir, gözəlliyi duymağı, dərk etməyi və onun qanunlarına uyğun şəkildə yaratmağı öyrədir. Öz obrazlarında incəsənət gözəllik ideallarını təcəssüm etdirir [19,s.48].

"Hətta" ədatı ilə çıxış etməyin Heydər Əliyev üçün estetik zövq olduğu məlum olur. "Hər adamın öz vərdişi var" ifadəsi ilə yaradılış baxımından, nitq söyləmək baxımından insanların fərqliliyi başa düşülür.

"Əgər" şərt bağlayıcılarının təkrarı və feilin şərt şəkli ilə nitq prosesinin məntiqi ardıcıllıqla – fikirlərin formalaşması – yığılıb cəmləşməsi – üzə çıxması – auditoriyalara izahı, "xüsusən" modalı ilə böyük natiqin təvazökarlıq nümayiş etdirməsi natiqliyin bir daha estetik zövq yaradan sənət olması fikrini diqqətə çatdırır: "Sonra. Hətta sovet dövründə də mən respublikamızda əsasən mətnsiz çıxış edirdim. Moskvada isə bir dəfə belə etdikdə, mənə dedilər ki, belə lazım deyil. Hamı çıxışını mətndən oxuyur, siz fərqlənmək istəyirsiniz? Bu, ona görə deyildi ki, mən fərqlənmək istəyirəm. Sadəcə olaraq, hər adamın öz vərdişi var, bu vərdiş isə məndə çoxdan yaranmışdır. Əgər sən işlədiyin, çalışdığın yerdəki həyatla həqiqətən yaşayırsansa, onda belə etmək olar. Əgər sən işi bilirsənsə, onunla hər gün məşğulsansa, onda bunların hamısı yaddaşında yığılır, fikirlərini formalaşdırır. Fikirlər isə bir gündə, tutalım, sənə haradasa çıxış etmək lazım olanda formalışmır. Onlar tədricən formalaşır, yığılıb cəmləşir və gərək olduqda, lazım gəldikdə üzə çıxır. Mən belə təsəvvür edirəm. Bu barədə danışmaq mənim üçün çətindir, xüsusən də söhbət məndən gedəndə. Amma mən bunu belə təsəvvür edirəm. O ki qaldı mənim idman formama, sağ olun. ***Axı***, mən cavan adam deyiləm, neçə yaşım olduğunu bilirsiniz" [XXVIc.s.7].

Geyim estetikası və texniki estetikada Heydər Əliyevin nitqlərində mühüm yer tutmuşdur. "Şadam ki, siz buraya gəlmisiniz. İndi moda xüsusi əhəmiyyətə malikdir və modanın həmişə əhəmiyyəti olubdur, amma indi onun xüsusi əhəmiyyəti var. Azərbaycanlılar da modadan geri qalmaq istəmirlər. Buna görə də sizin buraya gəlişinizin, məncə, böyük əhəmiyyəti olacaqdır" [XXVIIIc.s.278].

Sovetlər İttifaqı dövründə bizim öz modamız, onların öz modası vardı. Amma buna baxmayaraq, əksəriyyət, hər halda, Avropa modasından istifadə etməyi üstün tuturdu. Əlbəttə, fərq böyük idi. Ancaq indi, siz doğru deyirsiniz, biz hamımız birlikdəyik – Rusiyada da, başqa ölkələrdə də, keçmiş Sovetlər İttifaqı ərazisindəki müstəqil dövlətlərdə də artıq bu sahə əhəmiyyət kəsb edir və ictimaiyyətdə maraq doğurur. Sovet dövründə Moskvada moda nümayiş etdirilərkən ona ancaq sayseçmə adamlar maraq və həvəs göstərirdilər. Yadımdadır, mən Moskvada yaşayarkən "Burda moden" jurnalının baş redaktoru ilk dəfə oraya gəlmişdi. Bu həmin dövr idi ki, Sovetlər İttifaqında müəyyən proseslər baş verirdi. Xatirimdədir, İttifaqlar evində "Burda moden" moda nümayiş etdirirdi, adamlar oraya can atırdılar, oraya gedə bilənlər də oldu, bilməyənlər də və sair. Mən həmin "Burda moden" jurnalını götürüb baxdım. İndi "Burda moden" daha elə geniş şöhrətə malik deyildir. Nəyə görə? Ona görə ki, o vaxt bu bizdə yox idi və lakin birdən peyda oldu. Bu jurnalı əldə etmək üçün böyük canfəşanlıq göstərilirdi [XXVIIIc.s.279].

**Heydər Əliyev:** Bilirsiniz, bir halda ki, biz sizinlə görüşürük və söhbət edirik, demək istəyirəm – tarixən elə olub ki, hər bir xalqın öz geyim forması olmuşdur. İndi dünyada qəbul edilmiş geyim forması isə Avropada yaranmışdır. Bununla belə, keçmiş zamanlarda, neçə-neçə əsrlər bundan əvvəl çox gözəl şəxsi geyim formaları olub və indi də tətbiq edilə bilər. Həmin geyimi indi biz ancaq teatrda və ya kinoda görürük. Məsələn, hansısa tarixi mövzuda film çəkirlər, onda sən bunu görürsən. Xüsusən də qadın paltarından söhbət düşəndə – çünki kişi geyimi dəyişmişdir – qadın modasından söhbət gedəndə, məsələn, bizdə köhnə fotoşəkillərdə və ya rəssamlarımızın əsərlərində – yeri gəlmişkən, bizim yaxşı teatr rəssamlarımız olub, onlar müxtəlif tamaşalar, xüsusən də keçmiş tariximizə aid tamaşalar üçün eskizlər veriblər – bunlar

qalmışdır. Azərbaycanda gözəl, çox gözəl qadın geyimi olmuşdur. Təkrar edirəm, indi onu yalnız bizim filmlərdə və tamaşalarda görmək mümkündür.

Mən 70-ci illərdə burada, Azərbaycanda işləyərkən məndə belə bir fikir yaranırdı – niyə də təklif edilməsin ki, qadınlarımız Avropa geyimləri ilə yanaşı, öz milli paltarımızı da geysinlər? Axı öz milli geyimimiz çox gözəldir. Onu modernləşdirmək olar. Elə rəsmlərdə – rəssamlarımızın əsərlərində gördüyüm qadınların da geyimi çox qəşəngdir və bundan niyə istifadə edilməsin? Onda dünyada rəngarənglik olar. Yoxsa ki, indi təkcə Avropa modasını əsas götür-müşlər. Şəxsən mən azərbaycanlı kişilərin keçmiş vaxtlarda geyindikləri paltar formasına qayıtmaq istəməzdim. Qadın geyiminin isə çox gözəl və cürbəcür olduğunu, zənnimcə, bilirsiniz – kataloqlar, kitablar var. Mən hətta bir dəfə rəhmətlik həyat yoldaşıma təklif etdim ki, gəl, qızımıza belə kostyum tikdirək və qoy onu geyib bizimlə birlikdə bir yerə getsin, bəlkə bununla başqalarına nümunə göstərərik və onlar da belə edərlər. Amma baş tutmadı” [XXVIIIc.s.281-282].

Bu məqamda XVIII əsr Azərbaycan qadınlarının geyim estetikası ilə bağlı Molla Pənah Vaqifin şeirlərini yada salmaq pis olmaz:

Gümüş biləklərin, bəyaz qolların,
Sarı kəhrabası, hayıf ki, yoxdur! [92,s.111]

Molla Pənah Vaqifin şeirlərində geyim estetikası xüsusi yer tutur. Libasın, geyimin estetik zövq yaratması ədəbiyyatımızda yeni bir şey deyildir.

Gah zaman başına tirmə şal bağlar,
Gah olur ki, zülf gizləyib, xal bağlar,
Kalağayın qabağına al bağlar,
Yaşılın altından, ağın üstündən. [92,s.70]

Boyu yaraşıqlı sərvi-xuraman,
Əndamıdır ağ gül, sinəsi meydan,
Kəlağayı gülgəz, libası əlvan,
Bir güli-rənadır mənim sevdigim. [92,s.64]

Nə əcəb təsvir olur ağ əllərə əlvan ***həna***,
Məxmuri gözlər piyalə, gərdəni misli mina,
Al ***sərəndazla*** qəsabə, üstü türfə ağ ***cuna***,
Qol gümüş ***bazbəndli***, beldə kəmər-üstü ***mina***,
Məclis içrə bu nişanda saqi öldürdü məni. [92,s.169]

Azərbaycan estetik dünyagörüşünün formalaşmasında rolu şəksiz olan Heydər Əliyev şəxsiyyəti hər bir məqamda özünü göstərir: "Biz kişilər belə sürətlə dəyişən moda ilə çətin ki, ayaqlaşaq. Qadınlara isə bu gərəkdir. Gəlişinizə görə sizə bir daha təşəkkür etmək istəyirəm, siz bizə kömək edəcəksiniz. Mən ciddi şəkildə hesab edirəm ki, ölkəmiz, müstəqil dövlətimiz bu istiqamətdə də öz yerini tutmalıdır. ***Görürsünüz***, nə qədər kafelər, restoranlar, mağazalar tikilib, çox şey dəyişibdir, çoxlu tikinti var. Odur ki, gərək bu işdə də eyni proseslər baş versin. Mən sizin buraya səfərinizi dəstəkləyirəm. Fatma xanım mənə dedi ki, bu gün siz çoxlu yeni moda nümunələri nümayiş etdirəcəksiniz. Yəqin ki, böyük maraq var. Sizə uğurlar arzulayıram. Mən isə bu axşam Çin nümayəndə heyəti ilə olacağam" [XXVIIIc.s.284].

Mənəviyyatımızın inkişafı baxımından estetik elementlərin böyük rol oynadığı Heydər Əliyevin Novruz bayramı münasibətilə söylədiyi nitqlərdə aşkar görünür. Pessimizmə qapılmamağın, "dərddən-qəmdən xilas olmağın" yolu estetik elementlərin (çalmaq, oynamaq, bayram etmək) həyata keçirilməsi ilə bağlıdır. Məhz həmin estetik elementlər sinonim cərgədə (məğrur, cəsur, qəhrəman) etik dəyərlərin forma-

laşmasına gətirib çıxarır: ”Novruz bayramında adətən insanlar istəyirlər ki, dərddən-qəmdən xilas olsunlar, dərddən-qəmdən uzaqlaşsınlar, ya da bundan sonra dərd-qəm olmasın. Hamıya arzu edirəm ki, bu il, bu bayramdan sonra heç kəsin dərdi-qəmi olmasın. Olsa da elə olsun ki, insanlar o dərdi-qəmi, kədəri keçirə bilsinlər [XXVIc.s.7-8].

Nəhayət, düşünürük ki, Heydər Əliyev nitqlərində estetik elementlərin qısaca da olsa izahı estetik kateqoriyaların (gözəllik, faciəvilik, komizm), incəsəntin müxtəlif formalarının (bədii ədəbiyyat, rəssamlıq, musiqi, memarlıq, teatr, kino) formalarının anlaşılmasına kömək edəcək.

## 2.1.1. Heydər Əliyevin nitqində gözəllik

Gözəllik haqqında qədim yunan filosoflarından tutmuş müasir estetlərə qədər müxtəlif fikirlərin mövcudluğu yeni bir şey deyildir. Alman filosofu Kanta görə gözəllik xalis forma anlayışıdır. Bu, əşyanın zahirini, görkəmini seyr etməkdən doğan valehlik hissidir. Burada məqsəd, məna, xeyir, fayda axtarmaq lazım deyildir. Beləliklə, Kant fəlsəfənin əsas məsələlərində olduğu kimi, estetikada, xüsusilə gözəllik probleminin şərhində də aqnostik mövqe tutur, məzmunla formanı qarşı-qarşıya qoyur. O, gözəlliyi xalis formaya aid edir [159, 160]. Heydər Əliyevin gözəlliyə münasibətinə gəlincə fəlsəfənin ümumi dialektik qanunları estetik sahəyə də şamil olunur. Belə ki, böyük natiqin nitqlərində forma və məzmun ayrılmır: "Azərbaycan qadınlarının bir xüsusiyyəti də vardır: Azərbaycan qadınları çox gözəldirlər. Ümumiyyətlə, gözəllik anlayışını insanlar cürbəcür anlayırlar, dərk edirlər. Bu da təbiidir. Təbiətin də gözəlliyi vardır, hər bir insanın da gözəlliyi vardır. Amma gözəllik əsl mənada cəmiyyətdə olan gözəllikdir və bu, sadəcə, bir xarici görünüş deyildir. Gözəllik *həm* xarici olur, *həm də* daxili olur. Ancaq bu gözəllik anlayışının daşıyıcısı həmişə qadınlar olur. Hər bir millətin gözəlliyini nümayiş etdirən qadın olur" [XVc.s.42-43].

Borev yazır: "Harmoniyanı, simmetriyanı bizi əhatə edən aləmdəki gözəllik kimi qavrayırıq. Materiyanın bu köklü xassəsi – onun quruluşunun harmoniya və simmetrikliyi – ağac yarpağında da, müxtəlif canlıların bədən quruluşunda da, insanın özündə də təkrar olunur" [19,s.40]. Heydər Əliyev üçün də ölçü və miqyas gözəlliyin qiymətləndirilməsində mühümdür. Hüseyn Cavidin məqbərəsi ilə bağlı fikirlər bu sıradandır. "Nə", "nə də" inkar bağlayıcıları ilə nəhənglikdən qaçmağı məsləhət görür. "Nəhənglik", "ülvilik" olan yerdə, eləcə də "məqbərənin o tərəfdən, bu tərəfdən açıq olmasının

tərəfdarı deyiləm" deməklə, gur işıq olan yerdə düşünməyin, gözəlliyi duymağın çətinliyini nəzərdə tutur. "Oradakı yeri mütləq nəzərə almaq lazımdır" deməklə gözəllik və miqyas dialektik vəhdətinə işarə edir. "Sakit bir mühit olsun" deyimi Hüseyn Cavid dünyasına baş vurmağa gələn ziyarətçilər üçündür: "Ancaq mən ümumi fikirləri demək istəyirəm. Həmin fikirlər bundan ibarətdir ki, nəhənglikdən uzaq olmaq, ***oradakı yeri mütləq nəzərə almaq lazımdır.*** Elə olmalıdır ki, məqbərə ***nə*** çox böyük, ***nə də*** çox kiçik olmasın. Əsas fikrim belədir: qəbir məqbərənin içində olsun və orada elə bir şərait yaradılsın ki, insan girib orada ziyarət edə bilsin, qəbrin yanında dursun, ***düşünsün***. Məqbərənin o tərəfdən, bu tərəfdən açıq olmasının tərəfdarı deyiləm. Tarixən yaradılan məqbərələrin də hamısı tamam örtülü olmayıb. Məsələn, Möminə Xatun məqbərəsi tam qapalıdır, ancaq haradansa yuxarıdan bir balaca işıq düşür. Belə də olmalıdır. Bayaq Mola Pənah Vaqifin məqbərəsini ona görə yada saldım ki, o ***həm*** qapalı idi, ***həm də*** hər yerdən içinə işıq düşürdü. Elə etmək lazımdır ki, bu məqbərənin içində ***sakit bir mühit olsun***" [IVc.s.11].

"Gözəllik eyni zamanda sadə olanda daha gözəl görünür" ifadəsində "daha" ədatı ilə sadəliyin gözəlliyi artıran bir dəyər olduğu nəzərə çarpdırılır. Heydər Əliyev üçün incəsənət əsərlərində gözəllik milliliklə müşayiət olunduqda xüsusi dəyərə malik olur: "Bu baxımdan arzu edirəm ki, bu layihələrin hansınısa seçək, birləşdirək, sintez edək, bir də baxaq. Amma bu amili də nəzərdə tutaq ki, müasirlik də olsun, ***ancaq*** milli memarlıq ənənləri də unudulmasın. Həm gözəl, həm də sadə olsun. Gözəllik eyni zamanda sadə olanda ***daha*** gözəl görünür" [IVc.s.12].

Platona görə gözəllik-hansısa ayrıca götürülmüş predmetin gözəlliyi, yaxud gözəl predmet deyil, bu predmet və hadisələrin bütöv bir qisminə aid olan, onların hamısını əhatə edən ən ümumi bir cəhətdir. Platona görə ruhlar cisimlərdən,

ideyalar isə ruhlardan daha kamildir. Ona görə də, estetika yalnız cisimlərlə məhdudlaşmağı özünə rəva görə bilməzdi. Çünki ruhların və ideyaların gözəlliyi cisimlərin gözəlliyindən daha üstündür [182].

Estetlər gözəlliyi müxtəlif formalarda verməyə çalışırlar: [122,s.27]. Təbiətdəki gözəllik, cəmiyyətdəki gözəllik, insan əli ilə yaradılmış gözəllik, insan gözəlliyi. Təbiətdəki gözəllik adətən niyyətsiz və təmənnasız gözəllik hesab edilir. Çünki təbiətdə gözəllik heç bir niyyətlə yaradılmır. Sadəcə olaraq, Allahın yaratdığı hər bir şeyin gözəl olması aksiomdur. Allah hər şeyi insan üçün təmənnasız yaradıb. Təbiət gözəlliyindən həzz alan insan bunun əvəzini vermək barədə heç düşünmür də. Heydər Əliyev üçün "gözəllik" həm də qadınların "keyfiyyət" halıdır. "Bilirsiniz" modal sözü ilə qadın gözəlliyi ilə bağlı estetik fikirlərə yer ayırır. Belə fəlsəfi fikirlərin milyonların şüuruna yönəldilməsi məişət çalarlı nitqlə həyata keçirilir. "Ancaq" qarşılaşma bağlayıcısı ilə gözəlliyə münasibətin dəyişməsini, Azərbaycan qadınının "bütün dünyadakı qadınlardan gözəl olmasından" söhbət açır, qadın auditoriyası böyük natiqin ecazkar nitqi ilə fəth olunur: "Azərbaycan qadınlarının bir keyfiyyətini də mən qeyd etmək istəyirəm. O da bizim qadınlarımızın gözəlliyidir. ***Bilirsiniz***, biz əvvəllər, məsələn, dünyada, hansı ölkədə qadın nə qədər gözəldir – onu o qədər də bilmirdik. Mənim yadımdadır, gənc olarkən biz bir-birimizlə söhbət aparırdıq – gənc vaxtlarında insanlar bu barədə söhbətləri daha çox aparırlar – hansı millətin qadını daha gözəldir? İndi mən demirəm ki, o vaxtlar biz hansı millətin qadınlarını gözəl hesab edirdik. Amma mən sizə deyim, hamı belə fikirləşirdi ki, – hər halda, ətrafımda olanlar, hansılarla ki, mən təmasda idim – başqa qadınlar bizim qadınlardan gözəldir. ***Ancaq*** indi dünya bizim üzümüzə açıldı, hər yerə getdik, bütün ölkələri gördük. Hamımız dünyanın hər yerini görmüşük – kimi az, kimi çox. Mən özümü deyə bilərəm, baş-

qalarının fikrini bilmirəm. Mən dünyanın çox yerini gəzmişəm, qadınlarını görmüşəm. Fikrim belədir ki, Azərbaycan qadını bütün dünyadakı qadınlardan gözəldir [XIXc.s.256-257].

Mən bu gün sizinlə görüşə gələrkən düşünürdüm ki, ***ürəyimdə qadınlara aid olan bütün hissiyyatların hamısını*** sizə deyim. Amma vaxtınızı almaq istəmirəm. Siz bilirsiniz ki, mən bir dövlət başçısı kimi Azərbaycan qadınlarının fəaliyyətini, onların cəmiyyətdə rolunu həmişə yüksək qiymətləndirmişəm və qiymətləndirirəm. Qadınlar çox cəsarətlidirlər, təəssübkeşdirlər, vətənpərvərdirlər. Vətəni, ədaləti sevəndirlər. Mən bunu 1994-cü il oktyabr ayının 4-5-də bir daha gördüm [XVc.s.42]. "Bütün hissiyyatlar" dedikdə estetik zövqün formalaşmasına gətirib çıxaran estetik hisslər nəzərdə tutulur ki, bu hisslərdən öncə etik dəyərlər dilə gətirilir, qadın auditoriyası fəth edilir.

Millilikə yoğrulmuş Heydər Əliyev nitqləri müxtəlif çeşidli, müxtəlif üslublu auditoriyalarda günəş kimi parlayır. Gözəllikdən danışanda belə, qadınlar auditoriyasında belə milli dəyərlər bu nitqi tərk etmir: "Biz indi ölkəmizin qadınlarını bütün dünyaya açmışıq. Dünyanın çox yerlərinə getmişik, görmüşük. Biz iyirmi, otuz, yaxud əlli il bundan öncə hansı ölkədə insanların nə cür olmasını bilmirdik. Sadəcə olaraq, onları ayrı-ayrı rəsmlərdə, filmlərdə görürdüksə, indi hamısını öz gözümüzlə görürük. Bilmirəm, kimin gözünə hansı ölkədəki qadınlar necə görünür, amma mənim gözümə görə, ***dünyanın heç bir yerində Azərbaycandakı qadınlar kimi qadın yoxdur***" [XVc.s.43].

Dialektik qanunlar Heydər Əliyev nitqində estetika sahəsində də özünü göstərir: "Bilirsiniz, məşhur rus yazıçısı Çexov demişdir ki, insanda hər şey gözəl olmalıdır. Şübhəsiz ki, gözəllik insan üçün xüsusi əhəmiyyət kəsb edən amildir. Millətin gözəlliyi hər bir insanın gözəlliyindən meydana gəlir. Ona görə də mən həmişə millətim haqqında düşünürəm. Mən

millətimin ***həm*** mənəviyyatı haqqında düşünürəm, ***həm*** əxlaqı haqqında, ***həm də*** onun gözəlliyi haqqında düşünürəm. ***Həm*** zahiri gözəllik, ***həm*** daxili gözəllik. Bunların hamısını anlamaq üçün qadınların gözəlliyi həmişə nümunədir" [XVc.s.43-44]. Burada millət tam, hər bir insansa fərd kimi verilirsə, "həm", "həm də" bölüşdürücü bağlayıcılarla mənəviyyat, əxlaq, gözəllik anlayışlarının vəhdəti verilir. Bu məqamda Azərbaycan estetik fikrinin formalaşmasında əsərləri mühüm rol oynayan, Ulu Öndər demiş "millətin gözəlliyi"ni tərənnüm edən N.Gəncəvini [107, 108, 109], M.P.Vaqifi [92], Aşıq Ələsgəri [12], Aşıq Şəmşiri [13,14] yada salmamaq olmur.

8 Mart Beynəlxalq Qadinlar Gününə həsr olunmuş təntənəli gecədəki nitqdə "Azərbaycan qadınları eyni zamanda cəmiyyətimizi gözəlləşdirirlər, insanlarda sevinc, məhəbbət, nikbinlik hissləri yaradırlar. Bizim qadınların içərisində çox görkəmli incəsənət xadimləri vardır. Biz onları sevirik və onlar bizim mədəniyyətimizi günü-gündən inkişaf etdirirlər. Onlar ölkəmizdən xaricə gedərkən, başqa ölkələrdə olarkən millətimizin nə qədər yüksək mədəniyyətə sahib olduğunu çox gözəl nümayiş etdirir və təmsil edirlər" [XVc.s.41-42].

Heydər Əliyevin özü demiş, gözəlliyin daşıyıcısı qadınlar olsa belə, Azərbaycan qadınlarında "vətən, vətənpərvərlik hissi, vətəndaşlıq hissi" gözəllikdən öndədir. Qadınlarımızın gözəlliyindən öncə vətənpərvərlikdən danışmaq əbəs deyildir. Çünki, etik dəyərlər sırasında olan vətənpərvərlik olmadan, müstəqillik olmadan gözəllikdən danışmaq çətindir. Estetik zövq mənbəyi sayılan gözəlliyi müstəqillik olmadan qəbul etmək mümkün deyil. "Ən" qüvvətləndirici ədatı ilə vətəni sevməyin yüksək anlayış olduğunu auditoriyaya bəyan edir: "Bu, təsadüfi deyildi. Çünki, bir daha qeyd edirəm, qadınlarda vətən, vətənpərvərlik hissi, vətəndaşlıq hissi çox yüksəkdir. Bu, çox sevindiricidir. Çünki qadınlar bu hissləri öz uşaqlarına, övladlarına, balalarına verirlər. Beləliklə də bizdə vətən-

pərvərlik hissləri günü-gündən inkişaf edir, artır. Bu, bizim üçün çox lazımdır. Biz müstəqil ölkəmizi, müstəqil dövlətimizi qurub yaradırıq, inkişaf etdiririk. Dövlət müstəqilliyimiz çətin və ağır şəraitdə yaranır və biz çalışırıq ki, dövlət müstəqilliyinin əsasını elə qoyaq ki, heç bir qüvvə onu yenidən tərpədə bilməsin. Biz buna nail oluruq və olacağıq. Buna görə də vətənpərvərlik, vətənə sədaqət, vətəni sevmək hissləri hər bir azərbaycanlı üçün ən yüksək anlayışdır. Bunlara nail olmaq üçün qadınlar bundan sonra da öz müqəddəs vəzifələrini yerinə yetirməlidirlər və əminəm ki, yerinə yetirəcəklər.

"Ümumilikdə" yekunlaşdırıcı modal sözlə Heydər Əliyev gözəllik məfhumuna sanki yekun vurur. "Amma" qarşılaşma bağlayıcısı ilə gözəlliyin cəmiyyətdə olan gözəllikdən ibarət olduğunu qeyd edir ki, bu da Heydər Əliyevin dövlət başçısı kimi gözəlliyə olan müasibətidir.

Gözəlliyi Kant [159] kimi xalis forma hesab etmir. "Həm", "həm də" iştirak bağlayıcları ilə gözəlliyin xarici və daxili təriflərinin olduğunu qeyd edir. "Hər bir millətin gözəlliyini nümayiş etdirən qadın olur" deyiminə uyğun olaraq Aşıq Ələsgərin və Aşıq Şəmşirin Azərbaycan qadınını vəsf edən şeirləri ilə həmahəng səslənir: "Azərbaycan qadınlarının bir xüsusiyyəti də vardır: Azərbaycan qadınları çox gözəldirlər. Ümumiyyətlə, gözəllik anlayışını insanlar cürbəcür anlayırlar, dərk edirlər. Bu da təbiidir. Təbiətin də gözəlliyi vardır, hər bir insanın da gözəlliyi vardır. Amma gözəllik əsl mənada cəmiyyətdə olan gözəllikdir və bu, sadəcə, bir xarici görünüş deyildir. Gözəllik həm xarici olur, həm də daxili olur. Ancaq bu gözəllik anlayışının daşıyıcısı həmişə qadınlar olur. Hər bir millətin gözəlliyini nümayiş etdirən qadın olur".

"Heç kəs", "heç vaxt" inkarlıq ifadələri ilə gözəlliyə münasibətdə sərt, prinsipial milli təəssübkeşliyi müdafiə edən nitq nümunəsi yaradır. Həm cümlə, həm də söz kimi işlədilən

“xeyr” ədatı ilə milli təəssübkeşlik nümunəsi göstərir. “Ümidvaram ki” gələcəyə tuşlanan proqnostik fikri irəli sürür: “Ümumiyyətlə biz həqiqətən də fəxr edə bilərik ki, millətimiz gözəl millətdir. Heç kəs heç vaxt deməsin ki, bu barədə bizim millətimiz hansı millətdənsə aşağı səviyyədədir. Xeyr. Bizim millətimiz istedadlı millətdir, gözəl millətdir, qəhrəman millətdir. Biz bununla fəxr edə bilərik. Ümidvaram ki, mənim bu sözlərimi gələcək daim təsdiq edəcəkdir” [XVc.s.44].

Heydər Əliyev üçün qadın gözəlliyi təkcə zahiri gözəlliklə deyil. Gözəllik ağla, zəkaya söykənir. Böyük natiq üçün gözəllik mühit, mənzərə, əhval-ruhiyyədir. Gözəllik dialektik vəhdətdədir, “kişilərsiz qadın gözəlliyi yarımçıqdır”: “Qadınlar insan cəmiyyətinin ən gözəl, ən zəkalı hissəsi olduğuna görə, təsəvvür edin, bu salonda ***nə qədər*** gözəllik var! Əgər ayrı-ayrı kişilər, bu nazirlər burada oturmasaydılar bu salon necə olardı. Ancaq bilirəm ki, siz buna razı olmazdınız, çünki siz də istəyirsiniz ki, aranızda bir az kişilər olsun. ***Həqiqətən***, çox gözəl bir mənzərədir, gözəl mühit, gözəl əhval-ruhiyyədir” [XVIIc.s.306].

“Azərbaycan qadını tarix boyu öz ağlı, zəkası, namusu, qeyrəti, isməti ilə, fədakarlığı, çalışqanlığı, mərdliyi, vətənpərvərliyi ilə, millətinə, torpağına olan hədsiz məhəbbəti ilə və gözəlliyi, Azərbaycan xalqının xüsusiyyətləri ilə tanınmışdır. Ancaq bununla bərabər, əsrlər boyu Azərbaycan qadınının üzərinə böyük zəhmətlər düşmüşdür. O zəhməti də qadın həmişə mərdliklə, cəsarətlə çəkmişdir və heç vaxt bu zəhmətdən inciməmişdir. Tarixi keçmişimizdə Azərbaycan qadınının görkəmli nümayəndələri olmuşdur. Onların adları dünən də, bu gün də burada çəkilibdir. Ancaq bununla yanaşı, Azərbaycan qadını əsrlər boyu bir çox hüquqlardan məhrum olmuşdur” [XVIIc.s.307].

Sözün estetik gücündən yararlanmaq böyük natiqin nitq ustalığı ilə bağlıdır. “Gözəllik” estetik kateqoriyasını etik-

mənəvi dəyərlərdən (qeyrət, namus, ağıl, istedad, sədaqət) ayırmır: “Azərbaycan qadını haqqında çox yazılıb, çox deyilib. Bu gün də burada natiqlər hamısı Azərbaycan qadınının ***qeyrətindən, namusundan, ağlından, istedadından, gözəlliyindən, sədaqətindən*** xoş sözlər dedilər. Mən bütün sözlərin, ifadələrin hamısı ilə tam razıyam. Həmin sözlər mənim də qəlbimdən gələn sözlərdir [XIXc.s.254].

Heydər Əliyev dilində təbiət insanlaşır. Belə yanaşma Azərbaycan ədəbiyyatında təzə bir şey deyil. Necə ki Aşıq Şəmşir şeirində Azərbaycanın bir hissəsi olan Naxçıvan “insanlaşır”, “ülvüləşir”:

“Öpsəm torpağını dağılar dərdim,
Bəzəkli şəhrinə səcdə edərdim.
Səni görən deyər cənnəti gördüm,
Səni görmək bir murazdı, Naxçıvan” [14].

Təbiətin ülvi gözəllik elementləri (məğrurluq, qəhrəmanlıq) insan gözəlliyi ilə qoşalaşır. Naxçıvanın çox gözəllikləri var. Birincisi, onun təbiətidir. Azərbaycanın hər yerində gözəl guşə tapmaq olar. Haraya gedirsən, Azərbaycan gözəl bir yerdir. Amma mən bu gün Naxçıvandayam və Naxçıvan haqqında danışıram. Naxçıvanın təbiətinin gözəlliyi məğrurluq rəmzidir. Bax, ətrafda görünən dağlar, qayalar, çılpaq torpaqlar, – burada yaşıllıq azdır, – bu diyara xüsusi gözəllik verir. Ancaq bu gözəllik, yenə də deyirəm, qəhrəmanlıq, məğrurluq rəmzidir. O məğrur dağlar kimi, insanlar da məğrurdurlar. Mən bu fikri bir dəfə demişəm, bir də təkrar etmək istəyirəm, – Naxçıvanın gözəlliyi kişi gözəlliyidir. Güman edirəm, siz məni düzgün başa düşəcəksiniz. Mən bu sözü izah etməliyəm, ola bilər, sonra başqa cür başa düşərlər.

Hələ yunan filosofu Sokrat Hibbidən soruşurdu: Nə gözəldir? Gözəl qız şübhəsiz gözəldir. Bu fikir özlüyündə gözəl-

liyin etalonunun qadın olduğunu göstərir. "Təkcə Azərbaycanda deyil, ümumiyyətlə, bəşəriyyətdə qadın gözəlliyi gözəlliyin rəmzidir" fikri Heydər Əliyevə məxsusdur: "Ümumiyyətlə, həyatda hamı "gözəl" deyəndə ancaq qadını nəzərdə tutur: qadın gözəlliyi. Tarix boyu bizim ulu babalarımız həmişə gözəl qadınlar haqqında yazıblar. Nizami Gəncəvi də gözəl qadınları vəsf edib – "Leyli və Məcnun"da. Füzuli də, başqası da. Təkcə Azərbaycanda deyil, ümumiyyətlə, bəşəriyyətdə qadın gözəlliyi gözəlliyin rəmzidir. Kişiyə adətən gözəl deməzlər. Bəzən gözəl desən də, bəlkə acığına gələr. Amma kişiyə məxsus da gözəllik var. O gözəllik həmin o dağların gözəlliyidir, burada olan gözəllik, ***ancaq sərt təbiətin, iqlimin gözəlliyidir***. Bütün bu təbiət buradakı insanlara müəyyən qədər xüsusiyyətlər verir. Bu xüsusiyyətlərdən isə, – mənə elə gəlir, mən belə düşünürəm, – ən dəyərlisi odur ki, naxçıvanlılar həmişə milli şüurla yaşamışlar. Millilik, azərbaycançılıq, milli şüur Azərbaycanda həmişə yüksək olmuşdur" [XXIIc.s.201].

Böyük natiqin nitqində "estetik zövq verməyin" sinonimi elə "ilham verməkdir": "Bu gün bu salon həmişəkindən daha da gözəldir. Çünki salonun əksəriyyətini təşkil edən qadınlardır. Qadın gözəlliyi bu salona daha da çox işıq verir və salondakı kişilərə, o cümlədən mənə də ***ilham verir***" [XXVc.s.319].

Gözəllik daşıyıcısı qadınların "ilham verməsi" ilə kifayətlənməyən ümummilli lider Azərbaycan qadınının cəmiyyətdəki rolunu estetik bir dillə aşağıdakı kimi aydınlaşdırır: "Amma təkcə buna görə yox. Bu bayram doğrudan da bizim bütün bayramlar içərisində ən gözəl bayramdır. Bu, qadınlara həsr olunubdur. İnsan cəmiyyətində qadınların rolu, əhəmiyyəti məlumdur. Qısaca onu demək olar ki, ***qadınsız insan yoxdur. Qadınsız həyat yoxdur***. Bu, həmişə belə olub, bu gün də belədir, gələcəkdə də belə olacaqdır" [XXVc.s.319].

Növbəti çıxış mərhələsində Ulu Öndər Azərbaycan qadınının gözəlliklə yanaşı daşıdığı etik dəyərləri bir-bir sadalayır (ağlı, zəkası, müdrikliyi, sədaqəti, qəhrəmanlığı, vəfası, yüksək analıq keyfiyyəti). "Məhz" dəqiqləşdirici ədatı ilə Azərbaycan həyatında qadınların tutduğu mövqe (qadınlar bu sahələrdə işləyənlərin 60 faizini, bəlkə də çoxunu təşkil edir) açıqlanır. Təhsil etikasına uyğun şəkildə xalqın, millətin təhsil almasında qadınların öncül yer tutmasını xüsusi qeyd edir: "Azərbaycan qadını öz ***ağlı, zəkası, müdrikliyi, sədaqəti, qəhrəmanlığı, vəfası, yüksək analıq keyfiyyəti*** ilə bizim xalqımızı, millətimizi daim ucaldıbdır [XXVc.s.320].

Biz fəxr edirik ki, Azərbaycan qadınları həm elmdə, mədəniyyətdə, təhsildə, səhiyyədə, həm də iqtisadiyyatın bütün sahələrində – sənayedə, kənd təsərrüfatında, ticarətdə, hər sahədə özlərini göstərdilər və ölkəmizin, millətimizin inkişafına öz töhfələrini verdilər. ***Məhz*** qadınların bu cür geniş fəaliyyəti nəticəsində Azərbaycanda qısa müddətdə təhsil inkişaf etdi, insanlar savadlandı və Azərbaycan təhsili belə yüksək səviyyəyə qalxdı. Qadınların fədakar zəhməti nəticəsində Azərbaycanın səhiyyəsi belə yüksəklərə qalxdı. Mən bu sahələri ona görə xüsusi qeyd edirəm ki, bildiyiniz kimi, Azərbaycanda ***qadınlar bu sahələrdə işləyənlərin 60 faizini, bəlkə də çoxunu təşkil edir***" [XXVc.s.320].

Başqa bir məqamda "gözəllik"lə tibbi etikanı qoşalaşdıraraq auditoriyanı sözün sehrinə salır. "Onlar bizim nəslimizi artırırlar", "Qadın uşaq doğur, körpə böyüdür" ifadələri ilə gənc nəslin fiziki və əqli inkişafı kimi biotibbi etikanın əsas qayəsini auditoriyaya ünvanlayır: "Qadınlar cəmiyyətdə, həyatda göstərdikləri bütün başqa xidmətlərlə yanaşı, ona görə ən yüksək qiymətə layiqdirlər ki, onlar anadırlar, ***onlar bizim nəslimizi artırırlar***. Qadınlarla kişilərin ***bərabərliyinə*** gəldikdə, açıq demək lazımdır ki, qadınlar həmişə kişilərdən çox zəhmət çəkiblər.

Qədim zamanlardan belə təsəvvür var ki, kişi işləyir, pul qazanır, ailəni saxlayır, qadın isə ev işi görür. Bu, belə olubdur. Amma indi belə deyildir. İndi kişi də işləyir, qadın da işləyir, kişi də qazanır, qadın da qazanır. Demək olar ki, ailəni ikisi birlikdə saxlayırlar, uşaqlarını böyüdürlər. Amma onların arasında böyük fərq var. ***Qadın uşaq doğur, körpə böyüdür.*** Qadının bu zəhməti əvəzsizdir və heç bir kişi belə zəhməti çəkə bilməz. Biz qadınları ilbəil daha da çox qiymətləndiririk" [XXVc.s.320-321].

Növbəti nitq məqamında etika və siyasətin gözəlliklə əlaqəsini açır. Dövlətin apardığı hüquqi siyasətin nəticəsi kimi Azərbaycan qadınının nailiyyətləri bəyan olunur: "Şəxsən mən sevinirəm ki, bizim Azərbaycan qadınları çox qısa bir zamanda bu ***azadlığı*** əllərinə alıblar və bu ***azadlıqdan*** istifadə edirlər. Beləliklə də həm cəmiyyətə öz xidmətlərini göstərirlər, həm də xalqımızı yüksəldir, xalqımızı ***gözəlləşdirirlər***" [XXV c. 321].

"Dünyanın ən gözəl qadınları Azərbaycandadır" cümləsi ilə gözəlliyə münasibətdə də milli təəssübkeşlik hissini açıqca bəyan edir. "Qadınlar bir belə əziyyət, zəhmət çəkərkən nə istəyirlər?" ritorik sualına Ulu Öndər poetikcəsinə də cavab verir. Sonra isə feilin əmr şəklindəki ifadələrlə (görsünlər, etsinlər, yanaşsınlar) necə deyərlər kişilər auditoriyasını silkələyir: "Azərbaycan qadını bir xüsusiyyəti ilə də fərqlənir. O da onun gözəlliyidir. Kişilər gedib başqa ölkələrdə, başqa millətlər içərisində gözəl qadınlar axtarmasınlar. ***Dünyanın ən gözəl qadınları Azərbaycandadır.***

***Qadınlar bir belə əziyyət, zəhmət çəkərkən nə istəyirlər?*** Sadəcə, onlara diqqət, qayğı, hörmət, ehtiram! Bu anlayışlar çox genişdir. Diqqət də, qayğı da müxtəlif formalarda ola bilər. Ancaq kişilər gərək qadınları həmişə yüksəkdə ***görsünlər***, qadınlara gərək xüsusi ***hörmət etsinlər***, qadınlara ***diqqətlə yanaşsınlar*** [XXVc.s.322].

Gözəllikdən danışan anlarda böyük natiqin çıxışlarında poetiklik aşıb-daşır, məişət üslublu "həm dövlət başçısı kimi, həm də sadə bir insan kimi, yəni kişi kimi hər birinizə diqqət göstərməyə hazıram" cümləsi milyonlarla qadın auditoriyasının qəlbini riqqətə gətirə, nitqi yaddaqalan edə bilir: "Mənim sizə, Azərbaycanın bütün qadınlarına münasibətim məlumdur. Bu da ondan ibarətdir ki, birincisi, mən hamınızı çox sevirəm. Eyni zamanda həm dövlət başçısı kimi, həm də sadə bir insan kimi, yəni kişi kimi hər birinizə diqqət göstərməyə hazıram" [XXVc.s.323].

Heydər Əliyevin dilində "Bizim xalqımız zahirən də gözəl xalqdır" ifadəsi gözəlliyi xalis forma hesab edən İ.Kantın fikirləri ilə üst-üstə düşür. "Görün" əmr ədatı ilə xalqımızın gözəlliyini bütün dünyaya tuşlandırır: "Bizim xalqımız zahirən də ***gözəl*** xalqdır. ***Təbiidir*** ki, hər kəs özünü tərifləyir. Heç kəs özünə pis demir. Amma mən hesab edirəm ki, bu hisslərdən kənara çıxsaq, başqaları da tamamilə razı olmalıdır ki, bizim xalqımız ***gözəl*** xalqdır. ***Görün*** nə qədər gözəl uşaqlar var. ***Nə qədər*** gözəl qızlar, *nə qədər* gözəl oğlanlar var. Baxırsan, biri-birindən gözəl, qəşəng, biri-birindən şirindir. Bunun özü də Allahın bizim xalqa bəxş etdiyi böyük nemətdir. Bu da bizi ***fərəhləndirməlidir, ruhlandırmalıdır***. Bu da hər bir azərbaycanlının həqiqətən bu dünyada ***öz*** xalqına, cəmiyyətinə, ***öz*** ölkəsinə, torpağına sədaqətlə xidmət etməsinə kömək etməlidir [XXXVIIc.s.119].

Millətin estetik tərbiyəsi Heydər Əliyevin çıxışlarında mühüm dövlət tədbiri kimi auditotiyalara açıqlanır. "Neftçi" idman-sağlamlıq mərkəzinin 60 illiyi və mərkəzin olimpiya qurğusunun açılışı mərasimində idmanın estetik tərəfləri açıqlanır, onun milliliyi qabardılır. Azərbaycan idmanını dünya səviyyəsində inkişaf etdirmək, idmana dövlət qayğısını yüksəltmək özlüyündə estetik tərbiyənin şərtlərindəndir: "İdman, bədən tərbiyəsi nə qədər mühüm bir sahə, nə qədər gözəl işdir.

Bədən tərbiyəsi, idman insana fiziki hazırlıq verir, insanı fiziki cəhətdən möhkəmləndirir, ona ***gözəllik*** verir. Arzumuz da budur. Şəxsən mənim daim arzum odur ki, Azərbaycan milləti, hər bir azərbaycanlı fiziki cəhətdən güclü, sağlam olsun, ***gözəl***, ağıllı, şüurlu olsun" [VIIIc.s.348].

Beləliklə, gözəllik estetik kateqoriyası böyük natiqin dilində ən çox Azərbaycan qadınlarının bir araya gəldiyi tədbirlərdə, ölkənin gələcəyi sayılan uşaqlar və gənclər auditoriyasında, eləcə də incəsənətin müxtəlif növləri haqqında estetik zövqün özünü göstərdiyi məqamlarda səslənir;

"Gözəllik estetik kateqoriyası barədə onun fikirləri əsasən bədii-məişət üslubunda həyata keçirilir ;

"Gözəllik" estetik kateqoriyası klassiklərin əsərlərindən gətirilən nümunələrlə auditoriyalara ünvanlanır ;

Heydər Əliyevin nitqlərində gözəllik etik dəyərlərlə (vətənpərvərlik, məğrurluq, qəhrəmanlıq, sədaqət, etibarlılıq və s.) birgədir.

## 2.1.2. Heydər Əliyevin nitqində faciəvilik və komizm

Faciəviliyin estetlər tərəfindən verilən tərifini yada salaraq: "faciəvilik, birincisi, fərdiyyətin iztirablarını və yaxud ölümünü, ikincisi, adamlar üçün onun əvəzedilməz itki olmasını, üçüncüsü, bu təkrarolunmaz fərdiyyətdəki ictimai baxımdan dəyərli ilkinliklərin ölümsüzlüyünü, onun bəşər həyatında davam etməsini aşkar edir, dördüncüsü, varlığın yüksək problemlərini həll edərək, insan həyatının ictimai mənasını təsdiqləyir, beşincisi, tarixən konkret bir dövr üçün həlli qeyri-mümkün olan ziddiyyətləri açır, altıncısı, tamaşaçılara saflaşdırıcı təsir göstərir [19,s.76-77]. Füzulinin 500 illik yubileyi ilə əlaqədar Heydər Əliyevin Füzulinin həyatı haqqında dediklərini araşdırdıqda məlum olur ki, qısa, lakonik bir mətndə faciəviliyin bütün elementlərini böyük natiq Azərbaycan dilinin zənginliyi ilə auditoriyalara bəyan edə bilmişdir. "Füzulinin həyatı çox ağır keçib" ifadəsi faciəviliyin estetik tərifinin II bəndinə, "qoyub getdiyi irsdir" və "nə qədər bəhrələnirik və faydalanırıq" ifadələri isə tərifin III və IV bəndlərini özündə ehtiva edir: "Burada çıxış edənlər dedilər ki, ***Füzulinin həyatı çox ağır keçib***, bəxti gətirməyib. Bilir-`1qsinizmi, bir insanın həyatının ağır və məşəqqətli keçməsi, əlbəttə, qeyri-adi bir şey deyildir. Amma buna böyük tarixi nöqteyi-nəzərdən baxsaq, göstəririk ki, bu, kiçik bir şeydir. ***Əsas və mühüm*** məsələ Füzulinin yaradıcılığı və onun ***qoyub getdiyi irsdir***. Onun necə yaşaması, həyatının necə keçməsi, o qədər də vacib deyildir. Vacib olan budur ki, o, necə bir irs qoyub gedib və 500 ildən sonra biz bu irsdən ***nə qədər bəhrələnirik və faydalanırıq"*** [VIIc.s.166].

Faciəlilik kateqoriyası böyük natiqin dilində Azərbaycan xalqının erməni təcavüzkarları tərəfindən işğalı məsələlərində daha tez-tez müşahdiə edilir. BMT baş məclisinin 49-cu sessiyasındakı çıxışda faciə, onun miqyası faktlarla auditoriyaya

açıqlanır: "Təcavüz nəticəsində Azərbaycan ərazisinin 20 faizindən çoxu Ermənistan Respublikasının silahlı qüvvələri tərəfindən işğal edilmişdir. Mən Azərbaycan tərəfinin dəhşətli itkilərini sizə deməliyəm. 20 mindən çox adam həlak olmuşdur, 100 minə yaxın adam yaralanmış və xəsarət almışdır, 6 min adam əsir düşmüşdür, bir milyondan çox azərbaycanlı – ölkə əhalisinin təxminən 15 faizi qaçqın vəziyyətinə düşmüşdür və çadır şəhərciklərində yaşayır. Onlar öz vətənində evsiz-eşiksiz qalmışdır, yayın istisindən, qışın soyuğundan, epidemiyalardan əzab çəkirlər, ən zəruri şeylərə ehtiyac duyurlar. Azərbaycanın işğal edilmiş ərazilərində 700 şəhər və kənd dağıdılmışdır. Həmin şəhər və kəndlərdə demək olar, bütün evlər, məktəblər, xəstəxanalar yandırılmış və talan edilmiş, qədim mədəniyyət abidələri məhv edilmişdir" [IIc.s.309].

"Hərçənd dolanmaq, özü də şaxtalı-boranlı qışda dolanmaq bizim üçün asan olmadı. Ev-eşikləri isitmək üçün meşələrin 70 faizinə qədərinə ***balta çalındı*** – yenə də kifayət etmədi. Hamı kimi, mən də soyuqdan, suyun yoxluğundan ***əzab-əziyyət*** çəkdim. Amma nə edəsən? Mən həmyerlilərimə elə bəri başdan dedim: Əgər soyuqdan və ya aclıqdan ölmək lazım gəlsə, onda hamımız ***birlikdə öləcəyik***. Lakin əminəm ki, bu faciə baş verməyəcəkdir" [Ic.s.48].

Bu mətndə ekoloji fəlsəfəni əks etdirən ("balta çalınmaq") frazeologizmın köməyi ilə o dövrün sözlə rəsminin çəkilməsinin və faciəvilik estetik kateqoriyasının köməyi ilə oxucunun, dinləyicinin gözü qarşısında canlanır. "Əminəm ki" modal sözün köpməyi ilə auditoriya rahat nəfəs alır. Bu məqamda Ulu Öndəri həyatı ilə mübarizə aparan xəstənin başı üstündəki tibb alimi kimi görürük.

Faciəvilik "İnsan talelərinə vurulmuş mənəvi ziyan, xalqın dərd-bəlası isə heç nə ilə ölçülmür" [IIc.s.309]

"Xalqlar müharibə gedən yerlərdə baş verən faciəli hadisələrə biganə qalmamalıdırlar" [IIc.s.310]

Akademik Kamal Abdulla yunan mifologiyasının nakam övladı Antiqona və Oğuz övladı Beyrəyin faciələrini müqayisə edir və düşündürücü, özünəməxsus nəticələrə gəlir. Akademikə görə Antiqona ailəsi qarşısında borcunu yerinə yetirərək, şəxsi mənafeyi ictimai mənafedən üstün tutaraq ölümü seçir. Beyrək də ölümü seçir. O ictimai borcunu dərk edib Qazan xana, oğuzun bütövlüyünə sədaqətini bildirən bir Vətən oğlu kimi şüurlu şəkildə ölümə gedir [5].

Elə bu məqamda Heydər Əliyev öz şəxsi həyatı ilə nümunə göstərir. Faciəlilik Heydər Əliyev dilində "məhrumiyyətlərə düçar olmaq" anlamındadır. Bu məhrumiyyətlərə düçar olmaq aşağıdakı sətirlərdə öz yerini alır: "Bizdə soyuqlar və aclıq başlandı. Südəmər körpələr xəstəxanalarda soyuqdan donub ***ölürdülər***. Camaat bağ-bağatı ***qırıb*** od qalayırdı. Ev-eşiyi isitmək üçün meyvə ağaclarının 70 faizini kəsib doğradılar. ***Nə qədər*** meşə qırıldı. Lakin mən də sağ qaldım, xalq da" [Ic.s.59].

Zamanın bədii cəhətdən düşünülməsi üsulları ilə, incəsənətin ifadə etdiyi ideallarla şəxsiyyət tipləri arasında birbaşa asılılıq və qarşılıqlı təsir mövcuddur.

Yunan mifologiyası və onun obrazlar cəbbəxanasından istifadə edən qədim yunan incəsənəti yunanlı xarakterini, onun dünyaya münasibət formalarını, görüşlərini və idellarını lazımınca müəyyənləşdirdi [19].

İncəsənət adamları müəyyən istiqamətli və məqsədyönlü fəaliyyətə cəlb edərək, bütün cəmiyyətin və ya onun ayrı-ayrı tərəflərinin sosial dəyişdirilməsində iştirak edir [19].

Heydər Əliyevin timsalında auditoriyalar azərbaycanlı xarakteri ilə, dövlətçiliyə sədaqət prinsipi ilə tanış olur. Ulu Öndər Oğuz övladı Beyrək yolunu seçməklə azərbaycançılıq ideyasının nədən ibarət olduğunu dünyaya göstərir.

Dünyaya gələn hər bir insan bu dünyanı tərk edəcəkdir. Bu dünya heç kim üçün əbədi deyildir. Ancaq öz əməlləri ilə,

xalqa, millətə sədaqəti ilə, xalqın milli istiqlaliyyət ruhunu yüksəklərə qaldırmaları ilə dünyalarını dəyişənlər ən müqədds insanlardır. Onlar cismən bu dünyadan gediblər, ancaq ruhən bizim qəlbimizdədirlər, bütün Azərbaycan xalqının qəlbindədirlər. Bu gün Şəhidlər xiyabanına ümumxalq axını və hər bir Azərbaycan vətəndaşının gəlib müqəddəs qəbirləri ziyarət etmək arzusu və ziyarəti onu sübut edir ki, onlar – bu şəhidlər bütün xalqımızın qəlbində yaşayırlar. Onlar heç vaxt unudulmayacaqdır [XIVc.s.142].

Gecə mən yatdığım vaxt bir yerdə güllə atılanda oyanıram. Bir güllə səsinə oyanıram. Bəs o tanklar, toplar, avtomatlar, pulemyotlar bütün şəhərin binalarını atəşə tutanda bunların qulaqları nə qədər kar idi. Gözləri kor idi ki, elə yatmışdılar ki, ayıla bilmirdilər! Onların hamısı günahkardırlar. Onlar bilməlidirlər ki, bu gün onların hüquqi məsuliyyəti əgər sübut olunmayıbsa, mənəvi məsuliyyətləri göz qabağındadır. Mən bununla nəyi demək istəyirəm? Bizim xalqımızın qəhrəmanlarını, canını qurban verən insanları görürsünüz. Biz bunlarla fəxr etməliyik. Azərbaycan xalqının qəhrəmanlığını, cəsurluğunu nümayiş etdirənlər bu insanlardır, bu şəhidlərdir. Amma o böyük-böyük vəzifələri tutub, belə gərgin dövrdə gedib evində yatanlar və xalqın aqibətinə biganə qalanlar indi də burada rahat gəzənlərdir. Onlar xalqa xəyanət etmiş adamlardır. Onların hər biri böyük cinayət ediblər [XIVc.s.144].

Bu gün, bu bayram günü mən torpaqlarımızın müdafiəsi uğrunda canlarından keçmiş, həlak olmuş şəhidlərimizi böyük minnətdarlıq hissi ilə xatırlayıram. Onların şəhidliyi, qəhrəmanlığı bizim xalqımızın qəhrəmanlığını nümayiş etdirir. Şəhidi olan xalq qəhrəman xalqdır. Biz şəhidlərimizin qəmqüssəsini çəkirik, ancaq onların şəhidliyə getməsi ilə fəxr edirik. Çünki onlar vətən, ana torpaq, millət, Azərbaycan yolunda həlak olublar. Allah onlara rəhmət etsin [XVc.s.76].

Yeddi il bundan öncə o müdhiş fevral gecəsi Ermənistan silahlı qüvvələri Sovet İttifaqı ordusunun 366-cı alayının köməyi və iştirakı ilə Azərbaycanın gözəl bir diyarı olan Xocalının sakinlərinə qarşı dəhşətli soyqırımı etmişlər. Böyük, misli görünməmiş vəhşiliklə həyata keçirilən bu soyqırımı XX əsrin ən dəhşətli faciələrindən biridir. Dinc, silahsız xocalılara bir gecənin içində böyük zərbələr vurulmuşdur. Soyqırımı nəticəsində yüzlərlə xocalılı qadın, kişi, yaşlı, gənc, körpə, uşaq həlak olmuşdur. Yüzlərlə xocalı yaralanmış, xəsarət almış, şikəst olmuşdur. Yüzlərlə insan əsir düşmüşdür.

Bu faciə Azərbaycan xalqına qarşı Ermənistan-Azərbaycan müharibəsi dövründə vurulmuş ən ağır zərbədir. Xocalılılar bu faciəni mərdliklə, qəhrəmanlıqla qarşılamışlar. Öz evini, şəhərini, ailəsini qəhrəmancasına müdafiə edənlər həlak olmuşlar, şəhid olmuşlar. Vəhşi ermənilər tərəfindən açılan atəşlərin nəticəsində Xocalı ərazisi qana bulaşmışdır [XIXc.s.206-207].

Ancaq Xocalı yarası qəlbimizdə daim yaşayacaqdır. Xocalı soyqırımını törədənlər ədalət məhkəməsi ilə məhkum olunacaqlar. Xocalı soyqırımının törədilməsində günahı olan Azərbaycanın keçmiş rəhbərliyi və digər vəzifəli şəxslər də xalq qarşısında öz cəzalarını çəkəcəklər. Ədalət məhkəməsi onların cəzasını verəcəkdir [XIXc.s.207].

Xocalı faciəsi təkcə xocalılıların yox, bütün Azərbaycan xalqının dərdi, qəmidir. Ona görə də bu gün bütün ölkəmizdə kədər günü, hüzn günüdür, matəm günüdür. Mən bütün həlak olanlara bir daha Allahdan rəhmət diləyir və xocalılara, bütün Azərbaycan xalqına başsağlığı verirəm. Çünki həlak olmuş hər bir soydaşımız öz ailəsi ilə bərabər Azərbaycanın övladıdır və bu, Azərbaycan xalqının matəmidir [XIXc.s.208].

Ancaq hər dəfə xocalılarla görüşərkən mən qürur hissi keçirirəm. Bu qədər faciəli günlər keçirmiş, o dəhşətli, müdhiş gecəni yaşamış, ən əziz adamlarını gözlərinin qabağında itir-

miş insanlar məğrurdurlar, mərddirlər. Hər biri vətən qayğısı, vətən, torpaq eşqi ilə yaşayır. Bu, xalqımızın nə qədər yüksək mənəviyyata malik olduğunu göstərir. Xocalılıların bu yüksək mənəvi keyfiyyətləri bütün Azərbaycan xalqının mənəvi keyfiyyətlərini əks etdirir. Amma xocalılılar hamı üçün örnəkdir, nümunədir – qəhrəmanlıq, mərdlik, mətanət-lilik nümunəsidir, eyni zamanda vətənpərvərlik nümunəsidir [XIXc.s.209].

20 Yanvar faciəsinin 10-cu ildönümü ilə əlaqədar şəhidlərin xatirəsinə həsr olunmuş mərasimdəki nitqdə Heydər Əliyev "amma" bağlayıcısı ilə bu günün tərəflərini sinonim cərgələrlə (qəm, kədər) və antonimlərlə (qəhrəman, əyilməz, sınmaz) bəyan edir: "20 Yanvar 1990-cı il Azərbaycanın tarixində ən faciəli gündür. Ancaq eyni zamanda o gecə, o gün Azərbaycan xalqı öz qəhrəmanlığını, rəşadətini və şəhidlik zirvəsinə qalxa bilməsini bütün dünyaya nümayiş etdirdi. Ona görə də bu gün biz həmişə ***qəm, kədər*** içində oluruq. ***Amma*** eyni zamanda böyük qürur hissi keçiririk ki, xalqımız ***qəhrəman*** xalqdır, ***əyilməz*** xalqdır, ***sınmaz*** xalqdır" [XXIVc.s.217].

İndi kiminsə yaxın adamı vəfat edir. Qohumu, əqrəbası, dostu, iş yoldaşı mütləq onun dəfninə gedir, onun yasına gedir, o ailənin dərdinə şərik olur. Amma burada Azərbaycan xalqına qarşı təcavüz edilibdir, xalqımız şəhidlər veribdir. Millət, xalq birləşib bu faciəni törədənlərə nifrət edir, şəhidləri son mənzilə aparırlar. Ancaq Azərbaycanın rəhbərləri bundan kənardadırlar, qaçıb gizləniblər. Elə bu faktın özü çox aydın və aşkar göstərir ki, kim kimdir.

Ali Sovetin sessiyasını bir qrup deputatlar, özü də böyük maneçiliklərin öhdəsindən gələrək toplayıblar və Azərbaycanın böyük şairi Bəxtiyar Vahabzadə – hansı ki, ömründə bir iclas aparmayıbdır, çünki həmişə şerlər yazıbdır və Azərbaycanın şer sənətini inkişaf etdiribdir, yəni bu işdə təcrübəsi yoxdur. Ancaq onun mərd ürəyi var, onun xalqa məhəbbəti var, – o, heç bir şeydən çəkinmədi, heç bir şeydən qorxmadı.

Bir də ona görə ki, o, heç kəsin qarşısında gözükölgəli deyildi, heç vaxt heç kəsə xəyanət etməmişdi.

Mərhum İsmayıl Şıxlı, başqa ziyalılar da həmçinin, burada kadrlar göstərildi. Təəssüf ki, onların hamısı qalmayıbdır. Amma o gördüyümüz kadrlar kimin kim olduğunu tamam göstərdi. Bəs nə cür olur ki, şair Bəxtiyar Vahabzadə, yazıçı İsmayıl Şıxlı və başqa ziyalılar, yaxud da ki, Ali Sovetin bir qrup deputatları o salona toplaşıb məsələni müzakirə edə bilirlər, amma Azərbaycanın rəhbərləri qaçıb gizləniblər? Bununla da onlar xalqa rəhbərlik etmək hüququnu artıq tam itirmişdilər” [XXIVc.s.222-223].

***Xəyanətkarlar***, rəhbərlik etmək hüququnu ***itirmiş*** adamlar yenə də öz şəxsi mənafelərini xalqın, millətin mənafelərindən qat-qat üstün tutdular. Bunlar hamısı tarixin həqiqətləridir.

Ancaq bu gün biz fəxr edə bilərik ki, xalqımız, yenə də deyirəm, ***mərdlik*** və ***şücaət*** göstərdi [XXIVc.s.224].

Amma xalq heç bir şeydən qorxmadı. Xalq qorxmadı ki, yenə də o tanklar gəlib onları qıra bilər. Azadlıq meydanında, bütün küçələrdə, ta Dağüstü parka qədər böyük izdiham var idi [XXIVc.s.224].

Faciə eyni zamanda, ölkəmizdə böyük proseslərin həyata keçirilməsinə təkan verdi. Azərbaycan öz dövlət müstəqilliyni əldə etdi. Artıq doqquzuncu ildir ki, Azərbaycan xalqı öz müstəqil dövlətində yaşayır.

Yaşayışımızda çətinliklər, problemlər az deyildir. Hamımızı incidən, ürəyimizi ağrıdan problem torpaqlarımızın Ermənistan silahlı qüvvələri tərəfindən işğal olunması o torpaqlardan bir milyondan artıq vətəndaşımızın zorla köçürülməsidir, onların çadırda yaşamasıdır. Başqa problemlər də var. Amma bu ağır, çətin dövrü biz keçirik və keçəcəyik. İşğal olunmuş torpaqlar azad ediləcək, vətəndaşlarımız öz yerinə, yurduna qayıdacaq, Azərbaycanın suverenliyi təmin olunacaqdır. Çünki Azərbaycan indi müstəqil dövlətdir və heç bir

dövlətin Azərbaycana təcavüz etməyə artıq hüquqi əsası yoxdur [XXIVc.s.225-226].

Mən bu gün şəhidlərin xatirəsi qarşısında, ruhu qarşısında and içirəm ki, biz heç vaxt Azərbaycanın müstəqilliyini əlimizdən verməyəcəyik, heç vaxt hansısa bir dövlətə vassal olmayacağıq. Azərbaycanın dövlət müstəqilliyi bütün çətinliklərə baxmayaraq, bizə göstərilən bütün təzyiqlərə baxmayaraq, yaşayacaq və inkişaf edəcəkdir. Müstəqil, demokratik Azərbaycan, hüquqi, dünyəvi Azərbaycan dövləti şəhidlərimiz üçün böyük abidə olacaqdır.

Mən bu matəm gecəsini hazırlayanlara və burada ürək sözlərini deyənlərə bir daha təşəkkür edirəm. Allahdan bütün şəhidlərə rəhmət diləyirəm [XXIVc.s.226].

Olmasın, gərək olmasın. Çünki bu, müqəddəs işdir. Bilirsiniz, mənim təşəbbüsümlə 1994-cü ildə 20 Yanvar hadisələrinə geniş qiymət verildi. Milli Məclis nə qədər müzakirələr apardı və 1994-cü ilin mart ayında böyük bir qərar qəbul olundu. Ondan sonra mən 20 Yanvar şəhidləri yolunda nə qədər tədbirlər gördüm. Baxın, qəbirlər nə vəziyyətdə idi, indi nə vəziyyətdədir. Ondan sonra orada "Əbədi məşəl" abidəsi kompleksini yaratdıq. Dünən mən Respublika Sarayında dedim, – yəqin siz orada idiniz, – indi ora bizim ən müqəddəs yerimizdir. İnam yeridir, inanc yeridir, and yeridir. Ona görə 20 Yanvar faciəsi mənim üçün xalqımızın ən ağır faciəsidir. Amma eyni zamanda 20 Yanvar Azərbaycan xalqının mərdlik, qəhrəmanlıq və şəhidlik zirvəsinə qalxmasının əyani nümayişidir. Biz bir tərəfdən qəm-qüssə çəkirik. Ona görə mən dünən Respublika Sarayında olarkən, – baxmayaraq ki, bütün o sənədlərin hamısını bilirəm, 20 Yanvar hadisələrinin sabahısı günü mən Moskvada xəstə olaraq gedib öz möqeyimi bildirdim, sonralar bu barədə nə qədər çıxışlar etmişəm, sözlər demişəm, – o gecə mənə çox təsir etdi. Həddindən artıq təsir

etdi. Siz yəqin orada hiss etdiniz, – çox həyəcanlı idim [XXIVc.s.244-245].

Mən özüm düşünürdüm ki, oradakı abidə gərək çox əzəmətli olsun, ***şəhidlərin səmaya qalxmasını*** göstərsin. İndi siz gördüyünüz o abidə, – bunu demək mənim üçün bəlkə də o qədər yaxşı deyil, amma bilməlisiniz, – şəxsən mənim ideyamdır. Mənim ideyam əsasında memarlar onu işləyib hazırladılar.

Bilirsiniz ki, o abidənin ucaldıldığı yer də yox idi. Çünki qəbirlər qurtarandan sonra o tərəf uçurum idi. Mən göstəriş verdim, oraya gətirib daş-torpaq tökdülər. Dedim ki, sonra bu, çökə bilər, möhkəmləndirin. Möhkəmləndirdilər və onun üzərində, hesab edirəm ki, çox gözəl bir abidə yaranıbdır. Təbiidir ki, onu Bakı İcra Hakimiyyətinin, Rəfael Allahverdiyevin başçılığı ilə bizim memarlar, ustalar çox gözəl tikiblər. Mən bu gün ona yenə də diqqətlə baxırdım. Bizim Azərbaycan memarlığını əks etdirən, eyni zamanda Azərbaycanın öz daşından, – mərmər, filan, bundan parıldayır, – yonulmuş abidədir. Onun yerini də elə seçdik ki, şəhərin hər tərəfindən görünür. Yəqin ki, axşam vaxtı, qaranlıq düşəndə bulvara çıxırsınız, oradan görürsünüz. Onun içərisində od yanır, amma elə bil ki, günbəzi də hər tərəfdən yanır. Bəli, bunlar hamısı görünür. Bunlar sadə iş deyil, mənim fikirlərimdir, bizim memarlarla birlikdə tapdığımız formadır. Hesab edirəm ki, çox yaxşı abidədir [XXIVc.s.247-248].

Mən Azərbaycanda çox abidələr yaratmışam, çox binalar tikmişəm, çox yollar salmışam, körpülər tikmişəm, su kəmərləri çəkdirmişəm və sair – bunları saymaqla qurtarmaq olmaz. Amma mənim üçün onun qədər əziz abidə yoxdur. Çünki onun daxili mənası böyükdür, tarixi əhəmiyyəti böyükdür və əsrlər boyu da yaşayacaqdır. Mən dünən də dedim – təskinlik tapıram ki, insanlar həlak olub, şəhid olublar, amma

biz onları yaşadırıq. Qəlbimizdə yaşadırıq və o abidədə, Şəhidlər xiyabanında, o "Əbədi məşəl"də yaşadırıq [XXIVc.s.248].

Bu gün biz xalqımızın və bəşəriyyətin tarixinə ***ən dəhşətli*** kütləvi terror hadisələrindən biri kimi daxil olmuş Xocalı faciəsinin qurbanlarının xatirəsini dərin hüzn və kədər hissi ilə yad edirik. 1992-ci il fevralın 26-da ***ən*** müasir silahlar və texnika ilə təchiz olunmuş Ermənistan hərbi birləşmələri keçmiş sovet ordusunun 366-cı alayının bilavasitə iştirakı ilə Azərbaycanın Xocalı şəhərini ***yerlə-yeksan etdilər***, yüzlərlə günahsız mülki əhaliyə – qadınlara, qocalara, uşaqlara amansızcasına ***divan tutdular***. Xüsusi qəddarlığı ilə seçilən bu təcavüz aktı təkcə Xocalı əhalisinə deyil, bütövlükdə insanlığa qarşı misli görünməmiş cinayət idi. Əsrin əvvəllərindən başlayaraq təcavüzkar erməni millətçiləri tərəfindən azərbaycanlılara qarşı dəfələrlə soyqırımı aksiyaları törədilmişdir. Amma Xocalı soyqırımı bunların ən dəhşətlisi olmuşdur.

Lakin bunu da qeyd etmək lazımdır ki, Xocalının qəhrəman müdafiəçiləri təpədən dırnağa qədər silahlanmış düşmən qarşısında ***titrəməmiş***, özünü ***itirməmiş***, ***qeyri-bərabər döyüşdə*** əsl qəhrəmanlıq və şücaət nümunələri göstərmişdilər [XXXIIc.s.398].

Təəssüf ki, müasirlərimizin gözləri qarşısında baş verən bu ağır faciəyə, soyqırımı aktında dünya ictimaiyyəti də biganə qalmış, ona prinsipial mənəvi-siyasi qiymət verməmişdir [XXXIIc.s.399].

Xocalı soyqırımının qurbanlarının xatirəsini yad edərkən onların qarşısında hər birimizin vicdan və vətəndaşlıq borcu haqqında düşünürük. Bu borcu ödəməyin ən yaxşı yolu Xocalı qəhrəmanlarının uğrunda öz həyatlarını qurban verdikləri idealları yaşatmaq, müstəqil Azərbaycan dövlətini qorumaq,

onun sərhədlərinin toxunulmazlığını, ərazi bütövlüyünü təmin etməkdir.

Bu milli matəm günündə Xocalı şəhidlərinin məsum xatirəsi önündə bir daha baş əyir, onların haqq işinə sədaqətimizi bildirir, soyqırımı qurbanlarına Allahdan rəhmət diləyir, onların ailələrinə, yaxınlarına və bütün xalqımıza başsağlığı verirəm [XXXIIc.s.399].

Biz faciəni incəsənət əsərlərində izləməyə alışmışıq. Böyük natiqin nitqlərində faciə xüsusilə səslənir. Faciənin paradoksal olsa da qan yaddaşımız üçün, tarixdən ibrət dərsi almaq üçün yaşadılmasını istəyir:

"Hesab edirəm ki, bu gün bizim danışığımız çox səmərəli oldu. Bir tərəfdən Kəlbəcərin faciəsini xatirimizə saldıq. Bu faciəni heç vaxt unutmaq olmaz. Faciə bizə ***nə qədər qəm-qüssə, kədər*** gətirsə də, onu daim yaşatmaq lazımdır ki, bu faciədən hərə özü üçün ibrət dərsi götürsün. Yaşatmaq lazımdır ki, dünya xalqları bilsin – Azərbaycanın başına nə kimi bəlalar gəlibdir və erməni ***qəsbkarları, quldurları*** nə qədər vəhşidirlər ki, Azərbaycan xalqının başına bu cür bəlalar gətiriblər. Ona görə bunu yaşatmaq lazımdır, unutmaq olmaz, nəsillərdən-nəsillərə ötürmək lazımdır" [VIc.s.50].

Cəmiyyət tarixi də, incəsənət tarixi də, şəxsiyyətin həyatı da bu və ya başqa şəkildə faciəvilik problemi ilə qarşılaşıb təmasda olur. Müstəqillik dövründə 1993-cü ildən həyatının sonunadək Heydər Əliyev ömrü Azərbaycan xalqının faciəvi həyat səhnələri ilə birgə müşayiət olunur. Erməni təcavüzkarlarına qarşı müharibədə həlak olanlarımız, müstəqillik yolunda 20 Yanvar şəhidləri, Xocalı qurbanları, Ağdaban faciəsi və daha nələr.

Məhz ona görə də Ulu Öndərin nitqlərində estetik kateqoriya olan faciəvilik öyrənilməyə layiqdir. Bu estetik kateqoriya Heydər Əliyevin şəhidlərin anılmasındakı məişət üslu-

bundan tutmuş parlament divarları arasındakı rəsmi üslubadək öz əksini tapır. Bu kateqoriyanın şərhi son illər Azərbaycan həyatının düzgün, doğru dərki üçün vacibdir.

Estetikanın əsas kateqoriyalarından biri də komiklik kateqoriyasıdır. Komiklik də gözəllik, ülvilik, qrasiya, zəriflik və s. kimi estetik hadisədir. Bu o deməkdir ki, o da gözəllik, ülvilik və başqa kateqoriyalar kimi ikili, obyektiv-subyektiv təbiətə malikdir. Yəni obyektiv olan komik hadisədir, prosesdir, subyektiv olan isə bu hadisəyə reaksiya verən xoş duyğular keçirən subyektdir, hər hansı bir şəxsdir. Digər tərəfdən, məlumdur ki, komikliyin mahiyyəti həyatdakı nöqsanlara və mənfi hadisələrə gülməklə onları inkar və tənqid etməkdir. Bu gülüş, bu inkar, bu tənqid hökmən ideal mövqeyindən, gözəllik mövqeyindən edilir. Budur komikliyi estetik kateqoriya edən, onu gözəlliklə yaxınlaşdırın. “Bakılı oğlanlar” şən və hazircavablar klubu komandasinin yeni proqramla çıxışına baxdıqdan sonra komandanın üzvləri ilə görüşdəki söhbətdə “amma deyirlər ki, bugünkü çıxışınız pulsuzdur. Niyə? Gərək bugünkü çıxışınızı da pullu edəydiniz” ifadəsi ilə Heydər Əliyevin satirik üslubda söylənmiş nitqinin şahidi oluruq:

“Axşamınız xeyir olsun!

Mən sizi hazırladığınız bu yeni proqram münasibətilə təbrik edirəm. Bilirəm ki, siz bir neçə gündür ki, bu sarayda çıxış edirsiniz və çıxışlarınızın hamısı Azərbaycanda, Bakıda böyük həvəslə izlənilir, qəbul olunur. Deyirlər ki, Respublika sarayının salonunda boş yer yoxdur, yaxşı da pul qazanmısınız. ***Amma deyirlər ki, bugünkü çıxışınız pulsuzdur. Niyə? Gərək bugünkü çıxışınızı da pullu edəydiniz***” [XXXIVc.s.349].

Təbiidir ki, sizin bu çıxışlarınız daha çox yumor xarakteri daşıyır. Ortada suallar da təşkil edirsiniz, onlara cavab verirsiniz. Amma keçmişə nisbətən sizin bu çıxışlarınızın əsasını

yumor təşkil edir. Bu da çox vacibdir, əhəmiyyətlidir. Çünki yumor insanlar üçün həmişə mənəvi bir qida olubdur. İkinci tərəfdən də, yumor, eyni zamanda ayrı-ayrı qüsurların tənqididir. Əgər keçmişə nəzər salsaq, yumoristlər keçmişdə müəyyən qədər müxalifətdə olubdur. Məsələn, bizim böyük mütəfəkkirimiz Cəlil Məmmədquluzadə "Molla Nəsrəddin" jurnalında, yaxud öz əsərlərində o dövrdə xalqımızın, cəmiyyətin nöqsanlarını, xalqımızın bəzi məsələlərdə geri qalmasını çox yumoristik şəkildə əks etdirirdi. Həmin jurnalın nömrələrinə baxanda bəzi adamlar belə qəbul edirlər ki, bu sözlər, şəkillər sadəcə, insanı güldürməkdən ötrüdür. Amma orada iki məna var: həm insanı güldürür, həm də cəmiyyətə, insana başa salır ki, bu nöqsanları aradan qaldırmaq lazımdır.

Bizim böyük bəstəkarımız Üzeyir Hacıbəyov "Məşədi İbad" operettasını yaradıbdır. İnsanların, demək olar ki, əksəriyyəti – əgər mütəxəssisləri nəzərə almasaq – indiyə qədər hesab edirlər ki, "Məşədi İbad" operettası komediyadır, insanlar gəlib baxsınlar, istirahət etsinlər. Ancaq bu, bir tərəfdən, komediyadır, digər tərəfdən, əgər bu əsəri dərindən təhlil etsən aydın olar ki, bir tərəfdən, o dövrdə cəmiyyətdə gedən proseslər, ikinci tərəfdən də nöqsanlar, çatışmazlıqlar göstərilibdir. Eləcə də məsələn, Qoqolun əsərlərini götürsək, onun əsərlərindəki obrazlar indiyə qədər yaşayırlar. Ona görə də yumor iki məna, məqsəd daşıyır. Bir tərəfdən, insanlar həqiqətən gülür, istirahət edirlər. Deyirlər ki, sizin bu tamaşanız 3 saat 15 dəqiqə çəkibdir. Başqa bir tamaşada buna dözmək mümkün deyildir. Amma siz bir tərəfdən, insanları güldürürsünüz, ikinci tərəfdən isə, tənqid edirsiniz. Hesab edirəm ki, tənqidi də məhəbbətlə edirsiniz" [XXXIVc.s.350-351].

Siz məni də yaddan çıxartmırsınız. Görürəm ki, hər dəfə mövzunu bir az da genişləndirirsiniz. İndi oğlumu da buraya qatmısınız. Ola bilər, 2-3 tamaşadan sonra nəvələrimi də

qatasınız. Hər halda, bunlar hamısı xeyirlidir, faydalıdır. Siz faydalı iş görürsünüz [XXXIVc.s.351].

**Yuli Qusman:** Yadınızdadırmı, əgər Siz olmasaydınız, biz 1970-ci ildə qalib gələ bilməzdik.

Moskvadan Lapin mətnimizi qadağan etmək istəyəndə Siz dediniz ki, biz büroda baxmışıq, mən oxumuşam, buraxın. Beləliklə, onlar buna mane ola bilmədilər. O vaxt bu, artıq son canlı efir idi. Bu, 1970-ci ilin iyulunda, 30 il əvvəl olmuşdur. Biz bu günədək birinci yerdəyik.

**Heydər Əliyev:** Odur ki, siz Şən və Hazırcavablar Klubunun inkişafında mənim xidmətlərimi unutmamalısınız [XXXIVc.s.352].

## 2.2.Heydər Əliyevin nitqində incəsənət növləri

Bu yarımfəsildə Heydər Əliyevin nitqlərində incəsənət haqqında olan ümumfəlsəfi fikirləri, incəsənətə olan dövlət qayğısı, incəsənətin çoxfunksiyalılığını əks etdirən məqamlar, estetik zövqün cilalanmasına yönələn nitqlər araşdırma mövzusu olmuşdur. Ayrı-ayrı incəsənət növlərinə isə monoqrafiyada yarımfəsllər şəklində yer ayrılmışdır.

Heydər Əliyevin dilində "dayana bilməz" ifadəsi incəsənətə dövlət qayğısının bariz nümunəsi kimi səslənir. Ulu Öndərə görə bütün sahələrdə nəyisə dayandırmaq mümküm olduğu halda mədəniyyəti, incəsənəti, ədəbiyyatı dayandırmaq olmaz: "Amma mədəniyyət, incəsənət, ədəbiyyat elədir ki, ***dayana bilməz***, gərək həmişə inkişaf etsin. ***Ona görə də*** biz Azərbaycanda başqa sıxıntılarımıza, problemlərimizə baxmayaraq, mədəniyyətə, incəsənətə, ədəbiyyata – bütün bu sahələrə ***xüsusi diqqət göstəririk***. Ona görə də bunlar həm yaşayır, həm də inkişaf edirlər. Güman edirəm, bu müddətdə təkcə bunları yox, bizim Bakıda olan dəyişiklikləri də görmüsünüz, yaxud da görəcəksiniz ki, bir müstəqil, demokratik, dünyəvi, hüquqi dövlət kimi, Azərbaycan daim irəli gedir" [XXXIIc.s.101].

İncəsənətimizin təbliği ilə bağlı çıxışlarında auditoriya onu sənətşünas alim kimi görür, elmi üslublu çıxışın sehrinə düşür. Belə elmi üslublu çıxışlar antroponimik sıralarla elmi üslubun tələb etdiyi incəsənətdə işlədilən terminlərlə bəzənmiş olur: "Azərbaycan tarixi mədəniyyət, elm, ədəbiyyat, memarlıq sahəsində çox zəngindir. Bizim çoxəsrlik ədəbiyyatımız var – Nizami, Xaqani, Füzuli, Nəsimi, Vaqif və bunlardan sonra gələn dahilər... Bunların içərisində ən görkəmli yer tutan, dünyada məşhurlaşmış, dünyanın hər yerinə yayılmış musiqi əsərlərini yaradan və Azərbaycanın çoxəsrlik

musiqisini sistemləşdirən, formalaşdıran və dünyaya təqdim edən Üzeyir Hacıbəyov olmuşdur. Üzeyir Hacıbəyov ömrünün son gününə qədər həyatını Azərbaycan mədəniyyətinin, musiqisinin inkişafına, insanların təhsillənməsinə, maariflənməsinə həsr etmişdir. O həm yazıçı, publisist, həm də alim, maarifçi, filosof, ictimai-siyasi xadim olmuş, dövlət işlərində fəal iştirak etmişdir" [IV c s.276].

Azərbaycan incəsənətini yüksəklərə qaldıran mütəfəkkir şəxslərin (bəstəkar) yetişməsində, formalaşmasında təbii və sosial amillərin rolunu önə çəkən Ulu Öndər bunu tez-tez öz nitqlərində auditoriyalara açıqlayır. Auditoriya haqqında danışılan şəxsin formalaşmasında mühüm olan amillərlə əlaqələri izləyir. Estetik zövqün fərqliliyinin bir əlaməti kimi insanın doğulub boya-başa çatdığı ərazidən tutmuş, onun təfəkkürünün formalaşmasına kömək edən ədəbi− bədii mühitədək fərqliliyi şüurlara çatdırılır. Üzeyir Hacıbəyovun anadan olmasının 110 illiyinə həsr olunmuş təntənəli yubiley gecəsində olduğu kimi: "Azərbaycanın gözəl guşələrindən biri olan Ağcabədidə dünyaya gəlmiş, Şuşada ilk təhsilini almış, müqəddəs Şuşanın ***ab-havasının təsirini***, Natəvan dünyasının, musiqişünas ***Mir Möhsün Nəvvab sənətinin***, fikrinin təsirini duymuş, sonra Qori seminariyasında yüksək təhsil almış və nəhayət, Sankt-Peterburqda konservatoriyanı bitirmiş Üzeyir Hacıbəyov beləliklə böyük, parlaq yaradıcılıq yoluna başlamış və bu yaradıcılıq yolunu ***şərəflə*** keçmiş, Azərbaycan tarixində ***görkəmli*** bir yer tutmuşdur" [IVc.s.275].

"Natəvan dünyası", "Mir Möhsün Nəvvab sənəti" Üzeyir Hacıbəyovun görkəmli bəstəkar kimi formalaşmasında mühüm amildir" fikri dinləyicilərin diqqətinə çatdırılır. Onun təhsil illəri məntiqi ardıcıllıqla düzülür. Heydər Əliyevin təbirincə xalqın tarixində görkəmli yer tutmaq ***şərəfli*** yol keçməkdən qaynaqlanır.

Lahıc özü də Azərbaycanın bir abidəsidir. ***Doğrudan da,*** orada nadir bir təbiət və nadir xüsusiyyətə malik olan mühit, nadir insanlar var. Çox nadir. Elə bil ki, xırda, balaca bir adadır, amma özünəməxsus ölkə kimi bir yerdir. Ona görə də siz ki, gedib o yerləri çəkmisiniz, bu, çox gözəldir. Həm də o şeyi ki, rəssam görür, adi adam bəlkə də bunu dərk edə bilmir" [VIIc.s.196-197].

"Naxçıvanın təbiətini belə gözəl əks etdirmisiniz", "Azərbaycanın elə guşələri var ki, bunlar abidədir", "Lahıc özü də Azərbaycanın bir abidəsidir" ifadələri bir daha böyük natiqin nitqlərində azərbaycançılıq ideyalarının həmişə diqqət mərkəzində olmasına bariz nümunədir.

"Mənim istədiyim bu abidənin müəllifi mütləq azərbaycanlı, öz həmvətənim olmalıdır" ifadəsi N.V.Qoqolun [149] incəsənətdə milliliyin estetik kateqoriya olması fikri ilə üst-üstə düşür. Qoqol yazırdı ki, ...əsl millilik sarafanın təsvirində deyil, xalq ruhunun özündədir. Şair, hətta tamam yad aləmə özünün milli stixiyası ilə, öz xalqının gözü ilə baxıb təsvir edəndə də onun duyduqlarında və düşündüklərində həmvətənləri sanki özlərinin duyğularını və düşüncələrini hiss edəndə də milli ola bilər: "Onu demək istəyirəm ki, Moskvada heykəltəraşlar çox idi. Onların əksəriyyəti mənim yaxın tanışlarım, dostlarım idi. Şübhəsiz, Moskva heykəltəraşları tərəfindən bir neçə təklif gəldi ki, onlar mənə kömək etmək, bu arzunu yerinə yetirmək istəyirlər. Amma bunların hamısını nəzərdən keçirdikdən sonra fikirləşdim ki, mənim istədiyim bu abidənin müəllifi mütləq azərbaycanlı, öz həmvətənim olmalıdır. Həmvətənlərim içərisindən də Ömər Eldarovu seçdim. Onu Moskvaya dəvət etdim, o vaxt görüşdük, söhbət etdik. İlk söhbətimiz rəssam Tahir Salahovun iştirakı ilə gedirdi".

Bu məqamda estetik zövqə verilən tərifləri və Heydər Əliyevin dilində kütlələrin asan və səmimi başa düşdüyü bir dildə izahının müqayisəsi pis olmazdı. Zövqün ən qısa tərifini İ.Kant [159] vermişdir: "Zövq – gözəllik haqqında mühakimə yürütmək qabiliyyətidir". Müasir rus estetiki A.Belikə [140] görə isə "Estetik zövq istənilən predmetin gözəlliyini, estetik dəyərini nəzərə almaqla insanın yaratmaq, həmçinin təbiət hadisələrinin ictimai həyatın və incəsənətin əsərlərinin estetik dəyərini fərqləndirmək, aşkar etmək, başa düşmək və qiymətləndirmək bacarığıdır"

Estetik zövqün hər bir kəs üçün fərqli olduğu Heydər Əliyevin nitqlərində tez-tez səslənir: "Tofiq Quliyevin mahnıları çoxdur, lakin "Sənə də qalmaz" bunların zirvəsidir. Onun oğlu bugünkü gecənin rejissoru idi və gözəl də təşkil etmişdir. Rauf Abdullayev bu gün fəqlənirdi, orkestri çox yaxşı idarə edirdi. Mən heç kimə heç bir dərəcə vermək istəmirəm, ***hər bir*** müsiqisevərin öz rəyi var" [VIIc.s.338].

"Hər bir" təyin əvəzliyinin köməyi ilə incəsənətə – musiqiyə münasibətdə estetik zövqlərin müxtəlifliyi başa düşülür.

Heydər Əliyevin nitqində etik fəlsəfə dialektikanın əksliklərin vəhdəti və ziddiyyəti qanunu ilə birgə səslənir: "Təəssüf ki, cəmiyyətdə qanunu pozanlar, əxlaqsızlıq, mənəviyyatsızlıq edənlər də var. Belələri insanı o qədər incidir ki, həmin adam hər şeyi artıq qara rəngdə görür. Amma həyat tam qara deyil. Həyatın işıqlı tərəfi də, qaranlıq tərəfi də, gözəl tərəfi də, insanları incidən tərəfi də var" [XIIIc.s.171].

Bədii obrazların mükəmməlliyi və insana güclü təsiri ədəbiyyatı idrakın və estetik tərbiyənin mühüm vasitəsinə çevirir: "Bu əsərdən doğan məna ondan ibarətdir ki, gərək hər bir insan nə olur-olsun, paklıq, mənəvi saflıq, mənəvi təmizlik uğrunda mübarizə aparsın, insana xas olan mənfi keyfiyyətlərdən insanları xilas etməyə axıra qədər çalışsın" [XIIIc.s.169].

Burada katarsis hadisəsində – "təmizlənmə"də bədii ədəbiyyatın rolu bariz şəkildə verilib.

XVIII–XX əsrlərdə isə poeziyanın birləşdirici qüdrətini almanlar öz həyatlarında hiss etdilər. Poeziyanın bu qüdrəti Heydər Əliyev dilində yazıçıların X qurultatyında çox gözəl səslənir. "İkinci dünya müharibəsində – Böyük Vətən müharibəsində Azərbaycandan gedən 300 min adam həlak oldu, geri qayıtmadı. Xatirimizdədir, bunu dəfələrlə deyiblər. Onların bəzilərinin öləndən sonra cibindən Səməd Vurğunun, Rəsul Rzanın şeirləri çıxmışdı. Demək, şeir, şair sözü, yazıçı sözü ***hər şeydən təsirlidir***. Ona görə də istərdim ki, bu sahəni siz daim öz diqqətinizdə saxlayasınız. Mən bu sözləri bir sizə demirəm. Bütün Azərbaycan xalqına müraciət edirəm. ***Hər ataya,*** anaya müraciət edirəm, ***hər bir*** valideynə müraciət edirəm, eyni zamanda ***hər bir*** gəncə müraciət edirəm" [XIIIc.s.133].

"Təbii ki" modal sözü ilə Abayın qazax xalqına mənsubluğunu, "bununla yanaşı" ifadəsi ilə onun bəşəriyyətə mənsubluğunu bəyan edir. Elə buradaca Yuri Borevin [19,s.123] fikirləri yada düşür: "Ümumbəşəriliyin əsası incəsənətin öz bünövrəsində olur və tələb edir ki, sənətkar vasitəsilə hər bir hadisə təkcə fərdi və milli təcrübə ilə əlaqələndirilməsin, həm də həmin hadisələr estetik dəyər kimi qiymətləndirilərək bəşəri təcrübə ilə yan-yana qoyulsun və ümümbəşəri əhəmiyyət qazansın": "Abay, onun yaradıcılığı bütün bəşəriyyətə, bütün xalqlara məxsusdur. ***Təbii ki,*** bu qazax xalqının fəxri, qazax xalqının xoşbəxtliyidir. Çünki onun belə görkəmli övladı, alimi, maarifçisi var və o öz xalqını xoşbəxtliyə və firavanlığa aparan düzgün yol göstərmişdir. Bununla yanaşı o, bütün bəşəriyyətə, eyni zamanda Azərbaycan xalqına məxsusdur" [IVc.s.161].

İncəsənətin ictimai-dəyişdirici funksiyasının bir cəhəti də incəsənətin adamları müəyyən ictiqamətli və məqsədyönlü

fəaliyyətə cəlb edərək, bütün cəmiyyətin və ya onun ayrı-ayrı tərəflərinin sosial dəyişdirilməsində iştirak edir. İncəsənət özlüyündə sənətkarın ideallarına uyğun bir şəkildə fəaliyyətdir, dəyişdirmədir, yaratmadır [19,s.126]. Bütün bunlar Heydər Əliyevin görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışında öz əksini tapır. Auditoriya "sən" şəxs əvəzliyi ilə dövlət rəhbərinin Tofiq Quliyevə doğma, isti münasibətinin şahidi olur: "Ona görə biz hamımız ***sənə*** minnətdarıq, təşəkkür edirik. ***Sənin yaratdığın*** əsərlərə, xalqımıza bəxş etdiyin gözəl mahnılara, musiqiyə, bəstəkarlığına, təşkilatçılığına, Azərbaycanın ictimai həyatında daim fəal iştirak etdiyinə görə sənə təşəkkür edirik. ***Sən*** böyük işlər ***görmüsən***".

Əlizadə [38,s.322]: Deməli, gerçəkliyi hərtərəfli və çoxcəhətli əhatə etməsi, həyatdakı dəyişikliklərə tez cavab vermək qabiliyyəti, digər incəsənət növlərinə böyük təsir göstərməsi ədəbiyyatı incəsənətin ən başlıca və ən aparıcı növünə çevirir. Bədii obrazların mükəmməlliyi və insana güclü təsiri ədaəbiyyatı idarkın və estetik tərbiyənin mühüm vasitəsinə çevirir: "Bu gün sizə deyə bilərəm ki, şəxsən mənim bir insan kimi formalaşmağımda, təhsilimdə, əxlaqımda, mənəviyyatımda ədəbiyyatın, mədəniyyətin çox böyük rolu olmuşdur. Mən orta məktəbdə oxuyarkən Azərbaycan şairlərinin, yazıçılarının bütün əsərlərini sevə-sevə oxumuşam, onları bu gün də unutmamışam. Bu "oxumuşam, unutmamışam" sözləri sadəcə bir fikir deyil. Yəni onlar mənə təsir edib, mən onlardan bəhrələnmişəm, mənəvi qida almışam, ədəbiyyatla, mədəniyyətlə daim bağlı olmuşam".

M.Qədirli adına Mərkəzi Hövzə xəstəxanasında müalicə olunan xalq şairi Bəxtiyar Vahabzadə ilə görüşdəki söhbətdə Heydər Əliyevin Azərbaycan incəsənətinə verdiyi qiymət bu gün də təzətərdir, müasirdir, düşündürücüdür: "***Təsəvvür edin***, Azərbaycanda olan mədəniyyət xadimləri ***harada var***? Belə

şəxsiyyətlər ***harada var***? ***Yoxdur***. Azərbaycanda olan şairlər ***harada var***? Xarici ölkədə rəssam şəkil çəkir, aparıb küçədə qoyur ki, görsün onu sata bilir, yoxsa yox. Amma bizdə rəssam bir şəkil çəkir, gətirib sərgiyə qoyuruq, onu tərifləyirik, hörmətini qaldırırıq. Xaricdə şair şeir yazır, haradasa dərc olunur, ya olunmur, tanınmır" [VIIIc.s.334]. Auditoriyada "təsəvvür edin"lə müqayisə yaradaraq Azərbaycanda incəsənətə olan vətəndaş sevgisini, dövlət qayğısını ortaya qoyur. "Harada var" ritorik sualı ilə sonuclanan üç ritorik sual ardıcıl şəkildə təkrarlanaraq yüksək səfərbəredici nitq effekti yaradır.

Görkəmli Azərbaycan balerinası, xalq artisti, professor Leyla Vəkilovaya həsr edilmiş tamaşaya baxdıqdan sonra baletin iştirakçıları-incəsənət ustaları ilə görüşdəki çıxışda baletdən alınan estetik həzz özünəməxsus Heydər Əliyev dili ilə izahını tapır: "Tamaşaçı yarım saat, bir saat, saat yarım, iki saat oturur, əl çalır, ***həzz alır***, çox böyük estetik ***zövq alır***, ***sevinir*** –bu da təbiidir. Amma bu balet necə yaranır, necə ərsəyə gətirilir, hər bir ifaçı səhnədə nə kimi hisslər keçirir... ***Məsələn***, mən təsəvvür edirəm, lakin bununla yanaşı, ***mən də təsdiqləməyə cürət etmərəm ki, hər şeyi təsəvvürümdə axıradək canlandıra bilərəm***" [VIIIc.s.395-396]. "Həzz almaq", "zövq almaq", "sevinmək" kimi sinonimlərdən istifadə yolu ilə baletin estetik tərəflərini tamaşaçılara ünvanlayır. "Amma" ziddiyyət bağlayıcısı natiqin dilində yeni fikir səslənəcəyindən xəbər verir. "Mən də təsdiqləməyə cürət etmərəm ki, hər şeyi təsəvvürümdə axıradək canlandıra bilərəm" ifadəsi isə baletin incəsənətin yüksək səviyyədə fiziki və mənəvi peşəkar hazırlığa malik olmaq tələb edən növü olmasını auditoriyaya çatdırır.

"Əmin edirəm ki" modal sözünü işlədərək auditoriyada nikbinlik yaradır, qəti gələcək zamanda işlədilən "kömək edəcəyəm", "tədbirlər görəcəyəm" ifadələri ilə auditoriyada qətiyyətli bir ovqat yaradır: "Mədəniyyət xadimlərini, görüş

iştirakçılarını ***əmin edirəm ki***, əvvəllər olduğu kimi, yenə də incəsənətə, opera teatrına həmişə ***kömək edəcəyəm***, müasir şəraitdə mümkün olan bütün ***tədbirləri görəcəyəm*** ki, baletimiz getdikcə yüksəlsin, opera və balet teatrımız bugünkü kimi yaşasın, var olsun, bizdə yeni-yeni balet ustaları, yeni-yeni incəsənət ustaları yaransın" [VIIIc.s.396]

İncəsənətin hedonik funksiyası bədii əsərdə öz varlığını bir neçə planda göstərir və bir neçə mənbədən qidalanır [19,s.151]. Heydər Əliyev üçün incəsənətin bütün növləri dəyərlidir. "Xüsusən" modalı ilə sirkin uşaqların estetik cəhətdən inkişafında oynadığı rolu qeyd edir, "istedad və cəsarət" etik kateqoriyaları ilə sirk ustalarının xidmətini auditoriyaya açıqlayır: "Biz sizinlə birlikdə Azərbaycan sirkinin də bir neçə gözəl tamaşalarına baxdıq və onlar da çox yaxşı təəssürat bağışlayır. Burada səsləndi ki, Azərbaycan sirkinin də yubileyidir. Azərbaycan sirki xalqımıza böyük xidmətlər göstərmiş, ***xüsusən*** uşaqlara, gənclərə, onların əylənməsinə, şənlənməsinə çox xidmətlər göstərmişdir və gələcəkdə də göstərəcəkdir. Sirk işinə özünü həsr etmək böyük ***istedad*** və ***cəsarət*** tələb edir. Mən bu fürsətdən istifadə edib Azərbaycan sirkinin bütün əməkdaşlarına təşəkkürümü bildirir, onları da bu bayram münasibətilə təbrik edirəm" [XIVc.s.43].

İncəsənət təkcə estetik həzz mənbəyi olmaqla məhdudlaşmır. Heydər Əliev xalçaçılıq timsalında həm də incəsənətin utilitarlıq funksiyasını da unutmamağı tövsiyə edir. Bəzən utilitar maraqlar öz növbəsində güclü sənət əsərlərinin, özlüyündə yüksək estetik zövqün inkişafına gətirib çıxarır: "Bu xalçalar xalqımızın böyük incəsənətinin nümunəsidir, onu nümayiş etdirir. Dünyada xalqımız bu xalçalarla çox tanınır. Ölkəmiz müstəqillik əldə etdikdən sonra Azərbaycana dünyanın hər yerindən, xüsusilə Qərb ölkələrindən çoxlu qonaqlar gəlir. Onların hər birisi gedib xalça alır. Bəziləri

mənim yanıma gələndə deyirlər ki, biz Sizin ölkənizə xeyir verdik. Soruşuram, nə xeyir verdiniz? Deyirlər ki, xalça aldıq, burada pul qoyub gedirik. ***Şübhəsiz ki,*** bu xalçalar bizim hər birimiz üçün əzizdir. Bu xalçalardan belə saraylarda istifadə etmək lazımdır" [XVc.s.91].

İncəsənət xadimləri arasındakı qısqanclıq, xudpəsənlik, təkəbbürlülük kimi antietik dəyərləri yüksək nitq ustalığı ilə qınağa çəkən Ulu Öndər köməkçi nitq hissələrinin köməyi ilə ecazkar nitq nümunələri yaradır. "Qoy" əmr ədatı, "savayı" qoşması, "heç kəs" inkar əvəzliyi, "elə" məhdudlaşdırıcı ədatı ilə bu qınağı həyata keçirir (qoy onlardan savayı heç kəs olmasın, elə onlar qalsınlar). "Əgər" şərt bağlayıcısı ilə başlayan ritorik sualla auditoriyanı dediklərinin tarix fəlsəfələrinə söykəndiyini bəyan edir, sıra sayları ilə Azərbaycan xalqının keçmişdə də, gələcəkdə də korifey sənətkar yetişdirəcəyini dilə gətirir: "Mən hətta bizim incəsənət xadimləri ilə – müğənnilərlə, bəstəkarlarla və yazıçılarla danışanda həmişə deyirəm ki, siz gərək çalışasınız işinizin davamçıları olsun. İncəsənət xadimləri bu barədə bir az ***qısqanc*** olurlar, bəziləri hesab edir ki, ***qoy*** onlardan ***savayı*** heç kəs olmasın, elə onlar qalsınlar. Amma mən isə bir azərbaycanlı kimi, həmişə fikirləşirdim ki, məsələn, bizim böyük müğənnimiz Bülbüldən sonra kim olacaq, Bülbülsüz necə yaşayacağıq? Yəni bundan sonra Bülbül kimiləri, bəlkə Bülbüldən daha yüksəyə qalxan olmalıdır. ***Məsələn***, Rəşid Behbudovdan sonra bir neçə Rəşid Behbudovlar dünyaya gəlməlidir. Gəlir və gələcəkdir. Heç kəs də başqa cür düşünməsin. Bizim Azərbaycan xalqı o qədər istedadlı xalqdır ki, bunu əsrlər boyu nümayiş etdiribdir. ***Əgər*** belə olmasaydı bizim bu qədər böyük-böyük şairlərimiz ***olardımı***? Bizim ***X*** əsrdə də böyük şairimiz var, ***XII*** əsrdə də, ***XV*** əsrdə də, ***XVI*** əsrdə də, ***XVIII, XIX, XX*** əsrlərdə də nə qədər böyük şairlərimiz var. Bu, xalqın istedadını göstərir. Eləcə də bəstəkarlarımız, müğənnilərimiz.

İncəsənətdə ümumbəşərilik haqqında Yuri Borev [19,s.123] yazır: "İncəsənətdə ümumbəşəriliyin əsası incəsənətin öz bünövrəsində olur və tələb edir ki, sənətkar vasitəsilə hər bir hadisə təkcə fərdi və milli təcrübə ilə əlaqələndirilməsin, həm də həmin hadisələr estetik dəyər kimi qiymətləndirilərək bəşəri təcrübə ilə yan-yana qoyulsun və ümumbəşəri əhəmiyyət qazansın.

Ümummilli liderin Azərbaycanın ədəbiyyat, mədəniyyət, incəsənət, elm, din və idman xadimlərinin böyük bir qrupuna "Şöhrət" ordenlərinin təqdim edilməsi mərasimindəki nitqinə etika və siyasət prizmasından baxsaq incəsənətin inkişafında onun istiqamətlərinin formalaşmasında, gələcək inkişaf perspektivlərində dövlətin rolu inkar olunmur. Azərbaycan dövlətinin rəhbəri kimi dövlətin qayğısı şüurlara çatdırılır: "Bildiyiniz kimi, Azərbaycan dövlətinin ordenləri, medalları təsis olunub və ötən illərdə Azərbaycanın görkəmli şəxsləri bu ordenlərlə, medallarla təltif ediliblər. Təltif olunanların əksəriyyəti Azərbaycanın mədəniyyət, elm xadimləri – ədəbiyyatda, incəsənətdə, elmdə xalq qarşısında ***xidmət göstərmiş, fərqlənmiş şəxslərdir*** [XVIIc.s.132].

Azərbycanının incəsənət, ədəbiyyat sahəsindəki varislik ənənələrinin qırılmasına çalışanları böyük natiq sinonim cərgə ilə (pozmaq, qaralamaq, hörmətdən salmaq) tənid edir. "Bu nəyi göstərir" ritorik sualına böyük natiqin özünün lakonik, yığcam və mənalı cavabı məsələyə aydınlıq gətirir: "İkincisi, bu gün burada orden alan insanlar müxtəlif yaşlara mənsubdurlar. Ramazan Xəlilov 100 yaşına çatır. Fərhad Bədəlbəylinin, Rasim Balayevin 50 yaşı tamam olubdur. Buraya toplaşanlar 50 yaş ilə 100 yaş arasında olan insanlardır. ***Bu, nəyi göstərir***? Bu onu göstərir ki, Azərbaycanda nəsillər bir-birini ardıcıl surətdə əvəz edir. Azərbaycanın elm, mədəniyyət, ədəbiyyat, incəsənət xadimləri nəsilləri arasında əlaqələr qırılmır. Onlar bir-biri ilə bağlıdır, bir-birini irəliyə aparır.

Gənc ***də***, yaşlı ***da*** – hamısı bir yerdədir. Bunun xüsusi əhəmiyyəti vardır. Çünki son illərdə bəziləri Azərbaycanın tarixi keçmişini ***tamamilə pozmağa, qaralamağa, hörmətdən salmağa*** cəhdlər göstərmişlər" [XVIIc.s.163-164].

Xalqın ədəbiyyat, mədəniyyət, incəsənət tarixini heç kəsin poza bilməyəcəyini "da" qüvvətləndirici ədatı və antroponimik sıralanma ilə auditoriyanın yaddaşında təzələyir. "Şübhəsiz ki" və "əminəm ki" modal sözlərlə xalqın ənənələrinin gələcəkdə yaşayacağına olan ümidin üzülməməsini gələcək nəsillərə ünvanlayır: "***Şübhəsiz ki***, bu cəhdlər heç bir nəticə verə bilməz. Biz Nizamini, Füzulini, Nəsimini, Vaqifi qiymətləndirdiyimiz kimi, Mirzə Fətəli Axundovu da, Üzeyir Hacıbəyovu da, Cəlil Məmmədquluzadəni də, Cəfər Cabbarlını da, Müslüm Maqomayevi də, Səməd Vurğunu da, Rəsul Rzanı da, Süleyman Rəhimovu da, Mehdi Hüseyni də, Qara Qarayevi də, Fikrət Əmirovu da, Niyazini də, Rauf Hacıyevi də və başqalarını da qiymətləndiririk. Biz bu gün yaşayıb-yaradanları da qiymətləndiririk. Bunların hamısı bir-biri ilə üzvi surətdə bağlıdır. Xalqımızın, mədəniyyətimizin, incəsənətimizin, elmimizin çox gözəl keçmişi, tarixi və bu günü vardır. Mən tam əminəm ki, bundan da gözəl gələcəyi olacaqdır.

Kim hansı dövrdə, hansı hökmdarın dövründə, hansı ictimai-siyasi quruluşda yaşayıb, yazıb, kim müstəqil Azərbaycanda yaşayır, yazır – bunun fərqi yoxdur. Onların ***hər biri*** keçmişdə də, bu gün də xalqımıza, Azərbaycan xalqına, doğma millətimizə, vətənimizə xidmət edibdir" [XVIIc.s.163-164].

Sənətşünasların [122,s.158-160] operaya verdikləri tərifləri, onların opera haqqındakı elmi biliklərini Heydər Əliyevin bu sahədəki fikirləri ilə müqayisə etdikdə auditoriyaya yalnız heyranlıq qalır. Təəccüb dolu heyranlıq incəsənətimizə bu dərəcədə yaxından bələdliyə olan heyranlıq.

Opera haqqında oxuyuruq: Opera bütövlükdə musiqi sənətinin ən mürəkkəb janrı olub, həm vokal, həm də instrumental musiqini, eləcə də dramaturgiyanı, poeziyanı, xoreoqrafiyanı, təsviri sənəti birləşdirən sintetik sənət növüdür: [122,s.158-160] "Azərbaycanda dram teatrı ilə yanaşı, opera və baletin də qədim tarixi kökləri vardır. Muğam sənətimizuzun inkişaf yolu keçərək xüsusi ifaçılıq məktəbinə çevrilmiş, muğam əsasında yaradılmış tamaşalar meydana çıxmışdır. Bunların məntiqi nəticəsi olaraq dahi Azərbaycan bəstəkarı Üzeyir Hacıbəyovun yaratdığı "Leyli və Məcnun" operasının 1908-ci ildə ilk tamaşası ilə Azərbaycanda və bütün müsəlman Şərqində opera sənətinin təməli qoyuldu. Üzeyir Hacıbəyov ilə birlikdə Azərbaycanda Avropa tipli peşəkar musiqi sənətinin bünövrəsini qoyan Müslüm Maqomayevin "Şah İsmayıl" operası da muğam operası janrının incilərindən biri kimi Azərbaycan səhnəsində həmişəlik yer tutdu" [XVIIc.s.190].

Opera sənətindən danışan böyük natiq sonrakı nitq mərhələsində vokal sənəti, onun yaranması, inkişafı, bu sahədəki yenilikləri auditoriya üçün incələyir: "30-cu illərdə Üzeyir Hacıbəyovun "Koroğlu" və Müslüm Maqomayevin "Nərgiz" operalarının səhnəyə qoyulması Azərbaycan opera sənətində yeni mərhələnin başlandığını bildirdi. Opera sənətimizin incilərindən sayılan bu əsərlərdə ilk dəfə olaraq klassik opera formasına riayət olunmuşdur. Bu tipli operaların yaranması Bülbül və Şövkət Məmmədova kimi böyük sənətkarların öz nadir istedadlarını nümayiş etdirmək imkanlarını artırdı. Azərbaycan vokal məktəbi ənənələrini Avropa opera mədəniyyəti ilə birləşdirən Bülbül yaradıcılığı ölkəmizdə vokal sənətinin inkişafında və yeni tipli opera solistlərinin yetişməsində mühüm rol oynadı" [XVIIc.s.191].

Əlillərin birinci ümumrespublika bədii yaradiciliq baxış-müsabiqəsi qaliblərinin yekun konserti başa çatdiqdan sonra tədbir iştirakçıları qarşısında çıxışda Heydər Əliyev incə-

sənətin insanın formalaşmasındakı rolunu açıb göstərir. İncəsənətin insanlara olan tərbiyəedici funksiyası haqqında estetik elmi fikirləri ilə Heydər Əliyevin şifahi mətnləri arasındakı ideya uyğunluğu audioriyaları – xüsusən də sənətşünaslar auditoriyasını heyranlıqda saxlayır. İncəsənət ağır sınaqlardan keçmiş qəhrəmanları təsvir edərək insanları tərbiyələndirir, onların daxili aləmini təmizləyir [19,s.143].

İncəsənətin insanı nə dərəcədə yüksəltməyi Heydər Əliyev nitqində aşağıdakı kimi səslənir: "Nə qədər" ədatı ilə insanın qiymətini verir. Estetik zövqün sinonimi olan sözləri bir cərgədə (sevindirmək, heyran etmək, həyəcanlandırmaq) verir: "Bu gün bizə təqdim olunan incəsənət nümunələri bizi həddindən artıq ***sevindirdi, heyran etdi, həyəcanlandırdı.*** Bu gün bu səhnədən çıxış edənlər özlərinin yüksək istedadlarını nümayiş etdirdilər. Eyni zamanda onlar böyük iradəyə malik olduqlarını nümayiş etdirdilər. Bugünkü tamaşa insanın nə qədər böyük imkanlara malik olduğunu bir daha bizə göstərdi. Bizi sevindirən odur ki, fiziki cəhətdən qüsuru, çatışmazlığı olan insanlar nikbin yaşayırlar və öz iradələrinə söykənərək istedadlarını inkişaf etdirirlər və hətta ölkənin festivallarında, müsabiqələrdə çıxış edərək onları ictimaiyyətə nümayiş etdirirlər. Bu, insanın ən gözəl xüsusiyyətlərindən biridir. Bu, insanın ***nə qədər*** yüksək mənəviyyata, ***nə qədər*** yüksək gücə, ***nə qədər*** yüksək iradəyə malik olduğunu bir daha göstərir. Biz bu halları qiymətləndirməliyik və hər bir insanın cəmiyyətdə özünün daxilində olan imkanlardan istifadə etməsi üçün, öz istedadını nümayiş etdirməsi üçün ona şərait yaratmalıyıq" [XVIIIc.s.297-298].

Dinləyicilər etik və estetik dəyərlərin dialektik vəhdətini aşağıdakı mətndə dərk edirlər. Mətndən göründüyü kimi "bəli" təsdiq ədatı ilə fikirdəki ideya geridönməzliyi üzə çıxır. "Öz" təyin əvəzliyinin təkrarı ilə insanın cəmiyyətdə nə etməli

olduğu anlaşılır. Elə bu fikirlər Heydər Əliyevin etik kredosuna daxil ola bilir. "Məhz" dəqiqləşdirici ədatı ilə etik kredoya daxil ola biləcək insanları dəqiqləşdirir: "***Bəli***, insan çox şeyə qadirdir. İnsan nikbin olmalıdır. İnsan nə qədər çətinliklərlə rastlaşsa da, ***öz*** istedadını, ***öz*** biliyini, ***öz*** bacarığını cəmiyyətə təqdim etməlidir, cəmiyyətə, ölkəsinə həsr etməlidir. Bu gün ***bu*** möhtəşəm salonda, ***bu*** teatr səhnəsində böyük məharətlə öz istedadlarını nümayiş etdirən insanlar ***məhz*** belə insanlardır. Mən onları ürəkdən təbrik edirəm və onlara, bütün müsabiqədə iştirak edənlərə cansağlığı, səadət arzulayıram. Qarşıdan gələn beynəlxalq əlillər günü münasibətilə bütün əlilləri təbrik edirəm. Bir daha bəyan edirəm ki, Azərbaycanda hər bir vətəndaş dövlətin qayğısı altındadır və xüsusən əlillik ömrü keçirən, yaşayan vətəndaş dövlətin qayğısı altındadır" [XVIIIc.s.298-299].

"Təkcə" məhdudlaşdırıcı ədatı ilə auditoriyanı, necə deyərlər, intizarda qoymayan böyük natiq "bu qədər" kəmiyyət zərfi ilə Azərbaycanın zəngin mənəvi sərvətini diqqətə çatdırır: "***Təkcə*** Nizami, Füzuli, Nəsimi deyil, başqa böyük şəxsiyyətlər də islam sivilizasiyasını inkişaf etdirməkdə xidmət göstərmişlər. Bunlar hamısı kiçik bir ərazidə olan Azərbaycana məxsusdur. Azərbaycan özündə ***bu qədər*** böyük, zəngin sərvətləri qoruyub saxlayıbdır. Mən çox arzu edirdim ki, siz elmi müzakirələrlə yanaşı, Azərbaycanla, Bakı ilə tanış olasınız. Bilmirəm, Elçin Əfəndiyev bunu təmin edə bilib, ya bilməyibdir" [XVIIIc.s.378-379].

Bədii ədəbiyyat incəsənətin bir növü kimi, həm də aparıcı növü kimi estetlər tərəfindən öz qiymətini alır. "Cəmiyyətin ideya-bədii"inkişafında ədəbiyyatın xüsusi əhəmiyyətinə və onun digər incəsənət növləri ilə müqayisədə aparıcı roluna görə o, bizim dövrümüzdə çox geniş yayılmış "ədəbiyyat və incəsənət" ifadəsini alır. Heydər Əliyev üçün ədəbiyyat

"tariximizi, azərbaycançılığımızı, dilimizi" nümayiş etdirmək üçündür: "Azərbaycanın azərbaycançılığını, Azərbaycan dilini bu gün də sübut edən ən dəyərli əsər "Kitabi-Dədə Qorqud"dur. Biz "Kitabi-Dədə Qorqud" dastanının 1300 illik yubileyini qeyd edirik. Azərbaycanın alimləri, ədəbiyyatşünasları, yazıçıları son on illərdə Azərbaycan tarixinin bu hissəsini, məhz azərbaycançılığı, Azərbaycan dilini, yəni bizim milli kökümüzü, dilimizin milli kökünü hamıya nümayiş etdirmək, sübut etmək üçün gözəl əsərlər yaradıblar.

"Kitabi-Dədə Qorqud"un boyları çox elmi əsərlərdə təhlil edilibdir, yazıçı Anarın yaratdığı filmdə geniş kütləyə izah olunubdur. Bir çox alimlərin dəyərli əsərləri vardır. O cümlədən, Naxçıvan Muxtar Respublikasının alimi Səfərəli Babayevin bu günlərdə çapdan çıxmış kitabı çox qiymətlidir. Bu kitab ona görə qiymətlidir ki, "Kitabi-Dədə Qorqud"un boylarının, toponimlərinin hamısını Naxçıvanda tapmaq olar. Naxçıvanda bunu tapıblar, təhlil ediblər, elmi surətdə öyrəniblər və Səfərəli Babayev bu barədə böyük bir kitab yaradıbdır.

Bu, azərbaycançılıq, Azərbaycan dilinin qədimliyi, dilimizin dərin kökləri nöqteyi-nəzərindən nə qədər qiymətlidir! Yenə də deyirəm, bu, Naxçıvanın Azərbaycan tarixində – keçmiş əsrlərdə də, orta əsrlərdə də və sonrakı dövrlərdə də nə qədər böyük rol oynadığını göstərir" [XXIIc.s.193].

İncəsənət növləri arasında bədii ədəbiyyata mühüm yer ayıran böyük natiq "Kitabi-Dədə Qorqud" dastanının qiymətini xalqa çatdırır. Bu dastanın dünyaya tanıdılmasını və Azərbaycana məxsus olmasını davamiyyət bildirən modallarla – birincisi, ikincisi, üçüncüsü-həyata keçirir. Görülən işləri "təsəvvür edin" müqayisəsi ilə, "bax" qüvvətləndirici ədatı ilə auditoriyanın diqqətinə çatdırır: "Biz indi bu üç il müddətində – buradakı məruzələr, çıxışlar bunu göstərdi – ***birincisi***,

"Kitabi-Dədə Qorqud" dastanını xalqımıza yaxşı tanıtdıq, ***ikincisi***, dünyaya tanıtdıq, ***üçüncüsü***, tam təsdiq etdik ki, bu, Azərbaycana məxsusdur. ***Bəli***, bu turk xalqlarına məxsusdur, ancaq Azərbaycana məxsusdur. Onun vətəni Azərbaycandadır və varisi, sahibi Azərbaycandır, yəni Azərbaycan xalqıdır. Biz gələcək işlər üçün böyük yol açdıq. ***Təsəvvür edin***, ***bax***, qısa müddətdə burada nə qədər kitablar nəşr olunubdur. Amma bizim komissiyanın birinci iclasını yadınıza salın. Nə var ki? Bunlar yox idi" [XXVc.s.333].

Amma ən əhəmiyyətlisi odur ki, əsərlər yaranır və bu əsərlər gələcək üçün, bizim tariximizin daha da geniş, dərin təhlil olunması üçün, gələcək nəsillər üçün böyük töhfədir [XXVc.s.334].

Təbiidir ki, indi biz hər bir kitabı bir neçə min nüsxədə nəfis şəkildə nəşr edə bilmərik. Biz bunları yubiley üçün yaratmışıq. Ancaq fikrim bundan ibarətdir ki, bu kitabların çoxunu, bəlkə də hamısını, yaxud bir qismini geniş kütlələr üçün böyük tirajla sadə şəkildə nəşr edək. Onları geniş kütlələrə çatdırmaq üçün satışa buraxaq, kitabxanalara verək. İndi nəşr etdirdiyimiz bu əsərləri kitabxanalara versək, yerdə bir şey qalmayacaqdır. Çünki bunlar 1000–2000 nüsxədir, bundan artıq deyildir, elədirmi? [XXV c,s 334].

Ancaq geniş kütlənin "Kitabi-Dədə Qorqud" dastanı, abidəsi ilə bu gün və gələcəkdə dərindən tanış olması və onu dərindən bilməsi üçün – bunun əsas mənası ondan ibarətdir ki, öz kökünü, keçmişini, millətinin tarixini dərindən bilsin – biz bugünkü və gələcək nəsillərin bu kitablardan lazımi qədər istifadə etməsi imkanına malik olmalıyıq. Mən bu fikri dünən söyləmişəm, indi bir daha deyirəm. Mən görülən işləri çox yüksək qiymətləndirirəm. Ancaq bu, işin başlanğıcı olmalıdır. Bunun üçün biz vəsait də tapa bilərik. Doğrudur, indi bizim vəsaitimiz o qədər də çox deyildir. Amma biz buna qənaət

etməməliyik, bunları etməliyik. Çünki bunlar xalqımız, gələcək üçün lazımdır" [XXVc.s.335].

Yuri Borev incəsənətin infomativ-kommunikativ funksiyasından danışarkən qeyd edir ki, incəsənətin bu funksiyası adamların fikir və təcrübə mübadiləsi etməsinə imkan yaradır, zaman və məkanca bizdən çox uzaq olan insanların tarixi və milli həyat təcrübəsinə bələd olmaq üçün bizə imkan verir. Bununla da mütərəqqi incəsənət xalqlar birliyi idealına və mənəvi tərəqqi işinə, insanın mənəvi potensialının yüksəlməsi məqsədinə xidmət edir [19,s.141]. İncəsənətin insanlara təsirinin məşhur estetlər tərəfindən izahından fərqli olaraq bu izah Heydər Əliyev dilində şifahi şəkildə, spontan olaraq auditoriyalara dilin geniş imkanları hesabına həyata keçirilir: **"***Bilirsinizmi*, biz incəsənətin bütün növlərini xoşlayırıq. Perm baleti də, *şübhəsiz*, xalq çalğı alətləri orkestri də çox uğurlu çıxış etdi. Belə düşünürəm ki, bu gün də yaxşı konsert olacaq, biz birlikdə olacağıq. *Əlbəttə*, bunun əhəmiyyəti mədəniyyət və incəsənətin hüdudlarından çox-çox kənara çıxır. Bu, mədəniyyət və incəsənətin məhz belə bir vasitəsidir ki, biz insanlar *arasında*, xalqlar *arasında*, ölkələr *arasında* qarşılıqlı münasibətləri onun köməyi ilə daha çox möhkəmləndirə bilərik. İqtisadi əlaqələr və qalan digər əlaqələr də rol oynayır, amma onlar hansısa bir sahə, ticarət xarakteri daşıyır: *biz nəsə satırıq, nəsə alırıq, buradan nəsə aparırıq, buraya nəsə gətiririk*. Amma incəsənət, mədəniyyət adamlarının görüşməsi, mahnılar, rəqslər, musiqi, bədii söz və sairə – bütün bunlar çox güclü vasitədir və həmişə belə də olmuşdur. Biz keçmiş Sovetlər İttifaqında bu vasitədən fəal istifadə edirdik. *Zənnimcə*, çox yaxşıdır ki, biz ondan istifadə edirik. Biz artıq bir neçə dəfə Bakıda, Azərbaycanda Rusiya, Moskva günləri keçirmişik. Bir dəfə Yuri Mixayloviç Lujkovun özü də gəlmişdi. Eləcə də Moskvada Azərbaycan mədəniyyəti günləri

keçirilmişdir [XXVIIIc.s.378]. Diqqət yetirdikdə "bilirsinizmi" modal sözü ilə incəsənətin bütün növlərinə olan sevgisini dilə gətirməklə konsert tamaşalarının rolunu xüsusi qeyd edir, "arasında" ifadəsini təkrar etməklə (insanlar arasında, xalqlar arasında, ölkələr arasında), "şübhəsiz" modalı ilə incəsənətin dünya siyasətinə olan fəal təsirindən danışır. Bu fəal təsir auditoriyaya sadə, əvəzində yaddaqalan və düşündürücü məişət üslubunun köməyilə ünvanlanır (biz nəsə satırıq, nəsə alırıq, buradan nəsə aparırıq, buraya nəsə gətiririk.). İncəsənətin xalqlararası dostluq və əməkdaşlığa olan müsbət təsirinin quruluşdan asılı olmamasını "zənnimcə" təfəkkür modal sözü ilə açıqlayır.

Hər şeyə görə sağ olun. Bir daha deyirəm, siz bütün Azərbaycana olduqca böyük sevinc bəxş etdiniz. Axı burada təkcə çıxışlardan – konsertdən, baletdən, teatrdan söhbət getmir. Söhbət ondan gedir ki, mədəniyyət, incəsənət insanları yaxınlaşdıran, qarşılıqlı münasibətləri, dostluğu möhkəmləndirən çox güclü vasitədir. Bu günlər siz Rusiya Federasiyası ilə Azərbaycan arasında dostluğun və əməkdaşlığın möhkəmlənməsi işinə olduqca böyük töhfə verdiniz. Burada Qafqazdan – Qaraçay-Çərkəzdən, Şimali Osetiyadan olan gəncləri də görmək mənim üçün xoş idi, gözəl gənclər böyüyür. Bilirsinizmi, Qafqazın bu xalqları yüksək istedadları ilə həmişə fərqlənmişlər. Neçə-neçə belə adamlar bütün dünyada məşhurdur. Ancaq məni sevindirən budur ki, bu hərəkət kəsilmir, dayanmır, bu hərəkət irəliyə doğru gedir. Bir görün, necə cavandırlar və bu gün nə cür gözəl çıxış etdilər. Bu gün siz, həqiqətən, elə bir konsert verdiniz ki, burada folklor da, estrada da, gözbağlayıcı da, bədii söz də var idi. Amma yəqin ki, ən başlıca xidmət rejissorundur, gərək xidmətlərini qiymətləndirəsən, çünki o bunların hamısını məharətlə təşkil etmişdi, hər şeyi elə yerbəyer etmişdi ki, bir

saniyə də fasilə olmurdu. Məsələn, mən bir an belə gözümü səhnədən çəkə bilmirdim [XXVIIIc.s.390-391].

Fəxr edirik ki, bizim dünyəvi teatrın 130 illik tarixi vardır. Fəxr edirik və bu, bölgədəki bütün xalqlardan bizi fərqləndirir. O mənada ki, bizdə demokratik, dünyəvi ideyalar bu günün, dünənin hadisəsi deyil. 125 il bundan öncə Həsən bəy Zərdabi, onunla bərabər Mirzə Fətəli Axundov və başqaları toplaşıb – təbiidir ki, Həsən bəy Zərdabi "Əkinçi" qəzetinin yaradıcısıdır – belə bir təşəbbüslə çıxış ediblər. Gərək indi biz düşünək ki, o vaxt bu, asan yox, həddindən artıq çətin bir iş idi. Əgər 125 il bundan öncə bu, baş veribsə və biz "Əkinçi" qəzetini 125 ildir xatırlayırıqsa, indi görün bu insanlar nə qədər böyük vətənpərvər, millətinin inkişafını istəyən və nə qədər cəsarətli insanlar olublar. Çünki o şəraitdə belə bir qəzeti Azərbaycan dilində yaratmaq çox böyük risklərlə bağlı idi. Amma onlar bu riskləri ediblər. Təsadüfi deyildir ki, "Əkinçi" qısa bir zamandan sonra bağlanıbdır. Ondan sonra rus dilində nəşr olunan bəzi qəzetlərə əlavə olaraq vərəqələr çıxıbdır [XXIXc.s.243-244].

Yenə də deyirəm, bunlara görə filmi qadağan etmişdilər. Mən gedib həmin filmə baxdım, gördüm ki, orada hər şey normaldır, düz ediblər. Mən götürüb Moskvaya, daxili işlər nazirinə zəng etdim. Ona bildirdim ki, sən deyirsən heç bir milis rüşvət almır? Sən bunu deyə bilərsən? Cavab verdi ki, yox belə deyil, amma bu, bizi ləkələyir. Soruşdum ki, nəyi ləkələyir? Həqiqəti deyəndə, nəyi ləkələyir?

Mən olmasaydım, bu filmi buraxmırdılar. Yaxud, mənim vaxtımda Rüstəm İbrahimbəyovla Rasim Ocaqov "İstintaq" adlı bir film də çəkdilər. Bu, sizə məlumdur. Həmin film mənim xahişimlə, korrupsiya, "sexovşik"lər və sair qanunsuz hərəkətlər barədə bizim əldə etdiyimiz materiallar əsasında çəkilmişdi. Amma bu filmi bizim adamlar sonra qadağan

etdilər. Nə üçün? Deyirdilər ki, "Bu məsələ bizim daxili işimizdir, amma film bütün SSRİ-də yayılacaq, hər yerdə fikirləşəcəklər ki, görün, Azərbaycanda korrupsiya, qanunsuzluqlar və sair var". Ancaq mən belə fikirdə deyildim, bu gün də belə fikirdə deyiləm. Nə var, – odur, biz bunu gizlətməməliyik. Bunu nə qədər gizlətsən, o qədər də pis olacaq.

Bizim yazıçımız Anar bir əsər yazmışdı. Xatırlayıram, onun adı "Şəhərin yay günləri" idi. Bəziləri gedib bu tamaşaya baxmışdı, ağızlarını büzmüşdülər ki, "Bu nədir, orada prokuror obrazı var, o rüşvət alır" və sair. Mən maraqlandım, gedib həmin tamaşaya baxdım. Gördüm ki, o, çox gözəl bir tamaşadır. Sonra gəlib bəyanat verdim ki, bu çox gözəl bir əsərdir. Əksinə, həmin əsər üzrə film də çəkmək, onu rus dilində tamaşaya qoymaq lazımdır və sair [XXIXc.s.253–254].

Demokratik, hüquqi, dünyəvi dövlətdə, qanunlarla yaşayan dövlətdə jurnalistika çox vacib bir peşədir, mətbuat çox vacib bir sahədir. Bu mənim fikrimdir və mən bu fikrimi heç vaxt dəyişdirməyəcəyəm.

Azərbaycan xalqı bütün başqa xüsusiyyətləri ilə yanaşı, eyni zamanda gözəl bir xalqdır. Uşaqlara baxıram, bir-birindən gözəldirlər. Bu hər bir insanı sevindirir. Mən özüm haqqında deyirəm. Amma inanıram ki, çox az adam taparsan ki, uşağı sevməsin. Çox az adam taparsan ki, uşağı şən, gözəl, yaxşı əhval-ruhiyyədə görəndə özü də sevinməsin. Ona görə də, əziz balalar, uşaqlar, siz öz varlığınızla, bugünkü istedadınızla valideynlərinizi, hər birimizi, məni sevindirirsiniz. Bu gün bir daha Azərbaycana, ölkəmizin vətəndaşlarına yeni-yeni sevinc bəxş etdiniz. Mən isə sizinlə bir yerdə olmağımdan, təbiidir ki, daha da çox sevinirəm və ola bilər ki, başqaları mənə qibtə etsinlər ki, niyə Heydər Əliyev oradadır, mən orada deyiləm?

Siz incəsənəti çox gözəl nümayiş etdirdiniz. Ancaq şübhə etmirəm ki, məktəbdə dərslərinizi də belə yüksək səviyyədə öyrənirsiniz, oxuyursunuz. Bilik almaqda da istedadınız var, ondan istifadə edirsiniz. Həyatda sağlam vətəndaş kimi böyümək üçün də öz istedadınızdan istifadə edirsiniz. Çünki bunlarsız təkcə incəsənət – rəqs, mahnı insana hər şeyi gətirə bilməz. Ona görə də mənim sizə daim tövsiyəm bundan ibarətdir ki, yaxşı oxuyun, atanıza-ananıza daim hörmət göstərin. Azərbaycan xalqının qədim bir ənənəsi var, bu da uşağın böyüyə hörmət etməsidir. Bax, bu xüsusiyyəti özünüzdə yaradın, saxlayın. Özünüzü sağlam düşüncəli, vətənpərvər, vətənini, millətini, müstəqil dövlətini sevən vətəndaş etmək üçün çalışın. Mən ümidvaram ki, bizim gənclərimizin, uşaqlarımızın əksəriyyəti bu duyğularla, fikirlərlə yaşayır. Xüsusilə də siz, bu mərasimin iştirakçıları [XXXIc.s.176-177].

Sankt-Peterburq şəhərində (9 iyun 2002-ci il) dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvinin abidəsinin təntənəli açiliş mərasimindəki nitqdə incəsənətin mühüm növü kimi heykəltəraşlığın xalqlararası münasibətə göstərdiyi müsbət təsiri açıqlayır. Bu müsbət təsir məhz "həm", "həm də" iştirak bağlayıcılarının köməyilə auditoriyaya çatdırılır. "Ürəkləri vəcdə gətirmək", "həqiqi humanist ideyalar" ifadələrini eşidən auditoriya qarşısında böyük sənətşünas alimi, estet-filosofu görür və bu nitqin sehrinə düşür: "Bu gün Sankt-Peterburqda dahi şair Nizaminin heykəlinin açılışını biz dünya mədəni irsinə böyük ehtiramın ifadəsi, Azərbaycan xalqına bəslənilən dostluq və qardaşlıq hisslərinin təzahürü kimi qiymətləndiririk. Keçən il oktyabrın 12-də Bakıda rus poeziyasının dühası Aleksandr Sergeyeviç Puşkinə heykəl qoyulmuşdur. Bu gün isə burada, Puşkinin Böyük Pyotrun əsəri adlandırdığı bu şəhərdə Nizamiyə heykəl ucaldılmışdır. Bu iki abidə ***həm*** xalqlarımızın mədəniyyətinə hədsiz

ehtiramımızın, ***həm də*** ölkələrimiz arasında əlaqələrin yeni səviyyəsinin təcəssümüdür. Nizaminin ***ürəkləri vəcdə gətirən*** təkrarolunmaz lirikası və qəhrəmanlıq eposunda onun ***həqiqi humanism ideyalarını*** ehtiva edən fəlsəfi konsepsiyası öz əksini tapmışdır" [XXXIXc.s.42].

Beləliklə, böyük natiqin dilində bədii-publisistik və elmi-bədii üslubda incəsənətlə bağlı söylədiyi nitqlər incəsənətin müxtəlif formalarının analizi üçün əsas verir.

## 2.2.1.Heydər Əliyevin nitqində bədii ədəbiyyat

Ədəbiyyatın incəsənətin aparıcı növü kimi əhəmiyyət kəsb etməsinin bir neçə səbəbi vardır. Birinci səbəb ondan ibarətdir ki, o, qəribə həssaslıqla əsrin nəbzini tuta və zamanın dəyişmələrinə çox tez öz münasibətini bildirə bilir. Yəni incəsənətin başqa növlərinə nisbətən ədəbiyyat gerçəkliyin ən mürəkkəb, əsaslı proseslərini, əsrin başlıca inkişaf meyillərini, ictimai həyatın bütün sahələrini, tarixi dəyişiklikləri, sarsıntıları, çevrilşləri, inqilabları bütün dolğunluğu, mürəkkəbliyi, ziddiyyətləri, harmoniyası ilə təsvir etmək iqtidarındadır [122]. Bu ədəbiyyatı yaradansa xalq və onun görkəmli övladlarıdır. Həmin övladların adlarını, xidmətlərini, əsərlərinin bədii, tarixi, etik, estetik və s. əhəmiyyətini antrponimik sıralanmalarla Heydər Əliyev xalqın yaddaşına həkk edir: "Biz Nizaminin, Xaqaninin, Nəsiminin, Füzulinin adlarını böyük iftixar hissi ilə çəkirik və onların əsərlərini oxuyaraq xalqımızın nə qədər dahi, müdrik və istedadlı xalq olduğunu bir daha dərk edirik. Eyni zamanda dünya, bəşər qarşısında bunlarla fəxr edirik, öyünürük. Öyünməyə də haqqımız var. Çünki bu böyük insanlar nəinki xalqımızı, bütün bəşəriyyəti, bəşər tarixini zənginləşdirən əsərlər yazmışlar" [XXIc.s.254].

Xalq şairi Zəlimxan Yaqub [132] "Əbədiyyət dastanı" poemasının "Şeirlərin sirdaşıydı, şairlərin qardaşı" hissəsində Ulu Öndərin şeirə, şairə münasibətini səlistcəsinə nəzmə çəkir:

Dediyi söz Haqdan gələn, İlahinin sözüydü,
Bizim üçün əziz olan bir dahinin sözüydü.
O bilirdi hər söhbətin çeşidini, rəngini,
Sözün üstə kökləmişdi səsinin ahəngini.

Ulu sözün sehrini düşünəndə, duyanda
Ən uca zirvələrdə olduğunu görmüşəm.
Onun öz tarixiydi şeirin min illik yaşı,
Şeirlərin sirdaşıydı, şairlərin qardaşı!

Dil etikası ilə bədii ədəbiyyat arasındakı dialektik vəhdət aşağıda verilmişdir: "***Ədəbiyyatımızı bilmək lazımdır***. Ədəbiyyatını bilməyən adam ***dilini*** yaxşı bilməyəcəkdir. Ədəbiyyatı bilməyən adam yüksək mədəni səviyyəyə çata bilməyəcəkdir. Bu dərslərə fikir vermək lazımdır. ***Xüsusən***, o məktəblərdə ki, Azərbaycanda dərslər rus bölməsində keçir, buna fikir vermək lazımdır" [XXIc.s.255].

Bədii ədəbiyyatın estetikadakı rolunu aydınlaşdırmaq məqsədi ilə Heydər Əliyevin bir sıra nitqləri araşdırılmışdır. Heydər Əliyev üçün estetik zövqün kasıb olduğu əsərlər yarımçıq sayılır. Estetik zövqün formalaşmasında bədii ədəbiyyatın rolu birmənalı şəkildə böyükdür. Belə ki, bədii əsərlərin insanlara – ideya estetik təsir göstərməsi yeni bir şey deyil. Heydər Əliyevin təbirincə estetika hissiyyatlar haqqında elmdir. Elə bu "hissiyyatlar" Ulu Öndərin daim dilindədir: "Bu gün mənim keçirdiyim ən ülvi ***hissiyyatlar*** vətənimə, xalqıma, millətimə, vətəndaşlarımıza hədsiz minnətdarlığımdır. Mən hədsiz dərəcədə minnətdaram ki, gördüyüm işlərə bu qədər yüksək qiymət verilibdir. Hədsiz minnətdaram ki, mənə yenidən etimad göstərilibdir və mən yenidən Azərbaycanın xalq tərəfindən, demokratik prinsiplər əsasında seçilmiş prezidentiyəm.

Mən bununla fəxr edirəm, şərəf duyuram, Azərbaycan xalqına, vətəndaşlarına bir daha, bir daha minnətdarlığımı bildirirəm. Ona görə də qədəhləri müstəqil Azərbaycanın şərəfinə qaldırmağı rica edirəm. Azərbaycan xalqına hədsiz minnətdarlıq ***hissi*** ilə xalqımızın şərəfinə badə qaldırmağı rica edirəm" [XXIc.s.254].

Mən şairlərin, yazıçıların, ədəbiyyatçıların son illərdə keçirilən yubileylərini xatırlayıram. Bunlar ***elə ədəbiyyat, şeir, poeziya*** bayramıdır. Bu yubileylərdə hər bir sənətkarın yaradıcılığına qiymət verilir. Biz, məsələn, Qabilin əsərlərini oxumuşuq, lakin bu şeirləri bir daha yada salmaq çox əhəmiyyətlidir, həm də dinləyəndə o, insana ***zövq*** verir [VIIIc.s.236]. "Elə" ədatı ilə yubileyləri sinonim cərgənin köməyilə ***ədəbiyyat, şeir, poeziya*** bayramı adlandırır. Bu gün də ölkə başçısının sərəncamları ilə keçirilən yubileylər xalq tərəfindən rəğbətlə qarşılanır.

Azərbaycan şairi və dramaturqu, böyük ədib Hüseyn Cavidin məqbərəsinin təntənəli açılışı mərasimindəki nitqdə (Naxçıvan 29 oktyabr 1996-cı il) "üçün" qoşması ilə Heydər Əliyev ədəbiyyat əsərlərini "milli sərvət" hesab edir, dərslik kimi qiymətləndirir: "Hüseyn Cavid XX əsrdə Azərbaycan ədəbiyyatının, mədəniyyətinin inkişaf etməsində misilsiz xidmətlər göstərmişdir. Hüseyn Cavid Azərbaycan xalqını, onun mədəniyyətini, ədəbiyyatını, elmini yüksəklərə qaldıran böyük şəxsiyyətlərdən biridir. Hüseyn Cavidin yaratdığı əsərlər Azərbaycan xalqının ***milli sərvətidir***. Onlar bu gün ***üçün***, gələcək nəsillər ***üçün*** dərslik kitabıdır" [VIIc.s.468]. Görkəmli Azərbaycan şairi Əliağa Vahidin anadan olmasının 100 illik yubiley gecəsi başa çatdıqdan sonra mədəniyyət və incəsənət xadimləri ilə görüşdəki çıxışda (Respublika Sarayı, 30 avqust 1996-cı il) Heydər Əliyev incəsənətin bədii ədəbiyyat, musiqi, bədii qiraət növlərinin insana estetik zövq verməsini, "məni həyəcanlandırdınız" ifadəsi ilə əvəz edir. Elə buradaca yubiley gecəsinin milyonlara çatdırılmasında televiziyanın rolunu (bu yubiley gecəsi televiziya vasitəsilə respublikanın hər yerinə yayıldı) aydınca göstərir: "Vahidin nə qədər gözəl qəzəlləri, şeirləri, sözləri varmış. Yenə də deyirəm, Vahidin əsərlərini hər birimiz oxumuşuq. Birimiz bir dəfə bir qəzəlini oxumuşuq, bir muğamı eşitmişik. Amma bu

gün siz bunları bir yerə yığdınız. Həm ifa etdiyiniz musiqi, həm də oxuduğunuz şeirlərdə, mən hesab edirəm ki, hamını, o cümlədən də ***məni həyacanlandırdınız. Bu yubiley gecəsi televiziya vasitəsilə respublikanın hər yerində yayıldı***. Ola bilər, gələcəkdə bunu təkrar etmək lazımdır. Çünki bu, çox məzmunlu, gözəl gecə oldu".

"İnsanın xoşbəxtliyi nədir?" ritorik sualla auditoriyanı səfərbər edən Heydər Əliyev elə özü də sualı cavablandırır. Cavab Əliaga Vahidin misraları ilə həmahəng səslənir. Əliağa Vahiddə:

Vətən diyarında, Vahid, nə xidmət eylərsək,
Bu şanlı iş gələcək nəslə yadigar olacaq!

Heydər Əliyevdə: "Xoşbəxlik odur ki, insan 70 yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır. Özü də necə yaşayır!" Vahidin çətin həyat tərzi, ona olan diqqətsizlik "nə qədər" ədatı ilə auditoriyanın diqqətinə çatdırılır. Elə buradaca əsil şairin, yazıçının, elm adamının bütün çətinliklərə baxmayaraq xalq yolunda, Vətən yolunda "çox nikbin adam olması gərəkdir" müddəasını ünvanlayır: "Mən bu gün sizi dinləyərkən özüm üçün bir nəticə çıxardım ki, Vahid nə qədər çətin həyat tərzi keçiribsə, ağır yaşayıbsa, ona nə qədər diqqətsizlik olubsa, qayğı göstərilməyibsə də, o, çox nikbin adam olubdur. Vahid xalqımızın, respublikamızın xoşbəxt gələcəyini nə qədər gözəl tərənnüm edib, bunları açıqca deyib. Deyəsən sən oxuyurdun ki, ölkəmiz laləzar olacaq, bunu bir də təkrar et.

Aktyor Ramiz Əzizbəyli:

Könül, həmişə səadət bizimlə yar olacaq,
Xəzan qəmi itəcəkdir, ölkəmiz bahar olacaq!

Tərənnüm eyləyəcək hər çəməndə bülbüllər,
Bu odlar ölkəsi bir başqa laləzar olacaq!

Şərəflə ömr eyləyir hər kəs öz diyarında,
Sevimli ölkəmiz hər fitnədən kənar olacaq!

Cahan işıqlanacaq sülh ilə, ədalət ilə,
Bizim üfüqdə zəfər nuru payidar olacaq!

Vətən diyarında, Vahid, nə xidmət eylərsək,
Bu şanlı iş gələcək nəslə yadigar olacaq!

***İnsanın xoşbəxtliyi nədir?*** Xoşbəxtlik təkcə o demək deyil ki, o necə yaşayıb. ***Xoşbəxtlik odur ki, insan 70 yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır. Özü də necə yaşayır!*** O, xalqına necə gözəl xidmət edib. Xalqını bu ağır vəziyyətdən çıxarmaq üçün görün nə qədər gözəl töhfələr, irs qoyub gedir"

Əliağa Vahidin şeir gecəsində fəlsəfənin qolları kimi incəsənətin müxtəlif növlərinə aydınlıq gətirir. "Vahidin əsərləri başdan başa fəlsəfədir" deyimi ilə bədii ədəbiyyatın nə dərəcədə mühüm olduğunu dilə gətirir. Sonrakı nitq mərhələsində "musiqi də fəlsəfədir", "rəsm əsərləridir və onlarda da fəlsəfə var" ifadələri ilə auditoriyanı öz nitqinin cazibəsinə yönəldə bilir. Elə həmin gecədə rəssam Adil Rüstəmovdan Vahidin qəzəllərinin səslənməsini xahiş etməsi "Ulu Öndər və ədəbiyyat" dialektik vəhdətindən xəbər verir: "Mən foyedə rəssam Adil Rüstəmovun xalqımızın sevimli sənətkarına həsr olunmuş qrafika əsərləri sərgisi ilə tanış olanda da dedim, ***Vahidin əsərləri başdan-başa fəlsəfədir***. Bax, bu axşamkı yubiley tədbiri də bir fəlsəfə gecəsidir. Mən bunu belə qəbul etdim. Sizin oxuduğunuz o ***şeirlər***, dediyiniz ***sözlər***, səslənən ***musiqi də fəlsəfədir***. Bax, rəssam da bunu belə dərk edib.

Onun çəkdiyi əsərlər çox gözəl ***rəsm əsərləridir və orada da fəsfəsə var***. Siz şeirləri oxudunuz, rəssam da o rəsmləri çəkib, Vahidin surətini müxtəlif kompozisiyalarda yaradıb, bu rəsmlərin hər birində də Vahidin şeirlərindən misralar yazıb. Hətta o özü də Vahidin şeirlərini yaxşı oxuyur. Mən sərgiyə baxarkən o, Vahiddən bir neçə şeir oxudu. İstəyirsiniz desin.

Rəssam Adil Rüstəmov:

Gülşəndə idim seyrdə bir
yar idi, bir mən.
Bir bülbül idi, bir də
çəmənzar idi, bir mən.
Bülbül gülə, gül bülbülə
min naz eləyirdi,
Bir kəs yox idi, ol
güli-bixar idi, bir mən".

İncəsənətin digər növləri arasında ədəbiyyatın aparıcı rol oynamasının ikinci səbəbi ondan ibarətdir ki, incəsənətin bəzi növlərinin əsasında ədəbi əsərlər durur. Belə ki, teatr, kinematoqrafiya, opera, operetta, mahnı və bir çox başqa sənət növləri öz mənbəyini ədəbiyyatdan götürür. Məlumdur ki, pyessiz teatr tamaşası, ssenarisiz kinofilmi, liberettosuz opera, operetta və balet, şeirsiz mahni yarana bilməz. Deməli, bu incəsənət növlərinin və janrların inkişafı bədii ədəbiyyatın inkişafından asılıdır [38,s.122].

Üçüncüsü çox vaxt ədəbiyyat bir çox başqa sənət növlərinə, o cümlədən rəngkarlığa, musiqiyə, xareoqrafiyaya, teatra, kinoya, estradaya və s. mövzular, süjetlər verir. Belə ki, M.P.Musorqskinin "Boris Qodunov" və M.İ.Qlinkanın "Ruslan və Lyudmila" operaları Puşkinin eyni adlı əsərləri əsasında yazılmışdır.

Deməli, gerçəkliyi hərtərəfli və çoxcəhətli əhatə etməsi, həyatdakı dəyişikliklərə tez cavab vermək qabiliyyəti, digər incəsənət növlərinə böyük təsir göstərməsi ədəbiyyatı incəsənətin başlıca və aparıcı növünə çevirir. Bədii obrazların mükəmməlliyi və insana güclü təsiri ədəbiyyatı idrakın və estetik tərbiyənin mühüm vasitəsinə çevirir.

Bəzi estetiklərin fikrincə, "ədəbiyyat, incəsənət" ifadəsi ədəbiyyatın başqa növləri arasında xüsusi aparıcı rolunun dərk olunması faktını vurğulayır. Yəni "ədəbiyyat və incəsənət" ifadəsinin işlədilməsi ədəbiyyatın incəsənət növlərinə nisbətən aparıcı mövqe tutması faktını vurğulayır.

Qeyd olunduğu kimi, bədii ədəbiyyat söz sənətidir. Yəni bədii obraz ədəbi əsərlərdə söz vasitəsilə yaranır. Deyildiyi kimi bu sənət növü həyatın bütün sahələrinə və tərəflərinə müdaxilə etmək imkanlarına görə universal sayılır. Sözün sayəsində ədəbiyyat daha sonra ən "ideyalı" və ya ən "fəlsəfi" incəsənət növü sayılır. Çünki söz anlayışın, fikrin bilavasitə və birbaşa ifadəsidir. Deməli, ədəbiyyat təfəkkürün məzmununu ifadə etmək imkanlarına başqa incəsənət növlərinə nisbətən daha çox qadirdir. Heç təsadüfi deyil ki, Hegel poeziyanı incəsənətdən təmiz təfəkkür sahəsinə-fəlsəfəyə keçid hadisəsi hesab edirdi. Buna görə də o qeyd edirdi ki, ədəbiyyat həm ən mürəkkəb fəlsəfi fikirləri, həm varlığın zahiri təbii təsvirini vermək iqtidarındadır.

İncəsənətin hər bir növünün öz bədii üsulları və ifadə vasitələri vardır. Sənətkarlar bu üsullar və vasitələrdən istifadə edərək obrazların xüsusi təsirliyinə nail olurlar. Ədəbiyyatda bunlar müqayisə, epitet, bənzətmə, metafora, mübaliğə (hiperbola) və s. məcazlardan ibarətdir.

Poetik nitqin təşkilindən asılı olaraq onun iki forması mövcuddur: Poeziya və nəsr. Nəsr adətən daha ciddi, təmkinli, az "bəzəkli" olur, yəni burada məcazlar az olur. Xüsusi

coşqunluğa malik olan poeziyanın ifadə vasitələri daha zəngindir və güclüdür.

İncəsənətin növləri içərisində mühüm yer tutan bədii ədəbiyyat öz mənşəyini insanların oxuduqları əmək və mərasim mahnılarından almışdır və uzun müddət şifahi xalq yaradıcılığı, folklor nümunələri şəklində yaşayaraq, nəsildən-nəslə keçmişdir [122].

Şair Zəlimxan Yaqubun yaradiciliğina həsr olunmuş poeziya məclisi başa çatdiqdan sonra Azərbaycanın incəsənət ustalari ilə görüşdəki söhbətdə "şairlik Allah vergisidir" deyimi Heydər Əliyevin dilində "fitri istedad" kimi səslənir. "Həm", "həm də" bölüşdürücü bağlayıcıları ilə şairlik üçün lazım olan sevgini təsnif edir: "Şair olmaq üçün, ***şübhəsiz ki, fitri istedad*** lazımdır. Ancaq eyni zamanda, şair olmaq üçün vətənə, xalqa, torpağa bağlılıq lazımdır, sevgi-məhəbbət lazımdır və şair olmaq üçün sevgi lazımdır. ***Həm*** insanı sevmək lazımdır, ***həm*** xalqını sevmək lazımdır, millətini sevmək lazımdır, ***həm*** atanı, ananı, babanı, nənəni sevmək lazımdır, ***həm də ki,*** gözəl bir qadını da sevmək lazımdır. Şairlərin çoxunu şair edən elə bu sevgi-məhəbbət olubdur. Hər halda bunlar hamısı bizə ədəbiyyatdan, tarixdən məlumdur. İndi mən istəmirəm araşdırım, bizim Zəlimxanın həyatında bu nə cür olubdur" [XVIIIc.s.451].

Bədii yaradıcılığın estetik bünövrəsinin özündə milliliyin və ümumbəşəriliyin dialektikası mövcuddur. "Qobustan" jurnalında gənc müəlliflərin milli oyanışa çağıran yazılarının o dövdə işıq üzü görməsi, sinonim cərgə ilə – həqiqəti deyirdi, düzü deyirdi və insanları həqiqətə çağırırdı – onların cəsarətlə həqiqəti deməsi estetikada milliliyə bariz nümunədir: "Bu yazılar nə idi? Bizim ***milli*** mədəniyyətimizi, ***milli*** keçmişimizi, ***milli*** ruhumuzu o vaxtlar təbliğ edirdi. Bizim rəsmi jurnallardan fərqli olaraq, bu jurnal bunları təbliğ edirdi və insanlarda ***milli ruhu*** oyadırdı***, öz*** tarixinə***, öz*** keçmişinə***, öz***

mədəniyyətinə hörmət və ehtiramı yaradırdı. Çünki o dövr belə idi – hesab edilirdi ki, oktyabr inqilabına qədər heç bir şey olmayıbdır, hamısı oktyabr inqilabından sonra olubdur. **Bax**, o illər bu cür oyanış bizim yazıçılarımızın çox əsərlərində olmuşdur. O cümlədən "Qobustan" jurnalında. Beləliklə, Azərbaycanda bu gənc insanlar həqiqəti deyirdi, düzü deyirdi və insanları həqiqətə çağırırdı" [XIX c s.129]. "Milli" ifadəsi tez-tez təkrarlanaraq auditoriyanın şüurunda millilik anlayışının dərin iz buraxmasına səbəb olur. "Öz" təyin əvəzliyi ilə insanlarda nəyə nail olmağın, uzaq hədəflərə çatmağın yolları göstərilir. "Bax" qüvvətləndirici ədatı ilə diqqəti o çətin dövrdə cəsarət nümayiş etdirən jurnalistlərə yönəldir.

Siyasi xadim Heydər Əliyevin fəaliyyətində, çıxışlarında etik, estetik adını nə qoyuruqsa qoyaq istənilən dəyərlər sonda Azərbaycan dövlətçiliyinə xidmət edir. Bu yolda heç bir məqam nəzərdən qaçmır. Xalqların, xüsusilə türkdilli xalqların mənəvi nüvələri sayıla biləcək xalq dastanları – "Manas", "Dədə Qorqud" – mənəvi dəyər daşıyıcıları olan xalqların yaratdıqları dövlətlərin də bütün sahələrdə səyləri birləşdirməsi həm tövsiyə, həm də tələb olunur: "Yaxud da əvvəl zirvə görüşü, sonra isə "Kitabi-Dədə Qorqud" dastanının yubileyi olsun ki, türkdilli ölkələrin dövlət başçıları da bu tədbirlərdə iştirak edə bilsinlər. Artıq belə bir ənənə yaranıbdır. Məsələn, "Manas"ın min illiyi yubileyində türkdilli ölkələrin dövlət başçılarının Qırğızıstanda zirvə görüşü oldu. Yaxud da Daşkənddə Əmir Teymurun 660 illik yubileyi idi, eyni zamanda türkdilli ölkələrin dövlət başçılarının zirvə görüşü keçirildi" [XIXc.s.169].

"Kitabi-Dədə Qorqud" dastanının timsalında böyük natiq bədii ədəbiyyatın xalqların tarixini "əks etdirməsi", bu tarixləri "təsdiq etməsi", beynəlxalq səviyyədə tarixi kökləri "sübut etməsi" kimi missiyasını açıqlayır: "Kitabi-Dədə Qorqud" dastanının fövqəladə əhəmiyyəti ondan ibarətdir ki, o bizim

tariximizin 1300 illik dövrünü həm əks etdirir, həm də bir daha təsdiq edir. O, tarixi köklərimizi dünyaya göstərir, oğuz, türk mənşəyimizi və zəngin tariximizi sübut edir. Bunlar bizim hamımız üçün, xalqımızın bu günü, gələcəyi üçün əhəmiyyətlidir [XIXc.s.170].

Bədii ədəbiyyatla bağlı çıxışlarında incəsənətin digər növləri haqqında da geniş, müfəssəl məlumat verir, operanın, musiqinin inkişafında bədii ədəbiyyatın rolunu auditoriyalara açıqlayır. Azərbaycanın görkəmli ədəbiyyat xadimlərinin adlarını təkrar etməklə onları dünyaya tanıdır. Türkiyə Parlamentində dahi Azərbaycan şairi Məhəmməd Füzulini anma mərasimindəki çıxış bu qəbildəndir: “Ancaq bunların hamısından ən önəmlisi odur ki, Füzuli əsərinə, Füzuli yaradıcılığına, Füzuli irsinə XX əsrin əvvəlində – hələ o vaxt, xalqımızın, demək olar, çox qaranlıqda yaşadığı bir dövrdə, bilik, savad çox az adama qismət olduğu dövrdə dahi bəstəkar Üzeyir Hacıbəyov Füzulinin “Leyli və Məcnun” əsəri əsasında Şərq aləmində, türk dünyasında ilk dəfə böyük klassik, professional opera – “Leyli və Məcnun” operası yaradıbdır” [IIc.s.478-483].

Sonrakı nitq mərhələsində incəsənətin musiqi növünə aid fikirlər gündəmə gəlir: “1909-cu ildə Bakıda opera teatrı yaranıbdır və ilk operanı yaradan Üzeyir Hacıbəyov öz əsəri ilə Azərbaycan professional musiqisinin əsasını qoymuşdur. Bir əsrdir ki, biz bu əsasda Azərbaycan musiqisinin inkişaf etməsinin şahidiyik” [IIc.s.478-483].

Dünya ədəbiyyatının görkəmli nümayəndəsi kimi Məhəmməd Füzulinin 500 illik yubileyində Heydər Əliyev ədəbiyyatın ümumbəşəri rolunu etik dəyərlərin (dostluq, qarşılıqlı hörmət, qarşılıqlı yardım) daşıyıcısı olmaqda görür: “Ədəbiyyatın ümumbəşəri rolu Ulu Öndərin Moskvada Məhəmməd Füzulinin anadan olmasının 500 illiyinə həsr edilmiş təntənəli yığıncaqdakı nitqində aydın şəkildə verilmişdir: “Bütün Yer

kürəsində, o cümlədən də keçmiş Sovet İttifaqının ərazisində baş verən ictimai-siyasi proseslər müxtəlif bölgələrdə, eləcə də bizim Qafqazda adamların həyatını, təbii olaraq çətinləşdirir, haradasa düşmənçilik, qarşıdurma şəraiti yaradılır. Biz burada, Moskvada Füzulinin 500 illiyini qeyd edərkən qəti şəkildə bildiririk ki, bütün bu hallar keçib gedəndir, onlar əsrlər boyu xalqlar arasında toplanmış, yaradılmış nə varsa, hamısını – ***dostluq, qarşılıqlı hörmət, qarşılıqlı yardım hisslərini*** sarsıda bilməz. Buna görə də belə düşünürəm ki, biz hamımız bu çətinlikləri əl-ələ verib birlikdə aradan qaldıracağıq, ***ümumbəşəri*** dəyərlərə xidmət etmək, ***ümumbəşəri*** amallara xidmət etmək üçün birləşəcəyik" [IIc.s.514-515].

Bədii ədəbiyyatın xalqların milli oyanışında mühüm rolunu anlayan Ulu Öndər "ədəbiyyatın repressiyası"nı sanki gündəmə gətirir. Bu repressiya türkdilli xalqların, dolayısı ilə bəşəriyyətin malı ola biləcək "Kitabi-Dədə Qorqudun" qadağan olmasına gətirib çıxarmışdır. Demək, ədəbiyyat və xalqın müstəqilliyi doğma atributlar kimi səslənir: "Mən bu gün, bu müzakirə zamanı düşünürəm, – bəs nə üçün "Kitabi-Dədə Qorqud" haqqında heç bir təşəbbüs olmamışdı? Eyni zamanda, özüm belə bir cavab verə bilərəm: yəqin ona görə ki, ümumiyyətlə, bizim Azərbaycanın üzərinə pantürkizm damğası vurulduğuna, Azərbaycanda çox dəyərli insanlar pantürkist adı ilə həbs olunduğuna, repressiyaya məruz qaldığına, əsərlər, kitablar dağıdıldığına görə alimlərimiz, ictimai xadimlərimiz "Kitabi-Dədə Qorqud" haqqında təşəbbüs qaldırmağa bəlkə də cəsarət etməyiblər. Mən bunu belə izah edə bilərəm" [XIXc.s.171].

İncəsənət əsərlərinin Azərbaycan xalqının estetik dünyagörüşünün durmadan inkişafına, formalaşmasına xidmət etməklə yanaşı xalqın mənəvi yaddaşını özünə qaytarmaqla da mühüm rol oynadığını Heydər Əliyev 14 aprel 2000-ci ildə "Kitabi-Dədə Qorqud" dastanının 1300 illik yubileyi üzrə

Dövlət Komissiyasının yekun iclasındakı çıxışında öz ecazkar nitqi ilə auditoriyaya ünvanlayır: “Amma bu üç il müddətində, demək olar ki, ***hər bir*** kollektivdə, ***hər bir*** şəhərdə, ***hər bir*** rayonda, ***hər bir*** qəsəbədə, kənddə Dədə Qorqud yada salındı, təbliğ olundu, Dədə Qorqudun tanınması üçün xeyli işlər görüldü. İndi demək olar ki, bizim xalqımız öz ulu əcdadını – Dədə Qorqudu tanıyır və güman edirəm ki, bundan sonra heç vaxt unutmayacaqdır. Yaranmış əsərlər isə, təbiidir ki, gələcəkdə “Dədə Qorqud”un Azərbaycanda, digər türkdilli dövlətlərdə, başqa ölkələrdə təbliği üçün ***çox dəyərli*** işlərdir. Amma bununla bərabər, onlar xalqımızın təhsilində, təlimində, tərbiyəsində “Dədə Qorqud”dan istifadə olunması üçün çox əhəmiyyətlidir” [XXVIc.s.300-301]. “Hər bir” təyin əvəzliyinin köməyi ilə Dədə Qorqudun yayılma sürətini auditoriyanın gözü qarşısında canlandırır. Əsərin ümumbəşəri dəyərlər daşıma baxımından bu sahədəki elmi araşdırmaları isə xüsusi olaraq qiymətləndirir.

Xalq şairi Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədəki nitq (7 mart 1997-ci il) bədii ədəbiyyatla dil arasındakı əlaqəni açmaqla yanaşı, şeirin, poeziyanın yaratdığı estetik hissləri də özünəməxsus bir dillə, Heydər Əliyev dili ilə auditoriyalara ünvanlayır: “Səməd Vurğunun şeiri Azərbaycan dilini zənginləşdiribdir, inkişaf etdiribdir. Azərbaycan dilini hər bir azərbaycanlı üçün ***doğma, sevimli, şirin*** edibdir. Bu da Səməd Vurğunun Azərbaycan xalqı qarşısında göstərdiyi böyük xidmətlərdən biridir. Səməd Vurğun şeirinin böyüklüyü, eyni zamanda ***gözəlliyi*** ondan ibarət idi ki, onun hər kəlməsi, hər sətri ***hər bir*** azərbaycanlının ***qəlbinə çatırdı, onun beynini fəth edirdi, onu öz təsiri altına salırdı***. Səməd Vurğunun şeiri bu gün də müasirlərimizə, gənc nəslə ilham, ruh verir, onları coşdurur, daha da vətənpərvər edir, onlara vətəni, milləti, torpağı sevməyi öyrədir” [IXc.s.17-18]. Yuxarıdakı həcmcə kiçik mətndə böyük ideyaların səslənməsini

dünənki fəhmli dinləyici və bugünkü oxucu yaxşı anlayır. Öncə ədəbiyyatın dili zənginləşdirməsindən söhbət açılır, sinonim cərgə ilə-doğma, sevimli, şirin – Səməd Vurğun şeirinin hər bir azərbaycanlıya etdiyi təsir diqqətə çatdırılır. Sonra "gözəllik" estetik kateqoriyası kimi verilən şeirin yaratdığı "estetik zövq" ün sinonimləri – qəlbinə çatmaq, beynini fəth etmək, təsiri altına salmaq – sadalanır. Növbəti nitq mərhələsində natiq müasir dövrdə Səməd Vurğun şeirinin yaratdığı estetik hissləri başqa bir şəkildə – ilham vermək, ruh vermək, coşdurmaq – auditoriyaya çatdırır. Nəhayətdə bütün bu "estetiklik etik-əxlaqi dəyərlərimizin (vətənpərvərlik, vətəni, milləti, torpağı sevmək) inkişafına gətirib çıxarmalıdır" müddəasını ortaya qoyur.

"Heç olmasa" ifadəsi ilə klassik irsimizlə bu günkü gəncliyin tanış olmasını tələb kimi qarşıya qoyur: "Başqa vaxt deməyə imkanımız olmur, istəyirəm bir məsələni də deyim. Azərbaycanın orta məktəblərində artıq latın əlifbasına keçiblər. Yəni mənim nəvələrim artıq latın əlifbasını öyrənirlər. Amma mənim nəvələrim evimdə olan, kiril əlifbası ilə nəşr edilmiş kitabları oxuya bilmirlər. Yadımda qalmadı, Anar müəllim, yoxsa Elçin müəllim bu məsələni qaldırdı. ***Heç olmasa*** klassiklərimizin əsərləri latın qrafikası ilə nəşr olunmalıdır. Yəni uşaqlarımız dərsdənkənar vaxtlarda klassiklərimizi oxuya bilmirlər" [XXVIc.s.325]. Məhz həmin tələb ölkə prezidenti cənab İlham Əliyevin sərəncamları ilə özünün təsdiqini tapıb. Yüzlərlə adda kitab latın qrafikası ilə kitabxanaların ixtiyarına verilib.

Heydər Əliyev "bəli" təsdiq ədatı ilə Nizami Gəncəvi irsinə olan sevgisini açıqlayır. "Gərək bunlar unudulmasın" ifadəsi ilə feilin gərəklik bildirən əmr şəklindən istifadə edir: "Siz Nizaminin əsərləri haqqında danışdınız. Bəlkə də burada xatırlayanlar var, mən keçmiş zamanlarda bu barədə bir neçə dəfə demişəm. Gərək bizim yazıçılar yaddan çıxarmasınlar ki,

1970-ci illərdə mənim təşəbbüsümlə Nizaminin əsərlərinin hamısı Moskvada "Xudojestvennaya literatura" nəşriyyatında neçə cilddə rus dilində nəşr olundu. İstəmirəm ki, siz mənim bu sözlərimi özümü tərifləmək kimi qəbul edəsiniz, amma bunlar tarixi hadisələrdir. ***Gərək bunlar unudulmasın***. Biz bunu etdik. ***Bəli***, bunu mən etdim. Burada qərar qəbul etdik, bilirsiniz ki, "Xudojestvennaya literatura" nəşriyyatı bunu çətinliklə nəşr etdi" [XXVIc.s.326].

Növbəti nitq məqamında "bəli" təsdiq ədatı və "olan-olub", "keçən-keçib" poetik çalarlı məişət üslublu nitq ilə auditoriyanın yaddaşını təzələyir. "Qoy" əmr ədatı ilə "tarixi həqiqətləri hamı bilməlidir" müddəası ilə ədəbiyyatımızın inkişafındakı xidmətlərini auditoriyanın diqqətinə çatdırır: "***Bəli***, indi ***olan-olub, keçən-keçib***, həmin o nəşriyyat mənə bir neçə dəfə müraciət etdi ki, bu işin təşəbbüskarı bir halda sizsiniz, ona giriş sözünü siz yazın. Hətta onun bir neçə variantını da yazıb mənə gətirdilər. Əvvəldən dedim ki, mən nə şairəm, nə yazıçıyam – siyasət adamıyam. Olur ki, bəziləri özlərinə aid olmayan işlərdə iştirak edirlər. Ola bilər, mən yazım, bəlkə də hesab edirsiniz ki, bununla nəşriyyatın hörməti qalxacaqdır. Amma mən özüm bunu rəva görmürəm. Mən göstəriş verdim ki, ***qoy***, bunu Mirzə İbrahimov yazsın. Bu, ***tarixi həqiqətdir, onu hamı bilməlidir***" [XXVIc.s.326].

Böyük natiq "yəni" aydınlaşdırma bağlayıcısı ilə milli dəyərlərə sahib çıxmağımızı tələb edir. "Gəlin açıq danışaq" səmimi ifadəsi ilə xalq şairi Bəxtiyar Vahabzadənin fikirlərini təsdiq edir. "Nə ...nə" bağlayıcıları ilə mədəniyyətimizə, ədəbiyyatımıza xor baxanları tənqidə tutr: "Yəni zaman keçdikcə, nəsillər dəyişdikcə bəzi dəyərlərin əhəmiyyətini itirirlər. Bəzən də elə insanlar meydana gəlir ki, deyirlər, – bu nədir, bunu o yana, onu bu yana at. ***Gəlin açıq danışaq***, 7-8 il bundan əvvəl bizim tariximizə fikir verən var idimi? Bəxtiyar Vahabzadə düz deyir, tariximizə fikir verə bilən gərək milli

ruhlu adam olsun. Milli ruhu, kökü olmayan və öz ana dilini, milli-mənəvi dəyərlərini dərk edə bilməyən adam ***bunu etməz.*** Bizdə beləlri var. Xalq Cəbhəsinin hakimiyyəti vaxtında küçədən hakimiyyətə gələnlər belə hesab edirdilər ki, Azərbaycanın ***nə*** tarixi, ***nə*** mədəniyyəti bunlar üçün maraqlıdır, onlar üçün yalnız hakimiyyətləri maraqlıdır" [XXVIc.s.326].

Heydər Əliyev çıxışlarında incəsənətin əksər növləri bir yerdə səslənir. Dədə Qorquda abidə qoymaq haqqında danışarkən, "memarlarımız, heykəltaraşlarımız, rəssamlarımız bu barədə düşünməlidir" deyərək bədii ədəbiyyatın digər sənət növləri ilə əlaqəsinə diqqət yetirir: "Mən bir daha deyirəm ki, burada irəli sürülən təkliflər çox dəyərlidir. Məsələn, mən Dədə Qorqud haqqında bu fikirlə razıyam ki, bəlkə də adi bir heykəl qoymaq o qədər də məqsədəuyğun olmazdı. Mən razıyam ki, böyük bir kompleks yaratmaq, onun üçün münasib yer seçmək olar. Yəni doğrudan da, bir surətin heykəlini qoymaq çox lazımdır, ***lakin*** "Kitabi-Dədə Qorqud" elə bir dastandır ki, kompleks götürsək, məsələn, bir şəhərcik ayırsaq, sonra orada cürbəcür başqa abidələr də yaratmaq olar. ***Memarlarımız, heykəltəraşlarımız, rəssamlarımız bu barədə düşünməlidirlər***" [XIXc.s.176].

Görkəmli qazax yaziçisi, Qazaxistanin İtaliya və Yunanıstandakı səfiri Oljas Süleymenovla görüşdəki söhbətində "dostluq etik dəyəri ilə" türkdilli xalqların ədəbiyyatına olan sevgisini, marağını biruzə verir. "Xalqın taleyi, keçmişi, indisi, gələcəyi ədəbiyyatçıların diqqət mərkəzində olamlıdır" prinsipini irəli sürür. Oljas Süleymanovun timsalında "görür, müşahidə edir, duydum, dostluq hisləri doğurur" kimi məntiqi ardıcıllıqla ədəbiyyatçılarımızı bu yolda mətin olmağa çağırır: "Bizi sizinlə çoxdankı dostluq bağlayır. Hələ o vaxtlar, mən burada, Azərbaycanda, siz isə Qazaxıstanda işləyən dövrlərdə, sonra Moskvada işlədiyim zaman mən sizə böyük iftixar hissi ilə baxırdım ki, xalqlarımızın belə gənc istedadları var; elə

istedadlar ki, nəinki romanlar, pyeslər və ya digər ədəbi əsərlər yazmağa, həm də öz xalqı haqqında, onun taleyi, keçmişi, indisi və gələcəyi barədə düşünməyə qadirdirlər. İndi öz tarixi köklərini, tarixi keçmişini, milli özgürlüyünü və milli ləyaqətini daha dərindən dərk etmiş bütün xalqlarımızın belə görkəmli nümayəndələrindən birisiniz. Siz hələ cavanlığınızda bu məsələlərdə çoxlarına nisbətən daha böyük yetkinlik nümayiş etdirirdiniz. Bu, yaxşı məlumdur. O vaxtlar mən bunu görür, müşahidə edir, duyurdum və buna görə də bu, əslinə qalsa, ədəbi istedadınızla yanaşı, məndə sizə hörmət, ən səmimi, dostluq hissləri doğururdu. Buna görə də şadam ki, siz Azərbaycanı unutmursunuz" [XIXc.s.234].

Ədəbi əsərlərin xalqları birləşdirmək gücündə olduğunu auditoriyalara ünvanlayan böyük natiq "Kitabi-Dədə Qorqud" əsərinin həm ədəbi, həm də siyasi mənəvi sənət əsəri olduğunu bəyan edir: "Güman edirəm, bu, çox yaxşı olacaqdır. Çünki qonaqların arasında türkdilli ölkələrin dövlət başçıları – prezidentləri də olacaq, onlar da "***Dədə Qorqud***" dastanının yubileyində iştirak edəcəklər. Mən onların hər biri ilə ayrılıqda danışmışam. Onlar "***Dədə Qorqud***" dastanının yubileyini öz xalqlarının da yubileyləri kimi qəbul edirlər, ona görə də bu mərasimdə böyük məmnuniyyətlə iştirak etmək arzusunu bildirirlər" [XIXc.s.429].

1947-ci ildə Nizami Gəncəvinin 100 illik yubileyini Azərbaycan ədəbiyyatının yubileyi kimi qiymətləndirir, keçirilən hər bir yubileyin əhəmiyyətini, zəngin bir dillə, gözəl üslubda təqdim edir. "Xatırlayın" modal sözü ilə auditoriyanı keçmişə aparır, üç yerdə Nizaminin tanınması ilə bağlı ritorik sual verir, "yox" inkar ədatı ilə prinsipiallığa əsaslanan cavab səsləndirir. Yubileydən sonra Azərbaycanın "tarix, mədəniyyət, elm" cəhətdən zənginliyini sübut edən ritorik sual və "yox" ədatı işə düşür: "1947-ci ildə Nizami Gəncəvinin 800 illik yubileyi keçirildi. ***Xatırlayın***, o vaxta

qədər Azərbaycan xalqı Nizamini nə qədər tanıyırdı, yaxud dünya nə qədər ***tanıyırdı***? Tədqiqatçılardan, alimlərdən, yazıçılardan və mədəniyyətlə, ədəbiyyatla məşğul olan adamlardan başqa, ölkəmizdə Nizami bu qədər tanınırdımı, xalqımız, insanlar Nizaminin əsərlərini ***oxuyurdularmı***? Dünya tanıyırdımı ki, Azərbaycanın Nizami Gəncəvi kimi böyük bir şairi, yazıçısı, mütəfəkkiri, filosofu, alimi ***var***? ***Yox***. Təsəvvür edin, əgər 1947-ci ildə bu yubiley keçirilməsəydi, Nizaminin əsərləri o vaxt Azərbaycan dilinə tərcümə olunmasaydı, kitabları nəşr edilməsəydi, portreti yaranmasaydı, heykəli qoyulmasaydı, Nizaminin adı əbədiləşdirilməsəydi və 1947-ci ildən sonra Nizaminin adı dünyaya geniş yayılmasaydı, Azərbaycan tarix, mədəniyyət, elm cəhətdən bu qədər zəngin ***olacaqdımı***? ***Yox***!" [XIXc.s.429-430].

Nizami Gəncəvi yubileyindən danışan natiq yenidən "Kiatbi-Dədəd Qorquda" qayıdır, dastanın yubileyinin bu gün nə dərəcədə aktual olduğunu diqqətə çatdırır: "Əgər nəzərə alsaq ki, bizə düşmən olan bəzi ölkələr, xalqlar sübut etmək istəyirlər ki, "Azərbaycan xalqının dərin kökü, tarixi yoxdur, erməni millətçiləri daim təbliğ edirlər ki, "bunlar köçəri xalqdır, onların heç keçmişi olmayıbdır", əgər xalqımızın keçmişinə dair mənfi təbliğatı nəzərə alsaq, bu tədbirlərimizin nə qədər əhəmiyyəti olduğunu görərik. Azərbaycanın tarixində indiyədək keçirilmiş bütün yubiley mərasimlərindən "Kitabi-Dədə Qorqud" dastanının yubileyi hamısından əhəmiyyətlidir, vacibdir" [XIXc.s.432].

Bədii ədəbiyyatın xalqın estetik və etik dünyagörüşünün formalaşmasındakı rolundan danışmazdan öncə Ulu Öndər bu ədəbiyyatı yaradan klassiklərin adlarını antroponimik sıralanmalarla qeyd edir, onalrın hər birinin rolunu lakonik, yığcam şəkildə kütlələrə ünvanlayır. "Məhz" ədatı ilə hələ o vaxtlar rusdilli məktəblərdə Nizaminin, Füzulinin tanınmamasını dilə gətirir. Azərbaycanın bir hissəsi kimi Naxçıvanda

formalaşan ədəbi mühitin böyük insanlarını sadalayır: "Yaxud da ki, orada, rus məktəblərində Azərbaycan ədəbiyyatını, Azərbaycan dilini tədris edirdilər, amma bu, o qədər də hörmətli bir fənn hesab olunmurdu, – yəni onu bilsən də olar, bilməsən də. Bunları mən məhz o vaxtlar müşahidə etmişdim. Mən o vaxtlar rastlaşırdım ki, rus məktəblərində oxuyan gənclər şairlərimizi – Nizamini, Füzulini, başqalarını, müasir şairlərimizi tanımırdılar. Yaxud tanısalar da adlarını bilirdilər, onların əsərlərini oxumurdular, şerlərini oxumurdular. Çünki bunlar hamısı rus dilində oxuyurdular. Naxçıvan çox böyük mütəfəkkirlər diyarı, böyük alimlər, sənətkarlar diyarı olubdur. Əgər yaşadığımız əsrin əvvəlini götürsək, böyük Cəlil Məmmədquluzadə, Hüseyn Cavid, Azərbaycan mədəniyyətinin, ədəbiyyatının fəxrinə çevrilmiş şəxsiyyətlərdir, onların əsərləri öz həyat yolunu buradan başlamışlar. Naxçıvanda təhsilin, ümumiyyətlə, mədəniyyətin inkişafında mütəfəkkir Məhəmməd Tağı Sidqinin çox böyük rolu olmuşdur" [XXIIc.s.197].

Cəlil Məmmədquluzadənin ev muzeyində olarkən Heydər Əliyevin çıxışı sanki "müasir dövrdə Azərbaycan ədəbiyyatı" mövzusuna uyğun gəlir. Çıxış öncə Azərabaycan "nəyə görə fərqlənir" ritorik sualı ilə başlayır, "əgər" şərt bağlayıcısı ilə ədəbiyyat sahəsindəki korifeylərin gördüyü işləri yada salır, "bəli" təsdiq ədatı ilə fikrini möhkəmləndirir. Milli-dini dəyərlərin mühafizəsini sinonim cərgə ilə (qoruyaraq, saxlayaraq, inkişaf etdirərək) ümümbəşərilyə yönəldir. Yenə də "əgər" şərt bağlayıcısı ilə Cəlil Məmmədquluzadənin "Molla Nəsrəddin" jurnalı və "Ölülər" əsərinin rolunu elmi-publisistik dillə – "İnsanların gözünü real dünyaya açmaq"-şüurlara yönəldir, "elə" qüvvətləndirici ədatı ilə millətin inkişafında şair və yazıçıların nə etdiyini feilin nəqli keçmiş şəklində (oyada bilib, qaldıra bilib, milli ruhu inkişaf etdirə bilib, milli ruhu canlandıra bilib) xalqa çatdırır: "Mən dünən

çıxışımda dedim, bu gün də deyirəm, – Azərbaycan bizi əhatə edən istər uzaq, istər yaxın – bütün Şərq ölkələrindən bu gün fərqlənir. ***Nəyə görə fərqlənir***? Əgər bizim ulu babalarımız, əcdadlarımız Azərbaycanda mədəniyyəti, elmi, dünyəviliyi, tərəqqini yaratmasaydılar, onu inkişaf etdirməsəydilər, bəli, Azərbaycan belə olmazdı. Azərbaycanda insanlar bu gün də çadra altında olacaqdılar. Azərbaycan öz milli ənənələrini, dəyərlərini, dini dəyərlərini qoruyaraq, saxlayaraq, inkişaf etdirərək eyni zamanda dünyəvi mədəniyyətə doğru gedibdir. Azərbaycan xalqının buna nail olmasında Azərbaycanın böyük simalarının, o cümlədən dahi insan Cəlil Məmmədquluzadənin – Mirzə Cəlilin xüsusi xidməti və rolu olubdur.

***Əgər*** Cəlil Məmmədquluzadə kimi şəxsiyyət dünyaya gəlməsəydi, öz fəaliyyətini göstərməsəydi, əgər "Molla Nəsrəddin" jurnalı yatmış insanları qaranlıqdan çıxarmağa çalışmasaydı, əgər onun "Ölülər" əsəri insanların gözünü real dünyaya açmasaydı xalqımız bu qədər inkişaf edə bilməzdi. Bu sözlər təkcə Cəlil Məmmədquluzadəyə aid deyil, bizim çox dahilərimizə aiddir. Ancaq biz bu gün məhz Mirzə Cəlilin evinə gəlmişik və burada onun xatirəsini yad edirik. Ona görə də mən bu sözləri deyirəm. Azərbaycanın zənginliyi bir də ondan ibarətdir ki, ölkəmiz ***elə*** insanlar yetiribdir ki, bu insanlar kütləni, xalqı oyada bilib, qaldıra bilib, onlarda milli ruhu inkişaf etdirə bilib, milli ruhu canlandıra bilib və millətimiz millət olub, millətimiz inkişaf edibdir [XXIIc.s.261].

Heydər Əliyev üçün dünya ədəbiyyatına xidmət edən, ümümbəşəriliklə yoğrulan əsərlərin müəllifləri öz xalqlarına mənsub ola bilməzlər. "Təkcə" ədatı ilə dahin rus şairi Puşkini auditoriyaya nişan verir: "Puşkin ***təkcə*** Rusiyanın yox, rus xalqının yox, bütün bəşəriyyətin dahi insanlarından biridir. Təsadüfi deyil ki, Puşkinin yaradıcılığı – qısa bir ömür zamanı yazdığı həddən ziyadə əsərləri dünyanın bir çox xalqları tərəfindən sevilə-sevilə oxunur, öyrənilir və bu əsərlər insanlara mənəvi qida verir [XXXVIc.s.257].

Böyük natiqin “bax” əmr ədatı ilə Rus şairi Puşkinə Bakının “gözəl bir guşə” sində heykəl qoyulmasını “xüsusən” modalı ilə başqa “xalqlara hörmət və ehtiram” əlaməti kimi qiymətləndirir: “Biz Azərbaycanın dövlət müstəqilliyinin onuncu ildönümünü bayram edirik. ***Bax***, bu bayram günlərində Bakının mərkəzindəki ***gözəl bir guşədə*** Puşkinin abidəsinin qoyulması onu göstərir ki, Azərbaycan müstəqil bir dövlət olaraq, milli azadlığını əldə edəndən sonra, eyni zamanda bütün başqa xalqlara da, xüsusən keçmişdə sıx əlaqədə olduğu xalqlara da öz ***hörmət və ehtiramını*** bildirir”.

Puşkini “elə bir şəxsiyyətdir ki” deyimi ilə Azərbaycan auditoriyasına təqdim edir. Ədəbiyyatın ölkələr arasındakı siyasi münasibətlərə də aydınlıq gətirməsini də biz böyük natiqin dilindən eşidirirk. Puşkinin abidəsini “heykəltəraşlıq əsəri” adlandıran böyük natiq bədii ədəbiyyatın digər estetik elementlərlə sintezinə işarə edir: “Puşkin öz yaradıcılığı ilə rus xalqı ilə Azərbaycan xalqı arasında olan əlaqələrin inkişafında indiyə qədər böyük rol oynamışdır. Ancaq hesab edirəm ki, Puşkinin yaradıcılığı, Puşkin bu gün də bizə lazımdır. Ona görə lazımdır ki, Puşkin Rusiyanın böyük şəxsiyyətləri içərisində, tarixi şəxsiyyətləri içərisində elə bir şəxsiyyətdir ki, o hansı ictimai-siyasi sistemə mənsub olmasından asılı olmayaraq, hansı milli-mənəvi dəyərləri daşımasından asılı olmayaraq, böyük yaradıcılığı ilə bütün xalqlara öz təsirini göstərir. Bütün bunları nəzərə alaraq, biz Rusiya səfirliyinin təşəbbüsünü qəbul etdik. Rusiyanın prezidenti hörmətli Vladimir Putinin Azərbaycana bu ilin yanvar ayındakı rəsmi səfəri zamanı bu məsələni müzakirə etdik və Puşkinin Bakıda, onun mərkəzində, gözəl bir guşədə abidəsinin qoyulmasını çox zəruri hesab etdik. İndi bu abidə qoyulubdur. Həqiqətən bu, böyük bir ***heykəltəraşlıq əsəridir***. Güman edirəm ki, böyük rus heykəltəraşı da bunu Puşkinə, onun yaradıcılığına böyük məhəbbət hissi ilə yaratmışdır” [XXXVIc.s.259-260].

Ulu Öndərin çıxışlarından onun təkcə Azərbaycan yox, digər xalqların da ədəbiyyatına dərindən bələd olması aydınlaşır. Mirzə Fətəli Axundovun "Puşkinin ölümünə Şərq poeması"ndan bir parçanı əzbər deməsindən Heydər Əliyev şəxsiyyətinin ədəbiyyata əhəmiyyət verməsi bəlli olur: "Mən dedim ki, Mirzə Fətəli Axundov 1837-ci ildə, Puşkin həlak olan kimi, böyük bir poema yazmışdır. Bu, nadir hadisədir. Puşkinin ölümünə həsr olunmuş əsərlər var. Amma, mən bildiyimə görə, onların içərisində ən görkəmli yer tutan Lermontovun Puşkinin ölümünə həsr etdiyi şeirdir və Mirzə Fətəli Axundovun – Puşkinin ölümünə Şərq poemasıdır.

Mirzə Fətəli Axundov onu özü rus dilinə tərcümə edib, o vaxtlar yayılıbdır və yüksək qiymətləndirilibdir. Bu poemanı oxuyanlar Mirzə Fətəli Axundovun Puşkinin yaradıcılığına nə qədər yüksək qiymət verməsini, güman edirəm ki, müşahidə ediblər. Çünki o qədər məzmunlu ifadələr işlədilibdir ki, oxuduqca insanı heyran edir. Orada çox gözəl sözlər var. Ancaq mənim ən çox xoşuma gələn misraları bu gün burada oxumaq istəyirəm:

*Lomonosov gətirərkən*
*sənətə hüsnü düha,*
*Puşkinin nurlu xəyalı ora*
*qonmuş.*
*Əcəba*
*Şeirlər səltənəti Derjavinə*
*göylərdən*
*Kim imiş hökm alaraq*
*bir yeni hakim kəsilən.*
*Səddi-Çindən Tatarıstanə*
*qədər çar əli var,*
*Lakin ol şairin aləmdə*
*yanan məşəli var.*

Sağ olun" [XXXVIc.s.261].

"Çarın əli nə qədər böyük olsa da, şairin məşəli aləmləri bəzəyir". Elə Mirzə Fətəli Axundovun bu misralarını əzbər deməklə auditoriya Azərbaycanın mütəfəkkir övladlarının eyni düşüncə tərzində olduğunu görür, heyranlığını gizlətmir.

Azərbaycan xalqının estetik zövqünün formalaşmasında, eləcə də digər incəsənət növlərinin inkişafında ədəbiyyatın rolunu yerindəcə qiymətləndirən böyük natiqin fikirlərini aşağıdakı kimi yekunlaşdırmaq olar:

− Ədəbiyyatın qarçısında duran problemlərin həlli məsələlərində Heydər Əliyev nitqləri əsasən elmi-publisistik üslubda həyata keçirilir;

− Bədii ədəbiyyatın xalqın estetik və etik dünyagörüşünün formalaşmasındakı rolundan danışmazdan öncə Ulu Öndər bu ədəbiyyatı yaradan klassiklərin adlarını antroponimik sıralanmalarla qeyd edir, onalrın hər birinin rolunu lakonik, yığcam şəkildə kütlələrə ünvanlayır;

− Bədii ədəbiyyatla bağlı çıxışlarında incəsənətin digər növləri haqqında da geniş, müfəssəl məlumat verir, operanın, musiqinin inkişafında bədii ədəbiyyatın rolunu auditoriyalara açıqlayır;

## 2.2.2. Heydər Əliyevin nitqində rəssamlıq

Heydər Əliyev nitqlərindəki estetik mətn parçaları rəssamların gələcəkdə çalışmaları üçün mövzu rolu oynayır. Bu mətnlər incəsənət xadimləri, incəsənət işçiləri üçün sanki bir direktiv tapşırıqdır: "Ancaq indi yaşadığımız dövr – Azərbaycanın öz müstəqilliyini əldə etməsi və onu müdafiə etməsi, torpaqlarını qorumaq uğrunda vuruşması, xalqımızın qanının tökülməsi, şəhidlik verməsi, bir milyondan artıq qaçqın və onların vəziyyəti – bunlar Azərbaycan tarixinin böyük bir səhifəsidir. Bu, gərək bütün mədəniyyət və incəsənət ustalarımızın əsərlərinədək ***öz əksini tapsın***. Mən arzu edirdim ki, rəssamlarımız da bu dövrü öz əsərlərində ***əks etdirsinlər***" [IIIc.s.50]. Azərbaycan tarixinin böyük bir səhifəsi iki əlavə cümlənin köməyi ilə açılır. Auditoriya bu səhifəni böyük natiqin dilində görür, hiss edir. Qalır bu səhifəni rəssamlarımızın əsərlərində görmək. "Öz əksini tapsın", "əks etdirsinlər" felin əmr şəklində bunların reallaşacağına da inanır. Estetik dəyərləri incəsənət xadimləri yaradır. Heydər Əliyevin rolu burada da çoxşaxəlidir. Bu əsas şaxələrdən biri həmin sənət əsərlərini sənətşünas gözü ilə qiymətləndirmək, həmin əsərlərdəki dəyərləri xalqımıza və dünyaya tanıtmaq;

Heydər Əliyevin nitqlərində etikanın mənbəyi kimi estetik dəyərlər, estetik dəyərlərin daşıyıcıları olan sənət əsərləri mühüm yer tutur ki, rəsm əsərləri bu qəbildəndir. "Sənət əsərləri mənəviyyat mənbəyi, mənəviyyat məktəbidir" fəlsəfi fikir şüurlara çatdırılır: "Çünki rəssamın ***həm*** həyatı, ***həm də*** yaradıcılığı, əsərləri, mədəni və mənəvi irsi xalqımızın bu günü və gələcəyi üçün mənəviyyat mənbəyidir, məktəbidir. Xalqımızın estetik tərbiyəsini daha da gücləndirmək üçün Səttar Bəhlulzadənin əsərlərindən istifadə etməliyik. Ona görə də belə bir mərkəzin, belə bir muzeyin yaranması çox zəruridir" [IIIc.s.49].

Estetik dünyagörüşümüzün formalaşması zəminində incəsənət əsərlərinin qiymətini verməyə tələsməyən, bu əsərlərə sənətşünas gözü ilə baxan və bizləri də bu ovqata kökləyən Ulu Öndərin işlətdiyi aşağıdakı ifadə (Yəqin ki, mən bu əsərin həmin qeyri-adi dağı – İlanlı dağı nə dərəcədə dəqiq əks etdirdiyinə hələ sonra da baxacağam) zəngin estetik dünyagörüşdən xəbər verir: "Mən Azərbaycan Rəssamlar İttifaqına mənə bağışladığınız bu rəsm əsərinə görə təşəkkür edirəm. Bu mənzərə rəsmi, həqiqətən nadir bir əsərdir. Naxçıvanda olmayan, Naxçıvanı əhatə edən dağları görməyən bu əsərin əhəmiyyətini tam qiymətləndirə bilməz. Yəqin ki, mən bu əsərin həmin qeyri-adi dağı – İlanlı dağı ***nə dərəcədə dəqiq əks etdirdiyinə hələ sonra da baxacağam*** [XVc.s.338].

Rəngkarlıqda dünyanın bütün zənginliyini və gözəlliyini verən ən başlıca vasitə rəngdir. Rəngkarlıq əsərlərində obyektiv varlıq: insan, təbiət və real həyat hadisələri rəsmdə, şəkildə məhz rənglər vasitəsilə əks etdirilir. Tablonun rəngi müəyyən təəssürat, əhvali-ruhiyyə yaradılmasına, fikrin, niyyətin ifadə olunmasına xidmət edir [38]. Rəngkarlıqda ən başlıca və əvəzolunmaz vasitə olan rənglərə Heydər Əliyevin öz münasibəti var: "Mən bir çox ölkələrdə olmuşam, çox dağlar görmüşəm. Amma Naxçıvandakı kimi dağlara və İlanlı dağ kimi dağa şəxsən mən rast gəlməmişəm. Bəlkə də daha maraqlı, daha gözəl digər dağlar var, lakin bu dağ özünəməxsusluğu ilə fərqlənir, belə dağı təbiətin özü yaradıbdır. Maraqlıdır ki, günün müxtəlif vaxtlarında, günəş şüalarından asılı olaraq bu dağın ***rəngi*** köklü surətdə dəyişir. Bu nə isə nadir bir haldır. Mən bu dağın zirvəsinə qalxmamışam. Bu, çox çətindir. Amma uşaqlıq, gənclik çağlarımda mən bu dağın ətəklərində dəfələrlə olmuşam və həmişə də heyran qalmışam. Bu əsərə görə çox sağ olun" [XVc.s.338-339].

Xalq rəssamı Maral Rəhmanzadənin əsərlərindən ibarət yubiley sərgisinin açılışı mərasimindəki çıxışda estetlərlə

böyük natiqin fikirləri üst-üstə düşür. Estetlər [122,s.27] gözəlliyi müxtəlif formalarda verməyə çalışırlar: Təbiətdəki gözəllik, cəmiyyətdəki gözəllik, insan əli ilə yaradılmış gözəllik, insan gözəlliyi. Təbiətdəki gözəllik adətən niyyətsiz və təmənnasız gözəllik hesab edilir. Çünki təbiətdə gözəllik heç bir niyyətlə yaradılmır. Sadəcə olaraq, Allahın yaratdığı hər bir şeyin gözəl olması aksiomdur. Allah hər şeyi insan üçün təmənnasız yaradıb. Təbiət gözəlliyindən həzz alan insan bunun əvəzini vermək barədə heç düşünmür də: “Mən o qədər də bilmirdim ki, siz Naxçıvanın təbiətini belə gözə əks etdirmisiniz. Ora həqiqətən möcüzəli bir yerdir. ***Bilirsiniz***, oradakı dağların səhər bir ***rəngi*** olur, günorta ***rəngi*** dəyişir, günün axırında yenə dəyişir. ***Qəribə*** bir şeydir. Məsələn, dağlara, daşlara uzaqdan baxırsan, biri göy, biri yaşıldır, digəri narıncı ***rəngdədir***. ***Qəribə*** rəngləri var. O ***rənglər*** heç bir yerdə yoxdur. Günün işığı ilə ***rənglər*** dəyişir. Siz ki, oraya getmisiniz, onları öz əsərlərinizdə əks etdirmisiniz, bu, çox gözəldir. Çünki Naxçıvan elə bir yerdir ki, oraya gedib gəlmək də çətindir, ona görə bunları görən də azdır. Xınalığı da çəkmisiniz. Bu da çox gözəldir. Azərbaycanın elə guşələri var ki, bunlar abidədir. Bir tərəfdən ***təbiət abidəsidir***, ikinci tərəfdən də insanların dağlar qoynunda yaratdıqları evlər, yaşayış yerləri – bunlar da ***abidədir***. Xınalıq da Azərbaycanın bir abidəsidir, nadir bir yerdir” [VIIc.s.196-197]. Xatırlatmaq yerinə düşər ki, ölkə başçısı İlham Əliyevin təşəbbüsü ilə Xınalıq abidəsinə – Xınalıq kəndinə müasir yol çəkilmiş, orada yaşayan insalarımızın sosial vəziyyəti köklü şəkildə yaxşılaşmışdır.

Ulu Öndər “Səttar Bəhlulzadə Azərbaycan deməkdir” ifadəsi ilə “bir sənətkar bir ölkədir” müddəasını irəli sürür. Xalq rəssamı ilə bağlı yeddi yerdə Azərbaycanın adını çəkir. “Öz” təyin əvəzliyi ilə Səttar Bəhlulzadənin xalqına bağlılığını auditoriyaya açıqlayır: “Ancaq Səttar Bəhlulzadə

***Azərbaycanda*** bu janrın, bu üslubun və öz rəssamlıq məktəbinin banisidir. O, çox böyük, dəyərli və qiymətli əsərlər yaratmışdır. Səttar Bəhlulzadə ***Azərbaycan*** deməkdir. Onun əsərləri ***Azərbaycanı*** təsvir edir, ***Azərbaycanı*** göstərir, əks etdirir. Bu, rəssamın ***öz*** torpağına, ***öz*** vətəninə və xalqına nə qədər bağlı olduğunu göstərir. O, ***elə*** bir böyük sənətkatdır ki, istənilən mövzuda və sujetdə əsər yarada bilərdi. Ancaq onun əsərlərinin demək olar ki, əksəriyyəti ***Azərbaycanı*** və ölkəmizin əsasən bütün bölgələrini təsvir edir. Bunu etmək üçün Səttar Bəhlulzadə ***şübhəsiz ki***, bütün ***Azərbaycanı*** gəzmək və onun hər yeri ilə tanış olmaq gərək idi. Səttar Bəhlulzadə bu yolu da keçmişdir. ***Azərbaycanı*** dərindən tanıyan adam kimi, o, vətənimizi çox gözəl təsvir edibdir" [IIIc.s.47]

Təsviri incəsənətin ədəbiyyatdan, teatrdan, kinodan, musiqidən fərqi onun sabitliyindədir. Təsviri incəsənətdə hər hansı bir hadisə, insan həyatının bir anı, onun bir hərəkəti, təbiətin bir vəziyyəti, halı təcəssüm etdirilir. Lakin təsviri incəsənət əsərlərində göstərilən bu vəziyyət və yaxud bir an tamaşaçıya donuq, statik təsir bağışlamır. Burada rəssam həyatın bütün donuqluğunu, onun ahəngini, nəfəsini, mahiyyətini verir. Təsviri sənətin gücü də elə bundan ibarətdir ki, o, bir hadisə, bir fakt, insanın, təbiətin, əşyanın konkret təsviri vasitəsilə kitabda çox səhifələrdə, kinofilmdə bir çox metrlərlə lentdə təsvir edilən bir hadisəni açıb göstərir. Əlbəttə, bu zənginliyi açmaq üçün təsviri sənət əsərini "oxumağı", onun dilini başa düşməyi bacarmaq, hər bir bədii əsərin təkrarolunmaz xüsusiyyətinə, orijinallığına nüfuz etməyə çalışmaq lazımdır [19, 38, 122].

Böyük natiqin rəssamlıqla bağlı söylədiyi fikirlər auditoriyanı heyran qoyur: "Həm də o şeyi ki, rəssam görür, adi adam bəlkə də bunu dərk edə bilmir. Rəssamın gözü ilə adi adamın gözü arasında böyük fərq var" [VIIc.s.196-197].

Rəngkarıq təsviri sənətin elə növüdür ki, burada gerçəkliyin obrazları rənglər vasitəsilə təqdim edilir, sənətin başlıca ifadə dilini rənglər təşkil edir. Bədii ədəbiyyatın təsvir dili sözlərlə, musiqinin dili səslərlə bağlı olduğu kimi, rəngkarlığın dili də rənglərlə əlaqədardır. Prof. M.Məmmədov [81] yazırdı: "Rəssam rənglər vasitəsilə dərinlik, uzaqlıq, həcm və məsafə təsiri yaradaraq, işıq mənbəyini göstərir, işıq və kölgəni andırır... Texniki cəhətdən burada yağlı və sulu boyalardan, pastel, quaş və tempera rənglərindən istifadə edilir"

Azərbaycan qədim mədəniyyət ölkəsidir, Azərbaycan xalqı dünya sivilizasiyasına bir çox olduqca qiymətli mədəniyyət əsərləri, memarlıq, sənət abidələri, olduqca dəyərli ***təsviri sənət əsərləri*** bəxş etmişdir. Lakin keçmişdə, uzaq keçmişdə Azərbaycanın təsviri sənəti öz ifadəsini özgün, milli sənətdə, miniatür sənətində tapmışdır. Buna görə də fəxr edirik ki, Azərbaycan xalqı təsviri sənətdə öz yoluna, öz dəstxəttinə malikdir. Biz onunla da fəxr edirik ki, bizim Sultan Məhəmməd kimi dahi rəssamımız var. O, 500 il bundan əvvəl misilsiz miniatür sənəti əsərləri yaratmışdır. Biz bununla fəxr edirik. Lakin bununla bərabər, biz şadıq ki, Azərbaycan rəssamları, Azərbaycan xalqı Avropa rəngkarlıq məktəbinə də yaxınlaşmışlar. Bu, həm intibah dövrünün, həm də sonrakı dövrlərin sənət ustalarının təsiri altında və diqqətəlayiq rus rəngkarlarının təsiri altında baş vermişdir. Odur ki, XX əsrdə Azərbaycanda belə güclü rəngkarlıq əmələ gəlmişdir və rəngkarlarımızın əsərləri nəinki Azərbaycan muzeylərini bəzəyir, eləcə də Azərbaycan incəsənətini dünyada layiqincə təmsil edir.

İncəsənətdə ümumbəşərilik xalqların estetik səviyyəsinin yüksəlməsinə gətirib çıxarır. Bütün sahələrdə millətçiliyi qınağa çəkən, öz növbəsində milliliyi və ümumbəşəriliyi dəyərləndirən Heydər Əliyev rus təsviri sənətinin Azərbaycan

rəngkarlığına göstərdiyi müsbət təsiri səmimi ifadələrlə – onlardan öyrənərək, yüksək professional təhsil almış, rəngkarlıq ustaları, təsviri sənət ustaları olmuşlar. Eləcə də auditoriya böyük natiqin təsviri incəsənət tarixinə dərindən bələdliyinin şahidi olur, nitqi böyük həvəslə dinləyirlər: "Bütün bunlarda rus sənət ustalarının, Rusiya rəngkarlığının göstərdiyi təsirin böyük əhəmiyyəti var. Azərbaycanlılar onların təsiri altında və Moskvada, Leninqradda rəssamlıq institutlarında və akademiyalarında ***onlardan öyrənərək***, yüksək professional təhsil almış, rəngkarlıq ustaları, təsviri sənət ustaları olmuşlar. Buna görə də indi Azərbaycanda gözəl mühit, gözəl şərait mövcuddur və bu sənət növü dərk edilir. Azərbaycanda rəngkarlığı və təbii olaraq, öz ustalarımızın və digər ölkələrin ustalarının əsərlərini yüksək qiymətləndirirlər. Bununla əlaqədar Nikas Safronovun Azərbaycanda açılmış sərgisi xalqımızın estetik səviyyəsini daha da yüksəltmək, adamlarımızı Nikas Safronovun simasında təsviri sənətin yeni nümunələri ilə tanış etmək üçün çox yaxşı imkandır" [XVc.s.337-338].

Heydər Əliyevin rəssamlıqla bağlı söylədiyi fikirləri eşidən auditoriya qarşısında bir tərəfdən yüksək estetik zövqə malik şəxsi görürsə, digər tərəfdən rəssamlıq sahəsində işlənən elmi terminologiya ilə ("obrazların psixologiyasına, daxili aləminə nüfuz etmək bacarığı", "təbiətinə həsr etdiyiniz lövhələr", "mövzu rəngarəngliyi", "bəddi tərtibatçısı", "geyim eskizləri") çıxış edən sənətşünas alimi görür: "***Obrazların*** psixologiyasına, daxili aləminə nüfuz etmək bacarığı ilə yaratdığınız portretlər müasir insanın düşüncə və hisslərini, ziddiyyətli və zəngin mənəvi keyfiyyətlərini dərk etməyə çağırır. Səfərləriniz zamanı dünyanın bir çox ölkələrinin həyatına və təbiətinə həsr etdiyiniz ***lövhələr*** yaradıcılığınızda ***mövzu rəngarəngliyinə*** əyani sübutdur.

Siz milli kinematoqrafiyamızın inkişafında öz bilik və başarığını sərf etmiş kino rəssamı kimi də şöhrət tapmısınız. Azərbaycan kinosunun nadir inciləri sayılan “Arşın mal alan”, “Ögey ana”, “Görüş”, “Sevil” və başqa filmlərin ***bədii tərtibatçısı və geyim eskizlərini*** müəllifi olaraq onların böyük uğur qazanmasında mühüm rol oynamısınız. Filmlər üçün yaratdığınız ***eskizlərin*** bir çoxu öz bədii dəyərinə görə müstəqil rəsm əsərləri kimi dəfələrlə sərgilərdə nümayiş etdirilmişdir [XVIc.s.69].

Xalq rəssami Oqtay Sadiqzadə ilə görüşdəki söhbətdə incəsənətə dövlət qayğısını ön planda saxlayan siyasi xadim, dövlət başçısı Heydər Əliyev “Sizin mənə heç bir borcunuz yoxdur” ifadəsi ilə Aristotelin “böyüklük” etik dəyərini işdə sübut edir: “Xalq rəssami Oqtay Sadiqzadə ilə görüşdəki söhbətdə incəsənətə dövlət qayğısını ön planda saxlayan siyasi xadim, dövlət başçısı Heydər Əliyev “Sizin mənə heç bir borcunuz yoxdur” ifadəsi ilə Aristotelin “böyüklük” etik dəyərini işdə sübut edir: “Sizin mənə heç bir borcunuz yoxdur. Siz böyük bir rəssamsınız, çox işlər görürsünüz, Azərbaycanın rəssamlıq sənətini inkişaf etdirirsiniz. Dediyim kimi, Elmira xanım Şahtaxtinskaya da çox böyük əsərlər yaradıbdır, bizim rəssamlıq sənətində böyük iz qoyub gedibdir. Ona görə sizin sənətiniz, yaradıcılığınız çox qiymətlidir. Bunları nəzərə alaraq mən sizi ordenlə təltif etdim. Amma siz bundan sonra da çox işlər görə bilərsiniz. Görürəm ki, siz çox məhsuldar işləyirsiniz. Bu, çox yaxşıdır [XIXc.s.279].

Məşhur Rusiya rəssami Nikas Safronov ilə görüşdəki söhbətdə gerçəkliyə münasibətdə qəti təsdiq modal sözü “doğrudan da”nı işlədərək milli təəssübkeşlik hissini auditoriyaya bəyan edir: “Azərbaycanımız ***doğrudan da*** gözəldir. Bu gözəlliyi sizin kimi kamil rəssamın öz gözləri ilə görməsi və

qiymətləndirməsi bir azərbaycanlı kimi mənə xoşdur [XXc.s.386].

Azərbaycan xalqının malik olduğu etik və estetik dəyərləri yeri gəldikcə xarici qonaqlar auditoriyasında nümayiş etdirmək ənənəsini yaratmaq Ulu Öndərə xas olan mühüm xüsusiyyətlərdən idi. "Təvazökarlıq" etik kateqoriyasından danışan böyük natiq "buna baxmayaraq, xasiyyət xasiyyət olaraq qalır" fikrini söyləməklə xalqın öz dəyərlərinə sadiqliyini bəyan edir: "Azərbaycan xalqı son dərəcə təvazökarlığı ilə fərqlənən bir xalqdır. Biz heç vaxt öyünən deyilik və əsrlərdən bəri belə olmuşdur. Biz öz məziyyətlərimizi göstərə bilmirik, bəzən də hətta onları gizlədirik. Bu, xalqımıza xas xüsusiyyətdir, nə etmək olar. Mən uzun illər ərzində çalışmışam ki, adamlarımız Azərbaycanı daha fəal təmsil etsinlər, xalqın, ölkənin məziyyətlərini göstərsinlər. ***Buna baxmayaraq, xasiyyət xasiyyət olaraq qalır*** [XXc.s.386-387].

Gələcək sənətşünaslar üçün, rəssamlar üçün mühüm öyrənmə obyekti olan bu nitqlər araşdırılmağa layiqdir. "Həssaslıqla tutmaq", "xarakteri canlandırmaq" kimi frazeoloji birləşmələrdən istifadə edərək rəssamlığın incəliklərinə nüfuz edir. İnsanın malik olduğu etik dəyərləri (sadəlik, təvazökarlıq) rəsm dili ilə göstərməyin mümkünlüyünü auditoriyaya sadə və aydın cümlələrlə izah vermək yenə də Ulu Öndərə xasdır: "Bəri başdan deyim ki, siz yaxşı portret çəkmisiniz. Ona görə yaxşı deyirəm ki, şübhəsiz, insan yaşa dolduqca dəyişir, Zərifə xanım da dünyasını dəyişməzdən bir neçə il əvvəl təxminən belə görünürdü. Bir sözlə, siz bu məqamı ***həssaslıqla tutmusunuz***. Lakin ən başlıcası budur ki, siz onun ***xarakterini canlandırmağa*** müvəffəq olmusunuz. Tam oxşarlıq var. Özü də məsələ təkcə oxşarlıqda deyil, ***obrazdadır***. Siz onun ***obrazını*** çox yaxşı təsvir etmisiniz.

O, geyimini dəyişməyi çox da xoşlamırdı heç vaxt, bəzək-düzəyi sevmirdi. Bəzi qadınlardan fərqli olaraq o, həmişə çox sadə geyinirdi. Yeri gəlmişkən, onun bir çox gözəl keyfiyyətləri ilə yanaşı, birgə ömür sürdüyümüz dövrdə mənim üçün ən mühüm xüsusiyyətlərdən biri onun hər cəhətdən ***təvazökar*** olması idi. Buna görə onun paltarı da sadə idi. Siz bu xüsusiyyəti düzgün sezmisiniz. Portret çox uğurlu alınmışdır. Mən onun üzündə nə isə bir qüssə-kədər də sezirəm. ***Pozanı da düzgün müəyyənləşdirmisiniz***. Yaxşıdır. Sağ olun. Əlbəttə, mən bunu gözləmirdim, bilmirdim ki, Siz bu portreti çəkirsiniz. Lakin Siz bu portreti yaratmısınız [XXc.s.388].

Naxçivanda görkəmli rəssam Bəhruz Kəngərlinin muzeyinin açiliş mərasimindəki nitq quruluş baxımından diqqətəlayiqdir. Rəsmi görüşlərdəki öndə gələn "Hörmətli xanımlar və cənablar!" xitabını Naxşıvanda olarkən daha səmimi ifadələr qabaqlayır: "Əziz dostlar! Əziz bacılar, qardaşlar! Hörmətli xanımlar və cənablar!" [XXXIXc.s.154].

Bəhruz Kəngərli haqqında yazıblar, yəqin siz eşitmisiniz, bilirsiniz. Onun əsərlərinin çoxunu yəqin görməmisiniz. İndi burada nümayiş etdirilən əsərləri hələ çoxları görməyibdir. Bu onun əsərlərinin az bir hissəsidir. Nadir istedada malik olan bir insan idi. O, Azərbaycan xalqının professional rəssamlıq sənətində ilk rəssamdır, bunu açıq deməliyik. ***Bilirsiniz***, Əzim Əzimzadəni böyük şəxsiyyət kimi həmişə təbliğ edirik və bundan sonra da təbliğ edəcəyik. ***Amma*** onun əsərləri, əsasən, qrafika əsərləridir və daha çox "Molla Nəsrəddin" jurnalı ilə əməkdaşlığı, orada yaratdığı karikaturaları və bir çox başqa əsərləri ilə tanınır. Amma Bəhruz Kəngərli, ***birincisi***, Tbilisidə professional rəssamlıq təhsili alıbdır. ***İkincisi*** də, iş təhsil almaqda deyil, bu, Bəhruz Kəngərlinin özünün fitri istedadı idi. Orada o qədər adam təhsil alıb ki, onların heç də hamısı görkəmli rəssam olmayıbdır [XXXIXc.s.158].

Rəssamlıqdan danışan böyük natiq şəhərin gözəlliyindən-texniki estetikadan danışır. Sosialist təsərrüfat sistemindən fərqli olaraq özəl sistemdə estetik zövqü oxşayan şəhərsalmadan danışır: "Məsələn, bir neçə mağazalar özəlləşdirilib, maşınla keçəndə görürdüm, onların görkəmi yaxşıdır. Amma siz Bakıda küçələrdə gedirsiniz, görün o mağazaları necə gözəl düzəldiblər. Çünkı hamısı özəldir. ***Gözəl*** düzəldiblər, küçələr ***gözəlləşir***, mağazalar ***gözəlləşir***" [XXXIXc.s.186].

## 2.2.3. Heydər Əliyevin nitqində musiqi

Estetikanın mühüm bölmələrindən sayılan musiqinin Heydər Əlliyev nitqlərində öyrənilməsi bir sıra –“Dahi sənətkar, bənzərsiz mahnı ustası, SSRİ xalq artisti Rəşid Behbudovun xatirə gecəsində”, “Görkəmli Azərbaycan bəstəkarı Müslüm Maqomayevin anadan olmasının 110 illiyinə həsr edilmiş təntənəli yubiley gecəsi (18 sentyabr 1996-cı il) başa çatdıqdan sonra mədəniyyət və incəsənət xadimləri ilə görüşdəki çıxışda, “Məşhur İspaniya müğənnisi Xulio İqlesias ilə görüşdə”, “Rusiya estradasının ulduzu, SSRİ-nin və Rusiyanın xalq artisti Alla Puqaçovanın iştirakı ilə konsertdən sonrakı söhbətdə”, “Müasir dövrün görkəmli musiqiçisi Mstislav Rostropoviş və xanımı Qalina Vişnevskaya ilə görüşdəki söhbətdə” və digər nitq və çıxışlarında daha geniş şəkildə öz təcəssümünü tapmışdır.

İncəsənətin ən mühüm və ən qədim növlərindən biri də musiqidir. Musiqi də digər incəsənət növləri kimi gerçəkliyin bədii obrazlardakı inikasıdır. İncəsənətin bütün digər növləri içərisində musiqi insana daha çox estetik həzz verir və onun tərbiyəvi əhəmiyyəti daha böyükdür. Bir həzz mənbəyi olmaq etibarı ilə yaxşı musiqinin ən böyük təsir gücü ondadır ki, o, insan qəlbinin ən dərin guşələrinə belə nüfuz edə bilir, onda ən ülvi hisslər doğura bilir. Musiqi bizi mənən yüksəldir, qəlbimizi sevinclə doldurur, xoşbəxtlik hissləri ilə bizi qanadlandırır [122, 123].

Musiqinin bu cür əxlaqi təmizləyici rolunu hələ Platon [189] qeyd etmişdir. O göstərirdi ki, “musiqi-əxlaqi qanundur, o bütün dünyanı ilhama gətirir, qəlbə qanad verir, insan xəyalını göylərə uçurdur, insan üçün zəruri olan kədər və şadlığa səbəb olur. Musiqi − bütün mövcudata həyat verir. Musiqi – qaydanın, nizamın əsasıdır. O, insanı ülviliyə, ədalətə, gözəlliyə, zərifliyə doğru aparan qüvvədir. Musiqi gözlə

görünməsə də parlaqlıqla doludur, o dünyadakı bütün əbədi ülvilik və gözəlliklərin təcəssümüdür" [123].

Azərbaycanda Rusiya Federasiyasi mədəniyyəti günlərinin təntənəli açiliş mərasimində Azərbaycan Prezidenti Heydər Əliyev simfonik musiqiyə olan münasibətini "bilirsiniz" modal sözü ilə Çaykoviskinin timsalında belə açıqlayır: ***"Bilirsiniz***, Çaykovskinin yaradıcılığı çox xoşuma gəlir. Onun müsiqisi, simfoniyaları öz xüsusiyyəti ilə bir çox simfonik əsərlərdən fərqlənir. Mən Çaykovski haqqında filmi xatırlayıram. ***Yaxşı, gözəl*** film idi və Çaykovskinin musiqisi ilə müşayiət olunur" [XXXVIIIc.s.124].

Azərbaycan xalqının simfonik musiqiyə olan münasibətini "bilirsiniz" modal sözü ilə auitoriyaya bəyan edir. "Açığını deyək" səmimi və analitik düşüncə ilə simfoniyanın xarakterik xüsusiyyətini yada salır, "bax" və "bir baxın" ədatları ilə simfonik musiqiyə münasibətin yüksək olduğunu dilə gətirir. "Nəfəs çəkmədən" frazeologizmi və "sürəkli alqışlarla" ifadəsiylə simfoniyaya olan sevgisini bildirir: "Mən salona diqqət yetirdim. ***Bilirsiniz***, mən tamaşa salonunda tez-tez oluram, indi isə lojada idim və oradan salonu müşahidə etmək imkanım var idi. Hamı böyük diqqətlə dinləyirdi. ***Açığını deyək***, simfonik musiqi rəqs təranələri deyildir. ***Deməli***, insanlar bu musiqini başa düşürlər. ***Bax***, bizim dinləyicilər belədir. Bir ***baxın***, salona 2 mindən çox adam toplaşıb və onların musiqiyə münasibəti necədir.

Mən şadam ki, ***əvvəla***, bizim insanlar Rusiya incəsənətini sevirlər. İncəsənətin müxtəlif növləri var. Məsələn, Xazanov adamları güldürür. Bu da incəsənətin bir növüdür. Simfonik musiqi isə incəsənətin çox mürəkkəb, çətin növüdür. ***İkincisi*** isə, adamlarımız bu musiqini çox ***diqqətlə, nəfəs çəkmədən*** dinləyirdilər. Musiqi qurtaran kimi, ***sürəkli alqışlar*** oldu. Gözəl musiqidir!" [XXXVIIIc.s.125]

“Amma, görürüəm ki məcbur da etmək lazım deyildir” ifadəsi, “əlbəttə” qəti təsdiq modal sözü incəsənət sahəsində məcburiyyətlə uğur qazana bilməməkdən xəbər verir: “***Əlbəttə***, indi, demokratiya şəraitində insanları məcbur edə bilmərəm. O vaxt kommunist sistemi idi və kommunist intizamı vardı. Birinci katib dedi, qurtardı, indi isə məcbur edə bilmərəm. Amma görürəm ki, məcbur etmək lazım da deyildir. ***Doğrudur***, adətən, rəhbər işçilər əyləşən sırada boş yerlər də görürdüm” [XXXVIIIc.s.126].

Musiqini səslərin poeziyası da adlandırırlar. Yəni musiqi səslərlə ifadə olunan poeziyadır. Bəzi estetiklər haqlı olaraq hesab edirlər ki, əsl musiqiçi şair olmalıdır, şair isə-musiqiçi. Çünki poeziya özünün ən yüksək zirvəsinə yüksəldikdə o, musiqiyə yaxınlaşır, musiqi təsiri bağışlayır, sanki musiqiyə çevrilir [38].

“Necə hissiyyatla ifa edir” ifadəsi estetik zövqün yüksəldiyinə bir işarədir. “Həqiqətən” modal sözü ilə Müslümün oxuduğu “Azərbaycan” mahnısını yüksək ustalıqla oxunmasına şübhə yeri qoymur. Nitq məqamından ustalıqla yararlanan böyük natiq mahnının sözlərini yazan Nəbi Xəzrini də “gözəl şairimiz”, – deməklə auditoriyaya bir daha tanıdır. Elə bu məqam bədii ədəbiyyatla musiqinin ayrılmaz olduğunu, dialektik vəhdətdə olduğunu bir daha gündəmə gətirir: “Mənə elə gəlir ki, Müslüm Maqomayev bizim gözəl şairimiz Nəbi Xəzri ilə birlikdə bu mahnını yazanda onlar yəqin ki, gələcəyə baxmışlar, çünki bu mahnı ***həqiqətən*** azad, müstəqil Azərbaycanın himni kimi səslənir. Müslüm özü isə bu mahnını necə hissiyyatla ifa edir:

“Ömrümün mənasısan,
Qardaşlıq dünyasısan,
Anamın anasısan,
Azərbaycan!” [XIIc.s.358].

Musiqinin maddi çətinliklərlə üzləşən simfonik orkestr və simfonik orkestr musiqiçilərinin zəhmətini "ən" qüvvətləndirici ədatı və "hesab edirəm ki" modal sözü ilə qiymətləndirən Ulu Öndər "tədbirlər görəcəyik" qəti gələcək zamanda orkestr üçün əlverişli şərait yaradılacağını qeyd edir. "***Hesab edirəm ki***, bizim simfonik orkestr və simfonik orkestrin musiqiçiləri ***ən*** fədakar insanlardır. Bütün çətinliklərə baxmayaraq, onlar öz peşələrindən, öz sənətlərindən ayrılmırlar. Bizim simfonik orkestr yaşayır və yaşayacaqdır. Mən demişəm və bu gün də təntənəli surətdə vəd edirəm – bizim simfonik orkestrə ən əlverişli şərait yaratmaq üçün ***tədbirlər görəcəyik*** ki, o, fəaliyyət göstərsin. Bir daha təbrik edirəm" [XIIc.s.361].

"Halbuki meyxana xalqın özünə məxsus bir folklorudur" cümləsini eşidən auditoriya siyasi lider Heydər Əliyevin bir daha Azərbaycan ədəbiyyatının dərin qatlarına bələd olduğuna inanır "onlara da Vahid kömək edib" fikrindən sonra isə heyran qalır: "Mən gecədə iştirak edən ***meyxanaçıların*** çıxışlarını yüksək qiymətləndirirəm. ***Meyxana*** xalqımızın, millətimizin folklorunun çox gözəl ***janrlarından*** biridir. Ruslar öz çastuşkalarını sevirlər, ***meyxana*** da bizim üçün belə sevimli janrdır. Amma bəzən nədənsə ***meyxnaya*** xor baxırdılar. ***Halbuki*** meyxana xalqın özünəməxsus bir folklorudur. Ona görə də mən meyxana deyənlərin ustalığını xüsusi qeyd edirəm. Onlar indiyədək belə məclisə çıxmamışdılar. Onlara da ***Vahid*** kömək edib və bu gün belə bir gecədə çıxış etdilər" [VIIc.s.256-259].

Musiqi incəsənətin ən mühüm və ən qədim növlərindən biridir. Musiqi də digər incəsənət növləri kimi gerçəkliyin bədii obrazlardakı inikasıdır. Yəni musiqi də öz mənşəyini təbiətdən götürür. Lakin insan öz həzzi üçün yalnız təbiətin məlahətli səsləri ilə kifayətlənməyib, sənətkar qəlbinin hərarətindən, hiss və duyğularından doğan daha mürəkkəb musiqi

əsərləri yaratmağa məcbur olur. Buna görə də musiqi yalnız təbiət səsləri olmayıb, həm də insan qəlbinin və duyğularının incə səslərinin ifadəsi olub, gerçəkliyi və insan qəlbini bədii səsli obrazlarda ifadə edən incəsənətdir. Deməli, musiqidə obrazlar çoxifadəli olub, insan qəlbinin incə nöqtələrini, insan hisslərinin bütün incəliklərini ifadə edə bilər [122].

Bəzi alimlər qeyd edirlər ki, musiqi bəzən insanda qəm doğurur, onu kədərləndirir. Doğrudur, bəzən insanda kədəri andıran hisslər doğurur, bu, əsasən musiqinin insanı kövrəltməsindən irəli gəlir. Bu hal musiqinin kövrəldici təsiri altında insanın dincəldiyini, onun gözəllik və ülviliyə doğru meylinin güclənməsini, onun hiss və ehtiraslarının nəcibləşməsini göstərir. Göz yaşı həmişə yalnız kədərin ifadəsi olmayıb, bəzən də sevinci ifadə edir. Dahi rus bəstəkarı P.İ.Çaykoviski musiqinin təsir gücünü insanlarda doğurduğu “göz yaşları” adlandırmışdır. Musiqinin qəm dağıtmasını və insana zövq verməsini isə bütün sənətkarlar etiraf edirlər [38, 122]. Bu barədə qəzəlxan şairimiz Əliağa Vahid də çox düzgün demişdir.

Musiqi məclisinin türfə əlamətləri var.
Guş qıl, gör necə canlı hekayətləri var.

Musiqi zövqünə ol kəs ki, deyildir vaqif,
Bu büsatın nə bilir ki, nə şərafətləri var.

Musiqi zövqü hülakülərə təsir etmiş.
Oxu tarixi, gör orda nə rəvayətləri var.

Məscid əhli nə bilir musiqi zövqün, Vahid,
Çünki cahildilər, olduqca cəhalətləri var!”

Bu deyilənlərdən belə bir ümumi nəticə çıxarmaq olar ki, musiqi hamı üçün istisnasız həzz mənbəyidir. Musiqidən həzz

almaq üçün isə onu başa düşmək, öyrənmək, bilmək lazımdır. Çünki musiqi insanlar arasında mehribanlıq, dostluq yaradır, musiqi insanda insaflılıq, alicənablıq, ədalətlilik və ülvilik hisslərini tərbiyə edir [122, 123].

İncəsənətin digər növlərində olduğu kimi musiqi sahəsində də Heydər Əliyev bu sahənin yaradıcı insanlarına olan öz isti münasibətini auditoriyalar qarşısında bəyan edir. "Sən" şəxs əvəzliyini sənətkarlara ünvanlamaqla onların xalq üçün dəyərliliyini milyonlara açıqlayır: "Çox sağ ol. ***Sənin*** ifa etdiyin musiqini mən həmişə sevmişəm, xalqımız sevib. ***Səni*** dinləmək pis olmaz. Arif Babayev də bizim böyük müğənnimizdir. Bu yaxınlarda 60 yaşı tamam oldu, onu təbrik etdim. Arzu edirəm 100 yaşın olsun. Böyük xanəndəmiz Xan Şuşinskinin yerini tutmusan, onun sənətinin davamçısısan. Allahdan arzu edirəm ki, həmişə belə olsun" [XVc.s.83].

"Mən ümumiyyətlə hissiyyatlı adamam", "mahnılar məni həmişə həyəcanlandırır" ifadələri bir şəxsiyyət kimi Heydər Əliyevin musiqiyə olan baxışlarını açır. "Həqiqətən" modal sözü ilə Azərbaycanı həyatının mənası hesab edən Ulu Öndər auditoriyanın qəlbini riqqətə gətirir, "bugünkü və gələcək nəsillərə örnək bir nitq nümunəsi yaradır: "Görkəmli Azərbaycan bəstəkarı Müslüm Maqomayevin anadan olmasının 110 illiyinə həsr edilmiş təntənəli yubiley gecəsi (18 sentyabr 1996-cı il) başa çatdıqdan sonra mədəniyyət və incəsənət xadimləri ilə görüşdəki çıxışında olduğu kimi: "Müslüm və Tamara "Azərbaycan" mahnısını ifa edəndə mən iftixar hissi keçirdim ki, bu mahnı 70-ci illərdə, mən Azərbaycana rəhbərlik edəndə, respublikamızı tanıtmaq, ucaltmaq, Azərbaycanın incəsənətini göstərmək üçün hər şeyi etdiyim vaxt yaranmışdır. Azərbaycanı tərənnüm edən başqa gözəl mahnılar, o cümlədən Polad Bülbüloğlunun bəstələdiyi və Müslüm Maqomayevin ifasında xüsusilə yaxşı səslənən mahnılar da var idi. Lakin yeni mahnılar gərək idi və o zaman Müslüm

Maqomayev Nəbi Xəzrinin şeirinə həmin "Azərbaycan" mahnısını bəstələdi. Mən ümumiyyətlə, ***hissiyyatlı adamam***, musiqi, ***mahnılar məni həmişə həyəcalandırır***. Lakin o zaman ki, bu mahnını ifa edirlər, mən özümü xoşbəxt sanıram. Vaxtilə Müslüm Maqomayev bu mahnının mənə ithaf olunduğunu demişdi. ***Lakin*** mən bununla razılaşmamışdım, indi isə qəbul edirəm. Mən bu mahnını sevirəm, o, məni çox həyəcanlandırır, çünki mahnıda deyilir ki, Azərbaycan həyatımın mənasıdır. Azərbaycan ***həqiqətən*** də mənim həyatımın mənasıdır. Ona görə də, bu mahnını qəbul edirəm. Yəqin gördünüz, siz bu mahnını ifa edəndə salondakıların hamısı ayağa qalxaraq əl çalmağa başladı. Bu, gözəl idi" [VIIc.s.336]

Heydər Əliyevin musiqinin bütün növlərinə, bütün çeşidlərinə dərin bələdliyi onun musiqiçilər, bəstəkarlar auditoriyası tərəfindən sevilməsinin mühüm şərtidir. "Mən caz musiqisinin gənc pərəstişkarı" ifadəsi ilə onun caz musiqisinə münasibəti bəlli olur. "Hər bir musiqisevərin öz rəyi var" deməklə incəsənətə münasibətdə zövqlər plüralizmini nəzərdə tutur. "Sənə də qalmaz" mahnısını çox bəyəndiyini qeyd edir: "Musiqimizin ağsaqqalı Tofiq Quliyev həmişəki kimi bu gün də gözəl çıxış etdi. Mən onu görəndə həmişə sevinirəm. Onun mahnılar yazmağa başladığı illər xatirimdədir. O, 30-cu illərdə Azərbaycanda ilk caz orkestri yaratmışdı və mən caz musiqisinin gənc pərəstişkarı kimi o vaxtdan onu xatırlayıram. Mən onun "Sənə də qalmaz" adlı gözəl mahnısını çox sevirəm. ***Bilirsiniz***, elə mahnılar olur ki, onlar bütün başqa mahnılardan xüsusi seçilir. Tofiq Quliyevin mahnıları çoxdur, lakin "Sənə də qalmaz" bunların zirvəsidir. Onun oğlu bugünkü gecənin rejissoru idi və gözəl də təşkil etmişdir. Rauf Abdullayev bu gün fərqlənirdi, orkestri çox yaxşı idarə edirdi. Mən heç kimə heç bir dərəcə vermək istəmirəm, ***hər bir musiqisevərin öz rəyi var***. İndiki halda demək istəyirəm ki, o,

***Niyazidən*** sonra Azərbaycan dirijorluq məktəbini şöhrətləndirməkdə davam edir" [VIIc.s.336-337].

İncəsənətdə tarixi varisliyimizin qorunmasına xüsusi diqqət yetirən böyük natiq "qədim musiqimizlə" "müasir musiqi nümunələri"ni vəhdətdə inkişaf etdirməyi Azərbaycan musiqisi qarşısında bir tələb kimi qoyur. "Şübhəsiz ki" qəti təsdiq modal sözü ilə qloballaşan dünyada müasir mahnıların artacağını normal qəbul edir: "Siz bizim qədim musiqimizi bərpa etmisiniz. Bu, çox əhəmiyyətlidir, çox maraqlıdır. ***Şübhəsiz ki***, indi müasir həyat ***müasir musiqi*** nümunələri tələb edir. Azərbaycanda da bu çoxdur və bundan narahat olmağa dəyməz. Amma biz göstərməliyik ki, xalqımız həmişə musiqisevər, musiqi yaradan xalq olub və belə musiqilər yaradıb. Siz dediniz ki, Əbdülqadir Marağinin "Heydərnamə" əsəri həzrəti Əliyə həsr olunub?

Bəli, cənab prezident, imam Əliyə həsr olunub. Bildiyiniz kimi, imam Əlinin bir adı da Heydər olub. Ona görə də bu əsər "Heydərnamə" adlanır. Əbdülqadir Marağinin 28 əsəri dövrümüzə qədər gəlib çıxmışdır. Onlardan beşi ansamblın ifasında hazırlanmışdır. Bu əsərlərdən biri də "Heydərnamə"dir. Gələcəkdə biz hazırladığımız əsərlərin hamısını Sizin qarşınızda ifa etməyi arzulayırıq" [XVc.s.93-94].

Heydər Əliyev üçün ən böyük səadət gənclik istedadıdır, gənc nəslin inkişafıdır. "İrəliləyəcək", "inkişaf edəcəkdir" qəti gələcək zamanda işlənən ifadələr onun bir lider kimi gələcəyə inanmasıdır: "Amma srağagün, biz Musiqi Akademiyasında olarkən və bir neçə gün ərzində sizinlə birlikdə olmuş adamları birlikdə dinləyərkən mən oturub düşünürdüm – bu, necə böyük səadətdir, yeni nəsil yetişir, istedadlar var. Onlar ***həqiqətən*** çox görkəmli istedadlardır və Azərbaycan xalqı arxayın ola bilər ki, Azərbaycanda musiqi sənəti, professional musiqi ənənəsi ***irəliləyəcək***, ***inkişaf edəcəkdir***. Slava, bu

baxımdan sizin xidmətiniz, sizin rolunuz qiymətsizdir. [XVIc.s.59-60].

Estetik həzz almaq Heydər Əliyevin dilində "insanlara ruh vermək" anlamındadır. İncəsənət xadimlərinin xidmətlərini unutmamağı bir dövlət başçısı kimi həm tələb edir, həm də tövsiyə edir. "Onu unutmaq olarmı" ritorik sualı və "bəs" sual ədatı ilə başlayan ritorik sualla keçmişimizə hörmət etməyi tələb edir: "Sara xanım 1940-cı illərdə mahnılar oxuyubsa, insanlara ruh veribsə, – bəli, İkinci Dünya müharibəsi zamanı gənc bir qız, müğənni olan Sara xanım gedib əsgərlərin qarşısında mahnılar oxuyub, ***insanlara ruh verib***, – ***onu unutmaq olarmı***? Sara xanım ondan sonrakı dövrdə də öz fəaliyyətini davam etdirib, bu gün də xalqın içindədir, ictimaiyyətin görkəmli insanlarından biridir. ***Bəs*** kimsə deyə bilərmi ki, Sara xanım o vaxt olub, biz indi onu tanımırıq, bu gün hansısa bir müğənni çıxıb mitinqdə söz deyir – onu tanıyırıq. Bu, dəhşətli bir əhvali-ruhiyyədir [XVIIc.s.165].

Məşhur İspaniya müğənnisi Xulio İqlesias ilə görüşdəki söhbətdə (Prezident sarayı, 25 iyul 1999-cu il) Heydər Əliyevin musiqi ilə bağlı estetik fikirlərinin şahidi oluruq: "Allah sizə çox gözəl səs veribdir və çox gözəl istedad veribdir. Gözəl səsinizlə, gözəl istedadınızla siz həqiqətən, dünyanın ən məşhur, ən sevimli, ən gözəl müğənnilərindən biri olmusunuz. Bunu dünyanın hər yerində bilirlər. O cümlədən Azərbaycanda da bilirlər və sizin sənətinizi çox yüksək qiymətləndirirlər. Ona görə də, sizin Azərbaycana ziyarətiniz, Azərbaycan musiqisevərlərinə sevinc gətirməyiniz və Azərbaycanla tanış olmağınız bizim üçün çox əhəmiyyətlidir [XXIc.s.66].

Bu kiçik mətndə miqdar saylarının köməyi ilə vaxt, zaman estetik dəyərlərlə harmonik şəkildə çulğalaşır. Heydər Əliyevin nitqində "ruhlandım", "enerji aldım" kimi ifadələr estetik lüğətdə estetik həzzin sinonimidir desək səhv etmərik.

"Sizi iki saat yarım dinləyəndən sonar mən şəxsən yorulmadım" ifadəsi musiqinin estetik təlabata çevrildiyini, insanlarda ən böyük zövq mənbəyi olduğunu sübut edir: "Bəzən bizim böyük konsertlərimiz olur – ***bir saat otuz dəqiqə, bir saat iyirmi dəqiqə.*** Orada müxtəlif nömrələr göstərirlər. Amma ***bir saat iyirmi dəqiqədən*** sonra adamı yorur. Sizi isə ***iki saat yarım*** dinləyəndən sonra mən şəxsən yorulmadım. Əksinə, ***daha da ruhlandım, daha da çox enerji aldım***. Güman edirəm, salondakıların hamısı belə idi.

Sizin konsertiniz qurtarandan sonra biz dərhal görüşdük. Mən gördüm ki, siz bir az yorulmusunuz. Ancaq siz gördünüz ki, mən yorulmamışam. Nə üçün? Sizin musiqiniz ***o qədər gözəl ruh veribdir***. Bunlara görə sizə təşəkkür edirəm və sizin dünənki çox gözəl konsertinizi, çıxışınızı ürəkdən təbrik edirəm" [XXIc.s.68].

Rusiya estradasının ulduzu, SSRİ-nin və Rusiyanin xalq artisti Alla Puqaçovanın iştirakı ilə konsertdən sonra görkəmli sənətkarla görüşdəki söhbətdə estetik zövq elə öz adıynan da auditoriyaya bəyan edilir. "Bəs" sual ədatı kimi qəbul edilirsə, aşağıdakı situasiyada "bəs bizi demirsiniz" də qüvvətləndirici ədat səviyyəsində işlənir. "Həm", "həm də" iştirak bağlayıcıları ilə müğənni zəhmətini qiymətləndirir: "Alla Puqaçova: **–** Budur, biz yenidən görüşdük. Siz əvvəlkitək, yenə də cavansınız. Mən yenidən burada olmağıma görə çox xoşbəxtəm. Adamları bilmirəm, amma bu gün mən özüm ***elə bir zövq almışam*** ki...

"Bir baxın" ədatı Heydər Əliyevin dilində xüsusi üslub xüsusiyyəti kəsb edir. Bu ən çox incəsənət ustaları ilə görüşlərdə işlənir: "Alla Borisovna, ***bilirsinizmi***, bu gün tamaşaçılarımıza verdiyiniz zövq 25 il əvvəl də, indi də oxuduğunuz mahnılar baxımından sizin sənətinizin ***uzunömürlülüyünün təcəssümüdür***. ***Bir baxın***, bu mahnılar necə də heyranlıq doğurur. Siz qazandığınız uğurlarla kifayətlənmədiniz

və müasir mahnılarınızı da ifa etdiniz. Sizin ifa etdikləriniz bizim üçün əziz, çox qiymətli nə vardısa onların davamıdır. Amma siz təkcə ilk mahnınız olan "Arlekino"nu ifa etmədiniz.

Estetikada "katarsis" – paklanma, saflaşma effektini böyük natiq "qəlbi riqqətə gətirməklə" əvəzləyir. "Baxın" əmr ədatı, təkrarlanan "belə" qüvvətləndirici ədatı "bu nəyi göstərir" ritorik sualı ilə birləşərək Alla Puqaçovanın nələrə qadir olduğunu sinonim cərgə ilə göstərir. Çıxışın sonunda isə elə sinonim cərgə ilə də (səadət, firavanlıq, uzun ömür) ona arzularını bildirir: "Sizin bu axırıncı mahnılarınız da gözəldir, özü də təkcə onlar deyil, əvvəlki dövrün repertuarından olan mahnılar da. Sizin buraya gələndə və mən Moskvada konsertlərinizdə olarkən oxuduğunuz mahnılar, eləcə də son vaxtlar yaratdığınız mahnılar ***qəlbi riqqətə gətirir***. Mən diqqət yetirirdim – salonda olduqca çox gənclər, yəni 18–20 yaşlı və daha cavan adamlar vardı. Deməli, siz ilk dəfə səhnəyə çıxanda, onlar hələ dünyaya gəlməmişdilər. Mən isə ilk çıxışınızdan başlamış hər şeyi əvvəldən axıradək bilirəm. Onlar isə... ***Bir baxın***, onlar çıxışınızı necə məhəbbətlə qarşıladılar, bizim salondakıların ***belə*** rəqs etmələrini, ***belə*** əl çalmalarını mən hələ görməmişdim. ***Bu nəyi göstərir***? Bu onu göstərir ki, Alla Borisovna Puqaçova səhnəyə çıxandan keçmiş Sovetlər İttifaqında, dünyada böyük məhəbbət və böyük nüfuz, böyük şan-şöhrət qazanmışdır, bu gün daha böyük ***populyarlığa və nüfuza, şan-şöhrətə*** malikdir. Buna görə də mən Alla Puqaçovanın bu böyük sənətinin şərəfinə badə qaldırıram! Alla Borisovna, sizin sağlığınıza, sizə ***səadət, firavanlıq, uzun ömür*** arzulayıram!" [XXXIc.s.35-37]

Dahi sənətkar, bənzərsiz mahni ustasi, SSRİ xalq artisti Rəşid Behbudovun xatirə gecəsindəki nitqində Rəşid Behbudov haqqında danışan siyasi lider Azərbaycan estrada musiqisinin həm yaranma tarixindən danışır, həm də müasir

estradanın yaranmasını musiqi sahəsinin peşəkar mütəxəssisi kimi "yəni" aydınlaşdırma bağlayıcısı ilə auditoriyanı məlumatlandırır. "İlə" qoşmasının təkrarı ilə "müasir" estrada mahnılarının sintezinin nədən iabrət olduğunu qeyd edir: "Rəşid Behbudov Tofiq Quliyev ilə birlikdə Azərbaycanda ilk estrada mahnılarının yaradıcısı olubdur. Bilirsiniz ki, 40-cı illərdə artıq estrada musiqisi çox cazibədar olmuşdu. Ancaq bir çox hallarda bu, ümumi, trafaret xarakteri daşıyırdı. Ancaq Rəşid Behbudov özünəməxsus ustalığı ***ilə*** həm müasir estrada mahnılarını çox gözəl ifa edirdi, həm də Azərbaycan musiqi folklorundan, Azərbaycan xalq musiqisindən gözəl mahnıları götürüb onları müasirləşdirirdi və müasir estrada səviyyəsinə qaldırırdı. ***Yəni*** deyə bilərəm ki, Rəşid Behbudov Azərbaycanın xalq mahnıları ilə, musiqi folkloru ilə, ***müasir*** estrada mahnılarının Azərbaycan xüsusiyyətləri daşıyan sintezini yarada bilmişdir" [XXXVIc.s.280].

"Mənəvi zövq verirdi" ifadəsinin nədən ibarət olduğunu auditoriya gözəl anlayır. Bu zövq Rəşid Behbudovun xalqın dilindən gələn sözləri estrada mahnılarında "o qədər" şirin və "o qədər məharətlə" ifası imış: "Hesab edirəm ki, bu bizim musiqi tariximizdə, incəsənət tariximizdə xüsusi yer tutur. Xatırlayın, o bizim qədim xalq mahnılarını elə müasirləşdirirdi, elə gözəl ifa edirdi ki, adam heyran qalırdı – bu, qədim xalq mahnısıdır, ya müasir estrada mahnısıdır. O heç vaxt öz milli köklərindən ayrılmamışdır. Onun o dövrdə ifa etdiyi mahnıların hamısı milli xarakter daşımışdır. Azərbaycanın milli folklorundan, xalq dilindən gələn sözləri mahnılarında o qədər şirin, o qədər məharətlə ifa edirdi ki, adamı ikiqat, üçqat sevindirirdi, ***mənəvi zövq verirdi***".

"Mən nəyə fikir verdim" ritorik sualla musiqiçilər, incəsənət xadimlərinin toplaşdığı auditoriya səfərbər olunaraq sanki bu suala qoşulur. Bu ritorik sualın cavabı müasir Azərbaycan dilində R hərfi ilə başlayan keçmə sözlərin əvvəlinə

uyğun sait artırılmasını nəzərdə tutan qaydanın böyük natiqin dilində təsdiqi kimi verilir. "Xalqa xas olan xüsusiyyətlərini, ləzzətli məqamlarını heç vaxt itirmirdi" deməklə musiqimizin inkişafında milliliyi, xəlqiliyi önə çəkir: "Bu gün burada, səhnədə bizim gözəl qızlarımız Rəşid Behbudovun daim oxuduğu "Ləbu-ləb" mahnısını çox yaxşı ifa etdilər. Amma Rəşid Behbudovun ifası tamamilə başqa idi. ***Mən nəyə fikir verdim***? Rəşid Behbudov üslubuna. Məsələn, mahnılardan birində sözlər var: "İrəhmin gəlsin, ay nənə". Azərbaycan ədəbi dilində "rəhmin gəlsin" deyilir. Amma xalq lap keçmişdən "rəhmin gəlsin" əvəzinə, "***irəhmin*** gəlsin" deyir. Yəni o, mahnıları müasirləşdirəndə onların ***xalqa xas olan xüsusiyyətlərini, ləzzətli məqamlarını*** heç vaxt itirmirdi. O, mahnını oxuyanda bilmirdin ki, qədim xalq mahnısı oxuyur, yaxud da müasir estrada mahnısı oxuyur. Ona görə də Rəşid Behbudovun bu sahədə yaradıcılığı, hesab edirəm, Azərbaycan musiqi tarixində xüsusi yer tutur [XXXVIc.s.280-281].

Başqa bir nitq məqamında musiqi elminin incəliklərinə dərindən bələd olduğunu dilə gətirir. Gözəl səslə gözəl tələffüz arasındakı dialektik vəhdət "o qədər" ədatı ilə sənətin yüksək zirvələrə qalxmasının şərti olduğunu söyləyir: "Bir sənətkar kimi, Rəşid Behbudovun xüsusiyyətlərindən biri də ondan ibarətdir ki, gözəl səsi ilə yanaşı, mahnının sözlərini də gözəl tələffüz etmək qabiliyyəti var idi. Bəzən mahnını oxuyurlar, sözlər bir-birinə toqquşur, qavramaq mümkün olmur. Amma Rəşid Behbudov, ümumiyyətlə, bütün mahnıları ifa edərkən, sözləri o qədər aydın, səlis, o qədər düzgün tələffüz edirdi ki, bu onun sənətini daha da yüksəldirdi" [XXXVIc.s.281].

"Ancaq" bağlayıcısı ilə Rəşid Behbudovun rus dilini gözəl bildiyini, başqa dillərdə mahnılar ifa etməyin xalqlararası, millətlərarası dostluğun təməlini qoyduğunu auditoriyaya çatdırır. "Xüsusən" modal sözü ilə musiqini mədəniyyətin xüsusi bir növü kimi ayırır, "ən" qüvvətləndirici ədatı ilə musiqinin

yerini müəyyənləşdirir. Məşhur alimlərlə musiqi xadimləri arasında maraqlı müqayisə apararaq musiqinin daha aparıcı olduğu qənaətini auditoriya ilə bölüşür: "Ancaq bununla bərabər, bir xüsusiyyəti də ondan ibarət idi ki, o, Azərbaycan dilini gözəl bilərək, eyni zamanda rus dilini də gözəl bilirdi. Ümumiyyətlə, onun başqa xalqların dillərində mahnılar ifa etmək qabiliyyəti, demək olar ki, dünyada heç bir sənətkara nəsib olmayıbdır [XXXVIc.s.282].

Musiqi incəsənətinin bütün janrları iki böyük qrupa bölünür: çalğı alətlərinin müşayiəti ilə oxumaq üçün yazılan *vokal janrlarına və instrumental janrlara*. Həm vokal, həm də instrumental janrlarında yazılan əsərlər müxtəlif formalı olur. Vokal janrında yazılan ən kiçik forma mahnı, ən böyüyü isə operadır. İnstrumental musiqi formalarına isə – uvertura, sonata, simfoniya və simfonik poema aiddir. Vokal musiqi əsərləri – mahnı, romans, xor, ariya-özündə incəsənətin iki növünü: musiqi və poeziyanı birləşdirir. Vokal musiqi həmişə sözlə, nitqin ifadə intonasiyaları ilə əlaqədar olduğundan o, instrumental musiqidən daha yaxşı başa düşülür [122]. "Rəşid Behbudov, demək olar ki, vokal sənətinin bütün sahələrində özünü çox məharətlə göstəribdir" ifadəsi Heydər Əliyevin vokal sənətinə münasibətini auditoriya üçün açıqlayır. "Hamı bilməlidir", "gələcək nəsillər də bilməlidir" feilin lazım şəklində işlənən ifadələr Rəşid Behbudovun timsalında mahnının, musiqinin xalqı dünyaya tanıdılması yoludur. Heydər Əliyev məişət üslubunda qardaşı, rəhmətlik akademik Həsən Əliyevdən eşitdiyi fikirləri auditoriyaya bəyan etməklə düşündürücü, xoş ovqat yaradan və yaddaşlara həkk olunan bir nitq nümunəsi yaradır: "Mən sadəcə, öz xatirələrimi, hamısını da yox, bəzilərini, deyirəm. Çünki ***hamı bilməlidir***, gələcək nəsillər də ***bilməlidir ki,*** Rəşid Behbudov Azərbaycan xalqına, onun dünyada tanınmasına nə qədər böyük xidmətlər göstəribdir. Mənim böyük qardaşım, rəhmətlik akademik

Həsən Əliyevlə söhbətlərimdə onun dediyi sözlər yadımdan heç vaxt çıxmır. O deyirdi ki, biz yüz ildir dünyaya neft veririk, amma biz bununla özümüzü dünyaya tanıda bilmədik. Ancaq bir nəfər, bir insan – Rəşid Behbudov öz mahnıları ilə, yəni Azərbaycan mahnıları və musiqisi ilə Azərbaycanı bütün dünyaya tanıtdı. Çox düzgün deyilmiş sözlər idi. Mən bunu heç vaxt yadımdan çıxartmaram. Çünki bu həqiqətdir. Rəşid Behbudov, demək olar ki, vokal sənətinin bütün sahələrində özünü çox məharətlə göstəribdir" [XXXVIc.s.285].

Estetik dünyagörüşümüzün inkişafında xüsusi rolu olan musiqidən danışan böyük natiq antietik dəyərdən-qısqanclıqdan söhbət açır. Bu söhbətlə incəsənətimizin inkişafına mane olan hissləri aradan qaldırmağı tövsiyə edir: "Amma Rəşid Behbudov kimi bir adama ***qısqanclıq*** etmək, bu ağılsızlıqdır. Çünki ***qısqanclıq*** edəndə, sən heç olmasa, özünə bərabər, ya özündən bir pillə yuxarı adama ***qısqanclıq*** et. ***Qısqanclıq*** edən adam, elə bil ki, özünü böyük, ən yüksək mərtəbədə duran bir şəxsiyyətlə müqayisə edir və ***qısqanclıq*** edir. Ona görə də onun belə problemləri olurdu. Bəzən mənə şikayət edirdi. Ancaq hər dəfə mən bütün bu problemlərin həll olunmasında ona kömək edirdim. Ona görə yox ki, mənim onunla şəxsi münasibətim vardı, ona görə ki, o, ***Azərbaycan üçün ən dəyərli insanlardan biri idi***" [XXXVIc.s.290].

Zəmanəmizin görkəmli musiqiçisi Mstislav Rostropoviçə ölkəmizin ali dövlət mükafatinin – "İstiqlal" ordeninin təqdim edilməsi mərasimindəki nitqdə "kimi" qoşmasının təkrarı ilə musiqiçinin həyatda qazandığı titulları sıralayır. "Bütün dünyada" ifadəsinin mənasını auditoriya üçün açan böyük natiq elə özü də bütün dünyada siyasi fəaliyyəti, siyasi natiqliyi ilə tanınan şəxsiyyətdir: "Siz musiqiçi ***kimi***, dirijor ***kimi***, incəsənət xadimi ***kimi***, ictimai xadim ***kimi***, bütün dünyada tanınmısınız. Özü də "bütün dünyada" ifadəsi böyük insanlar barəsində işlədilir və nəzərdə tutulur ki, bu adam öz əsərləri

ilə, çox geniş yayılmış və dünya ictimaiyyətinin sərvətinə çevrilmiş fəaliyyəti ilə tanınmışdır. Sizin isə dünya şöhrətiniz onunla fərqlənir ki, Siz hər bir ölkədə konsertlər verirsiniz, insanlarla görüşürsünüz, onlarla ünsiyyətdə olursunuz, ictimai fəaliyyət göstərirsiniz. Beləliklə, Siz hər bir ölkədə təkcə kitablardan deyil, əsərlərinizlə deyil, şəxsən tanınırsınız" [XXXVIIc.s.424-425].

Mistislav Rastropoviç haqqında növbəti nitq parçasında etik kateqoriya olan "cəsarət", "ədalət" lə yanaşı hüquqi etikaya da toxunulur, bütün bunların sənət üzərində, musiqi sənəti üzərində qurulması auditoriyaya açıqlanır. "Uğrunda" ifadəsini bir neçə dəfə təkrarlayaraq böyük musiqiçinin nəyin uğrunda mübarizə apardığını bəyan edir. Sinonimlərlə bəzənmiş bu kiçik mətn elmi-publisistik üslubda gözəl nitq nümunəsi kimi dinləyici və oxucunu heyran edir ("sinə gərmək, tab gətirmək", "məhrumiyyətlərə, məşəqqətlərə, qanunsuzluğa"): "Sizin qeyri-adi istedadınız sayəsində, sənətinizin zəngin məzmunu sayəsində, coşğun ictimai fəaliyyətiniz, xüsusən haqq-ədalət uğrunda, həqiqət uğrunda, insan hüquqları uğrunda mübarizə məsələlərində fəaliyyətiniz sayəsində olmuşdur. Sizin həyatınız xoşbəxt həyatdır, lakin o belə böyük adamların həyatında olduğu kimi, heç də həmişə hamar və şirin olmayıbdır. Sizin yaradıcılığınızın xüsusiyyəti, həyatınızın fərqləndirici cəhəti bəlkə də məhz bundadır, lakin nə etmək, həyatınız belə gətirmişdir. Siz böyük insan, böyük musiqiçi, ictimai xadim olmaqla yanaşı, bir çox illər ərzində təqiblərə məruz qalmış, öz ölkənizdən baş götürüb getməyə məcbur olmusunuz. Qərbdə yerbəyer olub, şan-şöhrət qazanana və öz yaradıcılıq və ictimai fəaliyyətiniz üçün lazımi şərait yaradanadək ədalətsizliyə qarşı çıxaraq, çox çətinliklər çəkmisiniz.

Ancaq Siz ***cəsur*** insansınız və Sizi fərqləndirən cəhət həm də odur ki, Siz bu ***məhrumiyyətlərə***, bu ***məşəqqətlərə***, bu

***qanunsuzluğa*** mərdliklə ***sinə gərərək*** və ***tab gətirərək*** sübut etdiniz ki, həqiqət Sizin tərəfinizdədir. Ona görə çox gec də olsa, həm öz ölkənizdə, həm də bir çox digər ölkələrdə Sizi incəsənət xadimi, musiqiçi kimi və ictimai xadim kimi, həqiqət uğrunda, insan hüquqları uğrunda mübarizə aparan insan kimi başa düşdülər [XXXVIIc.s.425-426].

"Şəxsən mən özümü deyirəm" yaxşı bilirəm ki, ifadələri Ulu Öndərin incəsənət xadimlərinin, musiqi sahəsində çalışan insanların əməyinə qiymət verilməsini, onların peşəsinin heç də sadə, monoton əmək olmadığını dilə gətirir. "Elə bilirlər ki, hər şey asandır" ifadəsi isə xəlqiliyə söykənən bir ifadə kimi səslənir, "yox" ədatı ilə musiqi sahəsində çalışmağın asan olmadığını göstərir: "Biz, ***şəxsən mən özümü deyirəm***, güman edirəm mən tək deyiləm – incəsənət xadimlərinə, incəsənət ustalarına həmişə xüsusi hörmətlə və məhəbbətlə yanaşırıq.

Bilirəm ki, sizin əməyiniz çox çətindir. Peşəniz çox çətindir. Salonda oturub dinləyən bəlkə də anlaya bilmir ki, sizin hər biriniz səhnəyə gələnə qədər nə iztirablar çəkirsiniz, necə narahat olursunuz və çıxış üçün də nə qədər hazırlaşırsınız. Elə bilirlər ki, hər şey asandır, səhnəyə gəldi, getdi. ***Yox***. Mən çox illərdir ki, incəsənət, mədəniyyət işçiləri ilə yaxından təmasdayam. Yaxşı bilirəm ki, siz zəhmətkeş insanlarsınız, böyük zəhmət sahibisiniz. Eyni zamanda cürbəcür janrda olan sənətinizlə bizim cəmiyyətimizi, xalqımızı sevindirirsiniz və onlara çox böyük mədəni qida verirsiniz.

Ona görə mən sizə təşəkkür edirəm, hamınıza cansağlığı arzulayıram, xoşbəxtlik arzulayıram. Sizi bir-birinizdən seçmək mümkün deyildir. Hamınız yaxşı idiniz, hamınız gözəl idiniz. İndi nə deyim – onu deyim, bunu deyim, seçə bilmərəm. Çünki siz çox təsirli konsert verdiniz. Mikayıl Mirzə də çox təsirli şeir oxudu [XXXVIIc.s.61].

Söz və mahnı Heydər Əliyevin musiqiylə bağlı çıxışlarında vəhdət halındadır. "Çünki bu mahnı sözlərinə görə də

çox fəlsəfi bir şeirdir". Sinonim cərgə (qəm, qüssə, çətinlik, ağır həyat) "bilirsiniz" modalı və "bir" miqdar sayının "dəqiqə" və "an"a qoşularaq poetik çalarlı nitq nümunəsi yaradır. "Həqiqətən" modalı ilə dünyanın faniliyini dilə gətirir: "Mən Niyaməddinin "Dünya sənin, dünya mənim, dünya heç kimin" mahnısını ilk dəfə 1990-cı ildə –Moskvadan buraya gəlib Naxçıvana getdim – eşitdim. Niyaməddin gəlib orada bu mahnını oxudu. Mən bunu niyə deyirəm? Çünki bu mahnı ***sözlərinə*** görə də çox fəlsəfi bir şeirdir. ***Musiqisinə*** görə də çox yaxşıdır.

Mən həm Azərbaycanda, həm bütün dünya ölkələrində, həm də Moskvada belə şeyləri çox görmüşəm. Amma hər adamın ***bir dəqiqəsi*** olur, ***bir anı*** olur. Məsələn, mən Naxçıvana gəldim. ***Bilirsiniz, qəm, qüssə, çətinlik, ağır həyat...*** Amma bu mahnını eşidəndə mənim qəlbimə ***həm*** həyəcan gəldi, ***həm də*** sevgi gəldi. Ona görə mən bu mahnını həmişə sevirəm və hər dəfə bu mahnını dinləyəndə kövrəlirəm.

***Həqiqətən***, bizim böyük şairimiz Məmməd Araz çox düzgün yazıbdır. Dünya sənin, dünya mənim, dünya heç kimin. Ona görə heç kəs düşünməsin ki, bu dünya kimindir. Dünya sənindir, dünya mənimdir, eyni zamanda, biz yox olduq – dünya heç kəsindir.

Hamınıza təşəkkür edirəm. Qızlarımız, qadınlarımız gözəldir. Həm səsləri gözəldir, həm də görünüşləri gözəldir [XXXVIIc.s.61-63].

Görkəmli müğənni və bəstəkar Müslüm Maqomayevə Azərbaycanın ali dövlət mükafatının – "İstiqlal" ordeninin təqdim edilməsinə həsr olunmuş mərasimdəki nitqdə Heydər Əliyev musiqi tariximizə səyahət edir. Müslüm Maqomayevlə Üzeyir Hacıbəyovun ilk professional musiqinin, opera sənətinin banilərinin adlarını çəkməklə dialektikanın inkar qanununun burada da özünü doğrultmasını auditoriyaya

anladır. Müslümün timsalında Heydər Əliyev auditoriyanı dini-elmi üslubdakı çıxışının sehrinə salır. “Nadir səsin” də, “qabiliyyət” və “istedad”ın da, “belə görkəmli müğənni və belə görkəmli incəsənət ustası olmağın” da Allahın bəxşişi olduğunu ilahi bir inamla deyir: “Sən öz həyatın və yaradıcılıq fəaliyyətin ərzində mədəniyyətimizi, musiqi sənətimizi zənginləşdirmisən, özü də çox zənginləşdirmisən.

Azərbaycan mədəniyyətinin son 40 ildən artıq tarixini Müslüm Maqomayevsiz təsəvvür etmək mümkün deyildir. Doğrudur, bu tarix daha dərinlərə gedir, çünki bizim bugünkü ***Müslüm Maqomayevin*** babası görkəmli bəstəkar, musiqiçi idi və dahi ***Üzeyir Hacıbəyovla*** birlikdə onlar Azərbaycanda professional musiqinin, opera sənətinin baniləri olmuşlar. Müslüm babasının işini layiqincə davam etdirir, ona görə də Maqomayevlər nəsli təkcə indiki Müslüm Maqomayevin dövründən ibarət deyil, həm də Müslüm Maqomayevin babası, təkrar edirəm, Üzeyir Hacıbəyovla birlikdə Azərbaycanda ilk professional musiqi, opera sənəti əsərləri yaratdığı dövrdən başlanır.

Müslüm, ***Allah*** sənə ***nadir səs*** bəxş etmişdir, özü də təkcə səs yox. ***Allah*** sənə ***qabiliyyət, istedad bəxş etmişdir*** və bunlar sənə özünün bu nadir, bənzərsiz səsindən çox bacarıqla bəhrələnməyə və görkəmli sənət əsərləri yaratmağa və ***belə görkəmli müğənni, belə görkəmli incəsənət ustası olmağa*** imkan vermişdir” [XLIc.s.18].

“Dostluq” münasibətindən danışan Heydər Əliyev burada “bəlkə də mənim rəyim subyektivdir” deyimi ilə təvazökarlıq nümayiş etdirir. “Lakin” qarşılaşma bağlayıcısı ilə Müslümün ifaçılıq tərzindəki özünəməxsus çalarları auditoriya üçün açıqlayır. “Mən sənin mahnılarını təhlil edə bilərəm” ifadəsi ilə qarşımızda sanki sənətşünaslıq sahəsinin görkəmli mütəxəssisi dayanır. “Hər bir” təyin əvəzliyi ilə mahnıları qiymət-

ləndirir, "bəlkə də sonralar nə vaxtsa bunu da edəcəyəm" ifadəsi bu gün kövrək hisslər yaradır və Heydər Əliyev nitqlərinin özündən sonrakı illərdə də qəlbləri riqqətə gətirməsinə ən tutarlı misal olur: "Müslüm, mən səninlə bir çox illər ərzində dostluq münasibətlərində olmuş bir adamam, mən də, ailəm də. Bəlkə də mənim rəyim subyektivdir, ona görə yox ki, biz dostuq, məhz ona görə ki, açığını deyəcəyəm, mən sənin mahnılarını çox sevirəm. Mahnıları hamı ifa edir. Lakin eyni bir mahnını müxtəlif ifaçılar müxtəlif cür ifa edirlər. Müslümü bütün digər ifaçılardan fərqləndirən xüsusiyyət budur ki, o hər hansı bir mahnını ifa etməyə başladıqda ona öz aranjimanını, özünün müəyyən çalarlarını verirdi və bu mahnı elə səslənirdi ki, sanki yenicə yazılmışdır. ***Mən sənin mahnılarını təhlil edə bilərəm.*** Çünki sənin hər bir mahnın böyük ***sənət əsəridir***, amma indi mən bunu etməyəcəyəm, bəlkə də sonralar nə vaxtsa bunu da edəcəyəm.

Ona görə ki, biz bu gün səni təbrik etmək üçün toplaşmışıq və mənim müstəqil Azərbaycan Respublikasının ali mükafatını sənə təqdim etmək kimi sevindirici missiyam vardır. Amma bununla belə, mən bu barədə ona görə danışıram ki, həm incəsənət həvəskarı, həm mahnı həvəskarı, həm öz Azərbaycan xalqını, öz torpağını sonsuz məhəbbətlə sevən bir insan, həm də 30 ildən artıq Müslüm Maqomayevlə yaxın dost olan bir insan kimi, bütün bunları deməyə bilmirəm" [XLIc.s.19].

Müslüm Maqomayevin Azərbaycana həsr etdiyi mahnını himn adlandıraraq onun yaranma tarixindən danışır, "amma" ziddiyyət bağlayıcısı və "heç kim" inkar əvəzliyinin köməyi ilə bu mahnının Müslüm Maqomayev kimi ifa oluna bilməməsini prinsipial mövqedən açıqlayır. "Elə" ədatı ilə estetik təsiri dəfələrlə gücləndirir, mahnının ifasını auditoriyanın diqqətinə çatdırır. Azərbaycan dilinin zəngin imkanları

hesabına ilk baxışda antietik görünən söz və söz birləşmələri yüksək bədii-estetik təsir gücü qazanır. Azərbaycan aşıq sənətinin XIX əsrdə görkəmli söz ustası Aşıq Ələsgərin dilində:

Dərdim çoxdur dindərməyin həzarat,
Məni bir alagöz ceyran ***öldürür***. [12]

Belə estetik zövqyaratma Səməd Vurğun poeziyasına da xasdır:

Yenə ***qılıncını çəkdi*** üstümə,
Qurbanı olduğum o ala gözlər.

Bədii ədəbiyyatda aşıq şeirində antietik dəyərlərin estetik zövq yaratmasına tez-tez təsadüf edilir. “Nainsaf, bimürvət, zalım” anlayışlarını gözəllərə aid etmək, gözəllər tərəfindən də sevilə bilmək ziddiyyətini yaratmaq Ustad sənətkarlara aid olan, xalqın yüksək söz zənginliyinə malik olmasından irəli gəlir. XX əsr Azərbaycan aşıq sənətinin görkəmli nümayəndəsi Aşıq Şəmşirin misralarındakı kimi:

***Nainsaf, bimürvət, zalım*** gözəlim,
Sənsən mənim sevgim, axır-əzəlim.
Qulluğunda bəs nə qədər nəzəlim,
Di bax, gör Şəmşirin bir tabı varmı?!

Böyük natiq “pis” antietik dəyər ilə Müslüm Maqomayev sənətinin əlçatmazlığına işarə edir.

Elə bu mətndə məlum olur ki, incəsənətin bir növü ilə məşğul olmaq öz sahəsində görkəmli sənətkar olmağa, bitkin sənətkar olmağa imkan vermir. Müslüm Maqomayevin timsalında “opera sənətində çox işlər görmək”, “yaxşı heykəl

düzəltmək", "yaxşı şəkil çəkmək" kimi qabiliyyətlər sonda şəxsiyyətləri formalaşdırır. "Orada öz hisslərini ifadə etmişdir" ifadəsi Heydər Əliyevin nitqində estetik hisslərin olmadığı yerdə böyük əsərlərdən danışmaq çətindir" müddəasını ortaya qoyur: "Ancaq onun ən görkəmli mahnısı Azərbaycana həsr etdiyi mahnıdır. Bu mahnı Azərbaycanın himni kimi səslənir. O həmin mahnını, musiqini 1970-ci illərin ortalarında gözəl şairimiz Nəbi Xəzrinin sözlərinə bəstələmişdir. Amma ən başlıcası budur ki, Müslüm bu mahnını ***elə*** yaratmış, ***elə*** ifa etmişdir ki, onu ***heç kim*** belə ifa edə bilmir. Yaxşıdır ki, o bu mahnını belə ifa edir, ***amma pisdir*** ki, bunu heç kim onun kimi oxuya bilmir. Ona görə də heç kim onu oxumağa cürət etmir. Bu, müstəsna mahnıdır. Bu mahnı ayrıca bir görkəmli əsər kimi, tarixə daxil ola bilər və yəqin ki, daxil olacaqdır. Müslümün ifasında bu mahnını mən hər dəfə böyük həyəcanla dinləyirəm. Ancaq bu, yeganə mahnı deyildir, o çox mahnılar yaratmışdır. *Mən onun opera sənətində də çox işlər gördüyündən, yaxşı heykəl düzəltdiyindən, yaxşı şəkil çəkdiyindən danışmayacağam*. İki il əvvəl o, portretimi cəkib mənə bağışladı. Mən ona çox minnətdaram, çünki bilirəm ki, o, həmin portret üzərində günlərlə, bəlkə də aylarla işləmişdir. O, portretdə məni özünün düşündüyü kimi çəkmişdir. Bu baxımdan portret mənim üçün çox qiymətlidir, bir də ona görə qiymətlidir ki, əvvəla, onu Müslüm çəkmişdir, ikincisi isə, bilirəm ki, onun üzərində günlərlə işləmişdir. Deməli, ***orada öz hisslərini ifadə etmişdir***" [XLIc.s.23].

Görkəmli musiqiçiyə həsr olunan təbrikin sonluğu "Allah eləsin" ifadəsinin təkrar olunduğu dini-məişət üslubda bitir. Səmimiyyətin enerjisini artıran "Müslüm", "sən", "nikbin" ifadələri ilə həm yubilyarı, həm də auditoriyanı sözün sehrli cazibəsinə salır: "***Müslüm***, ***Allah eləsin***, bütün bunların hamısı qorunub saxlansın, Allah eləsin, səndəki enerji daha da

artsın, ***sən*** həmişə irəliyə daha çox baxasan. Yeri gəlmişkən, dünən televiziorda səni gördüm. Dediklərin mənim xoşuma gəldi. ***Sən*** dedin ki, nikbin olmaq lazımdır. ***Sən*** düz dedin. Nikbin olmaq lazımdır. Nikbin olmağa ***sənin*** hər cür əsasın vardır. Mən ***səni*** təbrik edirəm!" [XLIc.s.24].

Görkəmli bəstəkar, Azərbaycanin xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsində çixişdan məlum olur ki, natiqlik Heydər Əliyev üçün sənətdir. "Ümumiyyətlə" yekunlaşdırıcı modal sözlə "əvvəldən axıradək özüm yazıram", eləcə də "öz beynimdən gələn sözlərdir" ifadələrini "öz" təyin əvəzliyindən istifadə edərək auditoriyaya ünvanlayır. "Heç vaxt əlimdə kağız olmayıbdır" deyimi isə Heydər Əliyev yaddaşının gücünə işarədir. Tofiq Quliyevə "sən" müraciətinə gəldikdə isə bu milyonların diqqətini bəstəkar şəxsiyyətinə hörmətə yönəltməkdir: "Əziz Tofiq! Mən ***sənin*** 80 illik yubileyin münasibətilə ***sənə*** təbrik məktubu göndərmişəm. Onu da bil ki, mən göndərdiyim və ***ümumiyyətlə***, yazdığım məktubların hamısını ***əvvəldən axıradək özüm yazıram***. Siz də, hamınız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı ***öz beynimdən gələn sözlərdir***, ***heç vaxt əlimdə kağız olmayıbdır***. ***Sənin*** bu yubileyini belə təntənəli şəkildə keçirməklə biz hamımız borcumuzu yerinə yetirmişik. Bəlkə də mən buraya qalxmazdım. Ancaq hesab edirəm, ***sən*** bu yubileydə mənim haqqımda o qədər sözlər dedin ki, mən buraya gəldim ***sənə*** deyəm ki, bu ***sənin*** yubileyindir, bu gün ***sənin*** günündür [XIIIc.s.214].

Musiqi incəsənətinin ən geniş yayılmış və ən qədim növlərindən biri də *xalq mahnısıdır*. Mahnını xalqın canlı səsi, onun həyatının, tarixinin, zəhmətinin, sevincinin və kədərinin bir növ musiqili poetik salnaməsi adlandırırlar. İnanmaq olar ki, hər bir xalqın mahnılarında o xalqın xarakterinin əsas xüsusiyyətləri meydana çıxır. Məsələn, bizim muğam mu-

siqisində və xalq mahnılarının çoxunda məhəbbət nəğmələri olduqca böyük üstünlük təşkil edir ki, bu da tarixən Azərbaycan xalqının həyatında, xarakterində məhəbbət mövzusunun əsas yer tutduğuna dəlalət edir. Bundan başqa bizim xalq mahnıları arasında həzin lirik mahnılar və oynaq, şən mahnılar da az deyildir.

"Mahnı", "şərqi" deyərək musiqini növlərə ayıran böyük natiq "ancaq", "amma" qarşılaşma bağlayıcıları ilə mahnının daha geniş təsir bağışlamasını (kiçikdən böyüyə qədər, cocuqdan yaşlıya qədər, qadını da, kişini də, hamını), "ona görə də" səbəb bağlayıcısı ilə mahnının uzunömürlülüyünü dilə gətirir: "Musiqi ümumiyyətlə, insan üçün çox əziz olan bir sənət nümunəsidir. Musiqinin hər bir sahəsi həmişə insanlar tərəfindən sevilibdir. ***Ancaq mahnı, şərqi*** insanlara daha yaxın olubdur. Yəni əgər opera musiqisini, simfonik musiqini bir çox adamlar qəbul edir, ancaq o hamıya çatmırsa, ***amma*** mahnı və xüsusən sənin kimi bəstəkarın mahnıları demək olar ki, insanları – ***kiçikdən böyüyə qədər, cocuqdan yaşlıya qədər, qadını da, kişini də, hamını*** sevindirir və hamıya təsir edir. ***Ona görə də*** mahnı daim yaşayır" [XIIIc.s.215].

Opera sənətinin xalqın milli şüurunun oyanmasındakı rolunu açıb göstərən Ulu Öndər Üzeyir Hacıbəyovun "Leyli və Məcnun" operasının hansı hissiyyatları oyatmasını sinonim cərgə ilə ("sevgi, məhəbbət", "saf, ülvi hissiyyat"] musiqi ictimaiyyətinə çatdırır: "Füzulinin böyük poemasının əsasında o bu əsəri yazıb tamaşaçılara göstərməklə Şərq fəlsəfəsinin, Şərq aləminin dərinliyini, insanın ***nə qədər sədaqətli*** məxluq olduğunu nümayiş etdirdi. O vaxtlar "Leyli və Məcnun"u oxuyanları barmaqla saymaq olardı. Amma 1908-ci ildə, hələ mövhumatın hökm sürdüyü dövrdə operanı səhnəyə qoymaqla, insanlara o ***sevgini, məhəbbəti, saf, ülvi hissiyyatları***

bildirməklə göstərdi ki, xalqımızın mənəvi kökləri nə qədər sağlamdır" [XLc.s.72].

"Bəli" təsdiq ədatı ilə milli inkişafımıza, ümumbəşəri inkişafa mane olan adətlərə qarşı çıxan "Arşın mal alan" əsəri haqqında da danışır, bu əsərlərin təkcə zövq vermək mənasında yox, satirik üslubda tragikomik operalar olduğunu bəyan edir: "O, "Arşın mal alan" operettasını gülmək üçün yox, yaxşı mahnılarla insanlara zövq vermək üçün yaratmadı. O göstərdi ki, ***bəli***, bizim o vaxtkı adət-ənənələrimiz imkan vermədi ki, insan sərbəst olsun. Hətta həyat yoldaşını seçmək üçün də onu görə bilməzdin. Onu gərək ya xalası, bibisi, ya da, nə bilim, kimisə gedib ***görəydi, seçəydi, gətirəydi*** oğlanın evinə. İndi siz belə, sevgisiz kiminləsə həyat qura bilərsinizmi? Nəinki həyat qurmaq, hətta bir müddət görüşmək üçün, yəqin ki, ***hissiyyatınız*** olmasa, bunu etməzsiniz. Bizim xalqımız "Arşın mal alan", yaxud da ki, "O olmasın, bu olsun" kimi əsərlərin köməyi ilə ***oyandı***, ***ondan sonra da*** böyük əsərlər ***yarandı***" [XLc.s.72-73].

Beləliklə, "Heydər Əliyevin nitqində musiqi" yarımfəslini yekunlaşdıraraq aşağıdakı qənaətlərə gəlmək mümkündür:

− Azərbaycan, eləcə də dünya musiqisi haqqında təhlil xarakterli fikirlər irəli sürülməsi Ulu Öndərin zəngin müsiqi duyumundan xəbər verir;

− Xalqın estetik şüurunun formalaşmasında musiqinin rolunu yüksək qiymətləndirən böyük natiq məişət üslublu nitqləri ilə görkəmli müsiqiçiləri elə xalqın özünə də tanıdır;

− Azərbaycanın müsiqi tarixini yaradan korifeylərin yubileylərində onların xalq qarşısındakı xidmətlərini feilin lazım şəklində "hamı bilməlidir", "gələcək nəsillər də bilməlidir" ifadələri ilə auditoriyalara ünvanlayır;

− Şəxs əvəzliyi "mən"lə musiqi sahəsində gördüyü işləri dilə gətirərək etik dəyər olan "böyüklüyü" göstərir;

– Şəxs əvəzliyi "sən"lə musiqi sahəsindəki görkəmli şəxslərin xalq qarşısındakı xidmətlərinə görə dövlətin isti münasibətini açıqlayır;

– Korifey müsiqiçilərimizin "təkcə" ədatı ilə dünya dillərində ifalarının ümumbəşəriliyə aparan yol olduğunu göstərir.

Düşünürük ki, bu yarımfəsil "Heydər Əliyev və müsiqi" barəsində elmi iş aparacaq gələcək müsiqiçilər nəsli üçün başlanğıc material olacaq.

## 2.2.4. Heydər Əliyevin nitqində memarlıq

Memarlıqla bağlı Ulu Öndərin əsasən memarlıq abidələrinin açılışında, xüsusən akademik Zərifə Əliyevanın xatirəsinə həsr olunan "Elegiya" əsərinin təqdimat mərasimində, "İslam memarlığı minilliklər ayrıcında" beynəlxalq seminarda və digər incəsənət növləri ilə bağlı keçirilən tədbirlərdəki fikirləri araşdırma mövzusu olmuşdur.

Memarlıq abidələri nəinki gözəl olub insanda müsbət emosiyalar, xoş əhval-ruhiyyə doğurur, hətta çox möhtəşəm, əzəmətli və təntənəli olub insanda heyrət, təəccüb, pərəstiş, vüqar kimi ülvi hisslər də doğura bilər. Heç təsadüfi deyil ki, memarlıq abidələrinin insana göstərdiyi estetik, emosional təsiri çox vaxt poeziyanın, rəngkarlığın və musiqinin insanda doğurduğu estetik təsirlə müqayisə edib yanaşı qoyurlar. Bu cəhəti nəzərə alaraq musiqini hələ lap qədimdən "hərəkətdə olan memarlıq", memarlığı isə "donmuş musiqi" adlandırmışlar" [38,s.344].

"Hüseyn Cavidin məqbərəsi Naxçıvanın memarlıq tarixinə yeni bir səhifədir. Naxçıvanda böyük memarlıq, milli, mədəni abidələrimiz var. Bu abidə də həmin ənənələrin davamıdır. Ümidvaram ki, "Mömünə xatun" abidəsi kimi, bu abidə də əsrlər boyu yaşayacaqdır. Güman edirəm ki, gələcək nəsillər bu günü xatırlayacaq və bu abidəni yaradanları unutmayacaqlar".

Bütün çıxışlarında – həm etik, həm də estetik baxımdan seçilən çıxışlarında – Heydər Əliyev milliliyi, azərbaycançılığı öndə saxlayır: "Biz Bakı şəhəri – ölkəmizin paytaxtı ilə haqlı olaraq fəxr edirik. Onun bütün xüsusiyyətlərinə görə fəxr edirik. Eyni zamanda onun təbii gözəlliyinə, memarlıq gözəlliyinə görə fəxr edirik. Bakını quranlar, yaradanlar bu işi doğurdan da ürəklə, namusla görüblər. Şübhəsiz ki, burada pərakəndəliklər də, səhvlər də olubdur. Sonrakı nəsillər bunları

aradan qaldırır... Ancaq hər halda Bakı əsrlərdən-əsrlərə gözəl qurulub, gözəl yaradılıbdır. Bakının yerləşdiyi təbii ərazinin də gözəlliyi var, eyni zamanda burada yaradılmış abidələr, binalar da Bakıya xüsusi gözəllik verir. Ona görə də, Bakıdakı böyük memarlıq abidələri bizim milli iftixarımızdır".

Etik, əxlaqi və estetik hisslər bir-biri ilə sıx bağlıdır, çünki yaxşılıq və gözəllik arasında dərin daxili vəhdət vardır [75,s.304].

Heykəl, adətən insan fiqurunu ayaq üstə təsvir edir. Bilavasitə memarlıqla əlaqədar olub, böyük şəhərlərin meydanlarında, park və xiyabanlarında, dövlət və ictimai binaların qarşısında qoyulan iri həcmli heykəllər monumental heykəllər adlanır. Monumental heykəllər çox vaxt xalq qəhrəmanlarına, dövlət, elm və mədəniyyət xadimlərinə bir abidə olaraq ucaldılır və onların xatirəsini əbədiləşdirmək məqsədini güdür. Adətən belə abidələr tunc, mərmər və qranit kimi davamlı və möhkəm materiallardan hazırlanır və hər tərəfdən yaxşı görünmək üçün xüsusi kürsülər (postament) üzərində ucaldılır. Beləliklə, insanlıq üçün böyük işlər görmüş, cəmiyyətdə iz qoymuş dahi insanları və qəhrəmanları əbədiləşdirmək heykəltəraşlığın ən mühüm vəzifəsidir [38,s.341].

Bakıda Akademik Yusif Məmmədəliyevin abidəsinin açilişi mərasimindəki nitqdə 16 sentyabr 1998-ci il Azərbaycan xalqının qədim adət-ənənələrinə görə bizim ölkədə, ümumiyyətlə, Şərq aləmində insan heykəli ***dəb*** olmayıbdır. Ancaq xalqımız inkişaf edib, dünya mədəniyyətinin gözəl nümunələrini öz həyatına tətbiq etməyə çalışıb, dünya mədəniyyətindən bəhrələnib və XX əsrdə Azərbaycan torpağında, Azərbaycanın paytaxtında çox qədim, gözəl, əzəmətli memarlıq abidələri ilə yanaşı, heykəltəraşlıq abidələri də yaranmışdır. Bu, bizim vətənimizin həyatını daha da ***zənginləşdirmiş***, ***gözəlləşdirmişdir***. ***Hesab edirəm ki***, bu, çox gözəl bir ənənədir. ***Ona görə ki,*** heykəltəraşlıq abidələri, heykəllər

adətən, insan yaşayan hər bir yeri ***abadlaşdırır, gözəlləşdirir***. Bir də ***ona görə ki***, bu abidələr Azərbaycan xalqının görkəmli şəxsiyyətlərinə, insanlarına, öz tarixinə, elminə, mədəniyyətinə, dövlətinə göstərilən hörmət və ehtiramı əks etdirir [XVIIc.s.325].

Bununla belə memarlıqda utilitar-praktiki tələbatın ödənilməsilə gözəlliyin harmonik vəhdət təşkil etməsinə utilitar-praktiki tələbatın gözəlliyə tabe etdirilməsi zəminində yox, məhz gözəlliyin utilitar-praktiki məqsədlərə tabe etdirilməsi zəminində nail olunur. Başqa sözlə, memarlıq abidələri, hər şeydən əvvəl, praktiki məqsədlər üçün nəzərdə tutulur, ondan sonra isə estetik funksiya nəzərə alınır. Həm də bəzi alimlər hesab edirlər ki, istifadə üçün ən əlverişli, rahat, yararlı olan, öz praktiki məqsədlərinə və faydalılıq, gərəklilik prinsipinə daha çox cavab verə bilən bina gözəl ola bilər. Estetik funksiya hökmən faydalılıq, gərəklilik funksiyasından doğur və ondan asılıdır.

Deməli, memarlıq eyni vaxtda insanların həm utilitar-praktiki, həm də mədəni-estetik tələbatlarının birlikdə ödənilməsini nəzərdə tutan tətbiqi, tikinti incəsənətidir. Utilitar-praktiki və bədii-estetik cəhətləri harmonikcəsinə, ahəngdar və üzvi surətdə birləşdirmək memarlıq üçün həmişə ən aktual və başlıca məqsəd olmuşdur və olacaqdır [38,s.344].

Azərbaycan memarları da çoxlu memarlıq nümunələri yaratmışlar. Bakıda Sınıqqala minarəsi (1078-ci il), Qiz qalası (XII əsr), Şirvanşahlar sarayı kompleksi (XVəsr), Marağada türbələr (XII əsr), Naxçıvanda Möminə xatun türbəsi (1186-cı il), Təbrizdə Əlişah məscidi (1310-1320-ci illər), Göy məscid (1465-ci il) və bir çox başqaları belə abidələrdəndir. Azərbaycan memarları, həmçinin Türkiyədə, Orta Asiyada, Şimali Qafqazda və başqa yerlərdə də çox maraqlı, gözəl və yaraşıqlı memarlıq abidələri yaratmışlar [38,s.346].

Memarlığın 3 növündən biri kimi iri ölçülü binalar nəzərdə tutulur. İri ölçülü tikililər (dini, ictimai, sənaye, yaşayış binaları və s.) [122] sırasında Şirvanşahlar sarayı diqqət çəkir. Böyük natiqin dilində "həm", "həm də" iştirak bağlayıcılarının köməyi ilə bu kompleksin funksiyasını açıqlanır. "Ancaq etiraf etmək lazımdır ki", səmimi ifadə ilə auditoriyanın diqqətini memarlıq abidəmizin qayğı və təbliğinə yönəldir. "Xatırlayıram ki" modal sözlə auditoriyanı həm keçmişə aparır, həm də öz həyatı ilə tanış edir. Nitqin sonunda "göstərməliyik ki," qəti ifadə ilə auditoriyada səfərbəredici ruhun hakimliyi təmin edilir: "Şübhəsiz, onu edəcəyik. Ancaq əsas məsələ bu bərpa işini həyata keçirməkdir. Şirvanşahlar sarayı Azərbaycan xalqının iftixar etdiyi tarixi-memarlıq abidəsidir. Bu, ***həm*** bizim memarlığımızın ən yüksək səviyyədə olduğunu göstərir, ***həm də*** dövlətçiliyimizin tarixini əks etdirən bir abidədir, kompleksdir və şübhəsiz ki, dünyada da məşhurdur. Ancaq etiraf etmək lazımdır ki, biz bu sarayın ***həm*** təbliğinə, ***həm də*** onun bərpasına indiyə qədər fikir verməmişik. Doğrudur, onun adı dünyanın memarlıq albomlarında, kataloqlarında vardır. Mən ***xatırlayıram*** ki, institutda memarlıq fakültəsində oxuyarkən biz bunu xüsusilə öyrənirdik. Mən gəlib burada günlərlə, həftələrlə bu abidəni öyrənmişəm, bundan imtahan vermişəm. Divanxananın portalı ən yüksək memarlıq incisidir. Bunu çoxları bilir. Ona görə də biz bu kompleksi bərpa edib ***göstərməliyik*** ki, bizim tariximiz, 500 il bundan əvvəl olan dövlətçiliyimiz, dövlətimiz və bizə qalmış irs budur" [XVc.s.82].

Hüseyn Əlizadəyə [38] görə o binalar və tikililər memarlıq abidəsi hesab edilir ki, onlar insanların utilitar-praktiki tələbatlarını ödəməklə yanaşı, həm də estetik funksiyaya malik olsunlar. Deməli, təmiz utilitar, praktiki məqsədlərə xidmət edən hər tikilini və binanı memarlıq abidəsi, əsəri hesab etmək olmaz. Tikili və binalar yalnız gözəllik səviy-

yəsinə yüksələndə, gözəllik əldə edən məqamdan memarlıq bir incəsənət növü kimi təşəkkül tapmağa başlayır. "Həm", "həm də" iştirak bağlayıcıları ilə məscidin funksiyalarını (ibadətgah, müqəddəs yer, ziyarətgah, gözəl memarlıq abidəsi) sadalayır: "Bu məscid öz xüsusi mənası və məqsədi ilə bərabər, xalqımızın ***böyük***, ***dəyərli*** və ***gözəl*** memarlıq abidəsidir. Beləliklə, bu məscid Azərbaycanın mədəniyyət, memarlıq tarixini zənginləşdirən bir abidədir. Bunun mənası həqiqətən çox yüksəkdir. O, ***həm ibadətgahdır, həm müqəddəs yerdir, həm ziyarətgah, həm də gözəl memarlıq abidəsidir***. Umid edirəm ki, gələcək nəsillər bizim bu tarixi, xeyirxah işimizi layiqincə qiymətləndirəcək, bu məscidi, ziyarətgahı əbədi yaşadacaq və bu müqəddəs yerin başına keçmişdə gəlmiş bəlalara bir daha yol verməyəcəklər" [XVIc.s.232].

Adətən, heykəltəraş insan obrazlarının təsvirini verir. Bunların çoxu öz dövrünün tanınmış adamları, dövlət xadimləridir [122,s.343]. "Elmə hörmət olubdur, bu gün də hörmət var və gələcəkdə də hörmət olacaqdır" ilə incəsənətin heykəltəraşlıq növünü birləşdirir. "Bu gün Yusif Məmmədəliyevin xatirəsinə həsr olunmuş heykəlin, abidənin burada, Bakının mərkəzində, Elmlər Akademiyasının yanında ucaldılması da ***əsaslıdır*** və ***ədalətlidir***. ***Çünki*** onun Azərbaycan elminin inkişafındakı xidmətləri və eyni zamanda Azərbaycan elminin təşkilində, bütün elmlərin mütəşəkkil inkişafındakı xidmətləri belə bir qərarı qəbul etməyə əsas vermişdir. ***Güman edirəm ki***, bu abidə də, Yusif Məmmədəliyevin şəxsiyyətini, simasını əks etdirən bu heykəl də həm onun xatirəsinə həsr olunubdur, həm də Azərbaycan elminin inkişafına, keçmişinə və gələcəyinə həsr olunubdur. Bu, bizim insanlara bir də onu nümayiş etdirir ki, Azərbaycanda ***həmişə elmə hörmət olubdur, bu gün də hörmət var və gələcəkdə də hörmət olacaqdır***" (XVIIc.s.327-328].

Memarlığın ikinci növü sayılan landşaft memarlığı kimi Bakının ***ən uca nöqtəsində*** şəhidlərin xatirəsinə ucaldılmış abidə xüsusi diqqətə layiqdir. Bu gün biz həddindən artıq sevinc içərisindəyik. Çünki Azərbaycanın həyatında təkcə bu gün iki böyük əlamətdar hadisəni qeyd edirik. Şəhidlər xiyabanında ucaldılmış, şəhidlərin xatirəsinə həsr olunmuş abidəni bu gün səhər açıb, orada əbədi məşəl yandırdıq. Azərbaycanın müstəqilliyi, suverenliyi, ərazi bütövlüyü, Qarabağın müdafiəsi uğrunda həlak olmuş, şəhid olmuş insanların xatirəsinə Bakının ən uca yerində, dağın üstündə layiqli bir abidə yarada bildik. Bəli, 1938-ci ildən 1990-cı ilə qədər Bakının ***ən uca nöqtəsində*** olmuş Kirovun heykəlinin yerində bu gündən Azərbaycanın müstəqilliyini, suverenliyini və xalqımızın qəhrəmanlığını təcəssüm etdirən gözəl memarlıq abidəsi və əbədi məşəl olacaqdır" [XVIIIc.s.17].

Heydər Əliyevin heykəltəraşlıq haqqında olan estetik fikirləri, xüsusilə məşhur heykəltəraş, xalq rəssamı Ömər Eldarovun, görkəmli oftalmoloq, akademik Zərifə Əliyevanın xatirəsinə həsr etdiyi "Elegiya" əsərinin – mərmər abidənin və bu abidədən bəhs edən albomun təqdimat mərasimindəki çıxışda öz əksini tapmışdır. Həmişə olduğu kimi bu mərasimdə də Azərbaycanın incəsənət xadimlərinin gördükləri işlər öz dəyərini alır, həmin xadimlər dövlət başçısı tərəfindən öz xalqına və dünyaya tanıdılır: "Ola bilər mənim fikirlərim subyektiv olsun. Ancaq mən həmişə düşündüyümü demişəm. Ömər Eldarovun yaratdığı heykəltəraşlıq əsərləri Azərbaycan xalqının mədəni, mənəvi sərvətidir və onlar Azərbaycan xalqının mədəniyyətini zənginləşdirmişdir" (IXc.s.152-153].

Ilk baxışda daş üzərində, mərmər üzərində insan xarakterini verə bilmək, öz yaratdığı əsərdə milli kaloriti əks etdirə bilmək kimi qabiliyyətə malik olmağı heykəltəraşlar qarşısında tələb qoyur. Sənətdə yüksəlişin yolu mənəviyyatca

pak və təmiz olmaqdan keçir. "Elə" qüvvətlənirici ədatının köməyilə "daş"ı, "mərmər"i parçaya bənzədir.

Heykəltəraş işinin mühüm və müəyyən cəhətlərini bu sahə ilə əlaqəsi olmayan, bu işlərdə səriştəsi az olan auditoriya üçün rəvan bir dillə anladır. Auditoriya sanki qarşısında memarlıq fakültəsinin mühazirə oxuyan, bu fənnin sirlərini anladan mütəxəssisi (böyük rəssamlar, heykəltəraşlar əsərin ümumi konsepsiyasını, kompozisiyasını verirlər) görür: "Heykəltəraş kimi, Ömərin bir xüsusiyyəti də ondan ibarətdir ki, özü həm yaradır, həm də fəhləlik işini görür. O, həm böyük *heykəltəraşdır*, həm də çox zəhmətkeş bir *fəhlədir*. Çox, həddindən artıq nadir bir insandır. Çünki bəzən böyük ***rəssamlar, heykəltəraşlar əsərin ümumi konsepsiyasını, kompozisiyasını verirlər***, sonra onların köməkçiləri bu işi başa çatdırırlar. Amma bu adam bilavasitə özü işləyir. Bunların hamısını ***incəliklərinə*** (sənətşünas kimi) qədər yonmaq nə qədər çətin işdir! Bu, daşdır, mərmərdir, amma elə bil ki, parçadır. Mərmərə, daşa bu qədər incəlik vermək böyük məharətdir, böyük ustalıqdır. Mənəviyyatca ***pak***, ***təmiz*** insanlar həmişə yüksək zirvələrə qalxıblar" [IXc.s.161].

XX əsrdə fəaliyyət göstərən heykəltəraşlar antroponimik sıralanma ilə auditoriyaya tanıdılır: "Bu illər ərzində bizim böyük heykəltəraşlarımız yaranmışdır. Bu gün onların heykəllərinə baxarkən xalqımız bunları qiymətləndirir, xatırlayır. ***Fuad Əbdürrəhmanov*** gözəl əsərlər yaradıbdır. ***Cəlal Qaryağdı, Tokay Məmmədov*** və başqaları da həmçinin" [IXc.s.152-153].

"Görürsünüz, bu, adi bir əsər deyil. Bu əsərdə məni ***valeh edən***, -bu sözü tam həqiqətlə deyirəm – ***sevindirən*** və məndə böyük ***hissiyyatlar doğuran*** odur ki, bu əsərdə böyük fəlsəfə, məna vardır. ***Ən birincisi*** odur ki, Zərifə xanımın daxili mənəviyyatını, onun simasını, daxili və zahiri simasını Ömər Eldarov əks etdirə bilibdir. *Eyni zamanda*, o, gözəl bir

heykəltəraş kimi heykəltəraşlıq sənətinin, məktəbinin, – nəinki Azərbaycan heykəltəraşlıq məktəbinin, dünya heykəltəraşlıq məktəbinin elementlərini, yaxud onların müəyyən cəhətlərini – bu əsərində ***həyata keçirə, tətbiq edə*** bilibdir" [IXc.s.156]. Mətndən göründüyü kimi "valeh etmək" Heydər Əliyevin dilində estetik zövqün sinonimi kimi anlaşılır. Bu estetik zövqün kökündə dayanan əsərin dərin fəlsəfi mənasıdır. Bu fəlsəfi məna davamiyyət bildirən "ən birinci" modal sözlə, özündə forma (simasını) və məzmunun (daxili mənəviyyatını) dialektik vəhdətində, eləcə də "ikincisi" modal sözün sinonimi kimi "eyni zamanda" ilə dünya heykəltəraşlıq məktəbinin elementlərini, yaxud onların müəyyən cəhətlərini əks etdirməsindədir. Nəzərə alsaq ki, estetik qiymətdə insanın həm dünyagörüşü, onun bütün baxışlarının, görüşlərinin məcmusu, həm də hisslərinin inkişafı özünü biruzə verir [38,s.260], o zaman Heydər Əliyevin "Elegiya" əsərinə qiymət vermək haqqı məlum olar. "Yəni bu qiyməti elə Heydər Əliyev özü verə bilir" fikri məlum olar.

"Xüsusən" modal sözlə ağ mərmər üzərində işləməyin çətinliyini göz önünə gətirir. Heykəltəraşlıq elementlərini sinonim cərgə ilə (incə, nazik, zərif) təqdim edir. Burada "görürsünüz" feili heç də sırf feil kimi yox feili modal söz kimi verilir. Növbəti nitq mərhələsində "bu mənim üçün mücərrəd əsər deyil" ifadəsi iştirakçılar üçün əsl mənada, ilkin mənada "görünməyən" mənaları açıqlayır. Bir daha dərin fikirlərin aşkarlanmasında Azərbaycan dilinin zəngin qatlara malik olması üzə çıxır. Sonrakı nitq mərhələsində bir sənətşünas gözü ilə əsəri iştirakçılar üçün təhlil edir: "Bu heykəltəraşlıq əsəri kimi mürəkkəb əsərdir. Çünki burada heykəltəraş üçün, ***xüsusən*** daş, ağ mərmər üzərində işləyən heykəltəraş üçün çox çətinliklər vardır. Yenə də deyirəm, bunların hamısı bir tərəfdən bir heykəltəraş kimi Ömər Eldarovun əsərinin dəyərini nümayiş etdirir, amma eyni zamanda, mənim

üçün bu ***mücərrəd əsər deyil***. Deyə bilərəm ki, Zərifə xanımın mərhum ata-anası da bəlkə onu mənim kimi tanımayıblar. Ona görə də mən Zərifə xanımın daxili mənəviyyatını tam bildiyim üçün görürəm ki, bu əsərdə bunların hamısı öz əksini tapıbdır. Ona görə də bu əsər həm bədii, həm də fəlsəfi xarakter daşıyır və yüksək heykəltəraşlıq səviyyəsini nümayiş etdirir" [IXc.s.156].

Öz mövcudluğunu ibtidai dövrdən başlayan memarlıq tarix boyu unikal tikililərlə zənginləşir. Orta əsrlərdə Avropada roman və qotika üslubunda tikilmiş kilsələr, Parisdə Notrdam kilsəsi, Eyfel qülləsi, Almaniyada Köln kilsəsi, Naxçıvanda Möminə Xatun məqbərəsi, Bakıda Qız Qalası, İstambulda Topqapı, Dolmabaxça, Bəylərbəyi sarayları və digər möhtəşəm tikililər dünya memarlığının nadir incilərindən olub, həmin ölkələrin və ya şəhərlərin simvoluna çevrilərək dövrün bədii üslubunu əks etdirir [122]. "Ümumiyyətlə" yekunlaşdırıcı modal sözlə Heydər Əliyev bir tərəfdən Naxçıvanın mütəfəkkirlərlə zəngin olduğunu, digər tərəfdən Azərbaycanın Gəncə şəhərində ən qiymətli milli dəyəri Nizami Gəncəvidən söhbət açaraq hissədən tama, zərrədən bütövə ekskurs edir: ***Ümumiyyətlə***, Naxçıvan mütəfəkkirlərlə zəngin olmuşdur. Əgər orta əsrlərdə Azərbaycanın memarlıq sənətinin ən yüksək nümunəsi Əcəmi Naxçıvaninin yaradıcılığı olmuşdursa, XII əsrdə bizim mədəniyyətimizdə, ədəbiyyatımızda ən qiymətli əsərlərin müəllifi, xalqımızın ən qiymətli milli dəyəri Nizami Gəncəvi və onun yaradıcılığı olmuşdur. Həmin dövrdə Azərbaycanın ən yüksək, ən qiymətli memarlıq əsərlərini Naxçıvanda Əcəmi Naxçıvani yaratmışdır. Elə "Möminə Xatun" məqbərəsinə baxanda, onu seyr edəndə insan heyran olur.

800 il bundan öncə burada, Azərbaycanın bu ucqar diyarında, − amma o, ucqar deyildi, o vaxt Azərbaycanın mərkəzlərindən biri idi, − bu qədər gözəl memarlıq əsəri yaradılıbdır.

Deməki, mədəniyyət, memarlıq, dövlətçilik ***nə qədər*** yüksək səviyyədə olub və Atabəylər dövlətinin ***nə qədər*** qüdrəti olub, mədəniyyətə ***nə qədər*** diqqəti olub ki, bu gözəllikdə "Möminə Xatun" abidəsi yaradılıbdır. Bu, yeganə deyildir. Elə bu torpaqda Əcəmi Naxçıvaninin bir çox gözəl əsərləri var. Əcəmi Naxçıvani memarlıq məktəbi bütün Şərqə yayılmış, bu məktəb Şərq aləmində müxtəlif ölkələrdə öz əksini tapmışdı" [XXIIc.s.196].

"Gör" əmr ədatı ilə "əgər" şərt bağlayıcısını harmonik şəkildə işlədərək ulularımızı sinonim cərgə ilə (müdriklik, böyük zəka, ağıl) xalqa tanıdır: "Bu baxımdan onlar Mömünə Xatun türbəsini, şübhəsiz ki, özlərinin böyük insani keyfiyyətlərinə görə yaradıblar. Onlar müdrik insanlar olublar. ***Əgər*** o ***müdriklik, böyük zəka, ağıl*** olmasaydı, məsələn, Şəmsəddin Eldəniz öz həyat yoldaşına bu cür türbənin yaradılmasına qərar qəbul etməzdi. ***Gör*** nə qədər agıllı insan olubdur. O nəsil nə qədər ağıllı olubdur ki, onun oglu bunu davam etdirib və bizim tariximizi göstərən bu qədər əzəmətli memarlıq abidəsi, tariximizi təsdiq edən abidə yaranıbdır" [XXIIc.s.196].

Əlbəttə, bu abidənin qiyməti yoxdur. Məsələn, çox vaxt, elə bu gün də bunu gözəl memarlıq abidəsi kimi təblig edirlər. Bu təbiidir, dogrudan da belədir. Dagılanlar dagılıb, amma qalanlar içərisində Mömünə Xatun məqbərəsi XII əsrdə, Orta əsrlərdə Azərbaycanın nə qədər zəngin mədəniyyəti olduğunu, dogrudan da böyük memarlıq məktəbi oldugunu göstərir. Sən də dedin, biz də bilirik ki, Əcəmi Naxçıvani və onun yaratdığı məktəb təkcə Naxçıvanı əhatə etmir, Şərq aləminin böyük bir hissəsində onun memarlıq üslubu, memarlıq məktəbi davam edib, böyük əsərlər yaradıbdır" [XXIIc.s.196].

Memarlıq abidələri dövlət başçısı kimi Heydər Əliyev üçün dövlətçilik baxımından qiymətlidir: "Ancaq hesab edirəm ki, bu abidənin memarlıq qiyməti ilə bərabər, bizim üçün bəlkə daha da böyük qiyməti Azərbaycanın qədim dövlət

olmasını ***göstərməsidir***. Bu, təkcə memarlıgın ***zənginliyini*** yox, dövlətçiliyin nə qədər ***zəngin*** olduğunu, nə qədər möhkəm olduğunu da göstərir. Əgər dövlətçilik o qədər yüksək səviyyədə olmasaydı, onlar bu cür abidənin yaradılması üçün qərar qəbul elə bilərdilərmi?" [XXIIc.s.269-270].

Sənətşünaslıqla bağlı nitqlər məişət çalarları ilə auditoriyaya yön alır: "Bizim heykəltəraşlar, memarlar təşəbbüs göstəriblər – akademik, professor Zərifə xanımın, mənim mərhum həyat yoldaşımın büstünü bu parkda qoyublar. Doğrudur, mən bunu bilmirdim. Bu onlar tərəfindən göstərilən təşəbbüsdür. Mən bu təşəbbüsə görə çox məmnunam. Bu işdə təşəbbüs göstərənlərin, mənim ailəmə münasibət göstərənlərin hamısına dərindən minnətdarlığımı bildirirəm. Çox sağ olun.

Mən burada çoxlu gənclər görürəm. Yenə də deyirəm, bu məni sevindirir. Çünki gənclər müstəqil Azərbaycanın, ölkəmizin gələcəyidir. Mən gənclərdə xoş əhval-ruhiyyə görürəm. Hər bir insanın sifətinə, geyiminə, paltarına baxıram – ***Allaha şükürlər olsun***, görürəm ki, pis deyil. Təbiidir ki, bundan da yaxşı olmalıdır. Mən istəyirəm bundan da yaxşı olsun. Bax, bugünkü bu mənzərənin hamısı məni sevindirir. İnanıram ki, heç kəs xüsusi bayram paltarı geyib buraya gəlməyibdir. Burada hər kəs öz adi paltarındadır" [XXVIIc.s.11-12].

İnsanların sağlığında, adətən, onların heykəlləri yaranmır. ***Düzdür***, indi bəzi ölkələrdə cümhurbaşqanları var, hər küçədə özünə bir heykəl yaradır, bu o qədər də normal hal deyildir. Mən İhsan Doğramacıya dedim ki, Ömər Eldarov çox böyük sənətçidir, heykəltəraşdır. Siz inciməzsiniz, mən sizə deyim ki, Türkiyədə heykəltəraşlıq sənəti çox zəif olubdur. Sizdə çox az heykəllər var. Bakıya gələrsiniz, hər küçədə bir heykəl var. Amma heykəllər bizim böyük adamlaradır – şairlərə, bəstəkarlara, sənətçilərə. Siyasi xadimlərə, siyasət adamlarına heykəl qoymurlar. Amma görürsən ki, bir şair 5-6 kitab ya-

zıbdır, onun heykəli var. Bu belədir, nə etmək olar?" [XXXIXc.s.253]

Əziz dostum İhsan Doğramacı! Bu gözəl heykəl yaşayacaq, əsrlər boyu yaşayacaq. Güman edirəm ki, sən də hələ çox yaşayacaqsan. Mən də səninlə bir yerdə çox yaşayacağam. Biz bir-birimizə söz vermişik, gərək sözümüzə sadiq olaq. Ancaq gözəl heykəltəraş Ömər Eldarovun çox gözəl sənəti olan bu ***heykəl*** daim türk xalqlarının insanlıq, elm, mədəniyyət ***rəmzinə*** çevriləcəkdir. Əsrlər keçəcək, yeni nəsillər gələcək, Bilkənd Universiteti yaşayacaq, burada yeni-yeni insanlar həm çalışacaq, həm də təhsil alacaqlar. Amma ***hər kəs*** bu heykəlin yanından keçəndə baş əyəcək və İhsan Doğramacıya minnətdarlığını bildirəcək. Bu sözləri deyəndə mən əlavə edirəm ki, üç ildən sonra Bakıda – Azərbaycanda İhsan Doğramacının 90 illik yubileyini biz təntənə ilə bayram edəcəyik, ondan sonra 100 ilə qədər bir proqram yapacağıq" [XXXIXc.s.253-254].

Xalq rəssami Tokay Məmmədova ünvanlanmış məktubda ölkə prezidentinin memarlığın inkişafında rolu olan şəxslərə sevgisi səslənir: "Hörmətli Tokay Məmmədov! Siz Azərbaycanın dahi şəxsiyyətlərinin unudulmaz obrazlarını diqqətəlayiq gözəl abidələrə çevirərək mədəniyyət tariximizə həmişəlik həkk etmisiniz. Sənətin əbədi mövzularını bütün dərinliyi ilə əks etdirən əsərləriniz Azərbaycan heykəltəraşlığının gözəl və kamil nümunələridir. Öz bədii-estetik təsir gücü, plastik formaların rəngarəngliyi və milli koloriti ilə seçilən bu monumental abidələr insanlara xoş duyğular aşılayır.

Bakının küçə və meydanlarını bəzəyən abidələriniz paytaxtımızın görkəminin ayrılmaz hissəsinə çevrilərək onu daha da ***gözəlləşdirir***, milli-mədəni irsə dərin ehtiram və məhəbbət duyğuları oyadır. Bu, doğma torpağa, xalqına bağlı olan sənətkar kimi, Sizin müstəqil Azərbaycanımıza, onun mədəniy-

yətinin çiçəklənməsi naminə verdiyiniz əvəzsiz töhfədir" [XLc.s.184].

Memarlıqla əlaqədar Heydər Əliyevin şifahi, spontan söylənilən nitqlərinin özünəməxsus xüsusiyyətlərini aşağıdakı kimi yekunlaşdırmaq olar:

− Heydər Əliyev üçün memarlıq abidələri "gözəllik" estetik kateqoriyası ilə birgə səslənir ;

− Memarlıq abidələri haqqında Ulu Öndərin fikirləri sənətşünaslıq baxımından elmi, geniş dinləyici auditoriyası üçün məişət üslubunda çatdırılır;

− Milli-mədəni tariximizi əks etdirən memarlıq abidələri ilə əlaqədar söhbətlərdə Heydər Əliyev tez-tez "xatırlayıram" modal sözünü, müstəqillik dövründə tarixi abidələrimizə sahib çıxmağımızla bağlı çıxışlarında "Allaha şükürlər olsun ki" modal sözünü işlədir ;

− Memarlıqla bağlı, memarlıq abidələri ilə bağlı nitqlər bir sıra sinonim cərgələrlə ("böyük, dəyərli və gözəl memarlıq abidələri", "abadlaşdırmaq, gözəlləşdirmək", "həm ibadətgah, həm müqəddəs yer, həm ziyarətgah, həm də gözəl memarlıq abidəsi) auditoriyalara yol açır;

− Memarlıq sahəsində xalqın görkəmli sənətkarları antroponimik sıralanmalarla dinləyicilərə çatdırılır.

## 2.2.5. Heydər Əliyevin nitqində teatr

Ulu Öndərin xalqımızın estetik dünyagörüşünün formalaşmasında mühüm rolu olan teatrla bağlı fikirləri, əsasən onun mədəniyyət və incəsənət xadimləri ilə, teatr tamaşalarından sonra yaradıcı kollektivlə, mədəniyyət abidələrinin açılışlarında, incəsənətin kino və bədii ədəbiyyat kimi növləri haqqında olan söhbətlərdəki nitq və çıxışları əsasında tədqiqata cəlb olunmuşdur.

Biz bu vaxtacan incəsənətin zamanlı (ədəbiyyat, musiqi) və məkanlı (dekorativ-tətbiqi sənət, memarlıq, heykəltəraşlıq, rəssamlıq) növləri ilə tanış olduq. Bu sənət növləri bir-biri ilə birləşərək, qarışaraq yeni incəsənət növlərini əmələ gətirirlər. İncəsənətin bir növünün digər növlərilə birləşməsindən yaranan incəsənətlər sintetik incəsənətlər adlanır (sintez – "birləşmə", "uzlaşma" deməkdir). Buraya kino və teatr (dram, opera, balet) aiddir.

Öz təbiətindən doğan səbəblərə görə onlara eyni zamanda çoxlu adamların tamaşa etməsini tələb edən incəsənət növlərinə bir də tamaşa əsərləri deyirlər. Teatr və kino tamaşa incəsənətləridir. Teatr və kinonun çoxlu ümumi cəhətləri olduğu kimi, bunlar arasında həm də böyük fərqlər vardır. Hər şeydən əvvəl, bunlardan hər biri ayrı-ayrı incəsənət növləridir [38,s.122].

Xalq yazıçısı Elçinin "Ah, Paris...Paris..." ikihissəli komediyasina tamaşa etdikdən sonra aktyorlarla görüşdəki söhbətdə Azərbaycanın ictimai-siyasi xadimi Elçin Əfəndiyevin söylədiyi fikirlər Heydər Əliyevin şəxsində teatra sevgini, məhəbbəti, dövlətin teatra olan qayğısı əks olunur: "Siz bayaq İlyas Əfəndiyevin adını çəkdiniz. Mən bunu deməyi özümə borc bilirəm ki, İlyas Əfəndiyevin bu teatrda 19 pyesi tamaşaya qoyulubdur. Bu doğrudan da dünya teatr tarixində nadir hadisələrdən biridir. Bunu deməyi lazım bilirəm. Çünki bu həqiqətdir. İlyas Əfəndiyev bu teatra nə dərəcədə bağlı idisə,

o, teatrı fikirləşəndə, teatr haqqında düşünəndə həmişə Sizi nümunə göstərirdi – bu, dəfələrlə mənim gözümün qabağında olan hadisədir, faktdır – ***yəni daxilən teatral insan olmağınızı***, Azərbaycan teatrı ilə əlaqədar ***fəaliyyətinizi***, Azərbaycan teatrının çox görkəmli xadimləri ilə ***ünsiyyətinizi*** nümunə göstərirdi. Siz o vaxtlar Azərbaycan teatrının 100 illiyini ***elə yüksək səviyyədə*** keçirdiniz ki, heç bir ölkədə, heç bir keçmiş respublikada birinci katib teatrın 100 illiyi barədə məruzə etməzdi [XXVIIIc.s.320].

Dramaturqları antroponimik sıralanmalarla xalqa tanıdır: “1873-cü ildə Nəcəf bəy Vəzirov və başqa böyük şəxsiyyətlərimiz ilk Azərbaycan teatrını, Şərqdə ilk teatrı yaratdılar, özü də ö şəraitdə, dini təzyiqin mədəniyyətimizə böyük məhdudiyyətlər qoyduğu bir vaxtda, 1973-cü ildə biz bütün dünyaya car çəkdik və böyük iftixar hissi ilə Şərqdə ilk müsəlman teatrının yüz illiyini qeyd etdik. Bu yubileyin necə təmtəraqla, hörmətlə keçirildiyi, yəqin ki, xatirinizdədir. İndi o teatrı xatırlamırlar. Məgər bu Mirzə Fətəli Axundovun, Nəcəfbəy Vəzirovun, Abbas Mirzə Şərifzadənin, Ülvi Rəcəbin, Mirzağa Əliyevin, Sidqi Ruhullanın, Ələsgər Ələkbərovun ruhuna hörmətdirmi? Heç olmasa, onların ruhu qarşısında məsuliyyətinizi hiss edin.

Əgər Hüseyn Ərəblinski o dövrdə böyük teatr, mədəniyyət xadimi kimi fəaliyyət göstərərək bu yolda öz həyatını qurban vermişsə, indi mədəniyyət xadimləri nə üçün həyəcan təbili çalmırlar ki, mədəniyyətimiz batır, dağılır” [Ic.s.161].

Azərbaycan xalq artisti Amalya Pənahovanın 50 illik yubileyi gecəsindəki çıxışında “üç saat elə bil dəqiqə kimi keçdi” ifadəsi teatrın yaratdığı estetik zövqdən xəbər verir: “Bayaq biz salonda oturduğumuz zaman üç saat elə bil dəqiqə kimi keçdi. Ancaq mən təsəvvür edirəm ki, – yəqin bunu bütün tamaşaçılar da bilir – hər bir teatr işçisi öz rolunu oynayarkən nə qədər həyəcan keçirir, enerji sərf edir, öz daxili imkan-

larını toplayır. Bunlar səhnəyə çıxan aktyorun, rəqqasın, müğənninin hər birinə aiddir. Ona görə də mən bir daha deyirəm: teatr və incəsənət sahəsində çalışanlar ***çox fədakar insanlardır***. Səhnədə onlara baxdıqda çox vaxt hər biri qayğısız, xoşbəxt insan kimi görünür, həmişə şəndirlər. Ancaq onların həyatının səhnə arxasında necə olmasını çoxları bilmir, heç təsəvvürlərinə də gətirmir. Mən bunları bilirəm. Ona görə də incəsənət adamlarını cəmiyyətimizdə ***çox yüksəkdə*** tuturam" [IVc.s.82, 83].

"Bütün bunlar mənim xatirimdədir" ifadəsi ilə aktyorlarımızı xalqın yadına salır: "Mən Azərbaycan teatrını gənc yaşlarımdan sevmişəm. ***Abbas Mirzə Şərifzadəni, Ülvi Rəcəbi, Mərziyə Davudovanı, Fatma Qədrini, Ələsgər Ələkbərovu, Mirzağa Əliyevi, Sidqi Ruhullanı, Sona Hacıyevanı*** və bir çox başqalarını səhnədə görmüşəm. Onların yaratdığı obrazları sevmişəm. Səhnəmizdə böyük ad-san qazanmış sənətkarlarımızın da yaratdığı rollara tamaşa etmişəm. Onların hamısı ilə yaxından tanış olmuşam. Məsələn, mən Sidqi Ruhulla ilə çox yaxından tanış idim. Bütün bunlar mənim xatirimdədir" [IVc.s.84].

"Bəli" təsdiq ədatı ilə "musiqinin, teatrın vətəni yoxdur" müddəasını əcnəbi qonaqların diqqətinə çatdırır: "Biz azad olduqdan, demək olar, bütün ölkələri gəzdikdən, başqa teatrlarla, *o cümlədən* dünyanın musiqi baxımından ən inkişaf etmiş ölkələrinin opera və balet teatrları ilə tanışlıqdan sonra deyə bilərik ki, ***bəli***, Böyük Teatr ***rus mədəniyyətinin, rus musiqisinin, rus incəsənətinin*** şöhrəti və fəxridir. Şübhəsiz ki, Böyük Teatr bütün respublikalarda, ***o cümlədən*** də Azərbaycanda musiqi mədəniyyətinin inkişafına çox böyük təsir göstərmişdir. Biz Böyük Teatrın solistlərini həmişə sevinclə qarşılayırıq. Hesab edirəm ki, bizim dostlarımız, qonaqlarımız Müslüm Maqomayevin yubileyini qeyd etmək üçün buraya gəlmiş qonaqlarımızı bu gözəl salonun necə heyranlıqla,

gurultulu alqışlarla qarşıladığını gördülər. Mən sizə təşəkkür edir və yaradıcılıq uğurları arzulayıram" [XIIc.s.359-360].

Bütün çıxışlarında olduğu kimi aşağıdakı mətndə də fəlsəfi çalarlar öz yerini tutur: "Bu əsərdən doğan məna ondan ibarətdir ki, gərək hər bir insan nə olur-olsun, paklıq, mənəvi saflıq, mənəvi təmizlik uğrunda mübarizə aparsın, insana xas olan mənfi keyfiyyətlərdən insanları xilas etməyə axıra qədər çalışsın. Bizim yaşadığımız planetdə insanın tarixini heç kəs bilmir. Insan neçə min-min illərdir yaşayır. Hər bir insanın isə kiçik – altmış, yetmiş, səksən, doxsan il ömrü var, bəziləri yüz yaşa qədər ancaq yaşaya bilir. Bunun da bir hissəsi uşaqlıq dövrüdür, bir hissəsi yuxudur, son hissəsi də onun yaşlı dövrünə düşür. İnsan sadəcə olaraq yaşamaq üçün mübarizə aparır, başqa bir imkanı olmur. Bu, insanın ömrüdür. Amma insan cəmiyyətinin ömrünü heç kəs bilmir. Yer üzündə neçə yüz min illərdir ki, insan yaşayır və insan cəmiyyəti mövcuddur. İbtidai icma dövrü – tarixçilər yazıblar – neçə min illər bundan öncə olubdur.

Bu gün siz Bəxtiyar müəllimin yazdığı sözləri ifa edib bizə sübut etmək istəyirsiniz ki, o vaxtlar hər şey düz, pak olubdur, eyni zamanda, özünüz də inkar edirsiniz ki, yox, belə olmayıbdır. Həm deyirsiniz, həm də inkar edirsiniz. Yəni bunları Bəxtiyar müəllim belə yazıb, siz isə onları səhnədə ifa edirsiniz və bizə göstərirsiniz" [XIIIc.s.169].

Azərbaycan Milli Dram Teartı 20 sentyabr 1997-ci ildə İlyas Əfəndiyevin "Hökmdar və qızı" tamaşasına baxdıqdan sonra teatrın yaradıcı kollektivi ilə görüşdəki çıxışında böyük natiq qeyd edir ki, teatr üçün yazılmış əsərlərin, ***xüsusilə*** tarixi səpkidə yazılmış əsərlərin teatr vasitəsilə xalqa çatdırılmasının üstünlüyünü sadə dildə ünvanlayır. "Nə... nə" inkar bağlayıcıları ilə prinsipial mövqe bildirir: "Bu əsərlə İlyas Əfəndiyev yeni bir xidmət edibdir, bizim tariximizin o dövrünü açıb xalqımıza göstəribdir. Bunlar indi açılıbdır. Tarix-

çilər, bizim salnaməçilər bunları düzgün yazmağa başlayıblar. Ancaq bilirsiniz, indi hər bir adamın o tarix kitablarını oxumağa ***nə*** imkanı var, ***nə*** vaxtı. Bir də ki, biri oxuyur, o birisi oxuya bilmir. Bu baxımdan teatr, kino çox təsirli bir ***vasitədir***. Tariximizin bu dövrü keçmişdə təhrif olunubdur. Bunu siz bilirsiniz. Biz bu dövrü yaşamışıq" [XIIc.s.158].

Ancaq bu əsərin ikinci tərəfi də var. Bir var ki, bizim tariximizi aydınlaşdırır, amma ikinci tərəfi bundan da əhəmiyyətlidir. Xalqımızda vətənpərvərlik yaradır, müstəqillik, milli azadlıq hissiyyatlarını beyinlərə həkk etdirir, xalqımızı bu istiqamətdə tərbiyələndirir və əsasən, gəncləri tərbiyələndirir. Bu baxımdan əsərin aktuallığı çox böyükdür. İndi hər bir adam bilsin ki, müstəqillik nədir və öz xalqının müstəqilliyini qorumayan adamların aqibəti necə olur [XIIc.s.160].

"Təəssüf ki, cəmiyyətdə qanunu pozanlar, əxlaqsızlıq, mənəviyyatsızlıq edənlər də var. Belələri insanı o qədər incidir ki, həmin adam hər şeyi artıq qara rəngdə görür. Amma həyat tam qara deyil. Həyatın işıqlı tərəfi də, qaranlıq tərəfi də, gözəl tərəfi də, insanları incidən tərəfi də var.

Ona görə bu məsələdən belə nəticə çıxarmaq olar ki, biz indiyə kimi nə qədər çalışmışıqsa, bundan sonra da hər bir insan cəmiyyətimiz, hər bir adamın əxlaqının təmizlənməsi uğrunda mübarizə aparmalıdır və heç vaxt ümidsiz olmamalıdır. Mən Bəxtiyar müəllimə bildirmək istəyirəm – bu əsərdə bəzən bir az ümidsizlik hiss olunur.

Ümidsizlik ***olmamalıdır***. Cəmiyyət, insan ***ümidlə yaşamalıdır***. İnsan ümidlə yaşamalıdır ki, cəmiyyət mənfi hallardan xilas olsun. Biz bəlkə də buna nail ola bilməyəcəyik. Amma gələcək nəsillər buna mütləq nail olacaqlar" [XIIIc.s.171].

Estetik əsərlər insan ruhunu oxşamaqla yanaşı etik dəyərlərimizin də formalaşmasına yardım edir. Estetik əsərlərdə tariximizin gənc nəslə öyrədilməsi estetik hisslər doğuran

teatrla həyata keçirilməsi Heydər Əliyev nitqlərinin əsasını təşkil edir: "İlyas Əfəndiyev Azərbaycan teatrına çox böyük töhfələr veribdir, böyük xidmətlər göstəribdir, çox dəyərli əsərlər yaradır" [XIIIc.s.171].

İncəsənətin canlı növü olan teatr bu estetik zənginliyi auditoriyaya daha asan bir dildə çatdırır. Elə bu estetikliyin çatdırılması Heydər Əliyev dilində belə səslənir: "Güman edirəm ki, Bəxtiyar müəllim inciməz – bu əsəri səhnədə görməyən adam kitabı oxusa, bu təəssüratı ala bilməz. Məsələn, siz özünüz yazdığınız şeiri kitabdan oxuyanda ola bilər ki, onu yarıya qədər oxuyasan, yarısını oxumayasan. ***Elə*** bu əsərin özü də mürəkkəb əsərdir. Fəlsəfi əsərlər həmişə çətin olur. Səhnədə sizin ifanız Bəxtiyar müəllimin bu əsərinin ***məzmununu, mənasını, əhəmiyyətini çox gözəl*** açıbdır. Quruluşçu rejissorun da işi təqdirə layiqdir və hər birinizin ifa etdiyiniz rollar da çox gözəldir. Mən tamaşaya çox diqqətlə baxırdım. Hərə öz rolunu yaxşı ifa edirdi. Hamınızı təbrik edirəm və təşəkkür edirəm ki, bizə bu gün yeni bir tamaşa təqdim etdiniz, çox sağ olun" [XIII cild. s.173].

Ona görə də məhz həyatın mühüm ziddiyyətlərini aça bilən pyeslər tamaşaçını özünə cəlb edə bilər. Konflikti zəif və ya konfliktsiz pyeslərin ideya – bədii keyfiyyətləri, təsir, təlqin gücü və tərbiyəvi əhəmiyyəti də zəif olur.

Komediya da faciə kimi öz mənşəyini Qədim Yunanıstandan götürmüşdür. Bu janr öz mənşəyini "komediyanın atası" Aristofandan başlayır. Komediya ictimai həyatın gülünc və eybəcər hadisələrini əks etdirib, onlara qarşı tənqidi münasibət yaradır. Bu janrda yazılmış əsərlər həyatın mənfiliklərinə, qeyri-sağlam, qüsurlu təzahürlərinə gülərək müəyyən müsbət idealları təsdiq edir.

Hegel haqlı olaraq qeyd edirdi ki, "dramaturqların hamısı teatra nə qədər laqeyd olsalar da və ya ona nə qədər xor baxsalar da, yenə də onlar öz əsərinin səhnədə tamaşaya qoyul-

masına ümid və arzu bəsləyirlər" [38]. Dram əsəri öz bitkin təcəssümünü səhnədə tapa bildiyinə görə onun "dramatik dəyəri" də məhz onun "səhnədə qoyulmaq üçün yararlılığı" ilə ölçülür. "Çap olunmuş pyes səhnədə artistlər tərəfindən ifa olunmayınca, onların canlı, bəşəri hissləri ilə canlandırılmayınca, hələ bitkin əsər deyildir.... Səhnə əsərini bütün bitkinliyi və mahiyyəti ilə ancaq teatrın səhnəsində öyrənmək, bilmək olar" [122].

Bu deyilənlər onu göstərir ki, dramaturgiyada və səhnə sənətində ən qüvvətli ifadə vasitələrindən biri də sözdür, danışıqdır, personajların dilidir. Səhnədə söz həmişə təsirli, mənalı olmalı, tamaşaçıya dramatik məzmunu düzgün anlatmağı bacarmalıdır. Səhnədə bir personajın başqa personajlarla danışmasına dialoq, insanın təkbaşına, öz-özünə danışmasına isə monoloq deyirlər. Hamletin məşhur "Olum, ya ölüm?" səhnəsi monoloqa misal ola bilər.

Teatr sənətinin insanlara estetik təsiri, onun tərbiyəvi əhəmiyyəti incəsənətin başqa növlərinə nisbətən daha böyükdür və çoxcəhətlidir. Başqa sözlə, insanların qəlbinə, ruhuna, könül dünyasına, yəni eyni vaxtda həm ağlına, həm də hisslərinə təsir etmək baxımından teatr sənəti incəsənətin digər növləri içərisində görkəmli yer tutur. Bu bir neçə səbəblə əlaqədardır. Bu, hər şeydən əvvəl, teatr tamaşasının demokratik xarakteri ilə əlaqədardır. Ona savadsız, yazı bilməyən adamlar da baxıb zövq ala bilirlər, onları düşündürən müəyyən bir mətləbə cavab tapa bilirlər.

İkinci səbəb, yuxarıda qeyd olunduğu kimi, teatrın bütün başqa incəsənət növlərinə nisbətən daha canlı olmasıdır, onun son dərəcə həyata yaxınlığıdır. Burada vaqe olan hadisəni tamaşaçı sanki həyatda baş verən hadisənin özünü qavrayan kimi qavrayır. Həm də tamaşaçı onu həmişə indi, bu anda baş verən bir hadisə kimi qavrayır ki, bu da tamaşanın estetik təsirini və tərbiyyəvi effektini qat-qat artırır.

Üçüncü səbəb teatrın mürəkkəb və sintetik sənət olmasıdır. İncəsənətin əksər növləri birləşəndə onlardan hər biri öz təsirini əlavə edir və nəticədə estetik təsir toplanır və ümumi təsir güclənir. Digər tərəfdən, teatr sənəti eyni vaxtda həm görmə, həm də eşitmə orqanları vasitəsilə qavrandığına görə, onun insan qəlbinə təsir gücü də qat-qat yüksək olur. Bu səbəblərə görə teatr sənətinin estetik təsiri və tərbiyyəvi əhəmiyyəti, yəni katarsis yaratmaq qabiliyyəti daha böyükdür, çoxcəhətlidir və deməli, insanların mənəvi həyatında onun rolu əvəzolunmazdır.

Digər sənətlərlə müqayisədə aktyor sənətinin xüsusiyyəti ondan ibarətdir ki, o, eyni vaxtda yaradıcı şəxs olmaqla yanaşı həm də yaradıcılıq üçün materialdır. Yəni əgər rəssam rənglərdən, bəstəkar səslərdən, heykəltəraş daşdan və ya ağacdan surət yaradırsa, artist isə öz-özündən surət yaradır. Aktyor hər hansı bir obrazı yaradarkən yalnız öz təbii keyfiyyətlərinə – əndamına, səsinə, əsəblərinə, hisslərinə, özünün fizioloji və psixi quruluşuna, ehtiraslarına, temperamentinə və s. əsaslanır, onun ixtiyarında başqa vasitə və imkan yoxdur. Aktyor həmişə tamaşa zalı ilə ünsiyyətdə olur. Aktyor tamaşaçıların nəfəsini, əks-sədasını hiss edir. Ona görə də aktyor oyununa, tamaşanın müvəffəqiyyətli keçməsinə tamaşaçı nəfəsi, onun əks-sədası, məhəbbəti və nifrəti həmişə öz təsirini göstərir [122].

Aktyorların səhnədəki fəaliyyətləri, aktyor əməyinin dəqiq və düzgün qiyməti Heydər Əliyevin dilində "nə qədər" kəmiyyət zərfinin yaratdığı ciddi bir üslubda diqqətə çatdırılır. "Ona görə də" səbəb bağlayıcısı ilə teatr kollektivinin işini qiymətləndirir: "Mən dəfələrlə demişəm və bu gün bir daha demək istəyirəm ki, tamaşaçı səhnəyə baxır, artist çıxış edir, rolu oynayır, o, tanınmış adamdır, onu alqışlayırlar və sairə. Amma insan səhnəyə çıxanadək ***nə qədər*** zəhmət çəkir, ***nə qədər*** həyəcan keçirir, səhnənin arxasında nələr baş verir –

bunları heç də hamı bilmir. Ancaq mən bilirəm. Ona görə də teatr işçilərinin əməyini, kino-aktyor, rejissor əməyini yüksək qiymətləndirirəm və bu gün də həmin hisslərlə sizinlə görüşə gəlmişəm" [XVc.s.253].

Azərbaycan milli teatrının inkişafı ilə bağlı Ulu Öndərin verdiyi araşdırma sanki folklor sahəsində çalışan sənətşünas araşdırmasıdır. Teatrın, ümumiyyətlə incəsənətin inkişafında dinin rolunu inkar edən Sovetlər dönəmindən fərqli olaraq "dini tamaşalar da teatr sənətinin formalaşmasında özünəməxsus rol oynamışdır" ifadəsi ilə incəsənətdə yeni bir fikrin, yeni bir ideyanın ortaya qoyulmasının şahidi oluruq: "Azərbaycan teatr sənətinin qədim və zəngin tarixi vardır. Əmək fəaliyyəti ilə bağlı oyunlar və rəqslər, mövsüm bayramları, aşıq sənəti, meydan mərasimləri, "Qaravəlli" tipli müxtəlif tamaşa növləri xalq teatrının əsasını müəyyən etmiş, milli teatrın gələcək inkişafı üçün möhkəm zəmin yaratmışdır. Xalq teatrının repertuarını təşkil edən əxlaqi və tərbiyəvi əhəmiyyətə malik əsərlərlə yanaşı, ***dini tamaşalar da teatr sənətinin formalaşmasında özünəməxsus rol oynamışdır***" [XVIIc.s.188].

Antroponimik sıralanmalardan istifadə edərək milli peşəkar aktyorları xalqa tanıdır. "Məhz" dəqiqləşdirici ədatı ilə memarlığın mədəniyyət abidələrinin bir növü kimi teatrların tikilməsi dövrünü yada salır: "***Hüseyn Ərəblinski, Cahangir Zeynalov, Hüseynqulu Sarabski, Abbas Mirzə Şərifzadə, Mirzəağa Əliyev, Sidqi Ruhulla, Ülvi Rəcəb*** və başqalarının səyləri nəticəsində Azərbaycanda milli peşəkar aktyorluq məktəbi formalaşdı. Məhz bu dövrdə Azərbaycanda xüsusi teatr binalarının inşası başlandı və peşəkar teatrla bağlı digər sənət növləri də inkişaf etdirildi" [XVIIc.s.189].

Növbəti antroponimik sıralanmada "fəlsəfi düşüncələri canlandıran səhnə əsərləri" yaradan korifey sənətkarların adı vurğulanır: "Azərbaycanda peşəkar teatr sənətinin inkişafı ***Cəlil Məmmədquluzadə, Hüseyn Cavid, Cəfər Cabbarlı*** kimi

böyük sənətkarların xalqımızın tarixi keçmişini, məruz qaldığı sarsıntıları, xeyirlə şərin qarşıdurması ilə bağlı fəlsəfi düşüncələri canlandıran səhnə əsərləri ilə böyük vüsət aldı" [XVIIc.s.189].

Başqa bir antroponimik sıralanmada isə XX əsrin sonlarına doğru ədəbiyyatımızın və səhnəmizin görkəmli şair və yazıçıları, eləcə də səhnə xadimləri xalqın yaddaşında özünə yer alır: "Teatrların repertuarları dünya ədəbiyyatının gözəl nümunələri ilə yanaşı, ***Səməd Vurğun, Süleyman Rüstəm, Sabit Rəhman, Mirzə İbrahimov, Ilyas Əfəndiyev və*** başqalarının əsərləri ilə daha da zənginləşdi. Həmin dövrdə tamaşaçıların sonsuz məhəbbət və rəğbətini qazanmış ***Mərziyə Davudova, Rza Təhmasib, İsmayıl Hidayətzadə, Kazım Ziya, Rza Əfqanlı, Mustafa Mərdanov, Fatma Qədri, İsmayıl Dağıstanlı, Ağadadaş Qurbanov, Adil Isgəndərov, Ələsgər Ələkbərov, Ağasadıq Gəraybəyli, Möhsün Sənani, Ismayıl Osmanlı, Hökumə Qurbanova, Münəvvər Kələntərli, Lütfəli Abdullayev, Bəşir Səfəroğlu, Əliağa Ağayev, Əli Zeynalov, Sergey Yakuşev, Rahil Ginzburq, Mehdi Məmmədov, Həsənağa Salayev, Şəmsi Bədəlbəyli, Tofiq Kazımov, Barat Şəkinskaya, Leyla Bədirbəyli, Nəsibə Zeynalova*** və başqa aktyor və rejissorların adları Azərbaycan teatr sənəti tarixinə həmişəlik həkk olunmuşdur" [XVIIc.s.190].

Azərbaycan Dövlət Musiqili Komediya teatrinin yeni binasinin açilişi mərasimindəki nitqində ölkənin çətin dövründə teatrla bağlı fikirlərini söyləyir. "Heç vaxt dayandıra bilmərik" ifadəsi ilə prinsipial mövqe nümayiş etdirən Heydər Əliyev Azərbaycan mədəniyyətinə olan xüsusi sevgisini və dövlət qayğısını bəyan edir. Opponentlərinin deyə biləcəyi fikirləri ritorik suallarla çıxışının əvvəlində səsləndirir, "ancaq" və "yox" ədatlarının vasitəsilə mənəviyyatımızın yüksəlişinə səbəb olan teatrın, ümumiyyətlə incəsənətin rolunu açıqlayır: "Bundan, eləcə də bu gün bu teatrın inşasının

başa çatmasından, açılmasından gözəl ***nə ola bilər***? Bəlkə kimsə deyə bilər ki, biz ağır vəziyyətdəyik, ***nə üçün*** teatr binasının tikintisinə bu qədər xərc qoyulubdur və belə gözəl bina yaradılıbdır? ***Ancaq yox,*** biz Azərbaycan xalqının mədəniyyətinin inkişafını heç vaxt dayandıra bilmərik. Bizim xalqımız ***öz*** mədəniyyəti, elmi ilə yüksəlibdir. Biz mədəniyyətə ***nə qədər*** diqqət yetirsək, qayğı göstərsək, mədəniyyət xadimlərinin yaradıcılığı üçün imkanlar yaratsaq, xalqımızı da ***o qədər*** yüksəldəcəyik, xalqımızın ***mənəviyyatını*** daha da yüksəklərə ***qaldıracağıq”*** [XVIIIc.s.21]. Elə həmin çıxışın sonluğundakı xitablar bir daha böyük natiqin ümumilikdə “mədəniyyətə”, “teatra”, xüsusən də “Azərbaycan mədəniyyətininə” olan münasibətini əks etdirir:Yaşasın mədəniyyət! Eşq olsun Azərbaycan teatrına! Yaşasın Azərbaycan mədəniyyəti! [XVIIIc.s.22]

Teatr sənətinin ideya-mövzusunu dramaturgiya təşkil edir ki, incəsənətin bir sıra başqa növlərindən-ədəbiyyatdan, rəssamlıqdan, heykəltəraşlıqdan və s. teatr onunla fərqlənir ki, burada yaradıcı kollektiv başqa əsərdə, məhz dramaturgiyada öz əksini tapmış fikir və ideyaları həyata keçirir. Dramaturgiya ədəbiyyatın ən çətin və mürəkkəb bir janrıdır. Povest və romandan fərqli olaraq, dram əsərində müəllif məhdud bir dairə çərçivəsində hərəkət edir, onun bilavasitə danışmağa ixtiyarı yoxdur, onun yaratdığı obrazlar danışırlar. Ona görə də dram əsərində müəllif qəhrəmanların qəlbində nələr baş verdiyini, onlarda hansı hisslərin bir-biri ilə mübarizə apardığını və nə kimi fikirlər yarandığını oxucuya söyləyə bilmir [122]. Sənətşünasların bu fikirləri öz bariz nümunəsini Heydər Əliyevin nitqində tapır. 4 dekabr 1998-ci ildə Azərbaycan Dövlət Musiqili Komediya Teatrında Üzeyir Hacıbəyovun “O olmasın, bu olsun” musiqili komediyasının yeni quruluşda ilk tamaşasına baxdıqdan sonra yaradıcı kollektivin üzvləri ilə görüşdə incəsənətin müxtəlif növlərində çalışanları sadalayır.

Təkcə bu sadalanmada teatrın kollektiv incəsənət növü olduğunu bir daha gündəmə gətirir. "Hamınızı təbrik edirəm" bütöv fəlsəfi fikrinin ardınca "hissələr"-quruluşçu rejissor, rəssam, musiqiçilər, səhnənin aparıcıları olan aktyorlar-tanıdılır, baş rollardakılar isə xüsusi qeyd olunur: "Siz bu əsərə yenidən səhnə həyatı verdiniz və bu gün çox gözəl də tamaşa göstərdiniz. Ona görə də mən sizin hamınızı təbrik edirəm. Quruluşçu rejissor Cənnət xanımı təbrik edirəm ki, belə gözəl quruluş yaradıbdır. Rəssam İsmayıl Məmmədovu təbrik edirəm, çünki tamaşada çox gözəl dekorasiyalar, tərtibatlar vardır. Musiqi çox gözəl müşayiət olunduğuna görə dirijoru təbrik edirəm və səhnədə oynayanların hamısını təbrik edirəm. Hamınızın adınızı demək mənim üçün çətin olacaqdır, amma gərək Hacıbabanın, Afaq xanımın adlarını çəkəm. Bağışlasınlar, başqalarının adlarını bilmirəm. Hamınız rolları çox gözəl ifa edirdiniz [XVIIIc.s.326].

"Bilirsiniz" özünəməxsusluq qazanmış modal söz böyük natiqin fəlsəfi fikirlərini açıqlayanda daha çox işlənir ki, burada da "hər qaranlıq gecənin sonunda işıqlı bir sabah var" deyiminə uyğun "bəzən elə olur ki, bədbəxt bir hadisə sonra böyük bir xoşbəxtliyə gətirib çıxarır" ifadəsi öz yerini alır. Keçmişimizə hörmətə çağırış, qədirbilənlik hissi auditoriyaya aşılanır, Azərbaycan teatrının inkişafında xüsusi rolu olan insanın-Hacı Zeynalabdin Tağıyevin adı xüsusilə vurğulanır. "Şübhəsiz ki" modal sözü ilə texniki estetikanın təcəssümü nitqdə əks olunur: "Bilirsiniz, bəzən elə olur ki, ***bədbəxt bir hadisə sonra böyük bir xoşbəxtliyə gətirib çıxarır.*** Əgər bu teatr dağılmasaydı, ola bilər, yeni bina da tikilməyəcəkdi. Vaxtilə ***Hacı Zeynalabdin Tağıyev*** tərəfindən tikilmiş bu teatr öz həyatını sürdü, öz dövrünü yaşadı və dağıldı. Ancaq biz də bunun yerində həyatımızın bu çətin dövründə bina tikdik. Düzdür, bu bina əvvəlki binanın arxitekturası üzərində

***tikilibdir***. Amma şübhəsiz ki, bu, ondan da çox yaxşıdır, müasirdir. ***Bu, çox gözəldir***” [XVIIIc.s.325].

Tamaşanın başlanğıcından əsər haqqında düşünən Heydər Əliyev “şübhəsiz ki” modal sözlə əsərin yaradıcısı haqqında da düşüncələrini auditoriya ilə bölüşür. Elə buradaca komediya janrına yeni bir baxış irəli sürür, sadə xalq dilində - “insanlar gəlir, baxır, gülür, əylənir və hesab edirlər ki, elə bunun mənası budur” –komediya əsərlərinin əsas məzmununu xalqa çatdırır. Böyük natiqin fəlsəfi fikirlərini auditoriya ilə bölüşmək məqamlarında tez-tez istifadə etdiyi “bilirsiniz” modalı ilə Üzeyir Hacıbəyovun əsərlərini sənətşünas alim kimi araşdırır. Sonrakı nitq mərhələsində opera sənətinin sirlərini aydınlaşdırır, yekunda isə “heyran oluram”la estetik zövq aldığını dilə gətirən bir tamaşaçı mövqeyindən çıxış edir: “Ancaq mən burada tamaşanın əvvəlindən indiyə qədər bu əsər haqqında düşünürəm. ***Şübhəsiz ki,*** birinci növbədə bizim dahi bəstəkarımız, dahi insanımız Üzeyir Hacıbəyov haqqında da düşünürəm. Bəzən bu “Məşədi İbad”ı xalq arasında gülməli bir tamaşa kimi qəbul edirlər. ***İnsanlar gəlir, baxır, gülür, əylənir*** və hesab edirlər ki, elə bunun mənası budur. Ancaq bunun çox dərin bir mənası vardır. ***Bilirsiniz***, bu əsər dahi bir əsərdir. Üzeyir Hacıbəyovun əsərlərinin hamısı dahi əsərlərdir.

Məsələn, biz adətən öyrənmişik və deyirik ki, “Koroğlu” *operası* Üzeyir Hacıbəyovun şah əsəridir. Bunu bizim musiqişünaslar deyir, hamımız deyirik. Doğrudan da “Koroğlu” *operası* əzəmətli bir əsərdir və bizim opera sənətində ən yüksək zirvədə duran bir əsərdir. Ancaq gəlin baxaq görək, Üzeyir Hacıbəyovun hansı əsəri şah əsər deyildir? Bunu bir-birindən seçmək mümkün deyildir. Çünki hərəsinin özünəməxsus yeri, məzmunu və mənası vardır. Mən indi bütün personajlara diqqətlə fikir verirdim. Bunları Üzeyir Hacıbəyov sadəcə olaraq insanları güldürmək üçün yox, o vaxtkı

cəmiyyəti göstərmək üçün yazıbdır və cəmiyyəti o qədər ***gözəl, ağıllı, real*** göstəribdir ki, buna ***heyran olursan****”* [XVIIIc.s.327-328].

Feilin əmr şəklində – “təsəvvür edin”lə Heydər Əliyev auditoriyanın diqqətini əsərin məzmununu dərk etməyə çağırır. Personajların “mənfi cəhətini, xüsusiyyətini, cəmiyyətdə yerini” bir-bir sayaraq “ümumiyyətlə” yekunlaşdırıcı modalla dialektik qanunların bizim iradəmizdən asılı olmayaraq mövcudluğunu və dönməzliyini, yəni “cəmiyyətin rəngarəngliyini” qəbul etməyimizi anladır: “Üzeyir Hacıbəyov o vaxt bir-bir personajın cəmiyyətdəki yerini olduğu kimi göstəribdir. Məşədi İbadın obrazında o dövrün insanlarının bir qismini göstəribdir, Rüstəm bəyin obrazında bir başqasını göstəribdir. ***Təsəvvür edin***, dərindən fikirləşəndə görürsən ki, əsərdəki inteligent Həsən, qəzetçi Rza, qoçu Əsgər obrazlarının hər biri böyük məna daşıyır. O vaxt Üzeyir Hacıbəyov əsəri yazarkən bu insanlar Azərbaycanda var idi. Onların mənfi cəhətini, xüsusiyyətini, cəmiyyətdə yerini və ***ümumiyyətlə***, cəmiyyətin ***rəngarəngliyini*** Üzeyir Hacıbəyov bu obrazları yaradaraq göstəribdir” [XVIIIc.s.328-329].

Çıxışlarında incəsənətin milliliyindən danışan ümummilli lider xalqımızın qədim adət-ənənələrini yada salmaqla keçmişimizdən qopmamağa çağırır. “Mən bu gün bunu bir daha dərk etdim” ifadəsi teatrın canlı sənət növü olmasını, bu sənətdə hər dəfə yeni çalarların ortaya çıxmasını sübut edir: “Məsələn, tamaşada hamam səhnəsini götürün. Doğrudan da bu, çox qəribə bir səhnədir. Yəqin ki, indi bizim gənclər bilmirlər, – keçmişdə adət belə olub ki, oğlan və qız evlənəndə mütləq oğlanı da, qızı da hamama aparırdılar və bu, böyük təntənə ilə olurdu. Bu, təbii bir şeydir. Üzeyir Hacıbəyov bunu ***adət-ənənədən*** götürübdür, amma eyni zamanda hamam səhnəsini və hamamın o vaxt həyatda rolunu necə gözəl

göstəribdir. Yəni mən bunu indi təhlil etmək istəmirəm. ***Mən bu gün bunu bir daha dərk etdim***" [XVIIIc.s.329].

Teatrla bağlı Heydər Əliyev şəxsiyyətini bir neçə vəziyyətdə qiymətləndirmək mümkündür. Belə ki, biz onu gah baxdığı tamaşalara ürəkdən sevinən, heyran qalan, bir sözlə estetik zövq alan tamaşaçı kimi, gah incəsənət əsərlərini teatr əməkdaşlarına izah edən sənətşünas kimi, gah da əsərin dəyərini tamaşaçılara aydınladan teatrşünas kimi görürük. Nitqində xalq frazeologizmlərindən mümkün qədər yararlanmağa çalışan Ulu Öndər "başdan ayağa gördüm" deməklə bütöv ifadəsinin sinonimini işlədir. "Bir var ki", "bir də var ki" ifadələri ilə canlı seyretmənin rolunu bir teatrşünas kimi tamaşaçılara açıqlayır. Komediya əsərləri Heydər Əliyevin dilində zamanın reallığı və faciəsidir. "Doğrudan da" modal sözü ilə o dövrün acı həqiqətlərini dilə gətirir, auditoriyanı düşünməyə vadar edir və burada Heydər Əliyev natiqliyinin bir xüsusiyyəti də, bir gücü də odur ki, hər bir konkret həyat hadisəsini siyasətə gətirə, yerindəcə uyğunluq tapa bilə, ictimai-siyasi vəziyyəti komediya dili ilə – "indi də bəzi jurnalistlər gəlib deyirlər ki, pul ver, gedim məqalə yazım" – aydınlaşdırır: "Mən əvvəllər də bu əsər haqqında belə düşünmüşəm. Amma bu gün bir daha bunu ***başdan-ayağa gördüm***. Bir var ki, buna televiziyada, kinoda baxırsan, bir də var ki, səhnədə canlı insanlara baxırsan və şübhəsiz ki, onların ifaçılıq sənətini qiymətləndirərək, eyni zamanda hər obrazın əhəmiyyətini görərək mən şəxsən belə qənaətə gəlirəm ki, bu əsər dahi bir əsərdir. Bu, heç də gülmək üçün yazılmayıbdır, bəlkə də bəzilərinin ***ağlaması*** üçün yazılıbdır. Bu, zamanın reallığıdır, faciəsidir. Bu, əsərdəki hər bir epizodda görünür. Demək, kasıb Rüstəm bəydən pulnan qız almaq olarmış. Bu, ***doğrudan da*** o dövrün həqiqətidir. Yaxud, indi də bəzi jurnalistlər gəlib deyirlər ki, ***"pul ver, gedim məqalə yazım".*** Bəzən hesab edirlər ki, bu, demokratiyanın, mətbuat

azadlığının nəticəsidir. Demək, bu, yüz il bundan öncə də olubdur [XVIIIc.s.329-330].

"Bəli" təsdiq ədatı ilə Üzeyir Hacıbəyovun Azərbaycanda və dünyada tanınmış bəstəkar kimi yerini tanıdır. "Amma" ziddiyyət bağlayıcısı, "nə qədər" qüvvətləndirici ədatı ilə Üzeyir Hacıbəyovun dəyərini xalqa çatdırır. Əsərin bu gün də yaşaması, uzunömürlülüyü Ulu Öndər demiş onun "süjetinin həyatdan götürülməsi" ilə bağlıdır. Terminologiyaya (obrazlar, fikirlər, sözlərdir) söykənən Heydər Əliyev elmi üslubu burada da özünü göstərir: ***"Bəli***, yenə də deyirəm, Üzeyir Hacıbəyovu böyük bir musiqiçi kimi hamı, bütün dünya tanıyır və biz də Üzeyir Hacıbəyovun adı çəkiləndə onu bir bəstəkar, musiqiçi kimi tanıyırıq. ***Amma*** o, ***nə qədər*** böyük filosofdur, alimdir, Azərbaycanın həyatını o vaxtlar təhlil edərək ***nə qədər*** belə dahi əsərlər yarada bilibdir. Yenə də deyirəm, o, "Məşədi İbad" pyesinin musiqisini yazmazdan əvvəl əsərin özünü yazıbdır. Onun süjeti, məzmunu həyatdan götürülmüşdür. Ancaq bunlar Üzeyir Hacıbəyov fəlsəfəsindən, onun fikir və mülahizələrindən keçərək yaranmış ***obrazlar, fikirlər, sözlərdir***" [XVIIIc.s.331].

"Xalqı isə həmişə mənəviyyat birləşdirmişdir. Çünki başqa əsaslara nisbətən mənəvi əsaslar daha güclüdür. Bunlar xalqa daim sənət və xüsusən incəsənət vasitəsilə aşılanmışdır. Ədəbiyyatın insanlara böyük təsiri vardır. Ancaq bir var ki, insan hər hansı bir əsəri özü oxusun, bir də var ki, onu canlı olaraq səhnədə görsün. Ona görə də teatrın həyatımızda rolu böyükdür. Mən həmişə teatrı sevmişəm, ondan çox faydalanmışam" (nitq özü sənət, nitq incəsənətin növü).

Həyatımın ağır dövrlərində də mən həmişə teatrımıza hörmət və ehtiramımı saxlamışam, heç vaxt ondan ayrılmamışam [IVc.s.82].

Teatr sənəti incəsənətin digər növlərindən fərqlənən bir sıra xüsusiyyətlərə və üstülüklərə malikdir. Teatrın ən birinci və başlıca xüsusiyyəti onun incəsənətin canlı növü olmasından ibarətdir. Burada yaradıcı sənətkarın özü ilə yanaşı, onun yaratdığı əsər də, yəni tamaşa da, rol da canlıdır. Tamaşaçı pyesdə təcəssüm olunan əhvalatı elə həyatın özünü seyr edən kimi seyr edir. Gerçəklik teatrda həyatın özünə oxşar hadisələrdə, canlı insan xarakterlərində və onların münasibətlərində əks olunur. Burada aktyorların təbii, inandırıcı oyunu, canlı məxluq olaraq səhnədə yaşaması teatrın canlılığı üçün ən mühüm şərtdır. Odur ki, gerçəkliyə bənzəyiş "həyat forması" teatr sənətində incəsənətin başqa növlərinin hamısından daha güclü və dəqiqdir [38].

Qeyd olunduğu kimi, teatr məkanlı-zamanlı sənətdir, həm də buradakı zaman həmişə müasir zamandır. Çünki tamaşaçı baş verən hadisələri, hansı əsrə mənsub olmasından asılı olmayaraq, indi göz qabağında görür, bütün təsadüflərdə onları bir müasir kimi qəbul edir. Yəni tamaşaçı üçün hadisələr həmişə burada və indi vaqe olur, hazırda baş verir. Zalda oturub tamaşaya baxan tamaşaçı özünü səhnədəki hadisələrin ya iştirakçısı, ya da canlı şahidi hesab edir. Elə məhz buna görə A.Gertsen yazır ki, "səhnə tamaşaçı üçün həmişə müasirdir". Yaradıcı sənətkarla sənətin istehlakçıları arasındakı bilavasitəlik, gerçək həyatın özü ilə onun inikası arasında, keçmiş zamanla indiki zaman arasında olan yaxınlıq və doğmalıq nə dərəcədə, əlbəttə, incəsənətin başqa heç bir növündə, hətta kinoda belə yoxdur [38].

Teatrın əsaslı fərqi odur ki, aktyorları canlı şəkildə eşitmək və canlı şəkildə görmək digər incəsənət növlərində mümkün olmur. Heydər Əliyevin nitqində "bir var ki, eşidəsən, bir də var ki, özün eşidəsən və görəsən" ifadəsi buna bariz misaldır. Teatra olan böyük sevgisini dilə gətirən Heydər Əliyev

yazıçı Elçinin yazdığı pyesin tamaşasına gələ bilmədiyinə "təəssüflər olsun ki" modal sözü ilə münasibət bildirir. "Çox da məmnunam" deməklə aldığı estetik zövqü auditoriya ilə bölüşür: "Mənə Elçin məlumat verdi ki, bu tamaşa çoxdandır ki, bizim Milli Dram Teatrının səhnəsində uğurla gedir. ***Ancaq təəssüflər olsun ki***, mən vaxt tapıb indiyə qədər gələ bilməmişdim. Bu gün mən bu imkanı əldə etdim və gəlməyimdən, tamaşanı görməyimdən ***çox da məmnunam***. Çünki eşitmişdim, amma ***bir var ki, eşidəsən, bir də var ki, özün eşidəsən və görəsən***" [XXVIIIc.s.310].

Məsələn, son dəfə mən "Aydın" tamaşasına baxdım. Bu, Cəfər Cabbarlının bizim əsrin əvvəlindəki o həyatdan götürdüyü mövzudur və öz fəlsəfəsinə görə, öz fikirlərinə görə bu gün də çox aktualdır.

Elçin bizim çox istedadlı yazıçımızdır, gənc vaxtlarından çox dəyərli əsərlər yazıbdır. Amma son illər o, eyni zamanda teatr üçün də əsərlər yazıbdır. Deyəsən, keçmişdə bu olmamışdı. Çünki bu məsələ ilə əsasən sənin atan məşğul olurdu.

"Beləliklə də" yekunlaşdırıcı modal sözlə "teatrımızın yaşamasını" dialektikanın inkar qanunu ilə, fəlsəfi bir dillə rəvancasına, məişət üslubunda teatrşünaslar qarşısında bəyan edir. Öncə böyük Azərbaycan yazıçısı İlyas Əfəndiyevin, sonra onun oğlu, ictimai-siyasi xadim Elçindən söz açmaqla irsi-genetik qanunların incəsənət sahəsində, teatr sahəsində belə həmişə özünü doğrultmasını auditoriyaya ünvanlayır: "Atan rəhmətlik İlyas Əfəndiyev bu işlərlə çox uğurla məşğul olurdu və çox da gözəl əsərlər yaratmışdı. Elçin isə daha çox nəsr əsərləri yazırdı və dəyərli əsərlər yaratmışdır. Ona görə də gənc vaxtlarından – 60–70-ci illərdə gənc yazıçılar, gənc şairlər sırasında idi. Hətta xatirimdədir ki, ilk dəfə Yazıçılar İttifaqının ən gənc katibi Elçin Əfəndiyev oldu, o seçildi.

Amma son zamanlar görürəm ki, o eyni zamanda pyeslər də yazır və onlar bizim Milli Dram Teatrının səhnəsində tamaşaya qoyulur, uğurla göstərilir. ***Beləliklə də***, bizim ***teatr həyatı yaşayır*** [XXVIIIc.s.311-312]. “Mənəviyyatımızın inkişafı incəsənətimizin müxtəlif növlərindən, o cümlədən teatrdan keçir” müddəasına uyğun Ulu Öndər “nə” inkar bağlayıcısını beş dəfə təkrar etməklə ecazkar bir nitq nümunəsi yaradır: “Siz bilirsiniz ki, mən əvvəllər – 70-ci illərdə də Azərbaycanın rəhbərliyində olanda həmişə fəaliyyətimin əsas hissəsi bundan ibarət olmuşdur ki, xalqımızda yüksək mənəviyyat bərqərar olsun. Çünki insan üçün mənəviyyatdan yüksək heç bir şey ola bilməz: ***nə*** mal, ***nə*** dövlət, ***nə*** pul, ***nə*** villa, ***nə*** milyon – heç bir şey olmaz. Bunlar hamısı dünyada gəldi-gedər şeylərdir. İnsanı yüksəldən, insanı insan edən, adamı adam edən və insanı vətəndaş edən onun ***mənəviyyatıdır***. Ona görə də mən pyesdə bunları gördüm” [XXVIIIc.s.314-315].

Heydər Əliyev teatrın keçdiyi tarixi inkişaf yolunu elmi-publisistik bir dildə auditoriyaya ünvanlayır. “Məsələn” bağlayıcısı ilə fikrini gücləndirən böyük natiq Qərb teatrının Azərbaycan teatrının inkişafındakı danılmaz rolunu açıqlayır, “amma” qarşılaşma bağlayıcısı ilə Rusiya teatrının da rolunu qiymətləndirir. Rusiya teatr ədəbiyyatının xidmətini “çünki” səbəb bağlayıcısı ilə təmkinlə, məntiqə söykənən bir təmkinlə izah edir. “Yəni” aydınlaşdırma bağlayıcısı, “da” qüvvətləndirici ədatla ədəbiyyatları qiymətləndirir, “ancaq” qarşılaşma, “həm”, “həm də” iştirak bağlayıcıları ilə Cəlil Məmmədquluzadə sənətinin bənzərsizliyini dilə gətirir: “Bizim Azərbaycanda teatr sənəti ***Qərb*** teatrının təsiri altında yaranıbdır. ***Qərb*** teatrının təsirini biz ***Rusiya*** teatrının təsirindən götürmüşük. ***Məsələn***, biz Şekspirdən də götürmüşük, Şillerdən də götürmüşük. ***Amma*** biz eyni zamanda Rusiyanın teatrından çox şey götürmüşük. Mən bütün bunları – Qərb

ədəbiyyatını da, Rusiya ədəbiyyatını da, Azərbaycan ədəbiyyatını da həmişə layiqli qiymətləndirmişəm. ***Yəni*** mən bu teatr ədəbiyyatını deyirəm, teatr sənətini deyirəm. Hərəsinin öz yeri var. Bir-birinin təsiri altında olduğuna görə bir-birinə bənzərliyi də var. Ancaq Cəlil Məmmədquluzadənin “Ölülər” əsəri ***həm*** mövzuya görə, ***həm də*** onun fəlsəfəsinə görə heç bir əsərə bənzər əsər deyildir” [XXVIIIc.s.314-315].

Heydər Əliyevin tamaşaya qoyulan əsərlər, onların müəllifləri, tamaşanın kollektivi barəsindəki fikirləri bu gün də sənətşünaslıq baxımından öz aktuallığını saxlayır. Elə bu fikirlər əsas (feilin şərt şəkli) və köməkçi nitq hissələrinin (bağlayıcı) yaratdıqları ekspressivliklə bəzənmiş olur. “Əgər” şərt, “çünki, ona görə də” səbəb, “amma, ancaq” qarşılaşma bağlayıcıları kiçik bir mətndə böyük, yaddaqalan nitq nümunəsi yaradır: “***Ancaq*** təbiidir ki, əsər kağız üzərində yazılır. ***Əgər*** yazan özü bunu səhnəyə qoya bilsəydi, bu başqa cür ola bilərdi. ***Amma*** heç bir yazan adam bunu səhnə ustaları, sənətkarlar, ***yəni*** rejissorlar, aktyorlar, tamaşanı yaradan başqaları kimi edə bilməz. Burada müəllifin xidməti böyükdür, ***amma*** sizin xidmətiniz ondan az deyil. ***Çünki*** müəllifin fikirlərini siz səhnədə onun istədiyi kimi, bəlkə heç onun düşünmədiyi kimi, ondan da artıq ifa etmisiniz. ***Ona görə də*** gözəl bir əsər meydana çıxıbdır” [XXVIIIc.s.317].

Yarımfəslin sonuna doğru biz bir daha Ulu Öndərin Azərbaycan teatrının problemlərinə dərindən bələdliyini görür, milli teatrın keçdiyi keşməkeşli yolda Heydər Əliyevin üzləşdiyi, lakin mədəniyyətimizin inkişafı yolunda geridönməz xarakterli mübarizələrlə dolu yaşadığı bir ömrün səhifələrinə qayıdırıq: “Biz Azərbaycan teatrı ilə fəxr edirik. Mən bunu dəfələrlə demişəm. Siz bilirsiniz ki, Azərbaycan teatrının 100 illik yubileyində mən Respublika sarayında məruzə ilə ***çıxış*** etmişəm. Sonra mənə dedilər ki, ***“Sən respublikanın***

***rəhbərisən, teatrşünas deyilsən, nə üçün məruzə edirsən?"*** – dedim ki, məruzə etdim və hər halda, teatrşünaslardan pis etmədim. Bu, qəzetlərdə qalıbdır, arxivlərdən tapmaq olar. Mən bunu niyə deyirəm? Çünki bizim teatr ***həqiqətən*** klassik teatrdır. Əgər klassik teatr olmasaydı, bu qədər yaşaya bilməzdi. Teatrı belə yaşatmaq lazımdır" [XLIIIc.s.87].

"Məruzə etdim və hər halda, teatrşünaslardan pis etmədim" ifadəsinin müəllifi Heydər Əliyev sinonim cərgə ilə (istedad, məharət, bilik) aktyorun nə etməli olduğunu dilə gətirir. Aktyor sənətinin incəliyini, çətinliyini frazeoloji birləşmələrin (dərk edə bilmək, əsərin fəlsəfəsini duya bilmək) köməyi ilə sənətşünaslar üçün açıqlayır: "Hər bir rolu ifa etməyin çətinliyi var. Amma belə rolu ifa etmək, təbiidir ki, aktyordan böyük ***istedad, məharət, bilik*** tələb edir. Çünki ifa etdiyin surətin daxili aləmini ***dərk edə bilməsən, əsərin fəlsəfəsini duya bilməsən***, ***əlbəttə ki***, bu rolu oynamaq mümkün deyildir. Bunların hamısını biz bu gün gördük" [XLIIIc.s.88].

Heydər Əliyevin ümumiyyətlə, teatr barəsində, xüsusən də, Azərbaycan teatrı ilə bağlı fikir və mülahizələrini aşağıdakı kimi yekunlaşdırmaq olar:

− Xalqı isə həmişə mənəviyyat birləşdirmişdir. Çünki başqa əsaslara nisbətən mənəvi əsaslar daha güclüdür. Bunlar xalqa daim sənət və xüsusən incəsənət vasitəsilə aşılanmışdır kimi fikirləri auditoriyalara ünvanlayır;

− Çıxışlarında incəsənətin milliliyindən danışan ümummilli lider xalqımızın qədim adət-ənənələrini yada salmaqla keçmişimizdən qopmamağa çağırır;

− Xalqın yaddaşında teatr xadimlərinin adlarının möhkəmlənməsində yeri gəldikcə antroponimik siralanmalardan istifadə edir;

− Teatrla bağlı çıxışlar bütün üslubların çulğalaşdığı özünəməxsus Heydər Əliyev üslubunda həyata keçirilir, belə ki,

əsərlərin ideya-məzmununu açmağa yönələn məqamlar üçün terminologiyadan geniş istifadə olunmuş elmi üslub, teatrın işçi heyəti ilə olan görüşlərdə səmimiyyətə söykənən məişət üslubu, əsərlərdən alınan estetik zövqün açıqlanma anlarında bədii üslub, teatra dövlət qayğısı tələb olunan, məmurları səfərbər edən hallarda rəsmi üslubdan istifadə olunur;

– İncəsənətin canlı növü olan teatr estetik dəyərləri auditoriyaya daha asan bir dildə çatdırır ki, elə bu estetikliyin çatdırılması Heydər Əliyev dilində asan, rəvan, anlaşıqlı və zəngin bir şəkildə həyata keçirilir.

## 2.2.6. Heydər Əliyevin nitqində kino

İncəsənətlə bağlı nitqlər elə incəsənt xadimləri ilə, incəsənət sahəsinin işçiləri ilə görüşlərdə öz əksini tapır. Bu görüşlər böyük natiqin müxtəlif üslublu çıxışları ilə müşayiət olunur.

Təkcə 16 dekabr 1995-ci ildə Prezident Sarayında Azərbaycan Kinomatoqrafçılar İttifaqının yeni seçilmiş idarə heyətinin üzvləri ilə Heydər Əliyevin görüşü kino sənəti, kinonun kütlələrə təsiri, estetik dünyagörüşün formalaşmasında kinonun tutduğu mövqe, kino sənətinin inkişafına dövlət qayğısı və s. məsələləri aydınlaşdırmaq baxımından mühümdür.

Kinomuzla bağlı bu görüşdə Heydər Əliyev nitqlərinin müxtəlif çalarları dinləyicinin gözləri qarşısında canlanır. Yüksək estetik zövqə malik kino işçiləri qarşısındakı nitq səmimiyyətlə, xəlqiliklə, poetizimlə dolu bir girişlə başlayır: “Amma bunlara baxmayaraq, mən çox məmnunam ki, biz görüşmüşük və əgər hansı məsələləri isə həll edə bilməsək də, görüşüb bir-birimizi anlamağımızın, bizim bir adi sözümüz var – dərdləşməyin özü də insana təskinlik verir, təsəlli verir. Bir var ki, dərdin ola və onu heç kəsə deyə bilməyəsən – o, sənin içini yandıracaqdır. Amma dərdini kiməsə deyəndə yüngülləşirsən ki, dərdini dedin, buna çarə qılınsa da, qılınmasa da dərdini demisən. Ona görə də hesab edirəm ki, görüşməyimiz çox yaxşıdır və mən sizin problemlərinizi daha da yaxından başa düşürəm” [Vc.s.183].

Rəsmi-publisitik üslubla böyük natiq kinonu “milli, mədəni sərvətimiz” adlandırır, incəsənətin bir növü kimi kinoya göstəriləcək qayğını “şübhəsiz ki” modal sözlə auditoriyanın diqqətinə çatdırır. Gümanları həmişə reallığa çevrilən dövlət rəhbərinin gümanı bu gün reallığa çevrilmişdir: “Birincisi, onu demək istəyirəm ki, bizim kinonun tarixi və əldə etdiyi nailiyyətlər milli sərvətimizdir, mədəni sərvətimizdir və bunu

qorumalıyıq. Bilirəm ki, gələn il Azərbaycan kinosunun 80 illik yubileyini keçirmək üçün lazımi tədbirlər görəcəyik, yubileyi hazırlayıb keçirmək, təşkilati iş görmək üçün fərman da hazırlanıbdır, mən onu imzalayacağam. ***Güman edirəm ki***, bi tədbirlər ətrafında biz ictimaiyyətdə, respublikamızın vətəndaşlarında kinoya olan marağı, diqqəti daha da artıra biləcəyik və ***şübhəsiz ki***, kinoya qayğını da artıra biləcəyik" [Vc.s.184].

Beləliklə, iki qohum incəsənət-teatr və kino bir-birini əvəz etmir və bir-birini sıradan çıxartmır. Bütün incəsənət növləri kimi, bunlar da həyatın müxtəlif tərəflərini, cəhətlərini müxtəlif tərzdə əks etdirirlər. Bunlar bir-birinə kömək edir, bir-birini ifadə vasitələri ilə zənginləşdirir (məsələn, teatrda keçmişə qayıtmaq, zamandan zamana keçmək kinonun sayəsində mümkün olmuşdur).

Teatra gəlincə, dəfələrlə qeyd olunduğu kimi, teatr kinonun ən yaxın qohumudur. Hətta kinonu "ekranlaşdırılmış teatr" da adlandırırlar. Teatr kinoya tamaşa incəsənəti yaratmaq vasitələri, aktyor ifaçılıq sənətinin təcrübəsini vermişdir. Kino bütün musiqi, səs sərvətindən də istifadə edir. Kino sənətində musiqinin rolu o qədər artmışdır ki, hətta bəzi nəzəriyyəçilər kinoda musiqinin təsvir üzərində üstünlük təşkil etməsindən ehtiyat edirlər. Bütün bu amillərin kino sənətində bir araya toplanması kinonun estetik təsir gücünü qat-qat artırır. Kino sənətinin üç əsas növü mövcuddur: xronikal-sənədli, elmi-kütləvi və bədii kino. Çox vaxt xronikal sənədli və elmi kütləvi kinonu qısametrajlı kino da adlandırırlar [38].

Xronikal-sənədli kinoda adətən həyatın daha vacib hadisələri təsvir olunur. Belə filmlərdə aktyorlar oynamır. Burada həyatın özü elə olduğu kimi lentə çəkilir. Sənədli kinonun dəyəri təkcə həyat hadisələrini birbaşa və olduğu kimi təsvir etməsindən ibarət deyildir. Sənədli kino həm də həyatda baş vermiş konkret faktları və hadisələri tutuşdurmaq

və təhlil etmək üçün böyük imkanlara malikdir. Ona görə də sənədli kinonu əsrin xronikası, xalqların ekran yaddaşı, real problemlər incəsənəti adlandırırlar.

Elmin, texnikanın və incəsənətin nailiyyətləri təbliğ edən kino sahəsi ilə elmi-kütləvi kino məşğul olur. Bu kinonun vəzifəsi obrazlı kütləvi mühazirələr formasında elm və texnikanın müxtəlif məsələlərinə dair biliklər yaymaqdır.

Kinonun estetik təsir gücü çox yüksəkdir. Heç bir başqa incəsənət tamaşaçı hisslərinə belə güclü təsir göstərə bilmir. Tamaşaçıda belə yüksək sevinc hisslərini, xoş duyğuları-həzzi doğuran nədir? Kino sənəti hər şeydən əvvəl bütün başqa incəsənətlərin hamısından daha yüksək dərəcədə həyatı əks etdirə, canlandıra bilir. Çünki onun zahiri əlamətlərini, cizgilərini daha doğru, elə olduğu kimi əks etdirməyi bacarır. Özünün spesifik təbiətindən doğan səbəblərə görə (xüsusilə, iri planın sayəsində) kino gerçək həyatı tam obyektivliyi ilə təcəssüm etdirə və canlandıra bilir. Başqa sözlə, kino bütün başqa incəsənətlərin hamısından daha yaxşı həyatı "göstərməyi" bacarır. Daha doğrusu, kino bütün başqa incəsənətlərdən daha yaxşı reallıq, həqiqilik duyğusunu verməyə, dünyanın qavranılmasında daha yüksək doğruluq təəssüratı yaratmağa qadirdir. Kütləvilik, başa düşülən olması, tam həqiqətə uyğunluq duyğusu kinonun cazibə qüvvəsini, estetik təsir gücünü qat-qat artırır [122].

İncəsənət haqqında edilən söhbətimizi yekunlaşdıraraq demək olar ki, gerçək həyatın elə predmet və hadisələri yoxdur ki, bilavasitə və ya dolayısı ilə incəsənətdə öz təcəssümünü tapa bilməsin. Incəsənətin ayrılıqda götürülmüş hər bir növü üçün həyatı hərtərəfli təcəssüm etdirmək imkanları məhduddur. Onlardan hər biri gerçəkliyin bəzi tərəflərini və hadisələrini daha yaxşı əks etdirə bilir, digərlərini-pis, üçüncüləri isə heç əks etdirə bilmir. Məsələn, musiqi insanın ruhi vəziyyətini, onun hiss və duyğularını qeyri-adi tərzdə

ifadə etmək imkanlarına malikdir, lakin eyni zamanda maddi aləmin əyani təsvirini verməkdə çox zəifdir, imkansızdır. Ədəbiyyat insanların nitqini və fikirlərini bilavasitə təcassüm etdirə bilər, lakin eyni zamanda rəssamlıq bu imkanlardan məhrumdur. Heykəltəraşlıq bizə bədənin həcmini və plastik ifadəliliyini əyani göstərə bilir ki, bunu da ədəbiyyat, musiqi və rəssamlıq edə bilmir. Və ilaxır. Bununla bədii obrazın məzmununun xüsusiyyətləri və həmçinin incəsənətin hər bir növündə obrazın yaranmasının vasitələri müəyyən olunur [38].

İncəsənətin təsnifatından düzgün nəticə bundan ibarətdir ki, incəsənət həyatın hərtərəfli və bitkin inikasını yaratmaq, insanın estetik tələbatını bütövlüklə ödəyə bilmək üçün növlərə və janrlara ayrılmalı idi. Bu növlər arasındakı sərhədləri görməklə bərabər, bu sərhədlərin şərti olduğunu da nəzərdən qaçırtmaq olmaz.

Azərbaycan mədəniyyətinə qarşı milli-təəssübkeşlik hissi böyük natiqin nitqlərini tərk etmir, Azərbaycan kinosu ilı fəxr etdiyini dilə gətirir, bizləri də bu fəxrə səsləyir: "İkinci, Azərbaycan kinosunun 80 illik tarixi xalqımızın salnaməsidir. Çünki biz tariximizlə həmişə fəxr etmişik və eyni zamanda tariximizi qorumalıyıq. ***Əgər*** Azərbaycan xalqı – Şərqdə yaşayan və keçmişdə bu sahədə Qərb ölkələrindən geridə qalmış bir xalq, millət 80 il ***bundan*** öncə kino sənətini bu müddətdə yaşadıb inkişaf etdiriblərsə, bu, xalqın mədəniyyətinin ***nə qədər*** zəngin olduğunu göstərir. Biz bununla fəxr etməliyik və buna əsasımız da var" [Vc.s.184].

"Nə qədər" kəmiyyət zərfinin, "bundan öncə" qoşmasının köməyi ilə Azərbaycan xalqının kino sənətindəki nailiyyətlərini bəyan edir.

Böyük natiq incəsənətin teatr və kino növlərini müqayisə edir. Bu müqayisə "məsələn" bağlayıcısı ilə həyata keçirilir: "***Məsələn***, bizim gənclik illərimizi götürək, – indi burada

Tofiq Tağızadə kimi yaşlı nəslə mənsub olan adam var, mən də o cümlədən, ancaq gənclər də var, – o vaxtlar kinodan savayı bir şey yox idi, – ***nə*** televiziya var idi, ***nə də*** radio o qədər təsir göstərirdi. Biz ən çox təsir göstərən teatr idi, lakin bu da o qədər kütləvi deyildi. Əgər teatr Bakıda, başqa şəhərlərdə var idisə, teatra xüsusi getmək lazım idisə, kino belə idi ki, onu yayırdılar, aparıb kənddə də göstərirdilər" [Vc.s.184].

Heydər Əliyev müqayisələri bu mətndə "nə... nə də" inkar bağlayıcılarından, "o qədər" kəmiyyət zərfindən istifadə yolu ilə kinonun üstünlüyünü bir sənətşünas alim kimi auditoriyaya yönəldə bilir. "Aparıb kənddə də göstərirdilər" ifadəsi sadə xalq dilində müqayisəni əyaniləşdirir. İncəsənətin mühüm bir növü olan kinonun xalqın etik dəyərlərinin formalaşmasındakı rolu böyük natiqin çıxışlarında tez-tez səslənir: "80 il müddətində Azərbaycan kinosu çox dəyərli əsərlər yaradıbdır və bunu heç vaxt unutmaq olmaz. Azərbaycan xalqının bir çox nəsilləri kino ilə tərbiyələnib, kinonun təsiri altında formalaşıb, inkişaf edibdir, mədəniyyətə qovuşubdur" [Vc.s.184].

İncəsənət işçilərinin qiymətləndirilməsi, onlarda ruh yüksəkliyinin artırılması, onların xidmətinin xalqa çatdırılması mühümdür: "Bu gün fürsətdən istifadə edib öz fikrimi demək istəyirəm ki, siz elə bir sahədə işləmisiniz və işləyirsiniz ki, doğrudan da xalqımıza böyük xeyir gətirmisiniz. Həyatınız nə qədər çətin olsa da, – ümumiyyətlə hamınızın həyatı çətindir, – fəxr etmisiniz ki, belə bir sahənin fədakar adamlarısınız və bu ağır dövrdə də sənətinizdən uzaqlaşmamısınız, onu unutmamısınız və davam etdirirsiniz" [Vc.s.184-185].

İncəsənətlə bağlı söylənilən fikirlərdə Heydər Əliyev nitqi fəlsəfi çalarlarla zəngin olur. "Hər dövrün öz hökmü var" fəlsəfi fikrini gündəmə gətirir. Cəmiyyətdə, incəsənətdə dövrlərə uyğun baş verən dəyişiklikləri qəbul etməyə auditoriyanı hazırlayır: "Azərbaycan kinosunun 80 ildə yaratdığı filmlərin

hamısı dəyərlidir. Ola bilər, zaman dəyişib, bəziləri hesab edirlər ki, indi kino başqa cürdür, o vaxtkı kino ayrı cür idi. ***Bilirsiniz, əlbəttə ki***, hər dövrün öz hökmü var. ***Hər dövrün hökmünə görə də cəmiyyətin başqa cəhətləri formalaşır***. Amma gəlin İkinci Dünya Müharibəsindən əvvəl yaranan filmləri götürək. Xalqımız onları nə qədər sevirdi. Məinm özüm gəncliyimdə "Bakılılar", "Kəndlilər" filmlərinə nə qədər böyük həvəslə baxırdım" [Vc.s.185].

Dövlət səviyyəsində kinoya qiymət, kinonun inkişafına diqqət Heydər Əliyevin başlıca xidmətlərindən olmuşdur. Rejissorlarla, aktyorlarla olan məişət üslublu səmimi söhbətin araşdırılması bu xidmətə bariz nümunədir. Aktyorlara olan isti münasibət, onlara adları ilə müraciət, "o vaxt", "xatirimdədir" ifadələri ilə keçmişə səyahət, Nəsimi ilə bağlı nitq kənaraçıxması və yenidən kino sənətinə qayıdışı nitqi rövnəqləndirən bir vasitə olur. "Yaxşı ənənə idi" cümləsinin iki yerdə təkrarlanması, "rəhmətlik Həsən Seyidbəyli" ifadəsi nitqin gedişində kinoya Heydər Əliyev qayğısından söhbət açır: "Mən Azərbaycanda respublikanın rəhbəri işləyərkən kino sənətinin inkişafına böyük diqqət yetirirdim. Bu, Rüstəmin də yadındadır, başqalarının da. Rasim Balayevin kinoda ilk dəfə görünməsini də xatırlayıram. Rəhmətlik Həsən Seyidbəyli – Nəsimi filmini çəkirdi. ***O vaxt*** biz böyük şairimiz Nəsiminin 600 illiyini qeyd edirdik və onun haqqında film yaratmağı qərara almışdıq. ***Yaxşı ənənə idi***. Biz görkəmli adamların yubileylərini qeyd edirdik, onların haqqında kitablar, romanlar, tarixi oçerklər yazılırdı, kinofilmlər çəkilirdi. *Yaxşı ənənə idi*. ***Bax***, onda biz ilk dəfə olaraq Bakıda Nəsimiyə gözəl bir abidə ucaltdıq, onun adını əbədiləşdirdik, – bizdə Nəsiminin adına rayon var, – film yaratdıq. Həsən Seyidbəyli bu filmin yaradılmasını öz üzərinə götürdü. *Xatirimdədir*, ssenari çox mürəkkəb, çox çətin idi. Çünki tarixi *təhlil etmək*, *aydınlaşdırmaq* lazım idi ki, nəyi

göstərməli və nəyi göstərməməli. *Xüsusən* ona görə ki, – mən yenə Rasim Balayevdən sitat gətirirəm, – bu gün o dedi ki, ideologiya rol oynayırdı. *Həqiqətən* rol oynayırdı. Odur ki, həmçinin nəyisə ideologiyaya uyğunlaşdırmaq lazım idi. Prinsipcə, film çox yaxşı çıxdı" [XVc.s.251-252].

O, Nəsimi rolunu həqiqətən gözəl ifa etdi, çox gözəl ifa etdi. İndi baxın, o, artıq bir qədər yaşa dolub, fiqurası da o vaxtkına nisbətən böyüyüb. Onda çox qədd-qamətli, çox qəşəng oğlan idi. Əlbəttə, bu gün də qəşəngdir [XVc.s.252].

Kino sənətimiz öz tarixini 1898-ci ildən başlasa da, ölkəmizin teatr ənənələri və təcrübəsindən həmişə bəhrələnmişdir. Kino sənətinin uğurları ilk növbədə Azərbaycanın teatr xadimləri və aktyorlarının adları ilə bağlıdır [XVIIc.s.193].

Xalq yazıçısı, məşhur kino xadimi Rüstəm İbrahimbəyovun 60 illiyinə həsr olunmuş mərasimdə çıxışında "*Gözəllik elə harmoniyadır, elə əksliklərin ziddiyyətidir"* fəlsəfəsi önə düşür.

Rüstəm İbrahimbəyovun bütün əsərlərində əsas məzmunu, mənanı təşkil edən budur ki, o, həmişə həyatın reallığını təsvir edibdir. Amma o dövrdə, sovet ideologiyası çərçivəsində bu o qədər də asan deyildi. Çünki bəzən bu istiqamətdə yazanlar bir az da kənara çıxanda dissident olurdular. Ancaq Rüstəm İbrahimbəyovun həyatı olduğu kimi təsvir etməsi və həyatın hər tərəfini – həm müsbət tərəfini, həm mənfi tərəfini olduğu kimi göstərməsi onun yaradıcılığının ən ***gözəl*** cəhətidir və əsərlərinə böyük şöhrət gətirən amildir [XIXc.s.125].

Məsələn, bəlkə də "Ad günü" filmi zahirən adi bir mövzuya aid olan bir əsərdir, – nə siyasi xarakter daşıyır, necə deyərlər, nə də bir böyük mövzu iddiasındadır. Amma mənəviyyatımızı, müasir həyatımızı, həyatımızın qüsurlarını nə qədər gözəl əks etdiribdir.

Xatirimdədir, mən bu filmə təsadüfən baxarkən heç bilmirdim ki, bu film nədir və kimindir. Ancaq mənə o qədər

böyük təsir bağışladı ki, mən sonra bu filmin təbliğatçısına çevrildim. O vaxtkı dövrdə bu məsələni bilən adamlar xatırlamalıdırlar ki, mən bir neçə dəfə rəsmi müşavirələrdəki çıxışlarımda bu filmi təbliğ etdim. Hətta onu başqa ölkələrin bir neçəsinə göndərdim [XIXc.s.126].

Gürcüstan Kinematoqrafçılar İttifaqinin katibi, kinooperator Lomer Axvlediani ilə görüşdə söhbət zamanı (Prezident sarayı 27 sentyabr 1999-cu il) Heydər Əliyev "həqiqətən" modal sözü ilə kinonun mənəvi dəyərlərin formalaşmasında olan rolunu qiymətləndirir, "axı" qüvvətləndirici ədatı ilə tariximizi əks etdirən filmlərin böyük əhəmiyyətə malik olmasını göstərir. "Əlbəttə" qəti təsdiq və "xatirimdədir" modalları ilə kinomuzun keçdiyi yolu "məsələn" bağlayıcısıyla auditoriyanın diqqətinə çatdırır: "***Axı*** kimdən və nədən bəhs etməsindən asılı olmayaraq, tarixi səpkili sənədli filmlər çox böyük əhəmiyyətə malikdir.

***Əlbəttə***, biz bədii kinonu yüksək qiymətləndiririk, hamımız uşaqlıqdan, ola bilsin, kinofilmlərin böyük təsiri ilə böyüyüb başa çatmışıq. ***Məsələn***, mən yaşlı nəslin adamıyam, ***xatirimdədir***, səssiz kinoya baxmağa necə böyük həvəslə gedirdik, sonra səsli kino meydana gəldi, – bu, bizim üçün hadisə idi. Sonra uzun müddət kinofilmləri qara-ağ təsvirdə göstərirdilər, nəhayət, rəngli kinofilmlər meydana gəldi -bu da böyük hadisə idi. Buna görə də o illərdə kino insanların, onların xarakterinin formalaşmasına, mənəvi dəyərlərin formalaşmasına ***həqiqətən*** çox böyük təsir göstərirdi. Biz bunu unuda bilmərik, bunu həmişə qiymətləndirməliyik" [XXIIc.s.55-57].

İncəsənətin növlərini bir-birinə qarşı qoymaq, onların arasında keçilməz sədlər çəkmək, birinə üstünlük verməklə, o birinin mahiyyətini azaltmaq doğru deyildir. Incəsənətin növlərinin hamısı gərəklidir və hər birinin özünəməxsus estetik ləyaqəti vardır. Çünki insanın formalaşmasında incəsənətin müxtəlif növlərinin rolu da müxtəlifdir. İncəsənətin

ayrılıqda götürülmüş növlərindən heç biri estetik tərbiyə və insanın hərtərəfli inkişafı məsələsini tam dolğunluğu ilə həll etmək iqtidarında deyildir. Yalnız bütün incəsənət növləri birlikdə insanın bütün potensial imkanlarını tam dolğunluğu ilə inkişaf etdirə bilər, insanı həqiqətən hərtərəfli şəxsiyyət edə bilər, onun ruhi aləminin kamilləşməsinə və zənginləşməsinə kömək edə bilər. Ona görə də incəsənət növlərindən yalnız birini sevmək, o birilərinə isə laqeydlik göstərmək də estetik zövq və mədəniyyət əlaməti deyildir. Söz yox ki, hər kəs incəsənətin bir növünü daha çox sevə bilər. Belə şəxsi maraq və meyl yasaq deyildir. Lakin incəsənətin zəngin aləminə, onun müxtəlif növlərinə bələd olmaq, onları başa düşməyə, duymağa çalışmaq daha artıq təqdirəlayiqdir. İncəsənətin bir növünü yox, bir neçə əsas, daha mühüm növünü sevmək, onlarla daima və mütəmadi ünsiyyətdə olmaq insanın zəngin mənəvi dünyasından xəbər verir. Çünki həqiqətən yalnız incəsənətlər ailəsi, çoxlu incəsənət növü birlikdə hərtərəfli inkişaf etmiş, zəngin mənəvi aləmə malik, kamil insan yetişdirə bilər. Ona görə də bütün incəsənət növlərini sevməyi və onlarla qırılmaz ünsiyyətdə olmağı insan həyatı üçün çox vacib şərt hesab edirik [122]. Estetlərin yuxarıdakı fikirləri öz bariz ifadəsini Heydər Əliyevin nitqində tapır: "Televiziya meydana gəldikdən sonra kino, əgər belə demək mümkünsə, tədricən sıxışdırılmağa başladı. Buna baxmayaraq, mənə məlumdur ki, bir çox ölkələrdə adamlar əvvəlkitək kinoteatrlara gedir, filmlərə baxır, onlara böyük maraq göstərirlər. Buna elə bizim Azərbaycanda da tədricən qayıdırlar.

Bilirsiniz, keçmişdə mən incəsənətə, mədəniyyətə, o cümlədən kinematoqrafa öz münasibətimi dəfələrlə bildirməli olmuşam. Özü də bunu mən təkcə işimə, yüksək vəzifə tutduğuma görə deyil, həm də ürəkdən edirdim. Mədəniyyət və incəsənət kiçik yaşlarımdan qəlbimdə xüsusi yer tutur. Bəlkə də gənclik illərində arzum rəssam olmaq, yaxud teatra getmək

idi. Amma qismət başqa cür oldu. Ona görə də bunların hamısı qəlbdən gəlir.

Buna görə də 30-40 il əvvəl olduğu kimi, yenə də deyirəm ki, teatr yaşayır və yaşayacaqdır. Çünki kino, sonra isə üstəlik televiziya meydana gəldikdə teatra maraq azaldı. Bununla belə, teatrı heç nə əvəz edə bilməz. Heç nə. Ona görə ki, teatrda insan canlı adamlarla – bu və ya digər vəziyyəti səhnədə canlandıran aktyorlarla bilavasitə ünsiyyətdə olur. Bunu kinematoqraf haqqında da demək olar. İncəsənətin yeni nə kimi növləri meydana gəlsə də, kinematoqraf öz əhəmiyyətini heç zaman itirməyəcəkdir. Odur ki, bədii kino, bədii əsərlər indi televiziya ilə, digər üsullarla yaradılan qalan bütün lentlərdən, şübhəsiz, qat-qat yüksəkdir [XXIIc.s.55-57].

Bədii kino ilə sənədli kinonu sənətşünas gözü ilə fərqləndirir. Böyük natiqin bu cür çıxışlarına şərh vermək çətin olduğu qədər heç şərhə də ehtiyac qalmır: "Lakin bir daha ona qayıdıram ki, sənədli kino xüsusi əhəmiyyətə malikdir. Əlbəttə, adamlar bədii filmə baxarkən gördüklərinə inanır və bunu gerçəklik hesab edirlər. Təbiidir ki, bu, əksər hallarda gerçəkliyin təqlidi deyil, əks olunmasıdır. Bu, gerçəkliyin filmin yaradıcısının mövqeyindən əks etdirilməsidir. Bununla yanaşı, – mən yenə də öz hissiyyatlarımı, təəssüratımı deyirəm, – hər hansı bədii filmə baxış həmişə çox böyük təəssürat buraxırdı, həmişə inanırdım ki, bu, məhz belədir, bu həqiqətdir və sair. Mən bu gün də belə hesab edirəm. O vaxtlar bu cür fikirləşirdim – deyən adamlarla əsla razılaşa bilmərəm. Mən elə indi də belə düşünürəm" [XXIIc.s.55-57].

Ancaq, bir daha deyirəm, əlbəttə, bədii, peşəkarlıq səviyyəsi layiqincə olduqda sənədli kino xüsusi dəyər kəsb edir. Ona görə də indi, məsələn, XX yüzillik ərzində bizdə neft sənayesinin necə inkişaf etdiyini göstərəndə, əsrin əvvəllərinə aid hər hansı sənədli kadrları göstərəndə, bunlar

